*Yusif Balasaqunlu*

*Xoşbəxtliyə aparan elm*

QUTADĞU

# BİLİG



AVRASİYA PRESS

BAKI 2006

*Bu kitab "Yusif Balasaqunlu. Qutadqu bilik – xoşbəxtliyə aparan elm" (Bakı, Azərnəşr, 1994) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Türkiyə və özbək türkcəsindən istifadə etməklə
Xaqaniyyə türkcəsindən çevirənlər: **Kamil Vəliyev**
**Ramiz Əskər**

**894.3-dc22**
**AZE**
**Yusif Balasaqunlu. Qutadğu bilig.** Bakı, "Avrasiya press", 2006, 440 səh.

Türk xalqlarının abidəsi sayılan "Qutadğu bilig" kitabı XI əsrdə Yusif Xas Hacib Balasaqunlu tərəfindən qələmə alınmışdır. Əsər öz dövrünün tarixini, psixologiya, əxlaq və fəlsəfəsini əhatə edən qüdrətli sənət abidəsidir. "Qutadğu bilig" rus, özbək, türk, qırğız dillərinə tərcümə edilmişdir. Bu əsərin azərbaycan dilinə filoloji tərcüməsi türkdilli xalqların ortaq abidəsi kimi Azərbaycan xalqının ədəbiyyatını, dilini, tarixini öyrənmək baxımından da qiymətlidir.

**ISBN10 9952-421-51-4**
**ISBN13 978-9952-421-51-4**



# "QUTADĞU BİLİG" – "XOŞBƏXTLİYƏ APARAN ELM"DİR

Dünyanın bütün mədəniyyət növləri, ayrı-ayrı xalqların sivilizasiyaları qarşılıqlı zənginləşmə, bəhrələnmə, qidalanma yolu ilə gerçəkləşib. Türk mədəniyyətinin qədim şumer, elam, akkad, çin, hind, ərəb, fars, Bizans, slavyan, anqlo-saks, german, roman xalqlarının mədəniyyətləri ilə bağlılığı, təması türk xalqlarının dominant mədəniyyətinə zənginlik, dolğunluq gətirmişdir. Bu gün türk mədəniyyəti dedikdə türk xalqlarının mənəvi dəyərlər toplusu, türk dili, maddi və mənəvi sənətlərin məcmusu başa düşülür.

Türk mədəniyyətinin sözün geniş mənasında tarixi təsdiqini islam mədəniyyətindən ayrı düşünmək olmaz. Və sözün bu mənasında türk-islam mədəniyyəti türk xalqlarının dünya mədəniyyətindəki təsdiqidir. Şübhəsiz ki, islam mədəniyyəti ilə türk mədəniyyətinin qarşılıqlı münasibətini digər dünya xalqlarının türk mədəniyyətinə münasibətilə qarışdırmaq doğru olmaz. Çünki islam mədəniyyəti dünya mədəniyyətinin yeni dövrü, müasir mərhələsidir. Elm və məntiq baxımından dünyanın son və ən mükəmməl dini olan islam yeni dünyagörüş kimi insana, həyata yeni mənəvi iqlim, hava gətirmişdir. Mübarək Quran dünyanın son peyğəmbərinin yeni başlanğıcı idi ki, bu başlanğıcdan yeni təfəkkür, yeni idrak, yeni sənət, yeni mədəniyyət başlayırdı. Dünyanın bu sübh çağı türk aləminə də yeni bir dirilik gətirdi. Tək və mütləq qüdrətli Göy Tanrı ilə Allaha inam arasındakı paralellik, üzvi bağlılıq türk inanışı ilə, Tanrıçılıq fəlsəfəsi ilə islam fəlsəfəsi arasında ziddiyyətin olmaması üzvi vəhdət üçün zəmin yaratdı.

Türk xalqlarının xilqətindəki inanış islamda qanunauyğun inikasını tapdığı üçün türk və islam mədəniyyəti VII–VIII yüzilliklərdən sonra türk-islam mədəniyyəti kimi dünya tarixinə daxil oldu. Bu böyük prosesi əks etdirən yüzlərcə, minlərcə örnəklər arasında "Qutadğu bilig" başda gəlir.

Qut – türkcə səadət, xoşbəxtlik, uğurlu tale deməkdir. "Qutadğu bilig" – xoşbəxtliyə, səadətə aparan elm, bilik deməkdir (*qut* – xoşbəxt, *ad* – etmək mənalı adlardan feil düzəldən şəkilçi, *ğu* – feildən ad düzəldən şəkilçidir; *bil* (mək) felin kökü, *ig* – feildən ad düzəldən şəkilçidir).

Bu möhtəşəm abidənin müəllifi türk-islam ədəbiyyatının ilk böyük sənətkarı Yusif Xas Hacibdir (1017–1077).

İstər Yusif Balasaqunlunu, istərsə də onun müasiri, "Divani-lüğət-it-türk"ün müəllifi Mahmud Kaşğarini yetirən tarixi şərait və mühit bizim üçün maraqsız ola bilməz. Qaraxanlılar sülaləsinin islamı ilk qəbul edən və Kaşğarda ilk türk-islam dövləti yaradan Əbdülkərim Satuq Buğra Qaraxan soğdi dili və mədəniyyəti yerinə türk dili və mədəniyyətinin əsasını qoydu. Balasaqun şəhəri Türküstanın qədim şəhərlərindən biri kimi Kubalıq (Gözəl şəhər), Qara-Ordu, Quz-Ordu, Uluş, Balıq adları ilə adlanmış və Mahmud Kaşğarinin

"Divan"ında verilən xəritədə tam mərkəzdə göstərilmişdir. Kaşqar (Ordukənd) paytaxt olsa da, Balasaqun şəhəri Qaraxanlıların çox böyük şəxsiyyətlərindən biri olan Harun tərəfindən ikinci böyük iqtisadi və mədəni mərkəzə çevrilmişdi. Samanilərin zəifləməsi, Qaraxanlıların islama dönüşü Qərbi Türküstanda yeni və qüdrətli dövlətçilik sisteminin yarandığını göstərirdi. Təsadüfi deyil ki, uzun müddət yaşamasa da, türk ədəbi dilinin və mədəniyyətinin formalaşmasında mühüm rol oynayan Qaraxanlılar daha möhtəşəm türk-islam dövləti olan Səlcuqluların sələfi rolunu ləyaqətlə oynamışdır.

Yusif Balasaqunlunun doğum ili mübahisəlidir. Gah 1010, gah 1015, gah 1019, gah 1025 göstərilsə də 1017-ci il təvəllüd tarixi kimi daha çox qeyd olunur. Vəfat tarixinin isə 1077 olması daha geniş yayılmışdır.

Yusif Balasaqunlu "Qutadğu bilig" əsərini vətəni Balasaqunda yazmağa başlamış, güman ki, 18 ay ərzində orada da bitirmişdir.

Əsərin yazılma tarixi 1069-1070-ci ildir. Şübhəsiz ki, müəllif yenidən əsərə qayıtmış, xüsusilə əvvəlki 70 səhifəlik nəzm hissəsi sonradan əlavə edilmişdir. Çünki burada əsərin Türküstandakı şöhrətindən, bir türk "Şahnamə"si kimi uğur qazanmasından söhbət gedir. Müəllif əsəri ilk dəfə Tabğac Qara Buğra xanın hüzurunda oxumuş və ona təqdim etmişdir. Bunun üçün də hökmdar müəllifə hökmdardan və vəzirdən sonra üçüncü titul olan Xas Hacib adını vermiş və yazıçı bu adla da məşhur olmuşdur.

Yusif Xas Hacib Balasaqunlunun şəxsiyyəti və ədəbi-ictimai mövqeyi də maraqdan kənarda qala bilməz.

Hacibliк "Qutadğu bilig" əsərində bir növ hökmdarın ideoloji istiqamətlər üzrə müşaviri kimi "xidmətlərin ən incəsi" tək qiymətləndirilir. "Hacib olmaq və irəli keçib insanlara yol göstərmək" üçün əsaslı şərtlər qoyulur. Bu şərəfli vəzifə üçün ağıl, zəka, tədbir, bilikdən savayı boy-buxun, səliqə-səhman, nurani sifət də tələb olunur. Saray həyatının beyni kimi fəaliyyət göstərməli olan hacib üçün gərəkli şərtlərə həsr olunmuş 90 beyt bunu sübut edir. Əlbəttə, Yusifin bu xüsusiyyətləri bir növ canlı örnək idi. Dövrünün mütəfəkkir sənətkarı, dövlət xadimi olan Yusif Xas Hacib türk-islam tarixini, mədəniyyətini dərindən mənimsəmiş ideoloq idi. Əsərin başdan-başa türkcə yazılması, gəlmə sözlərin azlığı, qədim adətləri, etnoqrafik xüsusiyyətləri gözəl bilməsi, Quranı, islam fəlsəfəsini dərindən mənimsəməsi Yusif Balasaqunlunu yalnız bir sənətkar kimi deyil, həm də türk dövlətçilik tarixinin qüdrətli fikir-məfkurə simalarından biri kimi tanıdır. Təsadüfi deyil ki, "Qutadğu bilig"in zəngin materialı əsasında dini, əxlaqi, didaktik, hüquqi, sosial-siyasi, estetik, pedaqoji, psixoloji baxışlar sistemi üzərində ayrı-ayrılıqda kitablar, əsərlər yazmaq mümkündür.

Əsərdə tək bir yerdə Yusif Balasaqunlu özünə müraciət edir:

Ey Yusif kerek sözin sözlə koni,
Kereksiz sözüq kizlə kıtqa kora.



"Ey Yusif, gərəkli və doğru sözü söylə; gərəksiz sözü gizlə, onun zərəri toxunar".

Bu sözlər türk tarixinin nə qədər mənalı, müdrik simaları olduğunu xəbər verməklə yanaşı, yazı mədəniyyətindən, sənətkar əxlaqının saflığından, zəruriliyindən soraq verir. Bunun üçün də biz türk tarixinə minnətdarıq.

"Qutadğu bilig"in fəlsəfəsi, etik və didaktik sistemi, hüquqi, siyasi baxışları üzərində bir qədər dayanaq.

Məlumdur ki, türk fəlsəfəsi və dövlətçilik tarixi islama qədər böyük bir inkişaf mərhələsi keçmişdir. Türklərin tarixdə özünəməxsus yer tutması yalnız hərbi müvəffəqiyyətlə bağlı deyildir. Türklük aləmini dünyaya və insana fəlsəfi baxış, hüquq və dövlət dünyabaxışından ayrı təsəvvür etmək olmaz. Qədim türklərdə törü (törə) adlanan şifahi ədliyyə sisteminin, adət və ənənələrdə öz əksini tapmış hüquqi baxışlar toplusunun böyük əhəmiyyəti olmuşdur. Yusif Balasaqunlu islam fəlsəfəsi ilə qədim türklərin törələrdən, Tanrıçılıqdan, həyat və düşüncə tərzindən gələn fəlsəfəsini üzvi şəkildə birləşdirərkən təbii ictimai-sosial, fəlsəfi baxışları ifadə etmişdir. Bu mənada, əsər "Türklərin mənəvi tərifini, siyasi və idarəçilik görüşlərini ortaya qoymaqla Türk dövlətinin ictimai-siyasi bünövrəsini tanıtmağı bacarmışdır"[1].

"Qutadğu bilig"in dünyada tanınmasında böyük zəhməti olan Rəşid Rəhməti Aratın dediyi aşağıdakı sözlərə əlavə etmək çox çətindir: "Yusif bu əsəri ilə insan həyatının mənasını təhlil etmiş, onun cəmiyyət və eyni zamanda dövlət içindəki vəzifəsini təyin edən bir fəlsəfə – həyat fəlsəfəsi sistemi formalaşdırmışdır"[2]. Şübhəsiz ki, bu baxışlar sistemin Yusif Xas Hacib özü yaratmamışdır, mövcud haqq, ədalət, dövlət, hüquq, ədliyyə, əxlaq anlayışlarını gözəl bir üslubda canlandırmış mütəfəkkir-ideoloq səriştəsi ilə sistemləşdirmişdir. İslamı qəbul etmiş türklərin milli həyat fəlsəfəsi, vətəndaş və dövlət baxışı, bilavasitə milli dövlətin müqəddəsliyi prinsipi bu gün üçün də müasirdir. Molla və ya axund məscidə layiq olmaya bilər, amma Allah evi olan məscid müqəddəsdir. Seçilmiş, təyin edilmiş və yaxud irsi olaraq başına tac qoyulmuş hökmdar uğursuz və ya ləyaqətsiz ola bilər, ancaq milli dövlət müqəddəsdir. Bu müqəddəslik bilinmədikcə və tanınmadıqca, ətə, qana çökməyincə, beyinlərə hopmayınca o dövlətin yaşama haqqı şübhəli olacaq. Dövlətin qanunları da, ana yasası da, ordusu və idarə sistemi də o zaman möhtəşəm və qüdrətlidir ki, hər bir vətən övladı, özünü vətəndaş sayan şəxs həmin dövləti öz ailəsi qədər sevir və müqəddəs tutur. Vətəndaşın dövlətçilik hissini və milli dövlətə məhəbbətini ifadə etmək baxımından "Qutadğu bilig" örnək əsərlərdən biri kimi tariximizə daxil olub.

Bu fikirlər bəlkə də milli dövlətə müasir baxışdır və haradasa subyektiv yozumdur. Ancaq bizim iddiamız metod, konsepsiya deyil, milli dövlətə tari-

[1] İ.Kafesoğlu. "Kutadgu bilig" və Kültür Tarihimizdeki yeri. İstanbul, 1980, s.4.
[2] R.R.Arat. "Kutadgu bilig" – Mətn, Ankara, 1979, s.25.

ximizdon, törəlorimizdən, kökdən, bünövrədən gələn baxışları açıqlamaqdır. Həmin baxışların açıqlanması gəncliyimizdə milli dövlət əqidəsini formalaşdırmaq, dövlətçilik namusunu, qeyrətini aşılamaq üçün zəruridir. Müasir dünyanın mürəkkəb siyasət əlifbasında dövlətçilik və demokratiya prinsiplərini əqidə, amal səviyyəsində dərk etmədən heç bir azadlıqdan və müstəqillikdən söhbət gedə bilməz. Azərbaycanın azadlıq və müstoqilliyini köklü şəkildə dərk etmək üçün ədəbi və tarixi qaynaqlarımızın müasir gözlə oxunması, şərh edilməsi tədris və təbliği çox vacibdir. Bu baxımdan da "Qutadğu bilig"in sətirləri içərisində yatan həqiqətləri aşkar edilməsinə böyük ehtiyacımız var.

"Qutadğu bilig"in olyazma nüsxələri haqqında bir neçə söz. Dövrünün məşhur əsəri olan "Qutadğu bilig" Çində, Maçində, Hindistanda məşhur olmuşdur. Əsərin üç nüsxəsi məlumdur: Vyana nüsxəsi, Qahirə nüsxəsi, Fərqanə nüsxəsi. Vyana nüsxəsi ilk dəfə elm aləminə məlum olsa da, naqis əlyazmadır. Bu əlyazma uyğur əlifbası ilə qələmə alınıb. 1349-cu il nüsxəsi öncə Toqata, sonra İstanbula gətirilmişdir. Fransız şərqşünası J.Amadiya 1823-cü ildə əsər haqqında ilk məlumatı vermişdir. Vyana nüsxəsini ilk dəfə macar alimi H.Vamberi və V.Radlov tərcümə edib nəşr etdirmişlər. Qahirə nüsxəsi 1896-cı ildə üzə çıxarılmışdır. 1943-cü ildə Türk Dil Qurumu tərəfindən çap olunub. Bu nüsxə tam deyil. V.Radlov bu nüsxəni 1910-cu ildə alman dilinə tərcümə etmişdir. Əsərin tam və mükəmməl nüsxəsi 1915-ci ildə Fərqanə (ona Namanqan nüsxəsi də deyirlər) şəhərində tapılmışdır.

A.Z.Validovun tapıntısı elmdə məşhurdur. Ərəb əlifbası ilə olan bu nüsxəni Türk Dil Qurumu 1934-cü ildə nəşr etmişdir.

"Qutadğu bilig"in tədqiq və nəşr tarixi geniş bir mövzudur və məqsədimiz təfərrüatı ilə bu mövzunu əhatə etmək olmasa da, əsas araşdırmaları aparmağa ehtiyac var.

Klassik türkologiyanın H.Vamber, V.Radlov, A.Z.Validov, S.Y.Malov, R.R.Arat kimi nümayəndələrinin nəşr, tərcümə baxımından xidmətləri çox böyükdür. Onlarla birlikdə V.V.Bartold, Z.V.Toğan, P.K.Juze, A.N.Kononov, İ.Qafesoğlu kimi araşdırıcılar tədqiqatları ilə "Qutadğu bilig"in dünya elmi səviyyəsinə çıxmasında ciddi rol oynamışlar[1].

---

[1] Bax: H.Vambery. Uigurische Sprachmonumente und das Kutadgu Bilik, İnnsbruk, 1870; W.Radloff. Das Kutadgu Bilik des Yusuf – Chass – Hadschib dus Balasagun, m. I, st-P., 1891, m. II, 1910; А.З.Валидов. Восточные рукописи в Ферганской области, ЗВО, т, XXII, 1914; С.Е.Малов. Памятники древнетюркской *письменности, М.-Л., 1951; Z.V.Togan. Umumi Türk tarihine giriş, İ., 1981;* В.В.Бартольд Двенадцать лекции по истории турецких народов Средней Азии, Сочинения, т. V; R.R.Arat. Kutadgu bilig, I Metin, İ., 1947; Kutadgu Bilig, II (çeviri), V Baski, Ankara, 1991; Kutadgu Bilig. Tipkilbasim. 1-3, İ., 1942-1943; P.K.Juze. Thesaurus Linguarum, Turcorum, Baku, 1927; İ. Kafesoğlu. Kutadgu Bilig və Kültür Tarihimizdeki yeri, İ., 1980; Yenə onun. Türk Milli Kültürü, İ., 1984; А.Н.Кононов. Поема Юсифа Баласагунского "Благодатное знание", М., 1983.



"Qutadğu bilig"in nəşrləri içərisində üç nəşri biz, xüsusilə qeyd etmək istərdik. Birincisi, görkəmli Türkiyə alimi Rəşid Rəhməti Aratın 1947 və 1979-cu il nəşrləridir; ikincisi, görkəmli özbək alimi K.Kərimovun Daşkənd nəşridir; üçüncüsü, görkəmli rus türkoloqu S.N.İvanovun abidənin rus dilinə tərcüməsidir[1]. Araşdırmaların içərisində "Qutadğu bilig"in tarixi, bədii-poetik, dil xüsusiyyətlərinə həsr olunmuş çoxlu dəyərli əsərlər vardır. Yuxarıda adları çəkilən araşdırıcılardan başqa A.Baskakov, A.M.Şerbak, X.Koroğlu, M.N.Xıdırov, E.Fazilov, Ə.Tenişev, İ.V.Stebleva, S.Q.Klyaştornı, Q.F.Blaqova, N.S.Banarlı, A.S.Ləvənd, L.Banelli, O.Alberti, M.Aran, A.Bombaçi, F.Rəhməti, M.Hartman, S.Cağatay, Ə.İnan, İ.Nəcmi, A.Rüstəmova, A.Valitova və b. tədqiqatçıların onlarca əsərlərinin üzərində dayanmaq üçün geniş imkan yoxdur. Bu araşdırmaların içərisində A.Dilaçarın, İ.V.Steblevanın, S.Başerin adlarını çəkdiyimiz əsərlərini, eləcə də 900 illiyi münasibətilə "Sovetskaya tyurkologiya" jurnalının bütöv bir nömrəsinin (1970, № 4) başdan-başa (cəmi 13 məqalə) "Qutadğu bilig"ə həsr olunmasını qeyd etməyi özümüzə borc bilirik.

Azərbaycanda "Qutadğu bilig" nisbətən az öyrənilmişdir. M.Seyidovun, F.Zeynalovun, V.Aslanovun, Ə.Səfərlinin, P.Xəlilovun, A.Rüstəmovanın... tədqiqləri boşluğu doldurmaq üçün kifayət olmasa da dəyərlidir[2].

"Qutadğu bilig" Tanrını mədh edən bir münacatla başlayır. Sonra peyğəmbər mədh edilir. Ardınca dörd xəlifənin tərifi verilir. Dördüncü bölüm gözəl yaz mövsümünün və hökmdar Buğra xanın tərifidir. Daha sonra yeddi ulduz, on iki bürc, eləcə də elm, ağıl, dil haqqında bölümlər gəlir və kitabın adı, mənası müəllifin özü haqqında hissələr verilir. Bütün bunlardan sonra əsərin məğzi başlayır.

Gündoğdu adlı bilikli, fəzilətli adil bir hökmdar var imiş. Aydoldu adlı zəkalı, ədalətli bir adam tərifini eşitdiyi Gündoğdunun yanına gəlib onun xidmətində dayanmaq istəyir. O bu işi görərək xidməti və fəziləti sayəsində Gündoğdunun vəziri olur. Hökmdarla vəzir arasında həyat, dövlət, idarəçilik haqqında söhbətlər gedir. Bu dialoqlarda anlaşılır ki, Gündoğdu – ədalət, Aydoldu – səadət, xoşbəxtlik rəmzidir. Təəssüf ki, hər bir səadət kimi Aydoldunun da ömrü uzun deyil. Vəzir xəstələnib vəfat edir. Vəfatından

---

[1] R.R.Arat. Göst. Əsəri; Kutadğu biliq (saodatqa yullovçi bilim), nəşrə hazırlayan K.Kərimov, Daşkənd, 1971; Юсиф Баласагунский. Благадатное знание. Издание подготовил С.Н.Иванов. М., 1983.

[2] Bu barədə bax: M.Seyidov. Azərbaycan mifik təfəkkürünün qaynaqları, B., 1983; Ə.Səfərli, X.Yusif. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı, *B., 1982;* F.Zeynalov. Qədim türk yazılı abidələri, B., 1980; Yenə onun. Türkologiyanın əsasları, B., 1981; P.Xəlilov. SSRİ xalqları ədəbiyyatı, B., 1966; V.Aslanov. О лексических параллелях в "Кутадгу билиг" и в азербайджанском языке. Советская тюркология, Б., 1970, № 4; А.Рустамова. О некоторых паралелях в «Кутадгу билиг» Юсифа Баласагуни и в средневековой азербайджанской поэзии. Советская тюркология, Б., 1970, № 4.

qabaq oğlu Öydülmüşə[1] nəsihət edir. Vəzir dövləti və xalqı ədalətlə idarə etməyin yolları haqqında nəsihətlərini yazıb hökmdara təqdim edir. Var-dövlətini xalqa dağıdıb dünyadan köçən Aydoldunun böyük dövlət xidmətini oğlu Öydülmüş yerinə yetirməyə başlayır. Gündoğdu ilə Öydülmüş arasındakı söhbətlər ağıl, elm, zövq, bəylik, ədalət, mərdlik və siyasət haqqındadır. Hökmdar və onun ətrafı, vəzirin şəxsiyyəti, sərkərdələrin kim olması haqqında dialoq-söhbətlərdə elçi, qapıçı, katib, xəzinadar, hətta aşpazın belə kim olmasından söhbət gedir. Dövlət və idarəçiliyi təfərrüatı, detalı ilə izləyən bu dövlət başçıları gündəlik – çağdaş həyatı deyil, dövlətin əbədiyyətini qazandıran dəyərləri təhlil edirlər.

Söhbət əsnasında Ağıl rəmzi olan Öydülmüş qohumu Odqurmuşdan bəhs edir. Adi bir zahid olan Odqurmuş qənaət və gözütoxluq rəmzidir. Odqurmuş Öydülmüş və Gündoğdu üz-üzə və məktublaşaraq din və dünya haqqında dərin söhbətlər aparırlar. Bu hissələr də islam imanı, islam tələkkürü, hətta islam təsəvvüfü incəliyi ilə işlənmişdir. Aydın olur ki, dünya adamı da, din adamı da ehtiyacdan xali deyildir. Fəqət hər iki zümrəyə daxil olan insanlar öz ictimai və fərdi vəzifələrini anlayıb dərk edərlərsə, həyatda öz əbədi borcunu anlayıb yaşayarlarsa, dünya və axirət xoşbəxtliyinə qovuşa bilərlər. Cəmiyyətin bütün təbəqələri – kəndli, alim, şair, həkim, əfsunçu münəccim... haqqında görüşlər əsl sosioloji təhlildir və bu təhlil olmadan cəmiyyəti idarə etmək mümkün deyil. Necə ailə qurmaq lazımdır? Ailə tərbiyəsinin əsasında nə dayanır? – kimi suallar ailə ilə dövlət arasındakı üzvi bağlılığı şərh etmək baxımından diqqəti cəlb edir.

Nəticədə, hökmdar zahid Odqurmuşun bir bucağa çəkilib ibadətlə məşğul olmaq fəlsəfəsini başa düşür və onu haqlı sayır. Çünki hökmdar Gündoğdu da əbədi dünya anlayışını dərk edir. Böyük taleyə qovuşan Odqurmuş hökmdara ciddi mənəvi təsir göstərir...

Qaraxanlılar dövrünün mədəniyyət ensiklopediyası olan "Qutadğu bilig"in türk ziyalılarının dünyagörüşünü, duyğu və düşüncələrini, sosial və mədəni həyatlarının əsaslarını əks etdirən əsər kimi indi də müasir səslənməsinin səbəbi nədir? Şübhəsiz ki, zamandan asılı olmayaraq həmin anlayışlardakı, mənəvi dəyərlərdəki bəşərilik. Bu anlayışların bəzisi üzərində dayanaq.

Qədim türklər (müqayisə et: qədim şumerlər) Kainatın hakimi, tək və mütləq qüdrət sahibi Göy Tanrıya tapınırdılar. Göy Tanrının daşıdığı sifətlər və ilahi qüdrət olması ilə islam ölçülərindəki Allah anlayışı arasındakı paralellik heyrətləndirici dərəcədə üst-üstə düşür. Allah kimi Göy Tanrı da kainatın, həyatın sahibi, düzüb-qoşanıdır, ölüm və həyatın qaynağıdır, səadəti də, bədbəxtliyi də verən tək varlıqdır.

[1] Sözün kökü "ö q" qədim türk dilində, eləcə də şumer dilində ağıl deməkdir. Ö q ə – aqil, müdrik mənasındadır. Azərbaycan türkcəsindəki öymək, öyüd sözləri də bu kökə bağlıdır.



Belə ki, o qədim (bayaq), əbədi (menku), vahid (bir), öz-özünə mövcud və sıxıntıdan uzaq (Munqsuz), həyy (diri), iradə (erki) və qüdrət (oqan) sahibi olan xaliq (törütgən) və yaratdıqlarına üz tutan (deyici) vacibül-vücud bir varlıqdır[1].

Əlbəttə, daha böyük və mükəmməl bir sistem olan islam dini və Allah anlayışı bütün mənəvi dəyərlərdən yüksəkdə dayanır. Ancaq burada söhbət üstünlükdən deyil, dünyada həqiqət olanı tapmaqdan, ona yetişməkdən gedir. Bu mənada "Qutadğu bilig"in fəlsəfi, etik, estetik, sosialoji təhlili xüsusi əhəmiyyət daşıyır. Çox maraqlı araşdırmanın müəllifi olan Sait Bəşər qut və törə anlayışı üzərində geniş dayanaraq yuxarıda adı çəkilən baxış bucaqlarına işıq salmışdır. Bu araşdırma əsasən R.R.Aratın və İ.Qəfəsoğlunun tədqiqlərinə söykənsə də gənc araşdırıcı islam türk mədəniyyətinin əsas anlayışlarını layiqincə araşdırmışdır[2].

Qut mənşəcə Tanrıdan gəlir. "Qutadğu bilig"də dəfələrlə xatırlanan, işlənən bu açar-anlayış hələ Hun imperatorluğunda işlənib. Məsələn: "Tanrının qut və səadət verdiyi qulun işi hər gün yüksələr", "Tanrı kimə dəstək və yardımçı olsa, o qul qut tapar", "Qut Tanrının fəzlindəndir", "Qutun güclənməsinin digər bir səbəbi də xalqın xeyir-duasıdır"...

"Hökmdarın könlü, dili və təbiəti düzgün olmazsa, qut o məmləkətdə dolaşa bilməz, qaçardı" fəlsəfəsi türk dövlətinin dəyəri kimi açıqlanır. Törə – sözün geniş mənasında adət-ənənə, xartiya, nəsildən-nəslə keçən birgəyaşayış qanunlarının toplusudur. "Törə nə qədər yaxşı tətbiq edilsə, qut o qədər güclənər" və nəticədə, "qurd ilə qoyun yola gedər". Törənin əsasında ədalət dayanır və xalqın haqqını təmsil edir. Əsərdə törə – günəş, qut – ay kimi metaforikləşmişdir. Bu metaforanın özü dünya nizamı, ahəngi haqqında biliklər toplusunun işartısıdır. Bir sözlə, "Törə ilahi nizam olduğu üçün Tanrı öz nizamına uyğun adama qut verir".

"Qutadğu bilig"dəki insan konsepsiyası, ağıl anlayışı, hikmət fəlsəfəsi qut və törə kimi anlayışların çoxsəpkili təhlili ilə üzə çıxa bilər. Ümumiyyətlə, əsərdə sosial-fəlsəfi, etik problemlərin qoyuluşunun bütöv bir sistem daşıdığı şübhəsizdir. "Fənalıq cahillikdən doğar; xəstəliklər, pisliklər bir nöqsandan irəli gəlir. Müalicə ilə xəstəliklər sağaldıla bilər; tərbiyə ilə pisləri yaxşı etmək olar; oxumaq yolu ilə biliksizlərə bilik verilmiş olar", "hökmdar millətini, ailə başçısı ailə üzvlərini oxutmağa və tərbiyə etməyə məcburdur". "İqtisadi baxımdan cəmiyyətdə üç ayrı sinif vardır: zənginlər, orta sinfi təşkil edən ordu və məmurlar, füqərə sinif olan xalq... Fəqət himayə və təşviqlə qara camaat (qara budun) deyilən xalq orta sinif dərəcəsinə qalxa bilər. Orta sinif də get-gedə zənginlərlə birləşər. Beləliklə, cəmiyyətdə yoxsul və zülm görmüş bir sinif qalmaz"... kimi onlarca, yüzlərcə fikir yalnız ideal cəmiyyətin modeli haqqında düşüncələr deyil, həm də Orta Asiyanın müsəlman türk dövlətinin ideoloji bünövrəsidir.

[1] [2] Bax: Sait Başer. Kutadgu Bilig'de Kut ve töre. Ankara, 1990.

"Fərdin xoşbəxtliyi zəhmətin xoşbəxtliyinə bağlıdır. Fərdlər cəmiyyətin və cəmiyyətin başı olan hökmdarın yaxşılığı üçün çalışsalar, qısası, hökmdar ədalətli olsa, millət xoşbəxt olar" fikri, qanun haqqında düşüncələri Yusif Xas Hacibin dövlətçilik baxışlarını açıqlayan örnəklərdən biridir.

"Qutadğu bilig"in dili, poetikası haqqında çox danışmaq olar. Əsər xan dili deyə adlandırılan Kaşqar-Xaqaniyyə ləhcəsində yazılmışdır. Qaraxanın dövlət dili kimi sabitləşməyə başlayan ədəbi dilin kamil örnəyi kimi "Qutadğu bilig" diqqəti çəkir. Bu yeni Orta Asiya türk ədəbi dili qrammatik sabitliyi və normativliyi ilə lüğət tərkibinin dolğunluğu, zənginliyi ilə ortaya çıxır. Bu epik əsər türk dilinin şüurlu münasibətlə seçilən əsərlərindən biridir. Əsərdə doğma dilə, dövlət dilinə o qədər böyük bir sevgi var ki, heyrətlənməyə bilmirsən və istər-istəməz anlayırsan ki, dövlət və Vətən sevgisi elə ana dilindən başlayır. Və ana dilinə dövlət ölçüləri ilə yanaşma, dəyərləndirmə milli təfəkkürün başında gəlir. Şair yazır:

Keyik taġı gördüm bu türkcə sözüq,
Arı akrı tutqım yakardım ara.
Sıkadım sevittim könül birdi terk,
Taki ma belınlər birerde yirə.
Sunuq tutmışımça edərdim sözüq,
Key birdi ötrü yıpardı bura.
"Bu türkcə sözü çöl ceyranı kimi gördüm,
Onu yavaşca tutdum, tovlayıb özümə çəkdim.
Oxşadım, sevdim, mənə tezcə könül verdi,
Yenə də arabir (məndən) hürküb çəkinir.
Elə keçincə sözün ardınca düşdüm,
Onun müşki gözəl ətirlər saçmağa başladı".

Məcazi üsulla sevgisini bəyan edən şairin dil ustalığı, nitq mədəniyyəti, danışıq sənəti, dil və düşüncə haqqındakı fikirləri də çox maraqlıdır.

"Qutadğu bilig"də 9 saitli vokal sisteminə malikdir[1]. Əsərin çox zəngin morfoloji və sintaktik xüsusiyyətləri var. Xüsusən mürəkkəb cümlələrin müxtəlif növləri və qrammatik vasitələrin çoxçeşidliyi diqqəti cəlb edir ki, bu da yetkin yazılı dil normalarının formalaşmasına dəlalət edir[2].

"Şahnameyi-türk" adlanan "Qutadğu bilig" çox maraqlı poetik quruluşa malikdir. Əsər məsnəvi formasında epik mənzumədir. 6645 beytdən ibarət bu əsərdə 124 beyt həcmində üç parça və 173 də dördlük var. Kitaba sonda əlavə edilən 77 beytdən ibarət mənzum müqəddimə də var. Bəzən əsərin heca

[1] Əsərin dil xüsusiyyətləri haqqında ətraflı bax: A. Dilaçar. Kutadgu Bilig incelemesi, Ankara, 1972. Saitlərin uzanması yeni leksik vahid yarada bilir. Türk mənşəli sözlərdə f, v, c samitləri işlənmir. "Orxon-Yenisey" abidələri və M.Kaşğari "Divan"ına nisbətən alınma sözlər çoxdur ki, bu da kitabın mahiyyəti ilə bağlıdır.

[2] Bax: Г.А.Абдурахманов. Исследование по старотюркскому синтаксису (XI век), М., 1967.



vəznində yazıldığı iddia edilsə də, bu böyük epik mənzumə əruz vəznində - kəsik (qısa) mütəqarib vəznində yazılmışdır. FA'ülün FA'ülün FA'ülün FA'ül təfiləsi "Şahnamə" vəzni kimi Şərqdə məşhurdur.

Budda, manixey, xristian kitabları islamın qəbulundan sonra tezliklə unudulmağa başladı ki, bunun poetik baxımdan ən tutarlı örnəyi "Qutadğu bilig"dir.

Əsərin lüğət tərkibi, əsasən, türkmənşəli sözlərdən ibarətdir. Türk dilinin fonoloji quruluşuna çox da uyğun olmayan bu vəzndə klassik əsər yazan Yusif Xas Hacib böyük sənətkarlıq nümayiş etdirmişdir. Bu ənənə türk xalqlarının anadilli klassik poeziyasında, xüsusən Əhməd Yuqnəki, Əhməd Yasəvi, Yunus İmrə, Nəsimi, Rəbquzi, Əlişir Nəvai, Zahirəddin Babur, Qazi Bürhanəddin, Xətai, Sultan Vələd, Aşiq Paşa, Füzuli... yaradıcılığı üçün nəhəng rolunu oynamışdır. Bayatı, mani qoxulu dördlüklər türk dilinin öz təbii axarını əks etdirmək baxımından maraqlıdır.

Əsərin çox zəngin qafiyə sistemi vardır. Alliterasiya, anafora, epifora zənginliyi türk şeir dilinin potensialını reallaşdırmaq baxımından diqqəti çəkir. Ümumən, əsərdə türk dilləri üçün, xüsusən poetik dil üçün səciyyəvi olan təkrarlar sistemi mühüm rol oynayır.

Əsərin məcazlar sistemi daha çox türkcədir və ərəb-fars ədəbiyyatının güclü təsirinə nisbətən az uğrayıb. Dialoji üslub, didaktik deyim tərzi, yeri gəldikcə rəsmi-publisist boyalar əsərin bədii poetik siqlətini zəiflətməmiş, əksinə, onu daha da zənginləşdirmişdir. İstifadə olunan frazeoloji birləşmələr, atalar sözləri və zərb-məsəllər əsərin dilində xəlqiliyi gücləndirmişdir.

"Qutadğu bilig" türk şeir sənətinin ilk böyük qalalarından biridir ki, bu qalasız zəngin türk klassik poeziyasını təsəvvür etmək qeyri-mümkündür[1].

* * *

Orjinalla yanaşı, çağdaş türk və özbək dilinə tərcümə mətnindən geniş istifadə etdiyimiz "Qutadğu bilig"in elmi-tənqidi nəşrinin də hazırlanması zərurəti meydana çıxmışdır. Bu, böyük abidə ilə Azərbaycan oxucusunun ilk böyük görüşüdür. Azərbaycan elm adamlarının, gənclərinin ehtiyacı olan bu nəşrdən sonra şeirlə tərcümə və elmi-tənqidi mətn hazırlama mərhələsi gəlir. İnşallah, inanırıq ki, əziz oxucularımızın "Xoşbəxtliyə aparan elm"lə - "Qutadğu bilig"lə görüşü hər kəsə bir mənəvi rahatlıq, daxili xoşbəxtlik gətirəcək.

"Qutadğu bilig" insana, insan dəyərlərinə səsləyən bir çağırışdır. Milli dövlət, azad dövlət müqəddəsdir. "Qutadğu bilig" bu müqəddəsliyin 1000 il bundan öncəki himnidir, sevgidir, hörmətdir, ədalətdir, inam və imandır.

Allah xalqımızın imanını kamil eləsin! İslamın bayrağı ucalardan uca olsun! Tanrı türkü qorusun! Amin!

***Kamil Vəliyev***
***Ramiz Əskər***

[1] И.В.Стеблева. Развитие тюркских поэтических форм в XI веке. М., 1971.

*Xoşbəxtliyə aparan elm*

# QUTADĞU BİLİG

## A

*Bismillahir-rəhmanir-rəhim*

Həmdü səna, minnət və sonsuz tərif o böyüklük sahibi və tam qüdrətli padşah olan hörmətli və cəlallı Tanrıya məxsusdur, Yeri-göyü o yaratmış, bütün canlılara ruzi vermişdir. O nəyi dilədisə, – etdi, nəyi istəsə yaradır. *Yəf'alu-l-lahu ma yəşa və yəhkumu ma yurid*[1]. Yenə sonsuz səlam xilqətin ən yaxşısı, peyğəmbərlərin seçilmiş və böyük rəsulu Məhəmməd Mustafa ilə onun yoldaşlarına – əziz və möhtərəm səhabələrinə, *Rizvanüllahi əleyhim əcmain*[2].

Bu kitab çox əziz bir kitabdır. Çin hakimlərinin hikmətləri, Maçin alimlərinin şeirləri ilə bəzənmişdir. Bu kitabı oxuyan və beytləri başqalarına bildirən şəxs kitabın özündən də yaxşı və əzizdir. Çünki Çin, Maçin alimləri və hakimləri bu fikrə şərikdirlər ki, Məşriq vilayətində, cəmi Türküstan ellərində Buğra xan dilində, türk ləhcəsincə bu kitabdan yaxşısını heç kim yazmamışdır. Bu kitab hansı padşaha, ya hansı iqlimə çatdısa, fövqəladə və nəhayətsiz gözəl olduğu üçün o ellərin hakimlərin və alimləri tərəfindən qəbul olundu və hər biri ona dürlü ad və ləqəb verdilər. Çinlilər "Ədəbül-mülük" adı verdilər. Maçin məlikinin hakimləri "Ayinül-məmləkət", məşriqlilər "Zinətül-üməra" dedilər. İranlılar "Şahnameyi-türki", bəziləri də "Pəndnameyi-müluk" adlandırdılar. Turanlılar isə "Qutadğu bilig" dedilər. Bu kitabı təsnif edən Balasaqun şəhərində doğulmuş dindar və mömin bir şəxsdir. Amma bu kitabı Qaşqar elində tamamlayıb, Tabqaç Buğra xan hüzuruna çıxarmışdır. Məlik Buğra xan da onu ağırlayıb-əzizləyib və Xas Hacibliyini ona vermək lütfündə bulunmuşdur. Onun üçün də Yusif Ulu Xas Hacib adı və sanı dünyaya yayılmışdır.

Bu əziz kitab dörd ulu və ağır təməl üstündə bina tutmuşdur. Birincisi ədalət, ikincisi dövlət, üçüncüsü ağıl, dördüncüsü isə qənaətdir. Müəllif bunların hərəsinə türkcə birər ad vermişdilər. Ədalətə Gündoğdu Elik (hökmdar – *tərc.*) adını verərək, onu padşah mərtəbəsində tutmuşdur. Dövlətə Aydoldu adını verib, vəzir məqamına qoymuşdur. Ağıllı Öyüdülmüş adlandırıb vəzirin oğlu və qənaətə Odqurmuş adını verib, vəzirin qardaşı hesab etmişdir. Müəllif öz fikirlərini onlar arasında sual-cavab şəklində ifadə etmişdir ki, oxuyanın könlü açılıb müəllifi xeyir-dua ilə yad etsin.

[1] Nəyə qəsd qılsa – edər, nəyə ixtiyar qılsa – hökmü çatar.
[2] Cəmisinin üzərinə Allahın razılığı ata olsun.

## B

[1] Qadir və yeganə olan Tanrı hamıdan üstündür,
Ona çoxlu şükürlər olsun.
[2] O, ululuq yiyəsidir, qadir və cəlallıdır,
Yaradan, törədən qüdrətli və kamildir.
[3] Yerin və göyün, xilqətin sahibidir,
Hamıya ruzi yaratmışdır, sən də gülə-gülə ye.
[4] Fərq qoymadan hər kəsə ruzisini verər,
Hamının yedirər, ancaq özü yeməz.
[5] O heç bir canlını ac qoymaz,
Xəlq etdiklərinin hamısını yedirər, içirər.
[6] O, nə istəsə, o şey olar,
Kimi istəsə, onu da ucaldar.
[7] O seçilmiş rəsula salamlar olsun,
Onun əshabələrinə salam və ehtiram olsun.
[8] Məhəmməd peyğəmbər xilqətin başıdır,
O, xilqətin gözü üstündə qaşıdır.
[9] Bu kitab çox əziz bir kitabdır,
Qananlar üçün elm dəryasıdır.
[10] Dəyərli biliklərlə bəzənmişdir,
Sənə yalnız şükür və qənaət etmək qalır.
[11] Bunların hamısına hikmətli sözlər
İnci kimi sıra ilə düzülmüşdür.
[12] Məşriqin hökmdarı, Maçinin ağası,
Elmlilər, biliklilər, dünyanın yaxşıları.
[13] Hamısı bu kitabı alıb oxumuş,
Xəzinə içində gizlətmişlər.
[14] Kitab atadan oğula miras kimi çatar,
O da özündə saxlayıb, başqasına verməzmiş.
[15] Bu, faydalı, ziyansız kitabdır,
Ancaq bəzi türklər onun mənasını anlamaz.
[16] Hər oxuyan-yazan onu anlamaz,
Onu ancaq oxuyub duyan başa düşər.
[17] Kitabın sözləri hər adamın bələdçisidir,
Hər iki dünyada işi sahmana salandır.
[18] Bütün Çin və Maçin hakimləri
Kitabın gözəlliyini tərif etmişlər.
[19] Türk, Çin və bütün Məşriq ellərində,
Bütün dünyada buna tay kitab hanı?
[20] Kitabın qədrini bilənlər bilər,
Ağılsız adamdan nə gözləyərsən?
[21] Hər adama kitab vermə,
Dostun ola belə, etibar etmə.
[22] Çünki cahil onun qiymətini anlamaz,
Anlayan adam onu geri qaytarmaz.
[23] Müəllif bu kitabı Buğra xan zamanında
Xanın ləhcəsilə nəzmə çəkmişdir.
[24] Belə bir əsəri hələ heç kəs yazmamışdır,
Bundan sonra da çətin ki, yazsın.
[25] Belə bir kitab yaza biləcək adam varmı?
Varsa, mən onu öyərəm.
[26] Hər ölkədə, hər şəhərdə, hər sarayda,
Bu kitaba müxtəlif adlar verilmişdir.
[27] Hər ölkənin hakimi yerli qaydaya görə,
Bu kitabı başqa cür adlandırmışdır.
[28] Çinlilər ona "Ədəbül-müluk" deyirlər,
Maçinlilər onu "Ənisül-məmalik" adlandırırlar.
[29] Məşriq elindəki ulular isə,
Ona "Zinətül-üməra" deyirlər.
[30] İranlılar ona "Şahnamə",
Turanlılar isə "Qutadğu bilig" söylərlər.
[31] Bax, müxtəlif ölkələrdə, müxtəlif dillərdə,
Ona necə adlar vermişlər.
[32] Bu kitaba ad qoymuş ulu qulları
Allah özü bağışlasın.
[33] Ey bu kitabı qəbul edən,
Bu türkcə əsərə heyrətlə baxan,
[34] Bu kitab hamıya xeyir verər,
Məliklərə, xüsusilə, faydalı olar.
[35] Ölkəni kimlər idarə edir,
Onlara nələr lazımdır,

[36] Hökmdarlar nədən qorunmalı,
Hökmdarlığın şərtləri nələrdir,
[37] Dövlətin xarab və baqi olması nədəndir,
Hakimiyyət necə gəlib-gedir,
[38] Ordu, əsgər, at necə yığılır,
Harda toplanır, səfərə necə çıxır,
[39] Bütün bunları bu kitab açmış,
Hər şeyi yerbəyer, təyin etmişdir.
[40] Məmləkəti əlində möhkəm tutan adam,
Hər işi o işin ustasına tapşırmışdır.
[41] Ay necə çıraq kimi yolu işıqlandırırsa,
Hər bir iş üçün də uyğun adam lazımdır.
[42] Hökmdarın xalq üzərində haqqı olduğu kimi,
Xalqın da onun üzərində eyni dərəcədə haqqı vardır.
[43] Rəiyyət onun hüququnu qəbul etməli,
Hökmdar da rəiyyətin malını və canını qorumalıdır.
[44] Hökmdarın necə savaşa girməsini,
Ordusunu necə düzməsini,
[45] Zəfər üçün quracağı hiylələri,
Bu kitab bildirər.
[46] Hökmdar necə hərəkət etməlidir ki,
Xalq da ona elə itaət etsin,
[47] Belə məliki xalqı sevər,
Üzünü görməyə can atar.
[48] O, uğurlu olanları yaxına buraxmalı,
Kim "uğursuzdur" özündən uzaqlaşdırmalıdır.
[49] Kimi özünə bağlayıb yaxın tutmaq lazımdır,
Kimi "pisdir" deyə iraq tutmaq lazımdır,
[50] Necə baş kəsməli, siyasət işlətməli,
Necə könül almalı, fərasət göstərməli,
[51] Hökmdar necə bilikli, igid və ürəkli olmalıdır ki,
Xəzinəni ağzınadək doldurub axıtsın.
[52] Hökmdar rəiyyət üzərində nə qədər hökmlü olsa,
İşləri də o qədər rahat və yaxşı olar.
[53] Mən bu məsləhətləri sənə vəsiyyət kimi verirəm,
Sən də mənə dua etməyi unutma.
[54] Diqqətlə bax ki, bu kitabı yazan şəxs
Kişilər içində bir hünərli kişi imiş.

[55] Bu cür fəzilət və məziyyətlərlə
O özünü bəzəmiş insan imiş.
[56] Düzlük, hörmət və möminlik kimi
Təmizlik və alimlik də ona xas imiş.
[57] Yaşadığı yer Quz-Ordu eli imiş,
Əsil-nəcabətli, şirindil imiş.
[58] Öz elindən çıxıb gedən zaman,
Kitabını qoşub tamamlamışdı.
[59] Əsas qismini yazıb nizama salmış,
Kitab son şəklini Qaşqar elində almışdır.
[60] Bu xanlar xanı Tabqaç Qara Buğra xan,
Hüzurun əsərini oxumuşdur.
[61] Hökmdar ona xələt vermiş,
"Qələmin haqqıdır" deyə hörmət göstərmişdir.
[62] Müəllifə Xas Hacib adını vermiş,
Onu yaxın adamları sırasına almışdır.
[63] Buna görə müəllifə hörmət edirlər,
Ona Yusif Xas Hacib deyirlər.
[64] Yenə bu kitabın içindəkilər söylənir
Və bunlar dörd möhkəm təməl üstdə qurulur:
[65] Birincisi ədalətdir ki, doğruluq üzərindədir,
İkincisi dövlət olub, səadət və iqbal deməkdir.
[66] Üçüncüsü ağıl olub ululuğu bildirir,
Dördüncüsü isə qənaət və salamatlıqdır.
[67] Bunların hər birinə ad vermiş və
Onları belə adlandırmışdır:
[68] Ədalətə Gündoğdu adını verir və
Onu hökmdar mərtəbəsinə qoyur.
[69] Dövləti Aydoldu adlandırır,
Onu vəzir məqamında tutur.
[70] Ağıla Öydülmüş adı vermiş,
Özünü də vəzirin oğlu hesab etmişdir.
[71] Qənaətə Odqurmuş adını verərək
Vəzirin qohumu sayır.
[72] Bunun hikməti, bax, bu dörd təməl üzərindədir,
Bunları tənzim edərək kitabı tamamlamışdır.
[73] Ərəbcə və farsca kitablar çoxdur,
Bizim dilimizdə isə hikmətli kitab ancaq budur.

74 Kitabın hörmətini ancaq bilikli adamlar bilər,
Biliyin qiymətini də yalnız onlar başa düşərlər.
75 Türkcə bu şeirləri sənin üçün düzdüm,
Ey oxucu, oxuyaraq mənə dua et.
76 Mən dünyadan gedirəm, məni eşit,
Kitabdan ibrət al, gözünü aç.
77 İlahi, sən özün bizi bağışla,
Bütün möminlərə şəfqətini nəsib elə.



## C

## FƏSİLLƏRİN ADLARI

I fəsil. Əziz və ulu Tanrının mədhini bəyan edir.

II fəsil. Ulu peyğəmbərimiz Məhəmməd Mustafanın mədhini bəyan edir.

III fəsil. Peyğəmbərimizin dörd əshabəsinin mədhini bəyan edir.

IV fəsil. Yaz fəslinin və Buğra xanın mədhini bəyan edir.

V fəsil. Yeddi səyyarə və on iki bürcü bəyan edir.

VI fəsil. İnsan oğlunun qədir-qiymətinin bilik və anlayışla ölçüldüyünü bəyan edir.

VII fəsil. Dilin məziyyət və qüsurunu, xeyir və zərərini bəyan edir.

VIII fəsil. Kitab sahibi öz üzrünü bəyan edir.

IX fəsil. Yaxşılıq etmək barədə öyüd və nəsihət verir.

X fəsil. Biliyin, idrakın və hünərin faydasını bəyan edir.

XI fəsil. Kitabın adını, məzmununu və öz qocalığını bəyan edir.

XII fəsil. Davranış və hərəkət pozuqluğunun zərərini bəyan edir.

XIII fəsil. Sözbaşı. Gündoğdu Elikin – ədalətin vəsfini bəyan edir.

XIV fəsil. Aydoldunun Gündoğdu Elikin xidmətinə gəlməsini bəyan edir.

XV fəsil. Aydoldunun Gündoğdu Elikin hüzuruna çıxmasını bəyan edir.

XVI fəsil. Aydoldu Elikə özünün səadət olduğunu bəyan edir.

XVII fəsil. Dövlətin vəsfini və təbiətinin vəfasızlığını bəyan edir.

XVIII fəsil. Gündoğdu Elikin Aydolduya öz-özünü göstərdiyini bəyan edir.

XIX fəsil. Gündoğdu Elik Aydolduya ədalətin vəsflərinin necə olduğunu bəyan edir.

XX fəsil. Aydoldunun Elikə sual verdiyini bəyan edir.

XXI fəsil. Elikin Aydolduya cavabı.

XXII fəsil. Dilin ərdəmini və faydalarını bəyan edir.

XXIII fəsil. Vəzir Aydoldunun sualı və Elikin cavabı.

LXXVII fəsil. Öydülmüş Elikə Odqurmuşun xəstələndiyini bəyan edir.

LXXVIII fəsil. Öydülmüşün qardaşının yanına getdiyini bəyan edir.

LXXIX fəsil. Öydülmüşün Odqurmuşa yas tutduğunu bəyan edir.

LXXX fəsil. Ömrü boşa keçirdiyinə peşman olduğunu bəyan edir.

LXXXI fəsil. Yusifin gəncliyinə acıyaraq qocaldığını bəyan edir.

LXXXII fəsil. Zəmanənin xarab olduğunu, dostların vəfasızlığını bəyan edir.

LXXXIII fəsil. Kitab sahibi özünə nəsihət edərək öz üzrünü bildirir.



Ç

*Bismillahir-rəhmanir-rəhim*

I

## ƏZİZ VƏ ULU TANRININ MƏDHİNİ BƏYAN EDİR

1 Tanrının adı ilə sözə başladım,
O, yaradan, yetirən və köçürən rəbbimdir.
2 Vahid Tanrıya minlərcə şükür olsun ki,
Onun üçün fənalıq yoxdur.
3 Qara yeri, mavi göyü, günəşi, ayı və gecə ilə gündüzü,
Xilqəti, zamanla zəmanəni o yaratmışdır.
4 O, bütün varlıqları dilədi və yaratdı,
Bircə dəfə "Ol!" dedi, dedikləri oldu.
5 Bütün xilqət ona möhtacdır,
Möhtac olmayan yalnız özüdür, O, yeganədir.
6 Ey qüdrətli, qadir, əbədi Tanrı,
Səndən başqasına bu ad yaraşmaz.
7 Ululuq və böyüklük yalnız sənə məxsusdur,
Sənə tay və bərabər kimsə yoxdur.
8 Ey bir olan, sənə şərik yoxdur,
Hər şeydən əvvəl və sonra sən varsan.
9 Sənin birliyin hesaba gəlməz,
Sənin qüdrətin hər şeyə çatar.
10 Şübhəsiz, sən təksən, istisnasan, ey sonsuz Tanrı,
Müstəsna isə sıraviyə qarışmaz, qatışmaz.
11 Ey batini və zahiri bilən, ey həqqül-yəqin,
Gözdən iraq olsan da, könlünə yaxınsan.
12 Parlaq gün və ay kimi varlığın bəllidir,
Ancaq sənin necəliyini qavramaq üçün könül və ağıl acizdir.

[13] Sənin birliyin əşya ilə ölçülməz,
Əşyanı sən yaratmısan, onlar sənindir.
[14] Bütün xilqəti sən yaratmısan,
Varlıq fanidir, sənsə əbədisən.
[15] Yaradana yaranmışlar şahiddir,
Yaranmış iki yaradan birin şahididir.
[16] Onun oxşarı və bənzəri yoxdur,
Necəliyini məxluqun ağlı idrak etməz,
[17] Nə yeriyər, nə yatar, hər zaman oyaqdır,
Bənzəməz, müqayisə olunmaz, təsəvvür edilməz.
[18] Nə arxada, nə öndə, nə solda, nə də sağdadır,
Nə altda, nə üstdə, nə də ortadadır.
[19] Yeri o yaratdı, bu barədə danışmaq artıqdır,
Bunu bil ki, onsuz da yer yoxdur.
[20] Ey sirrə yaxın, ey könül üçün yeri uca olan,
Bütün surət və şəkillər sənə şahiddir.
[21] Minlərcə saysız-hesabsız canlını,
Çölü, dağı, dənizi, təpə və dərələri sən yaratdın.
[22] Yaşıl göyü tümən ulduzla bəzədin,
Qaranlıq gecəni parlaq gündüzlə işıqlatdın.
[23] Uçan, qaçan və duranlar,
Diriliyi səndən alıb yeyib-içərlər.
[24] Yüksək ərşdən altdakı torpağa qədər
Hər şey sənə möhtacdır, ey Tanrım.
[25] Ey vəhdətə inanan, onu dilinlə öy,
Könlünün inamı varsa, ağlı işə qarışdırma.
[26] Necəliyini arama, könlünü dinlə,
Varlığına inan, rahatlığa qovuş.
[27] Necəyə, nə cürə girmə, özünü saxla,
Necəsiz, nə cürsüz bil, sözünü uzatma.
[28] Ey rəbbim, sən bu möhtac qulunun
Bütün günahlarını şəfqətlə bağışla.
[29] Sənə sığınmışam, pənahım sənsən,
Çətin yerdə əlimdən tut.
[30] Məhşər günü məni sevimli peyğəmbərlə birlikdə dirilt,
Qoy mənim üçün o, şəfaət diləsin.



[31] Onun dörd əshabəsinə min-min salam,
Fasiləsiz surətdə ehtiram ərz et.
[32] Ulu gündə onların üzünü mənə göstər,
Xoş sözlərlə əlimdən tutsunlar.
[33] Səni olduğun kimi vəsf edə bilmirəm,
Səni sən mədh et! Sözüm kəsildi.

## II

## ULU PEYĞƏMBƏRİMİZ MƏHƏMMƏD MUSTAFANIN MƏDHİNİ BƏYAN EDİR

[34] Xalqın ən seçilmişi, adamların ən yaxşısı,
Sevgili peyğəmbəri rəbbim göndərdi.
[35] Qaranlıq gecədə o, xalq üçün məşəl idi,
Ətrafa işıq saçdı, səni də nura boyadı.
[36] O, Tanrının sənə göndərdiyi dəvətçi idi,
Onun sayəsində doğru yola girdin, ey qəhrəman.
[37] O, atasını, anasını fəda etdi,
Yeganə diləyi ümməti idi, ona yol göstərdi.
[38] Bax, gündüz yemədi, gecə yatmadı,
Tanrıdan ancaq səni istədi.
[39] Gecə-gündüz zəhmətlə səni istədi,
İndi sən onu öy, xeyir-dua istə.
[40] Bütün ümməti üçün qayğı çəkərdi,
Onun qurtuluşunu diləyirdi, rahatlığını istəyərdi.
[41] Atadan, anadan daha mərhəmətli idi,
Tanrıdan ancaq şəfqət dilərdi.
[42] Xalqının üstündə Tanrının rəhməti idi,
Əməlisaleh, qılıqlı insan idi.
[43] Xoşməcaz, safürəkli və xoşrəftar idi,
Həya sahibi, şəfqətli, səxavətli, əliaçıq idi.
[44] Qara yerdə də, mavi göydə də əziz idi.
Tanrı ona çox qiymət verirdi.
[45] O, bütün başçıların başçısı idi,
Bütün rəsullara da o, hatəm oldu.

46 Mən onun yoluna könüldən bağlandım,
Bütün dediklərinə inandım və sözünü tutdum.
47 İlahi, mənim könlümün səsini dinlə,
Məhşər günü məni sevimli peyğəmbərlə birlikdə dirilt.
48 Qiyamətdə dolu ay kimi üzünü göstər,
İlahi, onu mənə şəfaətçi et.

## III

## PEYĞƏMBƏRİMİZİN DÖRD ƏSHABƏSİNİN MƏDHİNİ BƏYAN EDİR

49 Onlar rəsulun sevdiyi dörd yoldaşı idi,
Yanındakı məsləhətçiləri bunlar idi.
50 İkisi qayınatası, ikisi damadı idi,
Onlar xalqın ən yaxşıları idi.
51 Başda hamıdan əvvəl Atiq[1] gəlirdi,
Tanrıya bağlı idi, qəlbi və dili düz idi.
52 Malını, cismini və canını fəda etdi,
Ancaq peyğəmbərin rəğbətini istəyirdi.
53 Sonra insanların yaxşısı Faruq[2] gəlirdi.
Onun dili və könlü bir idi.
54 Həqiqi dininköməkçisi və dayağı idi,
Şəriətin üzündən pərdəni o qaldırmışdır.
55 Sonra həya sahibi Osman gəlirdi.
Xoş xasiyyət, mərd və səxavətli idi.
56 O, malını və özünü fəda etdi,
Peyğəmbər on iki qızını verdi.
57 Ondan sonra Əli gəlirdi,
O, comərd, cəsur, igid və ağıllı idi.
58 Onun əli açıq idi, qəlbi saf idi.
Özü bilikli, mömin, adı böyük idi.
59 Onlar dinin və şəriətin təməli idilər,
Kafir və nifaqçıların yükünü onlar daşıdılar.
60 Bu dörd yoldaş mənim nəzərimdə dörd ünsürdür,
Ünsürlər düz düzülsə, həyat yaranar.

[1] Atiq – xilaskar deməkdir. Xəlifə Əbubəkrin adlarından biridir.
[2] Faruq – fərq edən deməkdir. Xəlifə Ömərin adlarından biridir.



61 Məndən onlara min alqış və salamı,
Rəbim, sən fasiləsiz yetir.
62 Onları həmişə məndən razı sal,
Ulu gündə mənə şəfaətçi olsunlar.

## IV

## YAZ FƏSLİNİ VƏ BUĞRA XANIN MƏDHİNİ BƏYAN EDİR

63 Gündoğandan əsib gəldi bahar yeli,
Dünyanı bəzəyərək cənnət yolunu açdı.
64 Kafur getdi, qara yel müşk ilə doldu,
Dünya gözəlliyini göstərmək üçün bəzənmək istər.
65 Yaz yeli əziyyətli qışı süpürüb apardı,
Parlaq yaz yenə səadət yayını qurdu.
66 Günəş yenə öz yerinə qayıtdı,
Balıq[1] quyruğundan Quzu[2] burnuna döndü.
67 Qurumuş ağaclar yaşıla büründü,
Al, sarı, göy, qızıl rənglə bəzəndi.
68 Qara yel üzünə yaşıl tər çəkdi,
Sanki xətay karvanı onun üstünə Tabqaç qumaşı yaydı.
69 Dağ, çöl, düz, dərə döşəndi bütün,
Yamaclar və vadilər al-göy bəzəndi.
70 Gülərək min-min çiçək açıldı,
Dünya kafur və müşk ətrilə doldu.
71 Qərənfil qoxulu səba yeli əsdi,
Bütün dünya müşk-ənbər ətrinə büründü.
72 Qaz, ördək, qu və qılquyruq
Çığırışaraq ətrafda qaynaşırlar.
73 Bax, biri uçur, biri qonur,
Biri qaçır, biri də su içir.
74 Göydə məğrur durnanın səsi əks-səda verir,
Düzülmüş dəvə karvanı kimi uçurlar.

[1] Balıq – 12 bürcdən biridir. Klassik adı hutdur. Günəş 19 fevral – 20 mart arası bürcdə olur.
[2] Quzu – 12 bürcdən biridir. Klassik adı həməl, müasir adı qoç bürcüdür. 21 martda, qısa illərdə 20 martda günəşin həmin bürcə daxil olması ilə yaz fəsli başlanır.

75 Gənc qız sevdiyi oğlanın çağıran kimi
Erkək kəklik ün salıb dişisini çağırır.
76 Kəklik gülməkdən bayılırmış kimi ötdü,
Ağzı qızıl qan rəngdə, qaşı qapqaradır.
77 Qara çumğuq uzun dimdiyi ilə ötür,
Səsi ərgən qız səsi kimi qəlbə yatır.
78 Çiçəklikdə bülbül min səslə cəh-cəh vurur,
Sanki gecə-gündüz suri-İbri oxuyur.
79 Əliklər çiçəklər üstündə oynaşırlar,
Keyiklər isə sıçraşıb-qaçışırlar.
80 Göylər qaşını çatdı, gözündən yaş səpir,
Çiçək üzünü açdı, gülməkdən uğunur.
81 Bu zaman dünya özünə bir nəzər qıldı,
Güvənib-sevinib əyninə baxdı.
82 Mənə baxaraq dünya sözə başladı:
– Bu xaqanın üzünü görmədinmi?
83 Əgər yatırdınsa, dur, gözünü aç,
Eşitməmisənsə, bu sözü dinlə.
84 Min ildi dul idim, rəngim solmuşdu,
Dul libasını soyunub, ağ gəlin paltarı geymişəm.
85 Bəzəndim, çünki ulu xaqan mənim bəyim oldu,
Diləyim budur ki, canım ona fəda olsun.
86 Bulud kükrədi, növbə təbilini vurdu,
Şimşək çaxdı, sanki xaqan tuğunu çəkdi[1].
87 Biri qından çıxsa, ölkələr tutar,
Biri ad-sanını dünyaya yayar.
88 Dünyanı tutdu ulu Tabqaç Buğra xan,
Adı hər iki cahanda əziz olsun.
89 Ey dinin izzəti, ey dövlətin dayağı,
Ey millətin tacı, şəriətin dirəyi,
90 Nə ki diləyin vardı, Tanrı verdi,
Bundan sonra da sənə arxa və kömək olsun.
91 Ey dünyanın bəzəyi, uluğun zinəti,
Ey mülkün nuru, ey səadəti cilovlayan,

[1] Tuğ qədim türk dilində bayraq deməkdir. Bu söz "Orxon-Yenisey" abidələrində, "Divani-lüğət-it-türk"də də vardır.



92 Dövran sənə hökmdarlıq və taxt verdi,
Tanrı bu taxtını – baxtını əbədi etsin.
93 Xaqan taxta çıxanda dünya dinclik tapdı,
Ona görə dünya ona qiymətli bəxşişlər göndərdi.
94 Əsirlikdən gələn səma quşları,
Kimisi rayi-hindi, kimisi qeysəri,
95 Nəğmələri ilə yarışaraq adını anır,
Sevinc və güvənc içində ötərlər.
96 Yerdə min bir çiçək, min bir mənzərə,
Çöl, dağ, vadi, dərə yaşıla-göyə bürünüb.
97 Kimisi ətriylə xidmətdə durur,
Kimisi gözəlliyi ilə qapı açır.
98 Kimisi əl uzadıb buxurdan tutur,
Kimisi müşk saçır, dünyanı ətrlə doldurur.
99 Kimisi gündoğardan min hədiyyə gətirir,
Kimisi günbatardan qulluğuna qoşur.
100 Səadət xidmətə gəlib qapında gözləyir,
Qapında duranlar qulluq üçün durur.
101 Dünya qulluq üçün beləcə hazırlaşdı,
Yağı boyun əydi, ortadan qalxdı.
102 Xaqanın adı-sanı dünyaya yayıldı,
Onu görməyən gözün yuxusu qaçdı.
103 Dünya dincəldi, qayda-qanun bərqərar oldu,
O öz adını qanunla yüksəltdi.
104 Kim mərd adam üzü görmək istəsə,
Qoy gəlib xaqanın üzünə baxsın.
105 Məsud, cəfasız, vəfalı görmək istəyən
Onun üzünü görsün, onun hər əməli vəfadır.
106 Zərər çəkmədən fayda almaq istəsən,
Gəl, ona xidmət et, könül ver, qızın.
107 Dürüst, xoşqılıq, təmizürəkli, şəfqətli adam axtarsan.
Gəl, onu gör, rahatlığa qovuş.
108 Ey əməlisaleh, əsil-nəsilli xaqan,
Dünya sənsiz olmasın.
109 Ey dövlətli hökmdar, Tanrı sənə səadət verdi,
Onun adını min dəfə çəkərək şükür etmək lazımdır.

110 Belə bir söz var ki, məsəldə gəlir:
Atanın yeri və adı oğula qalır.
111 Atanın yeri onun adı ilə birlikdə sənə qaldı,
Qoy bunlara mini də əlavə olunsun.
112 Min-min əl ona nadir hədiyyələr verdi,
Sən də "Qutadğu bilig"i hədiyyə et.
113 Onların hədiyyəsi gəldi-gedərdir,
*Mənimki isə əbədi qalandır.*
114 Dünyanın malı nə qədər çox olsa da, axırda qurtarar,
Söz isə dünya durduqca durar.
115 Xaqanın adı kitaba yazıldı,
Ey xoşbəxt hökmdar, bu ad əbədi qaldı.
116 Ya rəbb, sən onun dövlətini artır, diləyini hasil et,
Bütün işlərində ona arxa, kömək ol.
117 Onun sevdiyini sağ-salim et, düşmənini aradan götür,
Sevincini daimi qıl, kədərini yox et.
118 Yağmur yağsın, çiçəklər açılsın,
Qurumuş ağaclar tumurcuqlansın.
119 Fələk yenə çərxini fırlatsın,
Düşmənin başı həmişə aşağı əyilsin.
120 Qara yer mis-qızılı rəngə çalana qədər,
Od içində yaşıl çiçək açana qədər,
121 Qadir hökmdarın bir sevinci min olsun,
Paxılların gözü odda yansın.
122 Başqa nə arzusu, diləyi varsa,
Tanrı ona arxa, kömək olsun,
123 Sevinc, öyünc və güvənc ilə
Loğman qədər ömür sürsün.



V

## YEDDİ SƏYYARƏ VƏ ON İKİ BÜRCÜ BƏYAN EDİR

124 Tanrının adı ilə sözə başladım,
O yaradan, yetirən və köçürən rəbbimdir.
125 Necə dilədisə, aləmi elə yaratdı,
Dünya üçün günəş və ay da yaratdı.
126 Bax, yaratdı fələyi, çərxi daima dönür,
Onunla birlikdə həyat da davam edir.
127 Mavi göyü, üstündə ulduzları yaratdı,
Qaranlıq gecəni, parlaq gündüzü törətdi.
128 Göydəki ulduzların bir qismi bəzəkdir,
Bir qismi qılavuzdur[1], bir qismi yolgöstərəndir.
129 Bir qismi xəlayiqə işıq saçır,
Bir qismi qılavuzdur, itən yolu göstərir.
130 Bəziləri yüksəkdir, bəziləri alçaqdır,
Bəziləri parlaqdır, bəziləri sönükdür.
131 Bunlardan ən üstə Səkəntir[2] gəzir,
İki il səkkiz ay bir evdə[3] qalır.
132 Ondan sonra ikinci olaraq Onqay[4] gəlir,
O bir evdə on iki ay qalır.
133 Üçüncü olaraq Kürüd[5] gəlir, qəzəblə dolaşır,
Haraya baxsa, yaşıllıq quruyur.
134 Dördüncüsü Yaşıqdır[6], dünyanı aydınlaşdırır.
Yaxın gələni, qarşısına çıxanı nura boyayır.
135 Beşincisi, Sevitdir[7], sevimli üz göstərir,
Sənə sevərək baxsa, qəlbin sevinclə dolar.
136 Bundan sonra Arzu[8] gəlir ki,
Kim ona yaxınlaşsa, diləyinə, arzusuna çatar.

---

[1] Qılavuz bələdçi deməkdir.
[2] Səkəntir Zühalın türkcə adıdır. Latınca adı Saturndur.
[3] Bürc nəzərdə tutulur.
[4] Onqay Müştərinin türkcə adıdır. Latınca adı Yupiterdir.
[5] Kürüd Mərrixin türkcə adıdır. Latınca adı Marsdır.
[6] Yaşıq Günəşin türkcə digər bir adıdır.
[7] Sevit Nihad, yaxud Zöhrənin türkcə adıdır. Latınca adı Veneradır.
[8] Arzu, Ütaridin türkcə adıdır. Latınca adı Merkuridir.

137 Bunlardan ən altda Yalçıq[1] dolaşır,
Günəşlə üz-üzə gələndə bədirlənir.
138 Bunlardan başqa, on iki bürc var,
Bəziləri bir evli, bəziləri iki evlidir.
139 Quzu[2] – yaz ulduzu, sonra Ud[3] gəlir,
Ərəntir[4] Quçuqla[5] bir-birini itələyərək gəlirlər.
140 Bax, Aslanın[6] qonşusu Buğda başıdır[7],
Sonra Ülgü[8], Çayan[9] və yoldaşı Yay[10] gəlir.
141 Ondan sonra Oğlaq[11], Könək[12] və Balıq[13] gəlir,
Onlar doğanda göy üzü aydınlaşır.
142 Üçü yaz ulduzudur, üçü yay ulduzu,
Üçü payız ulduzu, üçü qış ulduzudur.
143 Bunlardan üçü od, üçü su, üçü yel,
Üçü torpaqdır, bunlardan dünya yaranıb.
144 Bunlar bir-birinə yağıdır,
Allah yağıya yağı çıxartdı, savaş kəsildi.
145 Uyuşmayan yağılar, barışdılar,
Görüşməyən yağılar öclərini ortadan götürdülər.
146 Hər şeyi nizamlayan Tanrı bunu da nizamladı,
Düzdü, tənzimlədi, barışdırdı.
147 İndi də insandan danışım,
Onun qiyməti bilik, ağıl və idrakdadır.

[1] Yalçıq, Ayın türkcə digər adıdır.
[2] Quzu, klassik adı Həməldir. Müasir adı qoç bürcüdür.
[3] Ud, klassik adı Surdur. Müasir dilimizdə buğa adlanır.
[4] Ərəntir, yaxud Ərəntiz – əski adı Cövza, müasır adı Ekizlərdir.
[5] Quçuq, klassik adı Sərətan, müasir dilimizdə adı Xərçəngdir.
[6] Aslan, klassik adı Əsəddir, müasir ədəbi dilimizdə Şir adlanır.
[7] Buğdabaşı, klassik adı Sünbülə, müasir adı Başaq və ya Qızdır.
[8] Ülgü, klassik adı Mizandır. İndi, əsasən, Tərəzi deyirik.
[9] Çayan, əski və müasir adı Əqrəbdir.
[10] Yay, klassik adı Qövsdür. İndi üç adı var: Yay Qövs və Kaman.
[11] Oğlaq, indiki adı da belədir. Klassik adı Cədidir.
[12] Könək, klassik adı Dəlv, indiki adı Dolçadır.
[13] Balıq, indi də Balıq bürcü adlanır. Klassik adı Hutdur.



## VI

## İNSAN OĞLUNUN QƏDİR-QİYMƏTİNİN BİLİK VƏ ANLAYIŞLA ÖLÇÜLDÜYÜNÜ BƏYAN EDİR

148 Tanrı insanı yaratdı, seçərək yüksəltdi,
Ona ərdəm, bilik, ağıl və idrak verdi.
149 Ona könül verdi, dilini açdı,
Ona qamət, qılıq və hərəkət bəxş etdi.
150 Ona bilik verdi, insan bu gün belə yüksəldi,
Ona idrak verdi, düyün açıldı.
151 Tanrı kimə ağıl, idrak və bilik verdisə,
O, çox yaxşılıqlara əlini uzatdı.
152 Biliyi böyük bil, idrakı ulu,
Bu iki şey yüksəldir seçilmiş qulu.
153 Bu sözə şahid kimi gəldi bu söz,
Bu sözü eşit və bu haqda sözünü kəs:
154 "Harda idrak olsa, orada ululuq olar,
Kimdə bilik olsa, o, böyük olar".
155 İdrakı olan dərk edər, biliyi olan bilər,
Bilikli və idraklı diləyinə yetişər.
156 Biliyin mənasını bil, bax gör bilik nə deyir:
"Bilik bilən ərdən xəstəlik iraq olar.
157 Biliksiz kişi həmişə xəstə olar,
Həkim sağaltmasa, o tezliklə ölər.
158 Yürü, ey biliksiz, xəstəliyini müalicə etdir,
Ey xoşbəxt alim, biliksizliyin əlacını söylə.
159 İdrak bir buruntaxtır[1], ər onu əlində tutsa,
Diləyinə, min arzusuna çatar.
160 İdrakın insana faydası çoxdur,
İnsan bilik bilsə, əziz olar.
161 Bütün iş-gücünü idrak ilə gör,
Əlinə keçən bu dövranı biliklə qoru".

[1] Buruntax və ya orijinalda olduğu kimi burunduq cilov, yüyən deməkdir. Müasir ədəbi dildə nadir hallarda işlənir, dialektlərdə tez-tez rastlanır.

## VII

## DİLİN ƏRDƏMİNİ, XEYİR VƏ ZƏRƏRİNİ BƏYAN EDİR

162 Dil ağıl və biliyə tərcümandır,
İnsanı nura boyayan dilin qədrini bil.
163 İnsanı dil qiymətləndirər, insan səadət tapar,
Dil insanı ucuz edər, dil ucundan baş gedər.
164 Bax, dil bir aslandır, astanada yatır,
Ev sahibi, diqqətli ol, başını yeyər.
165 Dilindən cəfa çəkən nə demiş, eşit,
Bu sözü unutma, yadında saxla:
166 "Dilim mənə çox əzab verir,
Kaş başımı kəsməsinlər, mən dilimi kəsərəm".
167 Sözünə diqqət elə, başın getməsin,
Dilini saxla, dişin sınmasın.
168 Bilikli bilik verdi dilə dair:
"Ey dil yiyəsi, başını qoru".
169 *Əgər salamat olmaq istəyirsənsə,*
Dilindən pis söz çıxarma.
170 Söz, bilərək söylənirsə, bilik sayılır,
Biliksiz söz öz sahibinin başını yeyir.
171 Çox sözdən heç bir fayda görmədim,
Danışmayan heç də lal deyildir.
172 Sözü çox uzatma, sözü az elə,
Min sözü düyününü bircə sözlə aç.
173 Kişi sözlə yüksəldi, sultan oldu.
Çox söz başı kölgə kimi yerə əydi.
174 Bilikli çox danışan adama "yanşaqladı" deyər,
Heç danışmayana da lal deyər.
175 Madam ki, belədir, orta yolu tut,
Orta yolu tutan kişi yüksələr.
176 Dilini qoruyan başını qoruyar,
Sözü qısa etsən, ömrünü uzadarsan.
177 Dilin zərəri də, faydası da var,
Aradabir öyülür, aradabir söyülür.
178 İndi ki, belədir, sözü bilib söylə,
Qoy sözün korlara göz olsun.



179 Biliksiz adam, şəksiz, kordur,
Ey biliksiz, yürü, bilikdən nəsibini al.
180 Bax, doğulan ölür, söz diri qalır,
Sözünü yaxşı söylə, ölməz ol.
181 İki şeylə insan qarınmaqdan qurtulur:
"Biri yaxşı əməl, biri yaxşı söz".
182 Bax, insan doğulur, ölür, sözü isə qalır,
Bax, insanın özü gedir, adı isə qalır.
183 Ey hakim, özünə dirilik diləsən,
Gərək işin və sözün yaxşı olsun.
184 Dili bu qədər öyməkdən, aradabir söyməkdən,
Məqsədim sənə sözün nə demək olduğunu başa salmaq idi.
185 Hər sözü gizləməyə ağıl tab etməz,
Kişi gərəkli sözü söylər, gizləməz.
186 Ey igid, mən bu sözü oğlum üçün söylədim,
O məndən aşağı dərəcədədir, mənlə necə tən gələr?
187 Ey oğul, bu sözləri mən sənə söylədim,
Ey oğul, sənə özüm nəsihət verdim.
188 Məndən sənə gümüş və altun qalsa,
Sən onları bu sözə bərabər tutma.
189 Gümüşü xərcləsən, axır qurtarar,
Sözümü xərcləsən, gümüş qazandırar.
190 Kişidən kişiyə söz miras kimi qalır,
Vəsiyyətimə qulaq assan, yüz qat qazanarsan,
191 Əgər mən öz üzrümü bəyan eləsəm,
Ey alim hakim, bu gün qaşını çatma.

## VIII

## KİTAB SAHİBİ ÖZ ÜZRÜNÜ BƏYAN EDİR

192 Diləyim söz idi, ey alim hakim,
Söylədim ki, məndən sonra gələnlərə qalsın.
193 İdrak gəldi, dedi: "Yaxşı bax,
Sözün yanlış olsa, sənə zərər verər.
194 Xalqın dili yavadır, səni dilə-dişə salar,
İnsan çox qısqancdır, ətini yeyər".

195 Baxıb gördüm bir az yüküm azaldı,
Öz-özümə dedim: "Sözü söylə, yükü tök".
196 Səbəbini sorsan, sənə deyim,
Ey cəsur igid, sözümü dinlə:
197 – Bu yalnğuq[1] adı insana yanıldığı[2] üçün verildi,
Yanılmaq yalnğuq üçün yaradıldı.
198 Mənə söylə, kim yanılmamışdır?
Deyim ki, minlərcə yanılmış var.
199 Bilikli azdır, biliksiz isə çoxdur,
Bil ki, idraksız çox, idraklı azdır.
200 Biliksiz biliklіyə yağı oldu,
Biliksiz biliklіyə qarşı vuruşur.
201 İnsandan insana çox fərq var,
Fərq bilikdədir, sözüm də bu haqdadır.
202 Bu sözümü bilikli üçün söylədim,
Biliksizin dilini heç özüm də bilmirəm.
203 Biliksiz ilə mənim heç bir işim yoxdur,
Ey bilikli, mən sənin qulunam.
204 Sözümü sənə çəkinərək söylədim,
Ona görə səndən üzr istədim.
205 Sözü söyləyən həm azar, həm də çaşar,
İdrak sahibi eşitsə, yanlışı düzəldər.
206 Söz buruntaxlı dəvə burnu kimidir,
Dişi dəvə boynu kimi haraya çəkilsə, oraya gedər.
207 Söz bilən və söyləyən adam çoxdur,
Mənim üçün sözü qanan adam əzizdir.
208 Bütün yaxşılıqlar biliyin faydasıdır,
Biliklə göyə də yol tapmaq olar.
209 Biliklə söylə hər sözünü sən,
Hər kəsin ancaq biliklə böyük olduğunu bil.
210 Mavi göydən endi qara yerə söz,
İnsan sözlə özünə qiymət qazandı.
211 İnsanın könlü dibsiz bir dənizdir,
Bilik inci kimi dənizin dibindədir.

[1] Yalnğuq – qədim türk dilində insan
[2] Yanğuluq – yanlışlıq. Müəllif bu beytdə söz oyunu yaratmışdır.



212 Kişi incini dənizdən çıxarmasa,
O, inci oldu, daş oldu – fərqi yoxdur.
213 Qara yer altındakı qızılın daşdan fərqi yox,
Əgər onu çıxarsalar, bəylərin başının bəzəyi olar.
214 Bilikli öz biliyini dili ilə meydana çıxarmasa,
İllərlə yatsa da, onun biliyi ətrafa işıq saçmaz.
215 İdrakla bilik çox yaxşı şeydir,
Əgər tapsan, onları işlət və göyə uç.
216 Nə deyir, eşit, bu elin bəyi,
İdraka, biliyə çatan kişi:
217 Dünyanı tutmaq üçün idrak gərəkdir,
Xalqa hakim olmaq üçün həm ağıl, həm də ürək lazımdır.
218 Dünyanı tutan idraki ilə tutdu,
Xalqa hökm edən buna ağılla nail oldu.
219 Apa[1] bu dünyaya cənnətdən bəri,
İdrak də gələrək qanun-qayda yaradıb.
220 Nə vaxt olursa-olsun, bu günə qədər
Ən uca yer biliklіyə qismət olmuşdur.
221 Pis adamın idrakla edam edirlər,
Xalq arasında qarşıqlıq biliklə ortadan qaldırılır.
222 Bu ikisi kar etməsə, biliyi qırağa qoy,
Qılıncı al olinə.
223 Hakimlər, alimlər, xalqın başçıları,
Biliksizin işini qılıncla həll etmişlər.
224 Dünyanı tutmaq üçün ərin idrakı,
Xalqı idarə etmək üçün isə biliyi olması vacibdir.
225 Kimdə bu iki sifət toplansa, o kamil insan olur,
Kamil insan dünyanın hər şeyinə nail olur.
226 Sən iki dünyanı arzu eləsən,
Bunun yeganə çarəsi yaxşılıq etməkdir.
227 Əgər sən yaxşılıq tapmaq istəyirsənsə,
Yürü, yaxşılıq et, başqa sözə nə hacət.
228 İnsan özü əbədi deyil, adı əbədidir,
Yaxşıların adı əbədi qalıb.
229 Özün əbədi deyilsən, adın əbədidir,
*Adın əbədi olsa, özün də əbədi olarsan.*

[1] Adəmin türkcə adı

IX

## YAXŞILIQ ETMƏK BARƏDƏ ÖYÜD VƏ NƏSİHƏT VERİR

230 Əlin uzun olub xalqa yetişsə, hakim olsan,
Həmişə sözlə, işlə yaxşılıq et.
231 İgidlik, gənclik qaçar, həyat uçar gedər,
Özün yuxu kimi dünyadan köçərsən,
232 Həyatını sərmayə elə, onun faizi yaxşılıqdır,
O, əvəzində sabah sənə yaxşı yemək və paltar verər.
233 Eşit gör kişilərin yaxşısı nə deyir:
"Canlıların hamısı axırda öləcəkdir".
234 Gör dünyaya necə insanlar gəldi,
Hamısı bir qədər yaşayıb öldü.
235 Həm bəy, həm qul – yaxşı və ya pis,
Özləri ölsələr də, adları nişanə qaldı.
236 İndi sənə çatıb mənsəb məqamı,
Hamıdan yaxşı ol, ancaq yaxşılıq elə.
237 Gec-tez dirilər öləcək,
Bax, yaxşı kişi ölsə də, adı diri qalır.
238 İki cür ad var – dildə-ağızda yaşayır,
Həm yaxşı, həm də pis dünyada qalır.
239 Pisə söyürlər, yaxşını öyürlər,
Gör hansını seçirsən?
240 Özün yaxşı olsan, adın öyülər,
Pis olsan söyülər, ey təmiz insan.
241 Nə üçün axmaq Zöhhak söyüldü,
Firidun isə şərəflə öyüldü?
242 Biri yaxşı ərdi, onu öydülər,
Biri pis ərdi, onu söydülər.
243 Sənin üçün hansı yaxşıdır, yaxşı, yoxsa pis?
Söyülməyi istərsən, yoxsa öyülməyi?
244 Hansını istəyirsən, onu da seç.
Nəticəsi yaxşı, ya pis olsa, peşman olma.
245 Sınanmış, təcrübəli kişinin sözü buna bənzər,
Təcrübəli insan elin-günün işini bilər.



246 Bax, kişinin yaxşı adı alqışlanır,
Pis adam ölsə, onu qarğıyırlar.
247 Çox sınamışam, pislik edənin
Gücü-taqəti gündən-günə azaldı.
248 Ey bilikli adam, neçə dəfə görmüşəm,
Pis adamın işi qabağa getməyib.
249 Pislik oddur, od yandırıb-yaxır,
Odun içindən keçməyə keçid yoxdur.
250 Bizdən əvvəl köçənlərə diqqət et,
İstər qara camaatdan, istər dünyanı tutan bəylərdən olsun,
251 Onlardan hansı bilik tapmışsa,
Zəmanəyə, dünyaya hakim olmuşdur.
252 Dünya bəylərindən hansı bilikli olubsa,
Yaxşı qanunları onlar tapıblar.
253 Bu gün kim yaxşılıqla ad-san qazanıbsa,
Yaxşıların başçısı da onlardır.
254 Kim hakim və bilikli bəy olmuşsa,
Bilikli kişiləri özünə yaxınlaşdırmışdır.
255 Əl vurduğu işi diqqətlə işləmiş,
Xalqı da idarə edə bilmişdir.
256 Elini tənzim etmiş, xalqını varlandırmış,
Xalqın varını özünə qalxan etmişdir.
257 Səxavəti ilə yaxşı ad qazanmışdır,
Səxavətli adam ölsə də, adı yaşayır.
258 Öləcəyini bilərək hazırlaşmışdır,
Adını kitaba saldırıb dirilər üçün qoymuşdur.
259 Bu gün kim oxusa, onları tanıyır,
Onlara bənzəmək istəyir və bundan xeyir görür.
260 Dünyada bilikdən əziz nə var,
Kimə biliksiz desələr, ona söymüş olurlar.
261 Dünyanı yorub gəlmiş bilikli kişi,
Eşit gör nə demişdir:
262 "Əgər biliksiz dördə yer tutsa,
Dör – eşik, eşik isə dör sayılar.
263 Əgər biz alimə eşikdə yer versələr,
Eşik dördən də yüksək və hörmətli olar.

264 Bütün bu hörmət biliyə görədir,
Dünyada yeri istər dör, istər eşik olsun".
265 Bax, iki cür əsl insan var;
Biri bəy, biri alim; onlar insanların başıdır.
266 Onlardan başqa, hamını heyvan sürüsü say,
İstərsən o tərəfi tut, istərsən bu tərəfi.
267 Sən indi hansısan, mənə açıq de,
Ya ondan ol, ya bundan, üçüncüdən qaç.
268 Biri əlinə qılınc alıb xalqı idarə edər,
Biri əlinə qələm alıb düz yol göstərər.
269 Onlardan gözəl nizam-intizam qaldı,
Bu mirasdır, kimin əlinə keçsə, onu yüksəldər.
270 Söz ölüdən diriyə miras qalır,
Miras sözə əməl etmənin yüz faydası var.
271 Biliksiz adam, şübhəsiz ki, kordur,
Ey kor, bilikdən payını al.
272 İnsanın bəzəyi sözdür, söz müxtəlifdir,
Xoş sözlü insanı öy, ey dilim.
273 Türkcə buna bənzər atalar sözü var,
Onu söyləyirəm o, belədir:
274 "Kamalın bəzəyi dil, dilin bəzəyi sözdür,
İnsanın bəzəyi üz, üzün bəzəyi isə gözdür".
275 İnsan sözünü dililə söylər,
Sözü yaxşı olsa, üzü parlar.
276 İndi baxsan görərsən ki, türk bəyləri
Dünya bəylərinin ən yaxşılarıdır.
277 Bu türk bəyləri arasında adı məşhur
Tonqa Alp Ərdir ki, taleyi bəllidir.
278 O, yüksək biliyə və çoxlu ərdəmə sahib idi,
Bilikli, idraklı xalqın seçilmişi idi.
279 Həm seçilmiş, həm yüksək, həm də cəsur ər idi,
Dünyada ancaq fərasətli ər hakim ola bilər.
280 İranlılar ona Əfrasiyab deyirlər,
Bu Əfrasiyab neçə-neçə ellər tutmuşdur.
281 Dünyanı ələ keçirmək üçün
Çoxlu hünər sahibi olmaq, idrak və bilik lazımdır.



282 Farslar bunu kitabda yazmışlar,
Kitabda olmasaydı, onu kim tanıyardı?
283 Cəsur və igid ər çox yaxşı söyləmişdir,
Cəsur ərən möhkəm düyünləri açar.
284 Bu dünyanı tutmaq üçün min cür hünər lazımdır,
Bu qulanı basmaq üçün aslan olmaq lazımdır.
285 Fatehə min-min ərdəm lazımdır ki,
Onunla eli-günü tutsun, dumanı dağıtsın.
286 O bununla qılınc çəkib yağı boynunu vura bilər,
Elini və xalqını qanunla idarə edə bilər.

## X

## BİLİYİN VƏ İDRAKIN FAYDALARINI BƏYAN EDİR

287 Ey ağıllı hakim, diləyim söz idi,
Ağıl və bilikdən danışmaq istərəm.
288 Ağıl qaranlıq gecədə bir çıraqdır,
Bilik isə səni işıqlandıran bir işıqdır.
289 İnsan ağıl ilə yüksəlir, biliklə böyüyür,
Bu iki şey insanı etibarlı edir.
290 Bunlara inanmırsansa, Nuşirəvana bax,
O, ağlın gözü ilə dünyanı işıqlandırdı.
291 Qanunu düz tətbiq etdi, xalqı varlandı,
O, gözəl dövrdə adını əbədiləşdirdi.
292 Ağıllı bir adam onun haqqında belə deyib:
Özü cəhənnəmlik idi, ancaq cəhənnəm əzabından qurtuldu.
293 Kiçik oğlana bax, ağla dolacaq,
Ancaq yaşa dolmasa, qələm də işləməz.
294 Bax əgər ağıllı kişi qocalsa,
Ağıl getdiyi üçün qələm də susar.
295 Əgər dəli vurub bir adamı öldürsə,

Ona ölüm yoxdur, qisas da alınmaz.
296 Desən niyə? Çünki o, ağıldan kəmdir,
Ağılsıza isə nə mükafat var, nə də ki cəza.
297 Hörmət və etibar ağıla görədir,
Ağılsız adam bir ovuc palçıqdır.
298 Diqqət et, bu söz çox yaxşı söylənib:
"Ağılsız və biliksiz özünü yüksəltməz".
299 Diqqət et, hərə əyninə bir şey geyir,
Bilikli, ağıllı adam isə paltarla deyil, özlüyündə
qiymətlidir.
300 Ağıl olsa, insan əsil və nəcib olduğunu,
Bilik olsa, bəyliyini büruzə verər.
301 Kimdə ağıl olsa, o, əsilli olar,
Kimdə bilik olsa, o, bəylik edər.
302 İnsanoğlu qara yer üzünə əlini uzatdı,
Hər şeyə biliyi ilə nüfuz etdi.
303 İnsan ağıl sayəsində insan adlanır,
Bəylər bilik sayəsində eli idarə edir.
304 Minlərlə alqışlanan işlər,
Ağıl ilə edildiyi üçün öyüldü.
305 Ağlın azına da az demə, yenə faydası çoxdur,
Biliyin azına da az demə, insan üçün yenə əzizdir.
306 Bu dörd şeyin azına az demə,
Hakim sözüdür, onu yaxşıca dinlə:
307 "Bu dörd şeydən biri od, biri yağıdır,
Üçüncüsü həyatın duzağı olan xəstəlikdir.
308 Nəhayət, bilikdir, bunlardan biri,
Bu dörd şeyi ucuz tutma, onlar çox əhəmiyyətlidir".
309 Bunlardan hər birinin xeyiri və zərəri çoxdur,
Bəzisi borcdur, bəzisi isə alacağın şeydir.
310 Bilik kimya kimidir, əşya onun ətrafına yığılır,
Ağıl onun sarayıdır, hər şeyi içinə alır.
311 Müşk və bilik bir-birinə bənzəyir,
İnsan onları gizlədə bilməz.
312 Müşki gizlətsən, ətrindən bilinər,
Ağlı gizlətsən, dilə verdiyi ülgüdən bəlli olar.



313 Bilik heç vaxt qiymətdən düşməyən sərvətdir,
Oğru və əyri onu səndən ala bilməz.
314 Bilik və ağıl insan üçün bir çidardır,
Çidarlı adam ona yaraşmayan yerlərə getməz.
315 Ər sevdiyi atını çidarda saxlayar,
Gərəkli atını mühafizə edər, qoruyar.
316 Çidarlı olan qaçmaz, istədiyin yerə qədər gedər,
Çidarlı olan uzaqlaşmaz, səni gözləyər.
317 Ağıl sənin üçün and içmiş yaxşı bir dostdur,
Bilik sənin üçün mehriban qardaşdır.
318 Biliksiz adamın yağısı onun hər şeyi öz bildiyi kimi
etməsidir, biliksizliyidir,
Başqa düşmənin olması da, bu ikisi onun bəsidir.
319 Bu haqda türkcə bir atalar sözü var,
Onu eşit və yadında saxla:
320 "Ağıllı adamın yoldaşı ağıldır,
Biliksiz adam üçün söyüş də addır, onun adıdır".
321 Biliklinin yeməyi və donu elə bilikdir,
Biliksizin əməli onun ən pis yoldaşıdır.
322 Ey ağıllı ər, hirsi özündən iraq tut,
Ey bilikli bəy, hiddətlənmə, yaxşı ad qazan.
323 Qəzəb və hiddətlə işə girişmə,
Əgər girişən, ömrün zay olar.
324 Hirslə iş tutan peşman olur,
Qəzəbli adam işində yanılır.
325 Ərə sakitlik və mülayimlik lazımdır,
Günün və ayın doğması üçün bəyə səbir etmək lazımdır.
326 Həm təmizlik lazımdır, həm də düzlük,
Həm ağıl gərəkdir, həm də bilik.
327 İnsanları tanımaq üçün ağıl lazımdır,
İşi başa vurmaq üçün bilik gərəkdir.
328 İşə yarayıb-yaramayana diqqət edərək,
Gərəkli olub-olmadığını soruşaraq,
329 Ayırd etsə, eləsə, seçə bilsə,
Bütün işlərdə gözü açıq olsa,
330 Nəticədə, bütün işlər bişər,
Bilikli adam aşı bişmiş yeyər.

331 Belə kişi diləyinə yetişər,
Hər iki dünyada işi düz gedər.
332 Qəzəb və hiddət insan üçün pisdir,
Bu ikisinin ucundan bədən əziyyət çə
333 Eşit gör bu barədə hakim alim nə dey
Sözünə görə hərəkət et, ey xoşbəxt ir
334 "İnsan əsəbi olsa, cahil kimi iş tutar,
Qəzəblənsə, qəzəb onu ağılsız edər.
335 Hiddət insana ziyandır, bildiyini əlind
Hiddətlənmiş xoşxasiyyət insan qabal
336 Dinlə gör bilikli adam nə deyir:
"Biliklinin sözü sevimli can kimidir".
337 Bax, bu bir neçə şey insana zərərdir,
İnsan onları bilsə, özünü qorumuş ola
328 Bunlardan birisi dil yalanıdır,
İkincisi sözündən yayınmaqdır.
339 Üçüncüsü içki düşkünlüyüdür,
Ona tutulan hədər yaşamış olur.
340 Biri də insanın inadkarlığıdır,
İnadkara dünyada sevinc yoxdur.
341 Yaraşmayan şeylərdən biri də kobudlı
Bu, insanın evində tozu dumana qatır.
342 Biri isə dilacılıq, hiddətdir,
Dil açıb söyməyə başlasa, insanı incid
343 Bu bir neçə şey bir adamda toplansa,
Mübarək xoşbəxtlik ondan uzaq qaçaı
344 Xeyir görməz, fələk ona yar olmaz,
Onun halında, hərəkətində sabitlik olı
345 Ey yaxşı insan, yürü, yaxşılıq et,
Yaxşı adamın işi düz gətirər.
346 Eşit gör əməlisaleh adam nə deyir,
Elini idarə edən, təcrübəli adam nə dı
347 "Yaxşı adam nə qədər yaşlansa, yenə
Pisi nə qədər islah etsən, yenə düzəlm
348 Yaşı qısa olsa da, pis peşmançılıqla qa
Uzunyaşlı yaxşı isə, peşman olmadan
349 Yaxşı adam hər gün bir diləyinə qovu
Pisin sıxıntısı hər gün bir az da artar".



# XI

## KİTABIN ADINI, MƏZMUNUNU VƏ ÖZ QOCALIĞINI BƏYAN EDİR

350 Kitaba "Qutadğu bilig" adını verdim,
Oxuyanı uğurlasın, əlindən tutsun.
351 Sözümü söylədim, kitabı yazdım,
Bu kitab uzanıb hər iki dünyanı tutan əldir.
352 İnsan hər iki dünyanı ağılla tutsa,
Xoşbəxt olar, bu sözüm gerçəkdir.
353 Əvvəlcə Gündoğdu Elikdən bəhs etdim,
Ey yaxşı kişi, bunu izah edərəm.
354 Sonra Aydoldudan söz açdım,
Mübarək bəxt günəşi onunla parlar.
355 Bu Gündoğdu dediyin başdan-başa qanundur,
Bu Aydoldu dediyin səadətdir.
356 Bax, sonra Öyüdülmüşü bəyan etdim,
O, ağlın adıdır, insanı yüksəldir.
357 Ondan sonra Odqurmuş gəlir,
Onu da aqibət kimi götürdüm.
358 Mən sözü bu dörd şey haqqında söylədim,
Oxusan bilərsən, diqqət et.
359 Ey sevincli ömür sürən gözəl gənc,
Sözümü qəribəliyə salma, könüldən dinlə.
360 Qeyrət et, doğruluq yolunu azma,
Gəncliyi hədər etmə, xeyirini bil.
361 Gəncliyə qiymət ver, tez keçər,
Necə bərk tutsan, bir gün qaçar.
362 Səndə hələ varkən igidlik gücü,
Hədər etmə, taət və ibadətlə məşğul ol.
363 Sonra peşman olar, gəncliyin həsrətini çəkərsən,
Son peşmançılıq fayda verməz, başqa sözüm yoxdur.
364 Kimin ki, yaşı qırxı keçdi,
Gənclik insana: "Xudahafiz" deyər.

365 Əlli yaşım mənə əlini vurdu,
Quzğun tüklü başımı qu tükünə çevirdi.
366 Altmış yaşım indi mənə "gəl" deyir,
Əcəl pusqusuna düşməsəm, indi oraya gedəcəyəm.
367 Kimin yaşı altmışa çatdısa,
Həyatının dadı getdi, yayı qış oldu.
368 Otuz yaşın yığdığını əlli geriyə aldı,
Bəs altmış əllini vursa, nə edəcəyəm?
369 Ey əlli, mən sənə nə etmişdim ki,
Mənə qarşı belə kinlisən?
370 Gənclikdə hər işdən bir ləzzət alırdım,
İndi isə yemək mənə zəhər olub.
371 Bədənim ox, könlüm yay kimi idi,
İndi bədənim yaydır, könlümü ox etməliyəm.
372 Gənclik mənim üçün nə yağmışdısa, qocalıq aldı,
Gözlə, o sənə də gəlib çatacaq.
373 Ey aləmin pənahı, mənə pənah ol,
Əziyyət içində illərin, ayların əsiri olmuşam.
374 Ayağım cidarsız olsa da, taqətim yoxdur, addım ata bilmirəm,
Görən gözüm qaralıb, işıldamır.
375 Zövq getdi, könlümün atəşi söndü,
Gənclik adı artıq məndən uzaq oldu.
376 Ey köçkün artıq ölümə hazırlaş,
Ötən günlər üçün ağla və sızla.
377 Zaman, gün hədər yerə ötüb keçdi,
Barı qalan günlər üçün tövbə elə.
378 Ey əbədi, ölümsüz rəbbim,
Bu saysız-hesabsız canlını ölüm üçün yaratdın.
379 İndi sənə dua edir və yalvarıram:
Məni bir qədər də yaşat, ömrümü uzat.
380 Səndən güc diləyib bu sözə başladım,
Ey rəbbim, bunu bitirmək üçün möhlət ver.
381 Ey dilim, durma, yaradana,
Məni pisliklərdən iraq tutana şükür et.
382 O seçdi, yaratdı və könlümü işıqlandırdı,
Düz yola doğru yönəltdi həmişə.



383 Qaranlıqda idim, gecəmi işıqlandırdı,
Zülmətdə idim, mənə günəş doğdurdu.
384 Azıb yüyürürdüm, mənə yol göstərdi,
Əgər o qorumasaydı, odda yanardım.
385 O seçdi, ayırdı, götürdü məni,
Azmışlar yolundan apardı məni.
386 Könlümü aydınlıqla bəzədi,
Dilimi isə kəlimeyi-şəhadətlə.
387 Könül, göz, ağıl, idrak və bilik verdi,
Dilimi açdı, danışmaq qüdrəti verdi.
388 Sevimli peyğəmbərin yolu məni düz yola çəkmişdir,
O rəsul mənim şəfaətçim olsun.
389 Bütün bunların hamısı rəbbin fəzli və kərəmi idi,
Mənim kimi asi qula qiymət verdi.
390 Bundan sonra aylar-illər uzunu yaşasam da,
Bunun şükürünü yenə ödəyə bilmərəm.
391 Ey ilahi, sən bu acizliyimi bilirsən,
Hər çətinlik və müşkülümü mən sənə açıram.
392 Bunlardan heç birinin şükürünü sənə qaytara bilmərəm,
Mənim əvəzimdən özün-özünə şükür et.
393 Məni doğru yol üstündə düz saxla,
Əynimdən bu iman donunu çıxarma.
394 Mənim bu canımı təndən çıxararkən
Nəfəsimi kəlmeyi-şəhadətlə kəs.
395 Qara yer altında yalnız qalanda da
Sonsuz rəhmətini məndən əsirgəmə.
396 Asi bir qulunam, günahım çoxdur,
Ey əziz olan, məni öz fəzlinlə bağışla.
397 Möminlərin hamısının günahından keç,
Sabahkı əbədiyyət aləmindən üzünü mənə bu gün göstər.

## XII

## GÜNDOĞDU ELİK HAQDA SÖZBAŞI

398 Bax, ağıl ərz edir, bilik bildirir,
Dünyanın bivəfalığını sənə bildirir.
399 Bu qoca dünya vəfasız və namərddir,
Ədası qız ədasıdır, di gəl, yaşı böyükdür.
400 Bəzən qız kimi cilvələnib özünü sevdirir,
Ancaq tutmaq istəyəndə, əlini vermir.
401 Onu sevən sevməz, keyik kimi ondan qaçar,
Kim ki, ondan qaçar, ayağını qucar.
402 Bir də görürsən ki, bəzənib-düzənib üstünə gəlir.
Bir də görürsən, özünü görməzliyə vurub, o yana baxır.
403 Bir də görürsən, üzünü çevirib yenə nazlanır,
Nə qədər tutmaq istəyirsən, qoymur.
404 Çox bəyləri qocaltdı, ancaq özü qarımaz,
Çox bəyləri o dünyaya göndərdi, ancaq yenə susmadı.

* * *

405 Bir bəy vardı bu dünyada, hakim və bilgə baş idi,
Bəylik içində uzunca bir ömür yaşadı.
406 Bu, Gündoğdu bəydi, adı bəllidir,
Şöhrəti dünyaya yayılmış, iqbalı bəllidir.
407 Əməli doğru, feli-rəftarı düz idi,
Sözü bütöv, gözü, könlü tox idi.
408 O bilikli, ağıllı və sərvaxt bir bəy idi,
Pis üçün od idi, yağı üçün bəla idi.
409 Eyni zamanda cəsur, ürəkli, xoşəxlaq idi,
Bu keyfiyyətləri onu gündən-günə ucaltdı.
410 Bu belə bəy idi, işini biliklə nizamlamışdı,
Həmişə belə etdi, belə yaşadı.
411 Siyasətdə şəxsi meyllərdən uzaq idi,
Himmət yalnız insaniyyətlə vəhdətdə gözəl olur.
412 Şairin buna bənzər bir sözü var,
Onu kim oxusa, gözü açılar.

413 Ərdə himmət və mürüvvət tən olmalıdır ki,
Pis və səfil adamlardan iraq ola bilsin.
414 Kişiyə himmət və mürüvvət gərəkdir,
İnsanın qiyməti onlarla ölçülür.
415 Gündoğdu Elik bu xasiyyətlə
Gün və ay kimi parlayaraq dünyanı işıqlandırdı.
416 Ağıllı adamları yanına çağırdı,
Bilikli adamları ucaltdı.
417 Ağıllı, bilikli, xalqın ən seçilmiş adamları
Onun ətrafına yığıldılar.
418 Bax, elin-günün işini özü nizama saldı,
Yenə də istədi ki, ətrafında seçilmiş adamlar olsun.
419 Ona kömək edib iş başlasınlar,
İşi getsin, özü bir az dincəlsin.

* * *

420 Bir gün təkcə oturmuşdu, öz-özünə dedi:
– Bəylik işi böyük və çətin işdir.
421 Həm çox zəhmətlidir, həm də işi çoxdur,
Bu işləri görən ağıllı insan əzizdir.
422 Bu qədər işi özüm görə bilmərəm,
Mənə iş bilən bir ər lazımdır.
423 Mənə indi seçilmiş, ağıllı, bilikli,
Ərlər başı bir insan lazımdır.
424 Mehriban, əməlisaleh, dili, könlü düz,
İş bacaran bir adam olmalıdır.
425 Mənim işlərimə kömək etməyə,
Daxili-xarici işləri görməyə adam lazımdır.
426 Eşit, gör bu təcrübəli kişi,
Başına çox iş gəlmiş yaşlı adam nə deyir,
427 İnsana kömək etməyə idarəçilər,
Ağıllı, bilikli elçilər lazımdır.
428 Elə köməkçi lazımdır ki, bütün işləri bilsin,
Bilib işləsə, bəy diləyinə yetər.
429 Köməkçi çox olsa, bəy zəhmət çəkməz,
İşi yoluna düşər, nizamı pozulmaz.

430 Hər işə köməkçi lazımdır,
Bəylik işində gərək köməkçin çox olsun.
431 Elik köməkçi axtardı, ancaq tapmadı,
Hər işi özü görməyə məcbur oldu.
432 O çox zəhmətlərə qatlaşmalı oldu,
Sakitlik arayan əziyyətə tuş olur.
433 Diqqət etsən, görərsən ki, mübarək bir adam
Bu sözü çox yerində demişdir:
434 "Sakitlik zəhmətlə birlikdə gəlir,
Sevinc də qayğı ilə bərabər yüyürür.
435 İnsan böyüdükcə baş ağrısı da böyüyür,
Baş nə qədər böyüsə, börkü də böyüyər".
436 Elik bütün elə göz-qulaq oldu,
Bütün bağlı qapılar ona açıldı.
437 Yaramazları boğdu, əllərini bağladı,
Pisləri elindən sürgün elədi.
438 Bax, bu tədbir ilə idarə etdi,
Qutu gündən-günə artdı, yüksəldi.
439 Hər yerdə insana belə tədbir lazımdır,
Bəylik işində, xüsusilə, diqqət lazımdır.
440 Dövlət işində bu ehtiyat və sayıqlıq
Dövlətin ömrünü uzadar.
441 Şairin bu haqda bir sözü var,
Onun dilindən bu söz çıxıb:
442 "Ayıqlıq və ehtiyatı ərənlər öymüşdür,
Qafillik üzündən minlərcə adam ölmüşdür.
443 Qafil olma, hər işdə ehtiyatlı ol,
Bu ehtiyatlılıq ilə iki dünyanı istə.
444 Bax, özündən müştəbehi qafillik ovlayar,
Yağı gələndə əvvəlcə qafillər ölür".
445 Eşit, gör dünya tutmuş ər,
Tədbirlə çox yağını udmuş ər nə deyir:
446 "Ey fateh, Elik gərək ehtiyatlı olsun,
Ehtiyat həm də şəriətin əmridir.
447 Qafil adam gözünü yumar, qəflətə uyar,
Ey qadir insan, qafil olma, ehtiyatlı ol.



448 Elikin ehtiyatı elə xeyir gətirər,
Bu xeyirlə eldə bərəkət olar.
449 Elik eli nizama saldı, xalq varlandı,
Qurdla quzu eyni yerdən su içdi.
450 Sevənlər sevinclə onu öydülər,
Yağılar eşidib boyun əydilər.
451 Kimi gələrək ona sığındı, pənah istədi,
Kimi də gəlib astanasını öpdü".
452 Eşit gör sayıq könüllü insan nə deyir,
Onun sözü çiçək kimi min rəngə bürünüb:
453 "Bu bəylik, ululuq çox yaxşı şeydir,
Əgər insan düzlüklə hərəkət edə bilsə.
454 Bəylik yaxşı şeydir, qanun ondan artıqdır,
Gərək onu düzgün tətbiq edəsən.
455 Xalq xoşbəxt olar, yaxşı dövran sürər,
Bəy yaxşı olsa, düz hərəkət etsə.
456 Yaxşı ad ər üçün bir səadətdir,
Onun yaxşı adı əbədi qaldı.
457 Yaxşı adam çox qutlu bəy olar,
Elin-günün işini insanlıqla həll etsə.
458 Elikin bu yaxşılığı bütün elə sirayət etdi,
Onun adı-sanı dünyaya yayıldı.
459 Yaxşı ad qazandı, eldə ona dua edən çoxaldı,
Həm ad, həm səadəti gündən-günə artdı.
460 Dünya xalqı bunu eşidib onu arzuladı,
Yığışıb ətrafına toplaşdılar.
461 Bax, dünya bir səadət qurşağı bağladı,
Qurdla quzu bir yerdə yaşadı".

## XIII

## AYDOLDUNUN GÜNDOĞDU ELİKİN XİDMƏTİNƏ GƏLMƏSİNİ BƏYAN EDİR

462 Aydoldu adlı zəkalı bir ər vardı,
Elikin şöhrətini eşidib, onun yanına getməyə hazırlaşdı.
463 O, igid ərdi, xoşxasiyyətdi,
Ağıllı, bilikli, həm də gözəl qəlbli gənc idi.
464 Üzü gözəldi, baxanda göz qamaşardı,
Sözü yumşaq idi, düz danışardı.
465 Hər cür hünəri tamamilə öyrənmişdi,
Heç vaxt ərdəmi əlindən buraxmazdı.

* * *

466 Bir gün özünə baxaraq belə dedi:
"Çoxlu hünərlərimlə mən eldə ən sayılan adamlardanam.
467 Niyə burada boş-boşuna durmuşam,
Elikin yanına gedib xidmətinə girdim.
468 Ərdəmimin Elikə faydası dəysin,
Mənim də əziyyətlərim sona çatsın.
469 O, ağıllı, bilikli xoşxasiyyət ərdir,
Özü də ərdəmli adamları axtarır.
470 Ağlın qiymətini ağıllı bilər,
Alimin satdığı biliyi ağıllı adam alar".
471 Şairin bu haqda bir sözü vardır,
Dili bunu belə ifadə edir:
472 "Biliyin qiymətini bilikli bilər,
Ağıla hörmət bilikdən irəli gəlir.
473 Biliyin qiymətini dəli hardan biləcək,
Bilik harda olsa, onu bilikli alar".

* * *

474 Aydoldu atını, donunu, silahını hazırladı,
Onun xidmətinə doğru yola düşüm dedi.



475 Lazımi hazırlıqlarını tamamladı,
Bu tətik alim Elikə tərəf üz tutdu.

* * *

476 Bir də dedi: – Mən buradan qalxaraq
Elikin xidmətinə varıram.
477 Qərib yerdə insana bir şey lazım olar,
Əlim daralsa, üzüm saralar.
478 Qəribliyin işi insana çox ağır gələr,
Qəriblikdə bir çox qabil adamlar da çarəsiz olarlar.
479 Şübhəsiz, altun və gümüş gərək olacaq,
Özümə xərcləməyə lazım olacaq.
480 Eşit, gör biliyi dəniz kimi olan nə deyir,
Diqqət etsən, bu söz buna bənzəyir:
481 Hər kəs ki, xidmətə girim desə,
İki şey lazımdır ona, sözü deyim kəsə,
482 Biri budur ki, gərək həyatın xəstəliksiz keçsin,
Qüsursuz xidmət edəsən, üzün ağ ola.
483 Ey qoçaq insan, biri də odur ki, külçə altun gərəkdir,
Onu işlədib, yerində xərcləyəsən.
484 Bunu bilsən, qapılar üzünə bağlanmaz,
Xidmətin də yaxşı keçər.
485 Külçə altun, gümüş, əşya və mal götürdü,
Dedi, dara düşsəm, bu lazım olar.

* * *

486 Evindən durub çıxdı, bəri gəldi,
Bir qədər yürüdü, bir qədər durdu.
487 Gəlib çatdı Elik olan orduya[1],
Çatdı könüldən istədiyi arzuya.
488 Girib kənd içində qalmağa yer axtardı,
Yer tapmadı, dünya ona dar oldu.
489 Axırda bir imarətə gəldi,
Orada yataraq səbirlə gecəni keçirdi.

---

[1] Ordu – qədim türkcədə şəhər, saray

490 İndi, eşit gör ağıllı adam nə deyib,
Bu sözü sənə bilərək bilikdən deyib:
491 Tanışı olmayan, nabələd adamın işi pis olar,
Əgər o, qələbəlik izdihama tək girsə.
492 Əgər adam bir yerə ilk dəfə gəlsə,
Bilişi olmasa, halı pis olar.
493 Tanışı olmayanlar kor kimidir,
Kor adam yolunu azsa, onu söymə.
494 Əgər kişi heç vaxt gəlmədiyi elə gəlsə,
Gəlin kimi utancaq olar, dili lal olar.
495 Yer ver ona, yedirt və içirt,
Qüsurunu bağışla, hörmət et, ey hakim alim.
496 Yada yaxşı baxanın gözü gülər,
Qonağa yaxşı baxsa, sözü yayılar.
497 İnsana hər yerdə tanış lazımdır,
Bütün işlər tanışla görülər.
498 Bu Aydoldu bir müddət belə vaxt keçirdi,
Qəribliyin qəmi üzünü saraltdı.
499 Axırda bəzi kişilərlə tanış oldu,
Otaq tutdu, yenə üzü güldü.
500 Eş-dost tapdı, onlarla yaxın oldu,
Böyüyə-kiçiyə xoş üz göstərdi.
501 Bu Aydoldu bir nəfərlə dost oldu,
İşlərini ona danışdı, gənəşdi.

* * *

502 Aydoldu yaxşı bir kişiylə dost oldu,
Bu yaxşı kişinin adı Küsəmiş idi.
503 Aydoldu ona könlünün sözünü açdı,
Özünün kimliyini, arzusunu bildirdi.
504 Öz yerindən bu elə niyə gəldiyini,
Özünün bildiyi hər şeyi ona danışdı.

* * *

505 Elikə yaxın bir xas Hacib vardı,
Özü də Eliklə sirdaş idi.



506 Küsməmiş bir gün qalxıb onun yanına getdi,
Münasib bir girişlə məsələni açdı.
507 Hacib onun sözünü diqqətlə dinləyərək
Dostunun nə istədiyini soruşub öyrəndi.
508 Küsəmiş hər şeyi danışaraq
Onun kim olduğunu və nə istədiyini bildirdi.

## KÜSƏMİŞƏ HACİBİN CAVABI

509 Hacib dedi: – Qoy əvvəlcə yanıma gəlsin,
Mən onu görüm, o da məni görsün.
510 Sonra bu sözü Elikə açaraq,
O gəlmək və hüzura çıxmaq vaxtını təyin edər.

## KÜSƏMİŞİN AYDOLDUYA SÖZÜ

511 Küsəmiş onun yanından çıxıb gəldi,
Dedi: – Aydoldu, bəxtinə gün doğdu.
512 Hacibin yanına get, onunla tanış ol,
Diləyin nədirsə ondan dilə.
513 Səni görüb tanısın, sözünü eşitsin,
Nə istədiyini ona özün bildir.
514 Sənin sözlərini ona nə qədər söyləsəm də,
Sən məndən yeyrək izah edərsən
515 Qəlbi-könlü düz adam iyi – yaxşı söyləmiş,
Yaxşı diqqət etsən, çox doğru sözdür:
516 Birinin sözünü başqası da deyə bilər,
Kişinin özü öz işinə daha yaxındır.
517 Nə qədər yaxşı və yaxın adam olsa da,
İnsana başqası özündən mehriban ola bilərmi?
518 Özün-özünə yaxın adam axtarsan,
Sözün qısası, özündən yaxın adam tapa bilməzsən.

* * *

519 Aydoldu yerindən qalxıb donunu geydi,
Küsəmişlə çıxıb oraya getdi.

520 Qapıya çatıb atdan düşdülər, içəri keçdilər,
Hacibin qulluqçusu gəlib onları qarşıladı.

* * *

521 Küsəmiş içəri girib Haciblə görüşdü,
Sonra çıxıb Aydoldunu onun yanına apardı.

* * *

522 Hacib onu qarşıladı, dördə yer göstərdi,
Hərarətli və gözəl sözlər söylədi.

## HACİBİN AYDOLDUYA SUALI

523 Hacib dedi: indi necəsən, könlün xoşdurmu?
Burda harda qalırsan, yerin necədir?
524 Tanışın, dostun, ya qardaşın varmı?
Baxanın, yeməyin, içməyin, aşın varmı?
525 Yenə təkrar dedi: diləyin nədir?
Nə iş görürsən, bir şeyə ehtiyacın varmı?

## HACİBİN AYDOLDUYA CAVABI

526 Aydoldu dedi: ey müdrik Hacib,
Bu Gündoğdu Elikin adını eşitmişəm,
527 Uzaqdan onun şöhrətini,
Biliyini, ağlını, şirin sözlərini eşitdim.
528 Ona xidmət etməyi arzuladım,
Xidmət üçün qapısına gəldim.
529 Diləyim Elikə xidmət etməkdir,
Hacib lazım bilsə, sözümü izhar etsin.

* * *

530 Görüb sevdi Hacib bu Aydoldunu,
Onu çox tərifləyib, öydü.



531 Üzünü, görkəmini, tövrünü, hərəkətini, özünü,
Dilini, sözünü – hamısını yaxşı hesab edib bəyəndi.
532 Onu çox könüldən sevdi, bəyəndi,
Elik qulluğuna yarayan bildi.
533 Eşit, özünü sevdirən kişi nə deyir:
Adam özünü sevdirsə, qüsuru da fəzilət kimi görünər.
534 Kimi sevsə, onun eyibi məziyyət olar.
Kimi sevməsə, hünəri də eyib olar.
535 Bu söz ona şahiddir,
Ey yaxşı insan, sən bunu oxu:
536 Könül kimi sevsə, qüsuru fəzilətdir,
Tərs işləri doğru, əksiyi tam görünər.
537 Könül kimi sevsə, onun hər yeri sevimli görünər,
Görən gözə də vursa, bu hərəkət pis görünməz.

## HACİBİN AYDOLDUYA CAVABI

538 Hacib Aydolduya belə cavab verdi:
– Sən tələsmə, bu işi mənə həvalə et.
539 Mən əvvəlcə Elikə sözü açaram,
Sənin kim olduğunu, diləyini ona bildirərəm.
540 Səni tanısın, həm də üzünü görsün,
Ucuz tutmasın, qiymətləndirsin.
541 Sənin üçün gərək olan hər şeyə mən baxacağam,
Bütün işlərini məmnuniyyətlə görəcəyəm.

* * *

542 Onun dili çox yaxşı sözlər söylədi,
İşini görəcəyəm deyə qəti söz verdi.
543 Kişilərin yaxşısı bu cür olar,
Kişilərin yaxşısı el yükü çəkəndir.
544 Eşit, gör nə deyir xalq rəhbəri,
Bütün işləri araşdırıb işləyən adam,
545 Kimin ki, dövləti, iqbalı yüksəlsə,
O, xalqa yaxşı qanunlar tətbiq etməlidir.

546 Kim xalqa hakim olursa, onun,
Hərəkəti təmiz, əməli düzgün olmalıdır.
547 Kimin xalq içində nüfuzu olsa,
Dili-sözü şirin, özü təvazökar olmalıdır.
548 Ayıq ol, dövlət vəfasızdır, həm düzəldər, həm pozar,
O, biqərardır, gah durar, gah da qaçar.
549 Bu iqbala inama, onu yaxşılıq et,
Bu gün bundadırsa, sabah ondadır.
550 Taleyə güvənmə, ey bəxt axtaran,
Gələn iqbal, bir gün də gedər.
551 Ey dövlət sahibi, dövlətin daimi olmasını istəyirsənsə,
O səndə durduqca, sən də yaxşılıq elə,
552 Sənə bəylik və ululuq qismət olsa,
Saçın ağaranadək onların səndə qalması üçün təvazökar ol.

* * *

553 Hacib dedi: sən indi get,
Şadlıqla yaşa, çünki bəxt kəmərini bağladın.
554 Sən bir az səbir elə, hər işin öz vaxtı var,
Vaxtı çatanda bəylik qapısı özü açılar.
555 Bilikli adam bu sözü yaxşı söyləmiş,
Fikir versən, biliklinin sözü çox qiymətlidir:
556 Hansı işdə səbir etməsən, o uzanar, gecikər,
Tələsik görülən iş peşmançılıq gətirər.
567 Tələsmə, hər işin öz zamanı var,
Ey hakim, hər iş öz vaxtında olar.

## AYDOLDUNUN HACİBƏ CAVABI

558 Aydoldu bu sözləri eşitdi və dedi,
– O halda mən səbir edib gözləməliyəm.
559 Hacib məni görüb sözümü dinlədi,
Nə etməyi, nə zaman etməyi özü təyin etsin.
560 Dedi: Hacib məni nə vaxt çağırsa,
Mən də o vaxt gələrəm.



* * *

561 Durub çıxdı Aydoldu onun yanından,
Evinə gəldi, içəri girib paltarını çıxardı.

* * *

562 Hacib gördü Aydoldu bir ayrı adamdır,
Başqalarından fərqli davranışı var.
563 Dedi: hələ belə ağıllı, bilikli, zəkalı
Adam görməmişəm.
564 Bu cürə insanlar çox az tapılar,
Nadir tapıldığı üçün nadirə qız adı vermişlər.
565 O şey ki, nadirdir, o şey əzizdir,
Nadir şey asanlıqla əldə olunmaz.
566 Belə kişilər Elikə gərəkdir,
Elikə gərək olan elə gərəkdir.
567 Hamıya lazımdır belə ərdəmli ər,
Ər bu ərdəmlə bir diləyə, arzuya çatar.

* * *

568 Vaxt çatdı, Hacib Elikə söz açdı,
Ona Aydoldunun bütün vəsflərini söylədi.
569 Onun halını, tövrünü, təbiətini,
Ağlını, kamalını bir-bir saydı.

## ELİKİN HACİBƏ CAVABI

570 Elik bunu eşidib dedi:
– Haradadır onu gətir, görüm.
571 Bu cür bir adam axtarıram ki,
Qabiliyyəti varsa, bəylik işini görsün.
572 Hər diləyə çatmışam, bir sözüm qalıb,
Belə bir insana ehtiyacım var.

573 Yürü get, onu yanıma çağır,
Hüzuruma çıxart, ey cəsur igid.

* * *

574 Hacib durub cəld qapıya çıxdı,
Bir oğlan göndərib xəbər yolladı.
575 Oğlan yüyürüb sözü çatdırdı,
Aydoldu sevincək durub geyindi.
576 Atın minib gəldi, qapıda düşdü,
Hacib qabağa çıxıb onu qarşıladı.
577 Ona hörmət göstərib dördə yer verdi,
Aydoldu ədəblə oturdu.

* * *

578 Hacib dönüb hökmdarın hüzuruna girdi,
Ayaqda duraraq vəziyyəti Elikə danışdı.

## ELİKİN HACİBƏ CAVABI

579 Elik dedi: – Qoy içəri girsin,
Mən onu görüm, o da məni görsün.

* * *

580 Hacib çıxıb dedi: – Ey Aydoldu, dur,
Hüzura çıx, bəxtin yar oldu.



# XIV

## AYDOLDUNUN GÜNDOĞDU ELİKİN HÜZURUNA ÇIXMASINI BƏYAN EDİR

581 Aydoldu hüzura girib diz çökdü,
Onun üzünü görcək Elikin könlü açıldı.
582 Elikə baş əyib sözə başladı,
Şirin sözlərlə özünü sevdirdi.

## ELİKİN AYDOLDUYA SUALI

583 Elik sordu: – Sən kimsən, adın nədir?
Haradan gəlirsən, haralısan?

* * *

584 Aydoldu sakitcə sözə başladı,
Bəlağətlə öz sözünü
585 Sakitlik və bəlağət ağlın vəsfidir,
Ağılsız adamlar heyvan sürüsüdür.
586 Şair bu haqda bir beyt deyib:
Birinə işin düşsə, tələsmə, səbirlə danış.
587 İşə tələsgən girmə, səbirli, soyuqqanlı ol,
Tələskənlik peşmançılıq gətirər.
588 Heç bir işdə tələsmə, səbirli, soyuqqanlıqla ol,
Qul səbirli olsa, bəylik mərtəbəsinə qalxar.

## AYDOLDUNUN ELİKƏ CAVABI

589 Aydoldu dedi: – Ey dövlətli hökmdar,
Qulluq adı xidmətlə gözəldir.
590 Adım qul – xidmətçidir, yerim qapıdır,
Şüarım doğruluq, işim xidmətdir.

591 Sənin yanına gəlmək üçün uzun yolları yordum,
Bu gün diləyimə yetib arzuma çatdım.
592 Diləyim budur: məni qaytarma,
Xidmətinə qəbul et, məndən usanma.

* * *

593 Elik bu sözü eşitcək çox sevindi,
Onu sınayıb arzuladığı adam olduğunu gördü.

## ELİKİN AYDOLDUYA CAVABI

594 Elik dedi: – Ey Aydoldu, gördüm səni,
Görkəmin və hərəkətin məni Sevindirdi.
595 Sən uğurlu bir sədaqətlə mənə xidmət et,
Daima qapımda dur, mənə yaxın ol.
596 Məndən kərəm, səndən xidmət,
Xidmət həmişə bəxt qapısını açar.
597 Sən bu gündən xidmətə başla,
Bəy xidmət edənin haqqını ödər.

## AYDOLDUNUN ELİKƏ CAVABI

598 Aydoldu yeri öpüb dedi: ey Elik,
Hökmdarın gözü parlasa, dövlət adama yar olar.
599 *Evdən durub xidmət üçün gəlmişəm,*
Uzun yollar yorub sənə çatmışam.
600 Xidmət üçün Tanrı mənə güc gəlmişəm,
Xidmətdə xətadan məni qorusun.
601 Aydoldu sevinib gülə-gülə hüzurdan çıxdı,
Könlü açılıb məşəltək yandı.
602 Eşit gör nə deyir bəxtiyar bir ər,
İstədiyinə, arzu-diləyinə yetmiş ər:
603 "Bəylər kimə gözləri ilə gülüb baxsalar,
*O ərin özünə inamı artar...*



604 Bəylər kimə gülər üz göstərsələr,
O ərin gözü parlar, sözü dinlənər.
605 Kimi tutsa bəylər özünə yaxın,
Bilin ki, hamı ona yaxın olar.
606 Bəy bir bəxtdir, bəxtə yaxın olan insan,
Diləyinə çatar, işləri yoluna düşər".

* * *

607 Bu Aydoldu o gündən xidmətə başladı,
Xidmətdə qüsur göstərmədi, erkəndən durdu.
608 Gündüz qapıçı oldu, gecə növbətçi,
Dürüstlüklə xidmət etdi.
609 Elikin yanına girib-çıxırdı,
Elik də ona rəğbətlə baxırdı.
610 O, gündən-günə xidməti artırırdı,
Elik də onu yüksəldirdi.
611 İşlə qiymətləndirər bəylər hər qulu,
Xidmət qəbul olsa, kiçiklər böyüyər.
612 Xidmət et, xidmətlə qul bəy olar,
Xidmət qəbul olununca, dilək də hasil olur.
613 Eşit gör bilikli adam nə deyir,
Bu fikri necə incə ifadə edir:
614 "İnsan xidmət sayəsində dördə oturar,
Yaramaz ha yarınsa, yenə bayırda qalar.
615 Xidmət edən dürüst xidmət etməlidir,
Yaxşı xidmət etsə, diləyinə çatar.
616 Bu Aydoldu qüsursuz xidmət etdi,
Elik ona kərəm qapısını açdı.
617 O gündən-günə Elikə yaxınlaşdı,
Qayğısı azaldı, sevinci artdı.
618 Aydoldu xidmətdə şövq göstərirdi,
Elik kərəm edirdi, xələt verirdi.
619 Elik onu hər işdə sınadı,
Gördü ki, Aydoldu tam onun arzusuna uyğun ərdir".

## XV

## AYDOLDU ELİKƏ ÖZÜNÜN SƏADƏT OLDUĞUNU BƏYAN EDİR

620 Elik bir gün yalqız oturmuşdu,
Çağırdı, Aydoldu sevinərək gəldi.
621 Aydoldu içəri girib ayaqda durdu,
Elik işarə etdi: "Yaxın gəl, otur".
622 Aydoldu cibindən bir top çıxarıb,
Onu yerə qoydu, üstündə oturdu.
623 Elik müxtəlif şeylər soruşdu,
Aydoldu cavab verib bildiyini söylədi.
624 Elik sevindi, üzü işıqlandı,
Bunu görüb Aydoldu gözünü yumdu.
625 Elik bir müddət susub danışmadı,
Aydoldu isə gözünü yumub açmadı.
626 Elik bir azdan yenə sözə başladı,
Aydoldu üzünü buruşduraraq cavab verdi.
627 Elik ona hər baxışdan diqqət elədi,
Ağlını, biliyini çox bəyəndi.
628 Elik ona şəfqətlə baxdı, rahat oldu,
Ancaq Aydoldu dərhal başını çevirdi.

### ELİKİN AYDOLDUYA SÖZÜ

629 Elik hiddətləndi, bənizi qaraldı,
Dedi: – Tələsmək insana pislik gətirər.
630 Bu işdə mən özüm yanıldım,
Sirrimi başqasına necə açdım?
631 Eşit gör bilikli adam nə deyir:
Tələsən illərlə peşman olar.
632 Tələsik iş həmişə çiy olar,
Tələsik bişirilən aşı yeyən xəstə olar.



633 Yanlışlıqların başı tələsiklikdir,
Yaxşı iş tələsmədən görülən işlərdir.
634 Tələsiklik budur ki, səni tanımadım,
Səni sınamadan özümə yaxın tutdum.
635 Gərək bəylər xidmətçi qulu
Əvvəlcə sınasın, sonra ona yol versin.
636 Xidmətdə bişirib, sınayıb, görüb,
Sonra ona lütf etsin, yüksəltsin.

### AYDOLDUNUN ELİKƏ SUALI

637 Bu Aydoldu dedi: – Ey dövlətli hökmdar,
Niyə qəzəbləndin, atəşə döndün?
638 Günahım nədir, bilmirəm özüm,
Bunu de, sonra məni dinlə.
639 Günahım varsa, mənə cəza ver,
Yoxdursa, mənə üz qaraltma.
640 Bunu qəsd edən ağıl
Bu haqda gör nə deyir, eşit:
641 "Xidmətçi yanılsa, çağırmaq gərək,
Niyə yanıldığını soruşmaq gərək.
642 Günahı varsa, cəza verməli,
Yoxdursa, xoşluqla könlünü almalı".

### ELİKİN AYDOLDUYA CAVABI

643 Elik yenə hirslə sözə başladı,
Dedi: – Ey biliksiz, axmaq insan.
644 Özünə bax, sən mənim üçün kim idin,
Niyə belə axmaqlıq edirsən?
645 Desəm ki, mənə xidmət edibsən,
hələ bir xidmətim yoxdur,
Desəm ki, mənə faydan dəyib,
hələ elə bir fayda da yoxdur.
646 Xidmətin yoxkən sənə hörmət elədim,
Sənə mövqe verdim, sən məni taptadın.

647 Oturarkən altına bir top qoydun,
Adam bunun üstündə oturarmı, düşünsənə.
648 Sənə söz dedim, sözünü dinlədim,
Sən gözünü yumanda, çaşdım qaldım.
649 Bağışladım, yenə sənə xitab etdim,
Bu dəfə də üzünü çevirdin, nə üçün, söylə?
650 Hakimlərin bu sözünü eşitməmisənmi:
"Bəyə yaxın olan, özünü qoru".
651 *Sənə deməyibmi atan və anan*:
"Ey oğul, özünü bəyə tay tutma,
652 Dəstəbaşçısı sənə demədimi,
Bəyini tapdama, başını gözlə?"
653 Bu bəylər oddur, oda yaxınlaşma,
Yaxın getsən, dərhal yanarsan?
654 Qafil olma, bəylər yanar bir oddur,
Kim ona yaxınlaşsa, fəlakət tapar.
655 *Diqqətlə baxsan, bəylər yanar bir oddur,*
Üstünə getsən, başını üzər, qanını sorar.
656 Sənə çox baxsa, baxışından qorx,
Əgər sən qorxmasan, qorxmağa məcbur edər.

## XVI

## AYDOLDU ELİKƏ DÖVLƏTİN VƏSFİNİ BƏYAN EDİR

657 Aydoldu gülərək dedi: – Başa düşdüm,
Sən bunu dedin, mənim də sözümü eşit.
658 Bu işləri mən bilərək etdim,
Gərək sən bunları başa düşəydin.
659 İndi *sənin yanına* gəlişim və etdiklərim
Mənim adətim idi.
660 Sən əvvəlcə mənə yer göstərdin, mən oturmadım,
Mənə yer yoxdur, bunu anla demək istədim.
661 *Topu yerə qoyaraq bu* hərəkətlə
Özümün nəyə bənzədiyimi sənə göstərmək istədim.



662 Düz yerdə top necə yuvarlanırsa,
Səadət də elədir, mən də yuvarlanaram.
663 Sən sevgi ilə baxdın, mən gözümü yumdum,
Sənə necə olduğumu göstərmək istədim.
664 Bu gün mən dövlətəm, korа bənzərəm,
Kim mənə yaxınlaşsa, onu tutaram.
665 Sən təkrar danışdın, mən cavab verdim,
Sən sevərək baxdın, mən üzümü gizlətdim.
666 *Mən sənə öz xasiyyətimi* göstərdim,
Yəni "Mən qərarsızam, mənə inanma" demək istədim.
567 Türkcə bir məsəl var, ona qulaq as,
Gör başı dərdlər çəkmiş ağsaqqal nə deyir:
668 "Ey dövlətli, bu boş dövlətə güvənmə,
Ey adlı-sanlı kişi, taleyə inanma.
669 Axar su, gözəl söz və sərvət durmadan
Dünyanı gəzər, durub dincəlmədən.
670 *Səadətə heç inanma, o vəfasız, dönükdür,*
Yürürkən birdən uçar, ayağı sürüşkəndir".

### ELİKİN AYDOLDUYA SUALI

671 Elik dedi: – Anladım, sözün açıldı,
Günahından keçdim, qurtuldun.
672 İndi mənə söylə, ərdəmin nədir?
Böyük sözlər dedi bu ötkəm dilin.

### AYDOLDUNUN ELİKƏ CAVABI

673 Aydoldu söylədi: – Hünərim çoxdur,
Kimə qismət gəlsə məndən gələr.
674 Xoşxasiyyətəm, yaşım da kiçikdir,
Bütün bəylərə və böyüklərə yol məndən keçir.
675 Üzüm gözəl, təbiətim isə mülayimdir,
Dilədiyim hər şeyə əlim çatar.
676 Özüm harda olsam bütün arzular
Mənimlə birlikdə olar, mənə bağlanar.

677 Rahatlıq məndədir, əziyyət məndən qaçar,
Sevinc məndədir, kədər mənə yol tapmaz.
678 Kim mənə qarşı çıxsa, məhv olub gedər,
Kim mənə boyun əysə, arzuya yetər.
679 Məni vurmaq istəyən, özü vurular,
Məni əzmək istəyən, özü əzilər.
680 İndi buna bənzər bir söz var,
Ağıllı, bilikli adam bunu dinləyib anlar:
681 "Harda xoşbəxtlik olsa, ona boyun əy, özünü bəyəndir,
Dövlətə qarşı çıxsan, cəfa ilə boğuşarsan.
682 Səadət gələndə insan bəxtiyar olar,
Bütün arzularına yetib rahat yaşayar".

## ELİKİN AYDOLDUYA SUALI

683 Elik dedi: bu ərdəmlərini başa düşdüm,
*Qüsurun varını, onu da, de, bilim.*

## AYDOLDUNUN ELİKƏ CAVABI

684 Bu Aydoldu dedi: – Mənə şər atırlar,
Eybim yoxkən, eybi var, – deyirlər.
685 Eybim budur ki, mənə bivəfa deyib,
Bunu adamlara söyləyib, məni pisləyir.
686 Halbuki bivəfalıq mənim qüsurum deyildir,
Mən özümə daima yeni yollar seçirəm.
687 Bütün köhnə şeylər çürümüş olar,
Çürümüş şeylər də üfunət verər.
688 Təzə şey var ikən, əski nə gərək,
Gözəl şey var ikən, pisə nə gərək?
689 Bax, bütün dad təzə şeydədir,
Zövq üçün insan hər zəhmətə qatlaşar.
690 Bu xasiyyətim üçün məni dönük deyə söyərlər,
Mənə bunu qüsur tutarlar.
691 Bir igidin bu haqda çox açıq bir sözü var,
Onun mənası bu dediklərimə şahiddir:



692 "Yaranmış hər bir şey yox olacaqdır,
Yaradan xaliq nə istəsə yaradar.
693 Bu həyat dediyin kimi keçər,
Tutmaq olmaz, qaçar, onu kim tutar?
694 Dövlətə güvənmə, gəldi-gedərdir,
Dövlətə inanma, həm verər, həm alar.
695 Əgər bu dövlət özü dönük olmasaydı,
Bu qut nə gözəl şey olardı, ey quzum".
696 Dövlət gəlib təkrar getməsə idi.
İşıqlanmış gündüz təkrar qaralmazdı.

## ELİKİNİN AYDOLDUYA SUALI

697 Elik dedi: – Səbatsızlığını başa düşdüm,
Çıxıb getmək istəsən, səni necə saxlamaq olar?

## AYDOLDUNUN ELİKƏ CAVABI

698 Aydoldu cavab verdi: – Mənim özüm,
Xasiyyətim keyikə bənzər, qısası.
699 Məni sevən və istəyən asan tapmaz,
Tuta bilməz, tutsa da tez itirər.
700 Əgər kimsə məni özünə bağlasa,
Mən ondan qaçmaram, deyim qısaca.

## ELİKİN AYDOLDUYA SUALI

701 Elik dedi: – Söylə, bağın nədir?
Səni hansı bağla cidarlamalı?

## AYDOLDUNUN ELİKƏ CAVABI

702 Aydoldu dedi: – Məni bağlamaq üçün bir neçə cidar var,
İndi onları nişan verirəm.

703 Məni tutan adam safqəlbli,
Həlim və şirin dilli olmalıdır.
704 Özünü gözləməli, iftira etməməli,
Pis və çirkin işə yaxın durmamalıdır.
705 Yığılmış malı yerində sərf etməli,
Həyatını, işini, rəftarını nizamlamalı,
706 Özündən böyüyə qulluq etməli,
Özündən kiçiyə şirin sözlə xitab etməli,
707 Kişi başqalarına yekəxana yanaşmamalı,
Özündən kiçikləri əzməməli,
708 Yavalıqla eyş-işrətə baş qoşmamalı,
Yavalıqla boş yerə pulunu saçmamalı,
709 Əli və dililə oyuna qarışmamalı,
Rəftarında doğruçul olmalıdır.
710 Dönük bəxtin cidarı bunlardır,
Səadəti bu şəkildə bağlasan, qaçmaz, qalar.
711 Bu sözə şahiddir şairin sözü,
Şairin sözü sözə duz qatmışdır:
712 Dövləti ürkək bir keyik san,
Əgər gəlsə, tut, ayağına cidar vur.
713 İnsan dövləti tuta bilsə, qaçmaz,
Əgər qaçsa, təkrar çətin tutasan.

## ELİKİN AYDOLDUYA CAVABI

714 Elik dedi: – Ey səadət, səni anladım, sevdim,
Ancaq sən məni tərk etmək istəyirsən.
715 Vəfasızlığın və tərəddüdün olmasaydı,
Bu gəlişin çox yaxşı şey olardı.
716 Lakin sən həm qərarsızsan, həm də bivəfa,
Sən vəfa göstər, cəfa etmə.
717 Atadan-anadan daha mehriban olub,
Güləruz göstərib insanı əl üstdə gəzdirərsən.
718 Gün olar, özünü görməzliyə vurub üz çevirərsən,
Rəftarın və sözün bir anda dəyişər.
719 Yığarsan, toplayıb hamısını dağıdarsan,
Əvvəl çağırarsan, gələndə qapını bağlarsan.



## AYDOLDUNUN ELİKƏ CAVABI

720 Bu Aydoldu dedi: – Ey xoşbəxt Elik,
Eybimi, ərdəmimi bütün söylədim.
721 Kim məni tapıb əlində bərk tutmaq istəsə,
Bacarırsa, tutsun, mən öz keyfiyyətlərimi saydım.
722 Məni tutan mənə cidar vurmasa,
Keyik tək qaçaram, kim mənə yetər?
723 Eşit gör təcrübəli qoca nə deyir,
Təcrübəli qocanın sözü sözlərin mayasıdır:
724 Səadət gələr, tuta bilməsən, gedər,
Mal verər, yeyə bilməsən, alar.
725 Qərarsız səadət tapsan, möhkəm tut,
Əgər qorumasan, yenə gedəcək.
726 Səadətə yetmiş kişi ehtiyatlı olmalı,
Bütün pis işlərdən uzaq olmalıdır.
727 Özü təmiz olmadı, doğru yolda olmalı,
Bunun bağı belədir, birdəfəlik bilməlidir.

## ELİKİN AYDOLDUYA SUALI

728 Elik dedi: – Eybini və ərdəmini anladım,
Sənin bu Aydoldu adın nə deməkdir?
729 Bunun mənasını mənə söylə,
Bilib, inanıb, sənə güvənim.

## AYDOLDUNUN ELİKƏ CAVABI

730 Aydoldu söylədi: – Mənim adımı, xasiyyətimi
Hakimlər aya bənzədirlər.
731 Bu ay göydə əvvəl doğanda kiçik görünər,
Gün keçdikcə böyüyər və ucalar.
732 Axır bədirlənib dünyanı işıqlandırır,
Dünya xalqı ondan faydalanır.
733 Böyüyüb ən yüksək nöqtəyə çatar,
Təkrar kiçilər, gözəlliyi azalar.

734 Parlaqlığı azalar, yenə yox olar,
Təkrar kiçilərək doğar və böyüyər.
735 Mənim də xasiyyətim belədir,
Bəzən var oluram, bəzən yox oluram.
736 Əgər düşkünlərə mən xoş üz göstərsəm, üzünə gülsəm,
Onun halı yaxşılaşar, sözün qısası,
737 Varlansa, böyüsə, adı-sanı yayılsa,
Uzaqlaşaram, onun da etibarı gedər.
738 Yenidən dağılar varı-dövləti,
Əhvalı yenə əvvəlki kimi olar.
739 Buna bənzər bir şair sözü var,
Şairin bu sözü biliksiz üçün bir gözdür:
740 "İnsana səadət gəlsə, adı-sanı yayılar,
Ay kimi böyüyər, parlaqlığı artar.
741 Dönük, dəli dövlətə belə bağlama,
O, dolu ay kimidir, yenə kiçilər".
742 Adımın başqa bir mənasını da sənə söyləyim,
İndi bunu da dinlə və mənə inan.
743 Bu ay yerini, evini daim dəyişər,
Yerini dəyişən daim yersiz olar.
744 Ayın bürcü Sərətandır, bu ev fırlanır,
Evi fırlandıqca ay da fırlanır.
745 Bu ay hansı evə girsə, ordan tez çıxar,
Tez çıxdığı üçün də yatdığı yeri yandırar.
747 Gələrəm, gedərəm, irəliyə yüyürərəm,
Dünyanı gəzərəm, mənim üçün yer-yurd yoxdur.
748 Bu mənadan də mənim adım Aydoldudur,
Bilikli bir adam mənə bu adı incəliklə verib.
749 Mən səadətəm, bütün eyib və ərdəmimi
Söylədim, xəstəliyimi və dərmanımı bildirdim.
750 Sözümü sənə açıq dedim, indi inan,
Buraxmaq istəyirsən, burax, tutmaq istəyirsən, tut.

### ELİKİN AYDOLDUYA CAVABI

751 Elik dedi: – Bütün sözlərini eşitdim,
Sözlərin məni aydınlatdı, özünü də bəyəndim.



752 Mən sənin kimi bir insan diləyirdim,
Ey ərlərin başı, Tanrı diləyimi verdi.
753 Tanrı kimi diləyinə qovuşdursa,
O, ona şükür etməlidir.
754 Bu gündən etibarən mən də durmadan
Yorulmadan bunun şükürünü yerinə yetirməliyəm.
755 İndi eşit gör müdrik alim nə demiş,
Özü getmiş, ancaq bizə kitabını yadigar qoymuşdur:
756 "Ey nemət sahibi, şükür qıl,
Şükür qılsan, Tanrı nemətini artırar.
757 Nemət sahibi bəzən özünü unudar,
Ancaq şükür qılsa, nemət ondan üz döndərməz.
758 Az yaxşılığa da çoxlu şükür qıl,
Nemət çox olsa, onun qədrini bil.
759 Şükür qılsan, nemət birə on olar,
Birə on olanda ev malla dolar".

* * *

760 Elik alqış verdi bu Aydolduya,
Dedi: – Gecə-gündüz mənim yanımda ol.
761 Çoxlu mal-mülk verdi, onu çox öydü,
Ona xələt, qızıl və gümüş verdi.
762 Elik hər sözünü ona söylədi,
Ondan məsləhət və bilik istədi.
763 Aydoldu da hörmət görərək
Ona can-başla xidmət elədi.
764 Elik onu çox işdə sınadı,
Onun hamıdan kamil insan olduğunu gördü.

## XVII

### GÜNDOĞDU ELİK AYDOLDUYA ƏDALƏTİN VƏSFLƏRİNİ BƏYAN EDİR

765 Elik bir gün yalqız oturmuşdu,
Evini xəlvət etmişdi, canı sıxılmışdı.

766 Aydoldunu hüzuruna çağırtdırdı,
O gəldi və əl-əl üstə müntəzir dayandı.
767 Elikin qarşısında dayanıb durdu,
Elik bir müddət ona heç nə demədi.
768 Sonra başını qaldırıb onu gördü,
Yaxın gəl, otur deyə işarət elədi.
769 Aydoldu yavaşca oturdu,
Gözlərini yerə dikdi, könlü sınıqdı.
770 Gözünün ucuyla Elikə baxdı,
Elik qaşını çatmış, üzünü büruşdürmüşdü.
771 O gümüş bir taxt üstündə oturmuşdu,
Bu taxt üç ayrı ayaq üzərində dururdu.
772 Əlində böyük bir bıçaq tutmuşdu,
Solunda acı ot, sağında şəkər vardı.
773 Aydoldu onu belə gördükdə
Çox qorxdu və nəfəsi çəkildi.

## ELİKİN AYDOLDUYA SUALI

774 Bir qədər sonra elik başını qaldırdı,
Dilini tərpədib Aydolduya dedi:
775 – Nə üçün lal kimi dayanıb-durubsan?
Görmürsən ki, mən nə haldayam, həm də yalqızam?

## AYDOLDUNUN ELİKƏ CAVABI

776 Aydoldu Elikə dedi: – Ey dövlətli hökmdar,
Mənim danışmağa cəsarətim yoxdur.
777 Bu gün səni kefsiz görürəm,
Ona görə çəkinirəm, ey alim insan.
778 Qara xalqa bilikli alim məsləhət vermişdir:
"Bəylər hirsli olanda onlara yaxınlaşma".
779 Bilikli alim isə daha yaxşı demişdir:
"Bəylər hirslənəndə od və zəhər kimi olurlar".
780 Bəylər hiddətlənib hirsli olanda,
Ey mülayim insan, onlara yaxınlaşma.



781 Bəylər qəzəblənib acıqlı olanda,
Onlara yaxın gəlmə, sənə zərər gələr.
782 Buna bənzər belə söz var,
Onu yadında saxla, özünü qoru:
783 "Bəylər qəzəbli olsa, onlara yaxın gəlmə,
Əgər gəlsən, gözdən düşüb ucuzlaşacaqsan.
784 Bəylər Aslana bənzərlər,
Qəzəblənsələr, başını qopararlar, ey parlaq bilikli".

## ELİKİN AYDOLDUYA SUALI

785 Elik dedi: – Cavab ver görüm,
İndi sən nəyə heyrət elədin?

## AYDOLDUNUN ELİKƏ CAVABI

786 Aydoldu dedi: – Mən ona heyrət etdim ki,
Sənin oturduğun bu gümüş taxt nədir?
787 Sənin oturduğun bu taxt necə taxtdır,
Bunun mənasını mənə izah edərsənmi?
788 İkincisi, əlindəki bu bıçaq nədir?
Gərək bunu da biləm.
789 Üçüncüsü, sağındakı o şəkər nədir?
Solundakı o acı ot nə deməkdir?
790 Baxıb gördüm ki, çox qəzəblisən,
Bunu görüb bəsirətimi itirdim.
791 Bu halını gördükdə qorxdum,
Dilimi açıb söz söyləyə bilmədim.

## XVIII

## GÜNDOĞDU ELİK AYDOLDUYA ƏDALƏTİN VƏSFLƏRİNİN NECƏ OLDUĞUNU BƏYAN EDİR

792 Elik dedi: – Nə demək istədiyini anladım,
Bunların mənasını sənə söyləyim.

793 Səni mən srağagün çağırmışdım,
Sənə hörmətlə yer göstərdim.
794 O qəribə işlərini mənə göstərərək,
Məni qəzəbləndirdin, ancaq özünü yaxşı qurtardın.
795 Mən qəzəbləndim, sən bunu bəyəndin,
Buna dözdüm, bu dəfə də üzünü büzüşdürdün.
796 Sən mənə: – Mən səadətim, məni tanı,
Sənə bunu başa salmaq üçün belə etdim, – dedin.
797 Sən niyə belə etdiyini bir-bir izah elədin,
Mən də hər şeyi açıqca başa düşdüm.
798 Onda mən sənin üzrünü qəbul etdim,
Hünərin nisbətində sənə hörmət etdim.
799 Bu gün mənim özümün xasiyyətimi,
Bütün məziyyətlərimi sənə göstərirəm.
800 Baxıb bil ki, mən doğruluq və qanunam,
Qanunu vəsfləri bunlardır, diqqət elə.
801 Bu üzərində oturduğum taxtın
Üç ayağı var, ey könlümü doyuran.
802 Bütün üçayaqlılar qımıldamazlar,
Üçayaq düz durar, tərpənməz.
803 Əgər üç ayaqdan biri tərpənsə,
O ikisi də oynayar, taxt yıxılar.
804 Üçayaq şeylər düz və sabit durar,
Dördayaq olsa, ayaqlardan biri əyri olar.
805 Düz olan hər şeyin hər tərəfi düzdür, yaxşıdır,
Bax, yaxşı şeyin hər cəhəti gözəldir.
806 Yana yatan hər şey əyridir,
Hər əyrilikdə bir pislik toxumu vardır.
807 Düz olan yana yatsa, durmaz, yıxılar,
O şey ki, düz durur, heç vaxt yanılmaz.
808 Mənim xasiyyətim də beləcə düzdür,
Əgər düz olan əyilsə, qiyamət qopar.
809 Mən işləri doğruluqla həll edirəm,
İnsanları bəy və qul olaraq ayırmıram.
810 Bu iti bıçaq ki, əlimdə durur,
O, biçən və kəsən alətdir.
811 Mən işi bıçaq kimi biçər və kəsərəm,
Haqq axtaran adımın işini uzatmaram.



812 Şəkər isə zülmə uğrayan adam üçündür,
O mənim qapıma gəlib ədalət tapar.
813 O məndən şəkər kimi ayrılar,
Sevincli olar və üzü gülər.
814 Bu acı otu isə o kişilər dadar ki,
Özü zorbadır, ədalətdən qaçandır.
815 Onlar dava edib yanıma gələrlər,
Mən hökm verəndə acı otu çəkib üzlərini bürüşdürərlər.
816 Mənim qaşım çatmağım və qəzəbim,
Qaşqabağım yanıma gələn zalımlar üçündür.
817 İstər oğlum olsun, istərsə yaxın, ya uzaq,
İstər yolçu olsun, istərsə qonaq,
818 Qanun qarşısında hamısı birdir,
Hökm verəndə heç biri məni fərqli görməz.
819 Bu bəyliyin təməli doğruluqdur,
Bəylər doğru olsa, dünya aram tapar.
820 Müdrik adam buna bənzər bir söz deyib,
Kim ona qulaq assa, işi düz gedər:
821 "Bəyliyin təməli ədalətdir,
Ədalət yolu bəyliyin əsasıdır.
822 Bəy ədalətli olsa, ölkənin belə idarə etsə,
Bütün arzu-diləyinə qovuşar".

## AYDOLDUNUN ELİKƏ SUALI

823 Aydoldu dedi: – Ey dövlətli hökmdar,
Hökmdarımızın adı "Gündoğdu" nə deməkdir?

## ELİKİN AYDOLDUYA CAVABI

824 Elik dedi: – Alim mənim təbiətimi
Günəşə bənzədərək bu adı verdi.
825 Günəşə bax, kiçilməz, daim eyni boyda olar,
Parlaqlığı da eyni şəkildə güclüdür.
826 Mənim xasiyyətim də ona bənzəyir,
Doğruluqla doludur, əsla azalmır.

827 İkincisi, gün doğanda, dünya işıqlanar,
Nuru xalqa çatar, özü yox olmaz.
828 Mənim də hökmüm elədir, mən yoxa çıxmaram,
Hərəkətim və sözüm bütün xalq üçün eynidir.
829 Üçüncüsü, günəş doğanda yerə istilik gələr,
O zaman minlərcə rəngdə çiçək açılar.
830 Mənim bu qanunum hansı elə çatsa,
O el başdan-başa daş-qaya olsa da, düzənə çevrilər.
831 Günəş doğar, kirli və təmizə fərq qoymadan,
Hər şeyi işıqlandırar, öz nuru azalmaz.
832 Mənim də təbiətim elədir,
Hamı məndən öz payını alar.
833 Həm də bu günəşin bürcü sabitdir,
O, sabit olduğu üçün təməli də möhkəmdir.
834 Günəşin bürcü Aslandır, o bürc tərpənməz,
Ona görə də evi pozulmaz.
835 Mənim xasiyyətimə və hərəkətimə bax,
Mənim nurum, işığım da qətiyyən dəyişməz.

## AYDOLDUNUN ELİKƏ SUALI

836 Aydoldu söylədi: – Xoşbəxt hökmdar,
Dünyanı, elləri tut, adın yayılsın.
837 Mən də bu uzun yolları yoraraq
Əziyyətlə, yorularaq sənin yanına gəldim.
838 Bu təbiət və fəzilətlərimdən dolayı
Böyük bir diləklə sənin xidmətinə gəldim.
839 Mənə söylə, sənə necə xidmət edim,
Səni sevindirmək üçün necə hərəkət edim?
840 Xidmət bəyin ürəyincə olmasa,
Nə qədər zəhmət çəkilsə də məqbul sayılmaz.
841 Eşit gör nə deyir İla ölkəsinin
Xidmətdə ad-san qazanmış qüdrətli şəxsiyyəti:
842 "Bəyinə xidmət edən xidmətçi
Onu sevindirəcək yolla yürüməlidir.
843 Bəyi razı salacaq şəkildə xidmət et,
Xidmət bəyi razı salsa, iqbal qapısı açılar.



844 Xidmətçi xidməti bacarsa dörə keçər,
Bacarmasa isə dördən astanaya düşər.
845 Xidmətçi qul öz bəyini çox sevindirsə,
O qula hörmət qapısı açılar".

## ELİKİN AYDOLDUYA CAVABI

846 Elik dedi: – Anladım indi sənin özünü,
Məni razı salmağa çalış, özünü topla.
847 Səndə çatışmayanları sənə söyləyim,
Qüsurlara yaxınlaşma, təmiz olmağa çalış.
848 Mənim tablamadığım şeylərdən biri yalandır,
Bundan sonra zülmkarlar gəlir.
849 Sonra hərislər və bədəməllər,
Tələskənlər və acgözlər gəlir.
850 Hər işdə qəzəb göstərənlər,
İçki düşkünləri və oğrular, quldurlar,
851 Bu cürə kişilər yaramaz mənə,
Açıqca söylədim bunları sənə.
852 Sən mənim xoşuma gəlmək istəsən,
Bu şeylərdən uzaq ol, ey adlı insan.
853 Beləliklə, sən hər gün mənə daha yaxın olacaqsan,
Mənim sənə etibarım və hörmətim artacaq.

## AYDOLDUNUN ELİKƏ SUALI

854 Aydoldu söylədi: – Eşitdim bunu,
Daha bir sözüm var, cavab ver ona.
855 Yaxşılıq necədir, nə deyən şeydir?
Yaxşının halı və tinəti necə olur?

## ELİKİN AYDOLDUYA CAVABI

856 Elik dedi: – Yaxşının vəsfi faydalı olmaqdır,
Onun xalqa çox xeyiri dəyər.

[857] O xalqa həmişə yaxşılıq edər,
Ancaq sonra adama minnət qoymaz.
[858] Öz xeyirini düşünməz, başqasının xeyirini düşünər,
Bunun əvəzində xeyir gözləməz.

## AYDOLDUNUN ELİKƏ SUALI

[859] Aydoldu dedi: – Bu sözü başa düşdüm,
Daha bir sualım da var.
[860] Mənə doğruluğu başa sal, doğru olan nədir?
İnsan onunla qəlbini necə işıqlandırır?
[861] Hansı yola doğruluq yolu deyilir?
Bu doğruluğun mahiyyəti nədir?

## ELİKİN AYDOLDUYA CAVABI

[862] Elik dedi: – Doğru ər odur ki,
Düşündüyü ilə söylədiyi bir olsun.
[863] Onun içi dışı kimi, dışı isə içi kimidir,
Doğru və dürüst insan belə olur.
[864] İnsan könlünü çıxarıb ovcuna qoyaraq
Adamların qarşısında utanmadan gəzə bilməlidir.
[865] Səadətin yüksəlməsi üçün insana doğruluq lazımdır,
İnsanlıq doğruluğun adıdır, buna inan.
[866] İnsan nadir deyildir, insanlıq nadirdir,
İnsan az deyil, doğruluq azdır.
[867] Bax, sənə söylədim bu sözə bənzər
Bir sözü də şair söyləmişdir:
[868] Gəzib-görən insan lap çoxdur
Mənə ancaq doğru, dürüst insanlar əzizdir.
[869] İnsan nadir deyil, insanlıq nadirdir,
Doğru insanları ağıl öymüşdür.



## AYDOLDUNUN ELİKƏ SUALI

[870] Aydoldu yenə dedi: – Ey dövlətli hökmdar,
İndi də mənə bu sözün sirrini aç.
[871] Bu yaxşı kişilər pis olarmı?
Pislər də bir gün yaxşı olarmı?

## ELİKİN AYDOLDUYA CAVABI

[872] Elik dedi: – Yaxşı insan iki cür olar,
Ondan biri doğruluq yolunu doğrudan tutar.
[873] Biri anadangəlmə yaxşı olar,
Doğru və dürüst həyat sürər.
[874] Biri də təqlid yolu ilə yaxşı olar,
Pis adama uysa, pislik edər.
[875] Pis adam özü də iki cürdür,
Onların ikisini də eyni dərəcədə pis sayma.
[876] Onlardan biri anadangəlmə pisdir,
Dünya xalqı ondan fayda görər.
[877] Digəri isə təqlid yolu ilə pis olar,
Dostu yaxşı olsa, doğruluq yoluna girər.
[878] Anadangəlmə yaxşı olandan həmişə yaxşılıq gələr,
Dünya xalqı ondan fayda görər.
[879] Əzəldən pis olanın islahına çarə yoxdur,
O, dünya üçün bəla, xalq üçün fəlakətdir.
[880] Buna bənzər türkcə bir məsəl var,
Onu eşit, anla, mahiyyətinə var:
[881] "Əgər yaxşılıq ananın ağ südü ilə insan ruhuna girsə,
O ölənə qədər doğru yoldan çıxmaz".
[882] İnsanın ruhuna işləmiş əxlaq
Ancaq ölümlə pozular.
[883] Ana qarnında yaranan tərbiyə
Ancaq qara yer altında insanı tərk edər, ey müdrik insan.
[884] Yaxşının bir pis yoldaşı olsa,
Yaxşının təbiəti də pis olar.
[885] Pis də yaxşı ilə oturub-dursa,
Yaxşılığa çatmaq üçün çıraq tapar.

886 Pis və yaxşı insanların bu yola girmələrinin səbəbi
Pis və yaxşı adamlarla dostluq etmələridir.
887 Bəy yaxşı olsa, xalq da ona itaət edər,
Yaxşı və gözəl rəftara çatar.
888 Bəylər yaxşı insanları özlərinə yaxın tutsalar,
Pislər də yaxşı hərəkət edərlər.
889 Bəylərin ətrafına pis adamlar yığılsa,
Elə pis adamlar hakim olarlar.
890 Pislər baş aparsa, yaxşılar itib-batar,
Yaxşı əl hakim olsa, pislər ortadan çıxar.
891 Əgər bəylər yaxşı olsalar,
Onların eli-günü də yaxşı olar.
892 Bəylər pis olmadıqca
O eldə pislərin üzü sevinclə parlamaz,
893 Gözəl qanun vermiş bəylərdən biri:
"Pisə qarşı ən yaxşı çarə qırmanc və zindandır".
894 Əgər yaxşı olsa elin başçısı,
Yaxşı olacaqdır onun işçisi.
895 Əgər bəylər yaxşı olsalar
Xalqı varlanar, dünya düzələr.

## AYDOLDUNUN ELİKƏ SUALI

896 Aydoldu yenə dedi: – Bunu anladım,
Elik bu sözləri doğru söylədi.
897 Bu yaxşını insan yaxşı kimi tanıyar,
Faydalı olduğu üçün edilməsini istəyər.
898 Onu hamı sevər, dilər, arzular,
Ancaq istəyənlər bu yaxşını necə əldə edərlər?

## ELİKİN AYDOLDUYA CAVABI

899 Elik dedi: – Yaxşı seçilmiş şeydir,
Seçilmiş şeyi seçilmiş adam istər.
900 Seçilmiş olan şey dəyərlidirsə,
Onu gerçəkləşdirmək bir o qədər çətindir.



901 Pislik dəyərsiz bir şey olduğu üçün
Onu dəyərsizlər edər, pis iş ucuzdur, pisdir.
902 Hansı iş dəyərsizdirsə, eləcə yerdə qalar,
İpək qumaşlar isə dördə yer tutar.
903 Yaxşı yoxuşa çıxmaq kimidir, çətindir,
Pis isə enişə enmək kimi asandır.
904 Ağıl buna bənzər bir söz söyləmişdir,
Ağlın sözünü eşitmək fayda gətirər:
905 Yaxşı yoxuşa çıxmaq kimidir, hamı çıxa bilməz,
Kal insan bu işi bacara bilməz.
906 Dəyərli şeyi yaratmaq çətindir,
Biliksiz və dəyərsiz adam üçün, xüsusilə, çətindir.

## AYDOLDUNUN ELİKƏ SUALI

907 Aydoldu dedi: – Ey dövlətli Elik,
Yaxşı bu dərəcədə şöhrət qazanmışdır,
908 Onda insanın tapa biləcəyi bir qüsur varmı?
Ağıl bunu anlar və nə olduğunu başa düşərmi?

## ELİKİN AYDOLDUYA CAVABI

909 Elik dedi: – Yaxşını həmişə öyürlər,
Pislər onda bu nöqsanları taparlar.
910 İnsan insana həmişə yaxın yaşayar,
Pis olmasa, yaxşıya iş tapılmaz.
911 Bu savaşda zəif olduqları üçün
Pislər yaxşının gününü qaranlıq istərlər.
912 Kim yaxşılıq istəsə, yaxşılıq edər,
Savaşa və zəifliyə baxmaz.
913 Kim bu gün rahatlığını istəsə,
O, pislik edər, sabah qayğı çəkər.
914 Yaxşılıq edən insan nə demiş, eşit:
Daim yaxşılıq et, qoy o sənin yol yoldaşın olsun.
915 Yaxşılıqdan bu gün sənə zərər dəyməz,
İnan ki, onun sabah sənə xeyiri dəyər.

916 Bu gün pislik sənə xeyirli görünsə belə,
Sabah onun zərərini görəcəksən, bunu bil.
917 Yaxşılıq sağdırsa, pislik də soldur,
Solda cəhənnəm var, sağdasa cənnət.
918 Bu gün pis nə qədər rahat olsa da,
Sabah o qədər peşmançılıq və əzab çəkər.
919 Yaxşı insan nə qədər zəif olsa da,
Sabah peşman olmaz, rahat olar.
920 Həqiqət bil bunu, ey Aydoldu sən,
Dünyadan yaxşı adla köçsəm, peşman olmaram.
921 Doğru insanın dili nə gözəl söz söyləmiş,
Doğru ərin dili sözə təməldir:
922 "Qoy pis səni istədiyi qədər pisləsin,
Ey yaxşı, mən səni diləyərək axtararam".
923 Ey yaxşı, de görüm, kim səndən doyar?
Bəri gəl, indi mən sənə acam.
924 Yaxşı kişi nə qədər zəif olursa-olsun, razıyam,
Kaş ki, mən onun yoldaşı olum.
925 Bəylik mənə pisliklə yetişəcəksə, istəməm,
O bəyliyi mən sənə bağışlayaram.
926 İnsanın təbiəti pisdir, bunu gözümlə görürəm,
Bax, rahatlığı az, peşmançılığı uzundur.
927 Şairin buna bənzər bir sözü vardır,
Oxusan, anlarsan, gözün iti olar:
928 "Bax, hansı yaxşı yaxşılığı üçün peşman olub,
Pis nə qədər adlı-sanlı olsa da, axırda peşman olar".
929 Pislik etsən, cavabı peşmançılıqdır,
Pisin acığına həmişə yaxşılıq et.
930 Mən necə öyüm pis kişini,
Pis yoldaşı necə arzu edim?
931 Abdallıq, qabalıq, yavalıq bütün
Pislərin əməlidir, ey ulu insan.
932 Bəla, möhnət, zəhmət, peşmançılıq və kədər,
Hamısı pisliyin əvəzidir, ey igid.
933 Bu yaxşı kişini necə sevməli,
Bu yaxşı işi necə öyməli,
934 Comərdlik insanlıq, xeyir və yaxşılığın
Hamısının yaxşı insandan gəldiyi şübhəsizdir.



935 Yaxşı insan dostların ən yaxşısıdır,
Yaxşı iş işlərin ən yaxşısıdır.
936 Yoldaşın yaxşı olsa, nə istəsən istə,
Yolu tapmaq üçün yaxşı yoldaş gərəkdir.
937 Rahatlıq, arzu, nemət təhlükəsizlik,
Bu sevinc, bu nəşə yaxşılığın əvəzidir.

* * *

938 Elik dedi: – Ey Aydoldu, sualına
Cavabım bunlardır, anla.

## AYDOLDUNUN ELİKƏ CAVABI

939 Aydoldu yeri öpdü, ayağa qalxdı,
Dedi: – Ey əziz iqbal, ey gözəl qanun.
940 Dünya qüdrətini buldun, yaşın uzun olsun,
Rahatlıq və yaxşılıq içində başın sağ olsun.
941 Bəyliyin və böyüklüyün pozulmasın,
Ömrün rahatlıq və sevinclə keçsin.
942 Ululuqla çoxlu elə sahib ol,
Bu qüdrətlə bəyliyin təməli bərk olsun.
943 Axıb-gəlsin arzun, qurumaz olsun,
Dövlətin qarımaz olub qapında dursun.
944 Bütün sevinclərin hamısı sənə gəlsin,
Düşmən paxıllıqla əriyib ölsün.
945 Sən hamının xidmətinə layiqsən,
Layiqliyə xidmət edənə səadət qapısı açılar.
946 Eşit gör, xidmət etmiş ər,
Xidmətlə arzu-dilək tapmış ər nə deyir:
947 "Xidmət etmə, etsən də layiqliyə et,
Layiqli bəy xidmətçinin haqqını bilər.
948 Xidmət etmə, etsən də səxavətliyə et.
Bil ki, onun evi qızıl, qapısı gümüşdür.
949 Xəsisə xidmət etmə, ey xidmətçi insan,
Yoxsa həyatın boş keçər, özün də pis olarsan".

950 Xəsis öz malını özünə də əsirgəyər,
Belə adam başqasının haqqını verərmi, söylə?

* * *

951 Aydoldu sözünü burda kəsdi, hüzurdan çıxdı,
Sevinc içində evinə üz tutdu.
952 Özünə qıymadan xidmətə başladı,
Nə gündüz oturdu, nə gecə yatdı.
953 Həqiqət və səmimiyyətlə çalışdı,
Elik onu gündən-günə özünə yaxın tutdu.
954 Bu minvalla bir müddət keçdi,
Aydoldu xidmətilə hamını razı saldı.

## XIX

## AYDOLDU ELİKƏ DİLİN ƏRDƏMİNİ SÖZÜN FAYDALARINI BƏYAN EDİR

955 Elik bir gün Aydoldunu çağırdı,
Yer göstərib "otur" deyə işarə etdi.
956 Aydoldu yavaşca və ədəblə oturdu,
Gözünü yerə dikib dilini qısdı.

### ELİKİN AYDOLDUYA SUALI

957 Elik dedi: – Ey Aydoldu, danış,
Niyə susursan, sənə nə oldu?

### AYDOLDUNUN ELİKƏ CAVABI

958 Aydoldu söylədi: – Ey bəylər bəyi,
Qul bəyin üzünü görüncə özünü itirir.



959 Elik öz sözünü buyurmadı,
O soruşmasa, mən nə deyim?
960 Biliklinin sözünü dinlə, etiraz etmə,
Səndən soruşmasalar, sözə başlama.
961 Əgər birini istəyib çağırsalar,
Sözə də birinci çağıran başlamalıdır.
962 Soruşulmadan sözə başlayan adama
Biri heyvan desə, haqlı olar.
963 Bil ki, bəylərin hüzurunda soruşulmadan danışan
Dəli və axmaq adamdır.
964 Qızıl dil sənin ömrünü qısaldar,
Salamat olmaq diləsən, onu qıs.
965 Dilini kəsən adam, eşit gör nə deyir:
"Kim özünə hakimdirsə, o, salamat olar".
966 Qara başın yağısı qızıl dildir,
O neçə baş yeyib, yenə də yeyir.
967 Başını qurtarmaq istəsən, dilini qoru,
Dilin hər gün başına bəla aça bilər.

### ELİKİN AYDOLDUYA CAVABI

968 Elik dedi: – Sözünü tamamilə anladım,
Ancaq canlı adam danışmasa da olmaz.
969 Bil ki, ancaq iki adam danışmaz,
Biri biliksiz, biri isə lal.
670 Lalın dili danışa bilməz.
Biliksizin dili sözünü gizləyə bilməz.
971 Biliksizin dili daim bağlı olmalıdır,
Bilikli isə dilinin hakimi olmalıdır.
972 Biliklinin sözü torpaq üçün su kimidir,
Su axsa, torpaqdan nemət çıxar.
973 Bilikli insanın sözü əskilməz,
Axan duru bulağın suyu kəsilməz.
974 Alimlər suyu yerlərə bənzərlər,
Haraya ayaq bassalar, ordan su çıxar.
975 Biliksiz insanın könlü qumsallıq kimidir,
Oraya çay axsa, dolmaz, orda ot və yem bitməz.

## AYDOLDUNUN ELİKƏ CAVABI

976 Aydoldu yenə dedi: – Elik bilir ki,
Dildən elə zərər dəyə bilər ki, insan həyatını itirər.
977 İnsan ömrü boyu bilməz,
Lazım olduğunu söyləyər, gizləməz.
978 Bir şey soruşsalar, danışmalıdır,
Soruşmasalar, ağzını açmamalıdır.
979 Ey Elik, soruşmaq erkəkdir,
Cavab vermək isə dişidir.
980 Dişi üçün bir erkək ər olar,
Əgər doğulsa, bunlardan iki uşaq doğular.

## ELİKİN AYDOLDUYA SUALI

981 Elik dedi: – Anladım, sözlərin tamam doğrudur,
Səndən soruşacağım başqa bir söz də var.
982 Dilin zərərini söylədin, eşitdim,
Onun xeyiri varmı, onu da söylə.
983 Əgər dilin zərərindən qorxub danışmasan,
Onun xeyiri haqqındakı sözün də faydasız qalar.

## AYDOLDUNUN ELİKƏ CAVABI

984 Aydoldu söylədi: – Dilin xeyiri çoxdur,
Əgər dilim dönsə, söyləyərəm.
985 Yava söz biliksiz dilindən çıxar,
Alim biliksizə heyvan deyər.
986 Boş və hərzə danışan qara təbiətlidir,
Onun qara başını da boş sözü yeyər.
987 Yava sözün Adama çox ziyanı var,
Söz yerində söylənsə, faydalı olar.
988 Avamın qarnı doysa, öküz kimi yatar,
Boş sözlərlə ovunar və kökələr.
989 Sadəcə yeyib yatan heyvandır,
Bu heyvan dediyim də onun təbiətidir.



990 Biliklilər öz bədənlərini zəiflədərlər,
Biliklə ovunar, ruhlarını bəslərlər.
991 Bədənin qisməti boğazdan girər,
Ruhun qisməti isə doğru sözdür, qulaqdan girər.
992 Bax, biliyin iki əlaməti var,
Bu iki şeylə insan bəxtiyar olar.
993 Bunlardan biri dildir, digəri boğaz,
Bu ikisinə hakim olan çox xeyir görər.
994 Biliklinin dilinə və boğazına hakim olması gərəkdir,
Boğazını, dilini gözləyən bilikliyə ehtiyac var.

## ELİKİN AYDOLDUYA SUALI

995 Elik dedi: – Anladım; bu söz bəllidir,
Sözün əsli, əsası nədir, o neçə qismə ayrılır?
996 Söz haradan çıxır, haraya gedir?
Ey bilən adam, bunu da mənə izah et.
997 Sözün miqdarını nə söyləməli, nə də söyləməməli,
Bilikli və ağıllı hakim bu barədə nə deyir?

## AYDOLDUNUN ELİKƏ CAVABI

998 Aydoldu söylədi: – Sözün yeri sirdir,
On cürə söz var, tək biri söylənməlidir.
999 Birini söyləmək olar, doqquzu yasaqdır,
Yasaq sözlərin hamısı əslində fənadır.

## ELİKİN AYDOLDUYA SUALI

1000 Elik yenə dedi: – Sözün neçə faydası var,
Zərəri nə qədərdir, onu mənə söylə.

## AYDOLDUNUN ELİKƏ CAVABI

1001 Aydoldu dedi: – Sözün faydası uludur,
Yerinə düşərsə, qulu böyüdər.

1002 Bax, sözün xeyiri ilə qara yerdəki
Yaşıl göyə ucalar, dörə keçər.
1003 Əgər dil sözü bacarmasa,
Mavi göydə olanı yerə endirər.

## ELİKİN AYDOLDUYA SUALI

1004 Elik yenə dedi: – Sözün miqdarı nə qədərdir?
Nə vaxt az, nə vaxt çox sayılır? Bunu de.

## AYDOLDUNUN ELİKƏ CAVABI

1005 Aydoldu söylədi: – Çox söz odur ki,
Soruşmadan söylənib insanı usandırır.
1006 Az söz isə soruşulan zaman söylənən,
Bir sözə cavab olan sözdür.
1007 Dilini gözəl sözlə bəzəyən və onun üzünü açan
Şair bu barədə belə bir söz deyib:
1008 Sözü yaxşı, gözəl düşünüb söylə,
Ancaq soruşulanda de və qısa elə.
1009 Çox söz eşit, özün çox danışma,
Sözü ağılla söylə, biliklə bəzə.

## ELİKİN AYDOLDUYA SUALI

1010 Elik dedi: – Anladım bu sözü də,
Bir sözüm də var, ona cavab ver.
1011 Doğru sözü kimdən eşitməli,
Sözü kimə söyləməli, bunu mənə de.

## AYDOLDUNUN ELİKƏ CAVABI

1012 Aydoldu dedi: – Sözü biləndən
Eşidib bilməyənə söyləməli.



1013 Gərəkli sözü uludan dinləməli,
Əməl etsinlər deyə kiçiklərə söyləməli.
1014 Çox dinləməli, ancaq bir-bir söyləməli,
Bilikli hakim mənə belə demişdir.
1015 Çox danışmaqla insan alim olmaz,
Çox eşidən alim başa keçər.
1016 İnsan lal da olsa, bilikli ola bilər,
Ancaq kar olsa, biliyə əli çatmaz.

## ELİKİN AYDOLDUYA SUALI

1017 Elik dedi: – Bunu da bildim,
Bir sualım da var, onu da soruşum.
1018 Dili susdurmalı, yoxsa danışdırmalı?
Sözü açmaq, yoxsa gizləmək yaxşıdır?

## AYDOLDUNUN ELİKƏ CAVABI

1019 Aydoldu söylədi: – Eşitsin Elik,
Dillə söylənməsə, bilik eləcə qalar.
1020 Dili yalnız söymək olmaz, öymək də lazımdır,
Sözün də öyüləcək və söyüləcək tərəfləri var.
1021 Bütün canlılar və məxluqat
Tanrının birliyinə dillə şəhadət gətirir.
1022 Yaratdı min-min xəlayiqi o,
Onlar Tanrını dillə öyərlər.
1023 Bədən sahibi insana bunlar lazımdır:
Biri dil və söz, biri də könül.
1024 Tanrı dili və könülü söz üçün yaratdı,
Sözü əyri olanları zorla oda atarlar.
1025 Doğru sözün xeyiri çoxdur,
Əyri söz isə həmişə söyüşdür.
1026 Doğru söyləyəcəksənsə, dilin tərpənsin,
Sözün əyridirsə, onu gizlə.
1027 Dili söyləməyən kişiyə lal deyərlər,
Çox danışana isə yanşaqbaşı deyərlər.

1028 İnsanın ucuzu yanşaq olanı,
İnsanların hörmətlisi isə comərd olanıdır.

* * *

1029 Elik bu sözləri eşitdi və sevindi,
Gözlərini göyə tutdu, əlini qaldırdı.
1030 Tanrıya çox şükür etdi, onu öydü,
Dedi: – Ey rəbbim, sən mərhəmətlisən, əzizsən.
1031 Mənə bütün yaxşılıqlar səndən gəldi,
Mən sənin günahkar və qüsurlu qulunam.
1032 Rahatlıq, dünya, dövlət və hər cür yaxşılıqları
Bütün dilək və arzularımı verdin.
1033 Bu ehsanlara şükür etməkdə mən acizəm.
Ey əsil olan, bunun şükürünü özünə sən özün qıl.

* * *

1034 Sözünü kəsdi, xəzinənin ağzını açdı,
Fəqirə, yoxsula çoxlu mal saçdı.
1035 Elik Aydolduya çoxlu xələt verdi,
Dililə tərif, əlilə ehsan verdi.
1036 Ona vəzirlik ünvanı, möhür[1]
Bayraq[2], davul[3] və zireh[4] verdi.
1037 Bütün el üstündə ona hakimiyyət verdi,
Düşmən boyun əyib, ortadan çıxdı.
1038 Aydoldu bütün işləri yoluna qoydu,
Bu iqbal çağında bir çox işlər elədi.
1039 Xalq qurtuldu, əziyyət qurtardı,
Xalqın dili Elikə dualar qıldı.
1040 Xalq qurtuldu, əziyyət qurtardı,
Quzu ilə qurd birlikdə yaşadı.

[1] Orijinalı «tamğa», yəni damğadır.
[2] Orijinalı «tuğ»dur.
[3] Orijinalı «kövrük», yəni nağaradır.
[4] Orijinalı «quyaq»dır, zirehli qalxan deməkdir. İlk üç sözə «Divan»da və «Kitabi-Dədə Qorqud»da, Orxon-Yenisey abidələrində isə hamısına rast gəlmək olar.



1041 Elin nizamı artdı, qanunu möhkəmləndi,
Elikin dövləti gündən-günə artdı.
1042 Bir müddət belə asayiş və nizam içində keçdi,
Elin və xalqın işi sahmana düşdü.
1043 Ölkədə yeni şəhər və kəndlər salındı,
Elikin xəzinəsi qızıl və gümüşlə doldu.
1044 Elik sevindi, özü rahat oldu,
Bax, adı-sözü dünyaya yayıldı.

## XX

## SƏADƏTİN MÜVƏQQƏTİLİYİNİ VƏ DÖVLƏTİN VƏFASIZLIĞINI BƏYAN EDİR

1045 Aydoldu arzu-diləyə yetdiyi zaman,
Süreksiz səadət qarıdı, ona arxa-kömək olan şeyləri yıxdı.
1046 Bilikli hakim buna bənzər bir söz söyləmişdir:
Nemət çox olanda yeməyə heç nə tapılmaz.
1047 Bu haqda alimin bir sözü də var:
Nemət bol olsa, ömür də tükənər.
1048 Enən yüksələr, yüksələn enər,
Yorulan durar, parlayan sönər.
1049 Hər şey öz tərəqqisini gözlər,
Tərəqqiyə çatıb tənəzzülə başlar.
1051 Bu Aydoldu hər diləyinə çatdı,
Ömrünü tamamladı, çoxlu malı-mülkü qaldı.
1052 Bədirlənmiş ay təkrar kiçilməyə üz qoydu,
Parlaq yazı sərt qışa döndü.
1053 Ahəngli ünsürlər qarışdığı üçün,
Biri güc göstərib digərini basdığı üçün,
1054 Ünsürlərin vəziyyəti dəyişdi, yeyəcəyi çiy oldu,
Könlü sıxıldı, ağır xəstəliyə tutuldu.
1055 Ünsürlər pozuldu, gücü azaldı,
Dik qaməti yaş söyüd tək əyildi.
1056 Ağır xəstəlik gəlib onu yerə sərdi,
Acılar içində inləyərək yatağa düşdü.

1057 Təbiblər yığışıb nəbzini tutdular,
Bu xəstəlik, ağrı nə imiş, onu dedilər.
1058 Biri dedi: – İndi bunu qan tutub,
Damarını açıb qan almaq gərəkdir.
1059 Biri isə: – İshal dərmanı içirməli, qəbz olub,
İndi onu boşaltmaq gərəkdir, – dedi.
1060 Biri şərbət hazırlayıb gülab qatdı,
O biri gərəkli şərab hazırlayıb verdi.
1061 Dərman-dava qalmadı, hamısını etdilər,
Nə lazımsa, düzəldib verdilər.
1062 xeyiri olmadı, xəstəliyi gündən-günə artdı,
Gücü azaldı, getdikcə şüurunu itirdi.
1063 İbadət sahibi olan kişi gör nə demişdir,
Onlar daim insanların başıdır.
1064 İstər şəlisə qat, istər tiryək düzəlt,
İstər matridus qarışdır, istər ishal dərmanı ver.
1065 İstər təbib gətir, istərsə də qam,
Öləcək adama dava-dərman xeyir verməz.
1066 Ey həyatda olan, qəflətə uyma ki, bu gün dirisən,
Diri olsan da, bir gün hökmən öləcəksən.

* * *

1067 Elik Aydoldunun bu halını eşitdi,
Bildi ki, ölüm xəstəliyi onu ələ keçirmişdir.
1068 Elik Aydoldunun yanına gəldi,
Gəlib onun yataqdakı halını gördü.

## ELİKİN AYDOLDUYA SUALI

1069 Elik soruşdu: – Könlün necədir?
Xəstəliyin nədir, yuxun necədir?

## AYDOLDUNUN ELİKƏ CAVABI

1070 Aydoldu söylədi: – Ey qutlu Elik,
Məni çarəsiz bir xəstəlik tutub.



1071 Ayım bədirlənmişdi, indi kiçildi,
Şəklim gözəl idi, indi o gözəllik əldən gedir.
1072 Günəşim sevinc içində doğardı,
İndi batır, gecəm daha aydınlaşmaz.
1073 Güvəndiyim dirilik artıq yox olur,
Dönük dünya məndən üz çevirdi.
1074 Sevinc, arzu və nemət geridə qaldı,
Əndişə, qayğı və möhnətə tərəf gedirəm.
1075 Bu gün səndən ayrılaram,
Peşmançılıq və əzabla gedirəm.
1076 Xalqın başçısı, insanların ən yaxşısı.
Hakim el boyi nə demiş, dinlə:
1077 Nə yaxşı olardı, dövlət gələydi,
İnsan diləyə çatdıqdan sonra yenə getməyəydi.
1078 Bəylik işi nə yaxşı olardı,
Ölüm olmasaydı, insan baqi qalsaydı.
1079 Bu gənclik günləri nə xoş olardı,
İnsan qarımayıb eləcə qalsaydı.

## ELİKİN AYDOLDUYA CAVABI

1080 Elik dedi: – Ey Aydoldu, bu sözləri burax,
Ey könlü düz, bu sözləri söyləmə.
1081 Bax, adam xəstələnər də, yaxşılaşar da,
Ey qüdrətli insan, bu xəstəlik təkcə səndən ötrü deyil.
1082 Dilinə yaraşmayan bu sözlər nədir?
Niyə özün öz könlünü pozursan?
1083 Mən həyatda səninlə təsəlli tapırdım,
Sözün dəyişdi, məni kədərləndirirsən.
1084 Tanrı sağaldar, bu sözləri söyləmə,
Bu sözlərlə könlümə atəşdən düyün vurma.

## AYDOLDUNUN ELİKƏ CAVABI

1085 Aydoldu söylədi: – Ey dövlətli Elik,
Bu dərdə dəva yoxdur, dərman axtarma.

1086 Doğulan hər kəs ölməlidir,
Yüksələn hər şey enməlidir.
1087 Hər yoxuşun bir enişi, hər təpənin bir dərəsi,
Hər sevincin bir kədəri, hər acının bir dadı var.
1088 Bu sözü vaxtilə söyləmişdim ki,
Mən dönük xasiyyətli və mütərəddidəm.
1089 Mən sənə öz xasiyyətimi bildirmişdim,
Gərək mənə bel bağlamayaydın.
1090 Mən gedirəm, sən buna şübhə etmə,
Doğulan ölməz desələr, inanma.
1091 Sənə inanmaq olmaz deyə məni indi söymə,
Dünyaya da inanma, o səni də qoyub gedəcək.
1092 Cəfa qıldı deyə məni pisləmə,
Bu dünya sənə qarşı məndən daha cəfaçıdır.
1093 Qafil olma, məndən sonra sən də öləcəksən,
Bu dünyaya inanma, ona əsla güvənmə.
1094 Mən sənə xidmət etmədən də sən mənə hörmət etdin,
Sənə yaxşı xidmət edə bilmədim, ey Elik.
1095 Mənim ölümüm öz diləyimlə deyil,
Gəlib-getmək təkcə bu günün işi deyil.
1096 İstəmədən, məndən asılı olmadan gedirəm,
Sağ qalmağa, qurtulmağa yerim yoxdur.
1097 Yox idim, o məni yaratdı, yetirdi,
Kiçik oğlan idim, məni böyütdü.
1098 Yalın üzlü idim, saqqal bitirdi,
Qara quzğun idim, məni ağ qu etdi.
1099 Qamətim ox kimi idi, əyildi.
Ömrüm tükəndi, vaxtım gəldi.
1100 Biliyi geniş hakim, gör nə gözəl deyib,
Ey xoşbəxt insan, sən bunu dinlə:
1101 Başında qu rəngi olan insan çalışmalıdır ki,
Könlü də qu kimi ağ olsun.
1102 Kimin fidan boyu əyri olsa, əyilsə,
Onun könlünü doğrultmağın vaxtı çatıb.
1103 Qara saç, saqqal ağaranda
Ölümün pusqusuna hazır olmalıdır.
1104 Şair buna bənzər bir söz deyib,
Ey gözəl insan, sən bunu dinlə.



1105 Qara saçın ağarması ölümə işarədir,
O, diri adama diriliyin qiymətli olduğunu bildirir.
1106 Çox minnət çəkdin və həyatın dadını gördün,
Unutma ki, tezliklə ölüm səni də yeyəcək.

## ELİKİN AYDOLDUYA CAVABI

1107 Elik dedi: – Ey Aydoldu, tələsmə hələ,
Xəstəlik sabah günahların girovu olacaq.
1108 Əgər bütün xəstələr ölsəydilər,
Dünyada ruzi yeyən kişi qalmazdı.
1109 Tanrı bu xəstəlikdən səni qurtarar,
Könlünü sıxma, bir az nikbin ol.

* * *

1110 Bax, Elik dil açaraq dua qıldı,
Əlini qaldıraraq Allahdan şəfa dilədi.
1111 Oradan durub qayğılı, qəmli çıxdı,
Könlü qırıq halda gəlib saraya girdi.
1112 Fəqirlərə sədəqə kimi çoxlu mal payladı,
Bəlkə ona xeyiri dəydi deyə düşündü.
1113 Ölümə qarşı gümüşün xeyiri olsaydı,
İnsan gümüşü özünə fidyə edərdi.
1114 İnsan ölümə qarşı fidyə verə bilsəydi,
Hökmdarlar fidyə verib ölümdən qurtarardı.

* * *

1115 Aydoldunun xəstəliyi şiddətləndi və
O, ümidini kəsib candan əlini üzdü.
1116 Peşman olub dedi: – Ey həyat, ey gözəllik,
Heyif ki, sizi yavalıqla boşuna xərclədim.
1117 Ömrümü qəflət içində keçirdim,
Gəncliyimi boş yerə sərf etdim.
1118 Mən həyata qaçmış bir qaçaq idim,
Əcəl tutub aparır, sözün nə faydası.

1119 Acgözlüklə dünya malını yığdım,
Mal qalır, özüm isə bu gün gedib yox oluram.
1120 Çox zaman əlimi və dilimi uzun etdim,
Ölüm gəldi, məni tutdu, nəfəsim kəsildi.

* * *

1121 Beləcə çox peşman oldu, çox ağladı,
Peşmançılıq ölümə əsər etmədi.
1122 Bu insan övladı necə acizdir,
Ömrünü dilədiyi kimi keçirə bilmir.
1123 İnsan diləyinə qovuşsa, yaşaya bilməz,
Yaşaya bilsə, diləyinə qovuşmaz, ey alim.
1124 Bir az rahat olsa, özünü unudar,
Sözünü mavi göydən üstün sanar.
1125 Hörmət qazansa, məğrur və təkəbbürlü olar,
Ölüm gələndə ikiqat olar, peşmançılıqla ölər.
1126 Yeyib qarnı doysa, buğra olar,
Əgər ac olsa, bilə-bilə zəhər yeyər.
1127 Kədərdən zəifləyib, rahatlıqdan usanar,
Sevdiyini tapıb tez ondan uzaqlaşar.

* * *

1128 Aydoldu peşman oldu, uzun müddət susdu,
Dedi: – Mən həqiqət yolunu itirmişəm.
1129 Niyə bu qızıl-gümüşü topladım,
Niyə onları yoxsullara paylamadım?
1130 Niyə bu yaxşı işdən əl çəkdim,
Niyə bu yazıq insanları söydüm?
1131 Bütün yaxşılıqları əvvəlcə göndərməliydim,
Onlar şübhəsiz mənə sabah xeyir gətirərdi.
1132 Bu gün peşmançılığın nə faydası,
Ölüm gəldi, səsimi-ünümü kəsdi.
1133 Eşit gör itigözlü ər nə deyib,
İnsana mehriban, doğru sözlü ər nə deyib:
1134 "Bütün canlılar üçün ölüm bir qapıdır,
Yeriyənlərin hamısı bu qapıdan keçir".



1135 Nədir bu dirilik, nədir bu ölüm?
Haradan gəlirəm, haradır yolum?
1136 Öləcəkdimsə, niyə doğuldum?
Ağlayacaqdımsa, nə üçün güldüm?
1137 Dünyada ölümdən güclü nə var? –
Bunu deyərək hər doğulan insan ölür.
1138 Buna bənzər bir şair sözü var,
Onun mənasını anlayan adamın gözü açılar:
1139 "Dünyada ölümdən ağır, de, nə var?
Ölümü düşünsən, dünyanın dadı gedər".
1140 Ölüm ucsuz-bucaqsız bir dənizdir,
Yaxşı diqqət etsən, dibsiz bir çuxurdur.
1141 Ölümü tanıyanlar qəflətə uğrasalar,
Ölüm tutanda bu sözün bir xeyiri olmaz.
1142 Nemətlərlə ovunub qəflətə uğrayanlar
Ölüm gələndə oyanırlar, ancaq gücləri heç nəyə çatmır.
1143 Çoxlu mal acgözü doyurmaz,
Əcəl tutanda, peşman olar, işi yoluna qoya bilməz.
1144 Məğrur insan dönük dövlətə bel bağlar,
Ancaq qara yer altında ürəyi partlar.
1145 Sevinc içində ovunub-gülən insan,
Ağlamağa da hazır ol, ey fani insan.
1146 Eşit gör nə deyir ağıllı insan,
Bu sözə əməl edən xeyir tapar:
1147 "Kim öz axırını yaxşı etmək istəsə,
Qoy hər iki dünyanı xarab etməsin.
1148 Ey xoşxasiyyət insan, pislik etmə,
Əməlinlə, sözünlə bu gün yaxşılıq et".

* * *

1149 Aydoldu peşman oldu, çox ağladı,
Ancaq bu yerdə peşmançılıq xeyir vermədi.
1150 Bax, kasıblara çoxlu qızıl-gümüş payladı,
Qohum-qardaşa öyüd-nəsihət etdi.
1151 Gözünü göyə dikib dedi: – Ey rəbbim,
Mən səndən başqa bir Tanrı tanımadım,

1152 Yaratdın, yetirdin, böyütdün məni,
Bunlar sənin fəzlin idi, bunu bilirəm.
1153 Mən sənə bütün varlığımla sitayiş etdim,
İndi əcəl gəldi, sözüm kəsildi.
1154 Qurtuluş yerim yoxdur, biliyimi də itirdim,
İndi sənin rəhmətin qoy əlimdən tutsun,
1155 *Axmaqlıqla çox pisliklər etdim,*
Mərhəmət et, məni bağışla, ey əziz olan.
1156 Heyif ki, həyatım yavalıqla keçdi,
Vaxtımı və bəylik zamanımı boşuna keçirtdim.

* * *

1157 Sözünü kəsdi, bir müddət durub düşündü,
Oğlunu görüb gözündən yenə yaş axıtdı.

## XXI

## AYDOLDUNUN OĞLU ÖYDÜLMÜŞƏ NƏSİHƏT VERDİYİNİ BƏYAN EDİR

1158 Bu Aydoldunun təkcə bir oğlu vardı,
Oğlanını yaşı çox az idi.
1159 Adı Öydülmüş idi, əsli təmiz.
Üzü gözəl, xasiyyəti xoş idi.
1160 Oğlunu yanına çağırdı,
Qucaqladı, gözündən yaş tökdü.
1161 Dedi: – Oğlum, artıq mən gedər oldum,
Var-dövlətim, malım-mülküm sənə qaldı.
1162 Sən mənim gözümün işığı idin,
Mən gedirəm, sən sağ-salamat qal.
1163 Bir türk vəziri bunu çox gözəl demiş:
Oğul-qız doğrudan da gözün nurudur.
1164 Oğul-qız dərdi dibsiz bir dənizdir,
Oğul-qız al bənizi sarı edər.



1165 Kimin arvadı, oğul-qızı varsa,
O kişinin necə yuxusu gələr?
1166 Oğul-qızdan ötrü ata əziyyət çəkər,
Ancaq oğul-qız atanın adını anmaz.
1167 Aydoldu söylədi: – Eşit, ey oğul,
Sözümü unutma, könlünü mənə tərəf tut.
1168 Bax, mən *indi sənin atan idim,*
Adım Aydoldu idi, indiki halıma bax.
1169 Aydoldunun həyatı artıq doldu,
Bax, peşmançılıq çəkir, ancaq onun xeyiri yoxdur.
1170 Həyat dadlı idi, ölüm acıdır,
Ölüm yaxaladı, ondan qaçmağa yol hanı?
1171 Dünyaya könül verib ovundum,
O məndən usandı, vəfa qılmadı.
1172 Dünya məni aldatdı, sevib yanına çağırdı,
Ona könül verdim, ancaq o məndən bezdi.
1173 Dünya cəfa qıldı, bu səadət qocaldı,
Bu sözə inan ki, səni də aldatmasın.
1174 Bütün gərəkli işlərimi yerə qoydum,
Nəfsə uyub gərəksiz işlərlə məşğul oldum.
1175 Bir qasırğa – *yel kimi həyat gəlib keçdi,*
İndi özümə acıyıb, boş yerə inləyirəm.
1176 Rüşvətlə və ya malla işim düzəlməz,
Bu gün əlimdən tutacaq bir kişi yoxdur.
1177 Qəflət yuxusundan oyanmış kişi,
Ölümün nə olduğunu bilən insan gör nə demiş:
1178 "Ölümü görən hakimin biliyi getdi,
Ağıllının ağlı itdi, ağılsız qaldı".
1179 Ölümün caynağı və yava şeydir,
Onun adamı vurmağı nə yava olur.
1180 Möhtəşəm sarayı yıxan ölümdür,
Bütün cəmiyyətləri dağıdan ölümdür.
1181 Şair buna bənzər bir söz demişdir,
Ey anlayan insan, sən onu oxu:
1182 "Dünyada *nə var ki, ona* tədbir *tapılmasın,*
Nə tədbir var ki, ona qarşı çarə tapılmasın.
1183 Hər şeyə qarşı bir tədbir, üsul, çarə var,
Təkcə ölümdən başqa, ölümə çarə yoxdur".

## ÖYDÜLMÜŞÜN AYDOLDUYA SUALI

1184 Oğul atasının bu sözlərini eşitdi,
Üzünü ona tərəf çevirib dil açdı,
1185 Söylədi: – Ey atam, sözüm var sənə,
Onu deyim, sən mənə cavab ver.
1186 Bu dünya içində sən çox yaşadın,
Bilik və hünər əldə etdin,
1187 Soruşdun, eşitdin, öyrəndin,
Hər şeyi sınayıb, görüb yaşadın.
1188 Ölümə qarşı bir çarə varmı?
Əgər varsa, onu tətbiq et, ey müdrik alim.
1189 Əgər başqa bir çarə yoxsa, hiylə yoxsa,
Malını, xəzinəni payla.
1190 Xəzinə və mal başa sadağadırsa,
Ver, sağ qal, yenə qızıl-gümüş yığarsan.
1191 Nə deyir, eşit gör gözü tox kişi,
Duz-çörək sahibi, ərlər başı:
1192 "Malını insanlara payla, yedir, içir,
Səni nə qurtarsa, sən onu ver.
1193 Ərə sağlamlıq gərəkdir, mal əskilməz,
Quşa həyat gərəkdir, yem əskilməz.
1194 İnsan diri olduqca, diləyə çatar,
Başı, canı sağlam olsa, arzuya yetər".

## AYDOLDUNUN ÖYDÜLMÜŞƏ CAVABI

1195 Aydoldu cavab verib söylədi: – Oğul,
Sözümü eşit və bu işdən vaz keç.
1196 Qızıl-gümüşün ölümə xeyiri olmaz,
Ölümü bilik və ağıl da aldada bilməz.
1197 Dünya malı ölümü aldada bilsəydi,
Bəylər bəyi ölərdimi?
1198 Hakimlərə hikmət xeyir qılmadı,
Biliklərin bilik əlindən tutmadı.
1199 Ölümə qarşı dava-dərman xeyir versəydi,
Təbiblər əbədi yaşayardılar.



1200 Ölüm qarşısındakı adama görə rəftar etsəydi,
Mübarək peyğəmbərlər ölərdilərmi?
1201 Doğulmuş canlılar öləcəklər,
Ölmək üçün doğulanlardan diri qalan hanı?
1202 Düşün, bu dünya bir mənzildir, hər gələn gedər,
O, böyük bir əjdahadır, yedikcə acar.

## ÖYDÜLMÜŞÜN AYDOLDUYA CAVABI

1203 Eşitdi Öydülmüş, söylədi: – Ata,
Ölümün səni daim izlədiyini bildiyin halda
1204 Niyə işini ona görə qurmadın,
İndi inləyərək onu söyürsən?
1205 Nə üçün topladın bu miras malı,
Niyə artığını başqalarına paylamadın?
1206 İnsan qəflət içində olanda
Peşmançılıqla özünü günahkar bilməlidir.
1207 Bu gün peşmançılığın faydası nədir, ay ata?
Başını yerdən-yerə vurmağın nə xeyiri?

## AYDOLDUNUN ÖYDÜLMÜŞƏ CAVABI

1208 Aydoldu söylədi: – Ey oğlum, eşit,
Məni gör, axirət üçün çalış.
1209 Qəflət məni məhv etdi, peşmanam,
Sən qəflətə uyma, ey gözəl üzlüm.
1210 Nə qədər doğulan varsa, ölmək üçün doğulmuşdur,
Nə qədər dirənsə də, axırda köçür.
1211 Bütün öləcək adamlar zamanın əlində girovdur,
Bax, vaxtı çatanda tərpənə bilməz.
1212 Şairin bu haqda bir sözü vardır,
Başa düşən üçün gözəl sözdür:
1213 Hər şeyin vaxtı var, günü bəllidir.
Bütün canlıların sanı bəllidir.
1214 İl, ay, gün necə keçirsə, həyat da elə keçir,
Keçən günün səni də aparacağı bəllidir.

1215 Aydoldu yenə dedi: – Bax, ey oğul,
Gör nə haldayam, məni gör, ayıl.
1216 Mən gedirəm, təkcə qorxum və əndişəm sənsən,
Sən bu gün kiçik yaşda mənsiz qalırsan.
1217 Məndən sonra sən necə olacaqsan,
Mənim bundan başqa bir düşüncəm yox.
1218 Atanın oğlu üzərində əməyi olsa,
O ata tərbiyəsilə yaxşı yetişər.
1219 Ata oğluna sərt tərbiyə versə,
Ata-ana bundan fərəh duyarlar.
1220 Oğul sərt tərbiyə görməsə,
Yava olar, ondan əlini üz.
1221 Oğulun atası alim adamsa,
Oğlunu yaxşı tərbiyə etməlidir.
1222 Eşit gör nə deyir oğullu kişi,
Təcrübəli, dünyagörmüş kişi:
1223 "Kimin oğlu-qızı ərköyün olsa,
Onun payına ağlamaq düşər".
1224 Ata uşağı kiçiklikdən tərbiyə etməsə,
Günah uşağın deyil, atanındır.
1225 Oğul-qızın xasiyyəti, əməli pis olsa,
Bu, atanın pisliyidir, uşağın deyil.
1226 Ata uşağı tərbiyə edib hər şeyi öyrədəndə,
Uşaq yetişib böyüyəndə o sevinər.
1227 Ey ata olan, uşağa sərt tərbiyə ver ki,
Arxadan gələnlər sənə gülməsinlər.
1228 Oğula, qıza bilik və mərifət öyrət,
Bu mərifətlə onlar təmiz əxlaqlı olsunlar.

## ÖYDÜLMÜŞÜN AYDOLDUYA CAVABI

1229 Cavab verdi Öydülmüş, dedi: – Ey ata,
Sənin qayğınla alışıb-yanıram.
1230 Kaş səndən sonra yaşamayaydım,
Sənin qayğılarını görməyəydim.
1231 Mərhəmətli rəbbim sənin yerinə
Mənim canımı alaydı, mənə bu acını göstərməyəydi.



1232 Əgər əcəl canımı almağa gələrsə,
Deməк, o, əzəldən belə yazılıbmış.
1233 Bu qayğı, ağlamaq nəyə lazım,
Bu, Tanrı hökmüdür, ağlama.
1234 Əgər dünya və dövlət qaldı deyə ağlayırsansa,
Ağlama, onun qarşısını almaq olmaz.
1235 Əgər bu cür nemətlər arxada qaldığı üçün ağlayırsansa,
Ağlama, onlar da ağlamağa dəyməz.
1236 Səndən əvvəl dünyanı sevən çox adam
Ah-vayla onu qoyub getdi.
1237 Sən dünyanın cəfasını bilirdin,
Elə isə bəs niyə qəflətə uydun?
1238 Bir insan bütün dünyanı tutsa da,
Dünya qalır, ona isə iki bez düşər.
1239 Əgər həyat üçün peşmansansa,
Onda ağla gözün qurumasın,
1240 Ancaq keçirdiyin gün geri gəlməz,
Nə etdinsə-etdin, artıq səni qaranlıq gözləyir.
1241 Bu qayğı və narahatlıq mənim üçünsə,
Heç qayğılanma, əksinə, sevin.
1242 Sən yaradılmışsan, yaradılan ölür,
Yaradılan ölür, ancaq yaradan qalır.
1243 Sən mənim üçün mərhəmətli ata idin,
Ancaq yaradan səndən də mərhəmətlidir.
1244 Səni o yaratdı və səadət verdi,
Mənə də verəcək, buna inan.
1245 Ucuza qiymət ondan gəlir,
Kiçiyə böyüklük ondan yetişir.
1246 Buna çox bənzəyir bir ağıllının sözü,
Bu, ağılsız üçün gözdür.
1247 Əziz o əzizdir ki, əzizlərə hörmət
Ondan gəlir, izzət və əzizlik indi nadirdir.
1248 Ucuza qiymət, kiçiyə böyüklük,
Böyüyə yüksəkliyi o verir, pislər ona sığınır.

* * *

1249 Aydoldu oğlunun bu sözünü eşitdi,
Əlini qaldırdı, gözünü göyə dikdi.
1250 Tanrıya çoxlu şükür qıldı ki,
Onun oğluna ağıl vermişdir.

## AYDOLDUNUN ÖYDÜLMÜŞƏ CAVABI

1251 Aydoldu dedi: – Oğlum sarıdan qəlbim bütün oldu,
Tanrının fəzli ilə səadət içində yaşa.
1252 Ağıllı adam bu sözləri nə gözəl söyləmişdir,
Onun mənasını bil və ona diqqət elə.
1253 Tanrı kimə ağıl, idrak və bilik versə,
Bütün arzularına əli çatacaq.
1254 Kimin xasiyyəti və əməli xoş olsa,
Hər diləyinə çatar, günəşi və ayı parlaq olar.
1255 Xoş əxlaq bütün yaxşılıqların rəhnidir,
Kimin əməlisalehsə, min sevinc tapar.
1256 Aydoldu təkrar əlini qaldırdı,
Tanrıya çoxlu şükür, səna qıldı.
1257 Dedi: – Ey rəbbim, sən hər şeyi yaratdın,
Saysız-hesabsız xilqətə ruzi verdin.
1258 Məni yaratdın, səadətlə, yüksəltdin,
Mən sənin qüsurlu, günahkar bir qulunam.
1259 Bu vaxtadək mənə çox lütf etdin,
Arzularıma qovuşdurdun, dünyanın nemətlərini
1260 Bütün arzu və nemətlərə qovuşdum,
Ey əziz Allah, məni hər cəhətdən sevindirdin.
1261 Artıq hökmün mənə çatdı, mən gedirəm,
Bir tək oğlum var, onu qoyuram.
1262 Ata idim, indi ölür bu ata,
Rəbbim sən dirisən, ona səadət ver.
1263 Onu rifaha yaxın, bəladan iraq tut,
Hər iki dünyada köməkçisi ol.
1264 Pislikdən qoru, yaxşılara qovuşdur,
Onu yeməyə və geyimə möhtac etmə.



* * *

1265 Könüldən gələn yaxşı dualar etdi,
Ey gözəl dua, sən bütün bəlaları dəf et.
1266 Eşit gör iman sahibi nə deyir,
İbadət sahibi olan insanların başıdır.
1267 Tanrı kimə inayət və kömək etsə,
O, iki dünyada səadət tapar.
1268 Hansı qula ensə Tanrıdan ömr,
O, iki dünyada diləyinə çatar.
1269 Tanrının fəzli kimə yetişsə,
O da bütün arzularına, nemətlərə yetişər.
1270 Ağıllı adam buna bənzər bir söz söyləmişdir,
Kim ona əməl etsə, işi yaxşı olar:
1271 "Tanrı kimi qorusa, o qorunar,
Diləyinə çatar, nemətin yaxşısına sahib olar".
1272 Hansı qul Tanrıya inansa,
Bəla və qayğı qapılarını bağlamış olar.

* * *

1273 Aydoldu davam etdi və dedi: – Ey oğul, anla,
Ölümü unutma, onu düşün, sayıq ol.
1274 Həyata inanma, yel kimi keçər,
Qafil olma, yoxsa dünyadan tez köçərsən.
1275 Mən səni tamamilə Tanrıya əmanət edirəm,
O istəsə səni qoruyar, nemətini artırar.
1276 Bu gün səndən ayrılaram,
Bu düşüncələrlə, peşmançılıqla və ah-vayla ayrılaram.
1277 Məndən sonra sən nə etməlisən?
Bunları sənə deyirəm, dinlə.

## XXII

## AYDOLDUNUN OĞLU ÖYDÜLMÜŞƏ VƏSİYYƏTİNİ BƏYAN EDİR

1278 Könlünü və dilini doğru tut, Tanrıya tapın,
Qafil olma, sabahkı işini bu gün düşün.
1279 Bütün yaxşılığı, pisliyi Tanrı hökmü bil,
Tanrıya inan və ona qulluq et.
1280 Nə ehtiyacın olsa, ondan dilə,
Ondan başqa sənə kimsə kömək edə bilməz.
1281 Onun bütün əmrlərinə itaət elə,
Tanrı səni bu gün də, sabah da əziz tutar.
1282 Doğruçul ol, doğru yoldan sapma,
Könlünü, dilini kiçik tut, böyük söz danışma.
1283 Bu qədər yaşadım, artıq gedirəm,
Gör dünya mənə nə etdi, yaxşı bax.
1284 Bu dünya üçün özünü oda atma,
Başqasının malını alma, zülm etmə.
1285 Mən mal yığdım, ancaq yeyə bilmədim,
Günü keçdi, son peşmançılıq xeyir vermədi.
1286 Malım sənə qaldı, o mənə ancaq yük oldu,
Rahatlıqla, sevinclə ye.
1287 Tuta bilsən, bu mal sənə bəsdir,
Hər iki dünyada üzünü güldürər.
1288 Tuta bilməsən, bir o qədər də yetməz,
Yetməsə, bənizin saralar.
1289 Doğru ol, bütünlüklə hərəkət elə,
Doğruluq içində xoşbəxtlik var.
1290 Eşit gör nə deyir, hərəkəti doğru olan kişi,
Doğru olan insan hər iki dünyanı qazanar:
1291 "Kişi öz gününün məsud olmasını diləsə,
Bunun çarəsini doğruluqda axtarmalıdır.
1292 Özünün varlı olmasını istəsən,
Bil ki, sərvəti doğruluqla tapırlar.



1293 Böyük və xalqın başçısı olmaq istəsən,
Doğruluq yolunu özünə açıq saxla.
1294 İnsanın hərəkəti doğru olsa,
Hər iki dünyada günəşi parlar".
1295 Aydoldu yenə dedi: – Oğlum, eşit,
Yaxşılıqla özünü cəhənnəmdən qoru.
1296 Həmişə yaxşılıq et, pislikdən uzaq ol,
İstər otur, istər qalx, bundan ancaq sənə xeyir gələr.
1297 Pis yoldaşa yaxınlaşma, sənə zərər gətirər,
Pislik ilandır, çalış səni vurmasın.
1298 İkiüzlü ərə sözünü söyləmə, sirr vermə,
Sözün yayılar, sirrin faş olar.
1299 Dedi-qoduçuları evinə yaxın qoyma,
Görüb-bildiklərini bütün elə yayarlar.
1300 Sınanmış, təcrübəli adamdan möhkəm yapış,
Sən ondan min bir feyz alarsan.
1301 Hər sözü dinlə, dərhal inanma,
Könül sirrini açma, onu bərk saxla.
1302 Başqasını qısqanma, çox yeyib-içmə,
Bu iki işi tutanın başı dərddən qurtarmaz.
1303 Qadını sərbəst qoyma, qapını qapalı tut,
Kişiyə bütün narahatlıq qadından gəlir.
1304 Yad adamı evə gətirmə, qadını onun üzünə çıxarma.
Dostluqdan əvvəl adamı sına.
1305 Yaxşı hərəkət et, mal sarıdan qayğı çəkmə,
Yaxşı hərəkət etsən, mal özlüyündən gələcək.
1306 Bu haqda bir söz var, indi onu eşit,
Bu sözü unutma, özünə yoldaş et:
1307 "İnsana mal yox, xoş əxlaq lazımdır,
Belə adam bütün yaxşı şeyləri əldə edər".
1308 Mal-dövlət pisin nəyinə lazımdır,
Nə qədər varlı olsa, kasıbla təndir.
1309 Həyasız adamdan uzaq qaç,
Həya sahibinə məndən min salam.
1310 Heç bir işdə tələsmə, səbirli ol,
Səbirli adamlar arzuya çatar.
1311 Nə iş olursa-olsun, onu xoş dillə qarşıla,
Belə olsa, səadət sənə yar olar.

1346 Diləsə, yaradar, nə istəsə olar,
Yaratdıqları onun diləyilə vücuda gəlmişlər.
1347 Bu saysız məxluqu ölüm üçün yaratdı,
Onun özündən başqa bütün dirilər öləcək.
1348 Sevimli peyğəmbərə məndən min salam
Və ehtiram yetirsin Tanrım.
1349 Digər əshabələrinə də rəbbim
Sonsuz salamlarımı çatdırsın.
1350 Ey xoşbəxt Elik, çox uzun yaşa,
Bu bəylik adınla çox ellərə hökm et.
1351 Adım Aydoldu, işim-əməlim dolu ay kimi idi,
Doluluğum azaldı, varlığım ölümlə tükənir.
1352 Ölüm mələyi gəldi, məni möhkəm bağladı,
Qurtuluş yerim yoxdur, həyatın dadı qaçdı.
1353 Mənə çox yaxşılıq etdin, ənam verdin,
Sənə layiqincə xidmət etmədən gedirəm.
1354 Bu yaxşılığın əvəzində sənə vəsiyyətnamə
Yazıb qoyuram, ey müdrik insan.
1355 Bu dünya işlərində sənə yoldaş idim,
İşlərini doğruluqla görməyə çalışdım,
1356 İndi isə sənə böyük bir bağlılıqla
Vəsiyyətim olan öyüdlərimi yazıb qoydum, oxu.
1357 Nə deyir, eşit, mehriban insan,
Səmimiyyət insanlığın başıdır.
1358 Səmimi insanın sözünü və öyüdünü eşit,
Bu söz, bu öyüd sənin üçün qoy dövlət toru olsun.
1359 İnsanların əsili sədaqətli olanıdır,
Sadiq insanın sözünü tut, o səni böyüdər.
1360 Ey Elik, mən sənə sədaqətlə bağlı insanam,
Sözümə görə hərəkət et, ey mərd insan.
1361 Ölüm qarşıma çıxdı, peşman oldum,
Sözlərimin və peşmançılığımın xeyiri olmadı.
1362 İndi mənə ibadət lazımdır,
Bütün pisliklər ancaq peşmançılıq gətirir.
1363 Topladığım qızıl-gümüş eləcə qaldı,
Mənə ancaq onların hesabını çəkmək qaldı.
1364 Peşmançılıq içində fəryad edirəm, xeyiri yoxdur,
Allahın rəhmətindən başqa bir ümidim qalmadı.



1365 Bu gün mən qüvvəsiz ölüb gedirəm,
Sabah sən də şübhəsiz arxamca gələcəksən.
1366 Ey Elik, ölüm gəlib çıxmadan oyan,
Biliyini işə sal, işini düzəlt.
1367 Sən xalqı bəladan, zülmdən qoru, yaxşılıq et,
Əlinlə, dilində onu sevindir.
1368 Sağlığında hər işi yaxşılıqla qarşıla,
Var-dövlət varkən, onları dağıt, yedirt.
1369 Kiçikliyində oyanmış, itigözlü, doğru sözlü
Adam nə demiş, dinlə:
1370 – Ölüm gəlməmiş ölümə hazırlaş,
Diriykən Tanrının əmrlərini yerinə yetir, ibadət et,
1371 Ölüm gəlib-çatanda peşmançılıq fayda verməz,
Qara yer altında nə qədər fəryad edirsən-et.
1372 Ey Elik, çalış ki, məndən sonra
Vaxtı boş keçirmə, ibadət elə.
1373 Bu dünya və dövlət səni aldatmasın,
Bütün işlərdə doğruluq axtar.
1374 Qanunu xalqa düzgün tətbiq et ki,
Qiyamət günü bəxtiyar olasan.
1375 Bu dünya üçün özünü oda atma,
Bədəndən intiqam al, nəfsin boynunu qopar.
1376 Sən bu dünyanın bəyisən, ona qul olma,
O səni qoymadan sən onu dul qoy.
1377 Hədsiz dərəcədə məğrur olma,
Dünyaya güvənmək olmaz, ondan vaz keç.
1378 Yaxşı adamları özünə yaxın tut,
Pisləri uzaq tut, zərəri dəyər.
1379 İşini həris adamlara tapşırma,
Aşını vəfasız adamlara yedirtmə.
1380 İbadətdə qeyrətli ol, günaha batma,
Axirətdə ancaq ibadətin sənə faydası toxunar.
1381 Ölümü unutma, ona qarşı silah yoxdur,
Ölüm pusqudan çıxan kimi çıxır.
1382 Nə qədər qaçsan da, axırda ölüm səni tutacaq,
Nə qədər qalsan da, sonda ölüm səni aparacaq
1383 Ölümə qəfil ovlanma, könlünü diri tut,
Nə qədər çox yaşasan da, bir gün torpağa girəcəksən.

1384 Ölümdən qaçıb qurtulan hanı?
Əcəl vaxtını aşmış adam hanı?
1385 Alim bu həyatı və zamanı
Bənzətmə yolu ilə yaxşı göstərmişdir:
1386 – İnsan oğlu da bir karvan kimidir,
Bir mənzildə daim qalmaz, mənzillər hanı?
1387 Uşaq atasının belindən gəldikdən sonra
Ana bətnində bir neçə ay qalıb istirahət edir.
1388 Anadan olub adını alır,
Yolçu kimi zamanının atını minir.
1389 Gündüzü bir addım, gecəsi bir addım,
Bu at ölümə aparır, rəngini soldurur.
1390 Bu dünya bir mənzil, məzar bir mənzil,
Bunlardan sonrakı mənzil o biri dünyadır.
1391 O dünyada səni iki yol gözləyir,
Bu iki yoldan hansı sənə nəsib olacaq?
1392 Yolun sağa olsa, işin düzəldi,
Sola olsa, inləyərək başını yerə çal.
1393 Ey dövlətli Elik, bu dünya bir tarladır,
Ər bu tarlanı əksə, həyat biçini biçər.
1394 Yerə nə əksən, o bitər,
Nə verilsə, əvəzində həmin şey alınar.
1395 Başqasının malını alma, qan tökmə,
Can çıxan zaman insan bu iki günah üzündən inləyir.
1396 Yuxuya bənzəyən bu həyat bilinmədən keçər,
Həm bəy, həm də qul, geri dönməmək üzrə gedər.
1397 Hanı keçən günün yuxu kimi keçdi,
Qalan günlərində isə peşmançılıqdan başqa bir şey yoxdur.
1398 Oyanmış və oyandıqdan sonra peşman olmuş
Adam nə demiş, eşit:
1399 "Oyaq olduğun halda həyatı yuxu kimi keçirtdin,
Faydası hanı, mənə bir nişanə göstər.
1400 Arzu-dilək üçün ömrü keçirtdin,
Həyat tükəndi, qazancın peşmançılıqdır".
1401 Saqın, həyatda qafil olma,
Həyat ölümə çox yaxındır.
1402 Xəsis olma, ey hökmdar, səxavətli ol,
Səxavətlinin adı ölməz, əbədi qalar.



1403 Əsgərə, orduya və mala güvənmə,
Sənə qoşunun, qəzəl və gümüşün xeyiri olmayacaq.
1404 Özünü başqaları üçün fəda etmə,
Özünü heç vaxt atəşə zorla atma,
1405 Səndən əvvəlki dünya bəyləri,
Dünyadan getdilər, bu da qəbirləri, yatırlar.
1406 Ölüm sənin üçün də hazırdır
Ey parlaq günəşim, o öz vaxtını gözləyir.
1407 Eşit, dünyanın eyiblərini bilən,
Bu haqda düşünmüş adam nə deyir, dinlə:
1408 "Bu dünya malı acı su kimidir,
İnsan nə qədər içsə doymaz, dili islanmaz".
1409 Bax, bu dünya kölgə kimidir, ey igid,
Dalınca düşsən qaçar, sən qaçsan, dalınca düşər.
1410 Diqqət etsən, dünya işi bir ilğımdır,
Kim onu tutmaq istəsə, qeyb olur.
1411 Ey hökmdar, çalış özün yaxşı ol,
Bəy yaxşı olarsa, xalq da yaxşı olar.
1412 Xalq qoyun kimidir, bəy onun çobanıdır,
Çoban qoyunlara qarşı mərhəmətli olmalıdır.
1413 Qapıda çoxlu ac qurd toplanmışdır,
Ey Elik, qoyunları yaxşı qoru.
1414 İşində hirslənmə, hirsinə hakim ol,
Bəylər hirslənsələr, bəylikləri pozular.
1415 İnsanlara kobud söz söyləmə,
Kobud söz alov-alov yanan bir od kimidir.
1416 Sakit, həlim və yumşaq ol,
Beləcə bütün yaxşılıqlara əlini uzat.
1417 Qarşında uzun bir yol, bir səfər vardır,
Ağıllı adam yola yaxşı azuqə hazırlar.
1418 Ey dövlətli hökmdar, saraylar tikdirmə,
Çünki qara yer altında evin hazırdır.
1419 Uca, gen, bəzəkli sarayların burda qalacaq,
Sənsə inləyərək qaranlıq torpaq evdə yatacaqsan.
1420 Niyə bu qızıl-gümüşdən xəzinə toplayırsan,
Sənin payına iki parça bez düşəcək.
1421 Şair dili buna bənzər bir söz demişdir,
Bax, şairin bu sözü sözə yol açar:

1422 "Qafil insan oğlu çoxlu mal yığar,
Yemək qismət olacaqmı, onu düşünməz".
1423 Varlanıb bütün diləklərinə çatınca,
Ömrü bitər, canı uçub gedər.
1424 Ey bəy, ovunma, rahatlığa güvənmə,
Bu ovunmaq və güvənmək səni qəflətə salar.
1425 Dünya üçün ömrü boşuna xərcləmə,
Dünya keçicidir, sənə güclə zəhmət verər.
1426 İpək paltarla örtülən bədənin
Qara torpağa səriləcək, ey hakim.
1427 Ovunduruсu zövqlərə ovunan bədənin
Qara yer altında arxası üstə yatacaq.
1428 Ayağı sərpməyən yorğa atından düşəcək,
İnləyərək yəhərsiz ağaca minəcəksən.
1429 Bunları fikirləş və ölümə hazırlaş,
Sabah bu qara yer altında peşman olma.
1430 Hər işə Tanrıdan bacarıq dilə,
Şəksiz, sənə bircə Tanrı güc verə bilər.
1431 Yaxşı-pis, nə gəlsə, ona tablan,
Qəzaya boyun əy, ağzını dağıtma.
1432 Əgər hər iki dünyanın bəyliyini istəsən,
Bu beş işə yaxşı olar ki, yaxınlaşmayasan.
1433 Haram şey yemə, zülm etmə,
İnsan qanı tökmə, düşmənçilik güdmə, kin bəsləmə.
1434 Şərab içmə, fəsaddan uzaq dur, ondan qaç,
Bu şeylər daim bəyliyi pozan şeylərdir.
1435 Əgər davamlı və əbədi bəylik istəyirsənsə,
Ədalətli ol, xalqın üstündən zülmü qaldır.
1436 Ey hökmdar, sən bu gün elin başçısısan,
Xalqı qoru, ayaq ol, öyün.
1437 Hökmdarın boynuna ağır yük yüklənib,
Ey xoşxasiyyət insan, qafil olma, tədbirli ol.
1438 Bədən arzusuna həris olan adam nəfsinin əsirdir,
Əsir olma, olsan da özünü qurtarmağa çalış.
1439 Həyatın yel və tufan kimi keçdi,
Qalan həyatın nə qədər bəyliyə təminat verir?
1440 Qalan günlərini boşuna keçirmə,
Özünü günah və qüsurlardan təmizlə.



1441 Bil ki, dünya sənə vəfa göstərməyəcək,
Bu keçici dünyadan öz azuqəni al.
1442 Eşit gör nə demiş mömin kişi,
Mömin adam hər şeydə müvəffəq olar:
1443 "Bu dünya bir mənzildir, sən özünü karvan say,
Bir karvan bir mənzildə nə qədər qala bilər?
1444 Dünya bir saray, bir qazanc yeridir,
Buradan oraya nə apara bilsən, apar.
1445 Köçəcəksən, köç yükünü əvvəlcədən göndər,
Gərəkli şeyləri al, gərəksizləri qoy".
1446 Bax, mən gedirəm, mənə bax, ibrət al,
Çalış ki, burada özünə yaxşı ad qoyasan.
1447 Eşit gör nə deyir can çəkən adam,
Nəsihət edərək can verdi adam,
1448 Ölüm ayağında olan dirilərə nəsihət verər,
Onun sözlərini eşit və könlünə yaz;
1449 O deyir: "Ey diri, qafil olma, ayıl,
Mən qafil idim, indi illərlə peşmançılıq içində yatacağam".
1450 Ey Elik, bu bəyliyin uzun olsun deyə,
Bu bir neçə işi qıl, bir neçəsini isə qılma.
1451 Ədalətlə iş gör, buna çalış, zülm etmə,
Tanrıya qulluq et, onun qapısını quc.
1452 İkincisi, qafil olma, diqqətli dır, ayıq ol,
Başqasının üzündən adına günah yazılmasın.
1453 Həvəs və acıq ilə heç bir işi görmə,
Hər iki halda dişini sıx, səbir et.
1454 Bu bir neçə şey eli qoruyar,
Bəyliyin uzun olar, ölkə tutarsan.
1455 Bütün yaxşılara hörmət göstər,
Pisləri isə öz elindən qov.
1456 Pis təmayül qurma, yaxşı qanun ver,
Günün yaxşı keçər, tale sənə yar olar.
1457 Ey hökmdar, məşhur alim nə demiş, eşit,
Bu sözdən sən də özünə pay götür:
1458 "Ey qanun qoyan, yaxşı qanun qoy,
Pis qanun qoyan diri ikən ölmüşdür.
1459 Ey dövlət adamı, pis qanun vermə,
Pis qanunla dünyaya hökm etmək olmaz.

1460 Hər kəs öz dövründə pis adətlər qoysa
Deməli, özündən sonra pis adı qalacaq.
1461 Özündən sonra yaxşı adətlər qoyanın
Adı həmişə ayaqda duracaq".
1462 Özünü yanıltma, ey Elik, diqqətli ol,
Saqın, əslini unutma, bunu daim yadında saxla.
1463 Ey əli uzun, pis hərəkətlərə yol vermə,
Yoxsa hər iki dünyada inildərsən.
1464 İqtidara yetdin, xalqa yaxın oldun,
Diqqətli ol, yoxsa ömrün əfsusla keçər.
1465 Məni gör, məndən ibrət götür,
Hələ ki, bu gün dirisən, sabah peşman olma.
1467 Kişi öləndə ondan bir miras qalır,
Ey alim, mənim sənə mirasım budur.
1468 Ey Elik, ən çox sevdiyim insan sənsən,
Faydalı mirasımı sənin üçün qoyuram.
1469 İnsan üçün ən xeyirli miras sözdür,
Miras sözə əməl etməyin faydası yüzdür.
1470 İndi bu doğru sözləri yazıb qoydum,
Bu sözü və məni unutma.
1471 Nə qədər çox yaşayıb diri olsan da,
Axır görəcəksən ki, ölümlə qarşılaşdın.
1472 Şübhəsiz, ölüm axır bir gün gələcək,
Bütün canlıların canını alacaq.
1473 Dəvətçinin gəlişinə hazır olmaq,
Uzun yol yürüməyə hazır olmaq lazımdır.
1474 Ölümdən qurtarmağa çarə yoxdur, bil,
Ölümə hazırlaş, gərəkli şeyləri al.
1475 Eşit gör nə deyir vaxtı çatmış ər,
Ölümü ölməzdən əvvəl anlamış ər:
1476 "Ölümün sırası növbə ilə gəlir,
Ölümə hər an hazır ol.
1477 Gümüş kəmər bağlayaraq "mən" deyənin
Kəmərindən ölüm tutanda kəmər qopur".
1478 Ey Elik, mən sənin haqqını ödədim,
Şəfqətinin əvəzini qaytardım.
1479 Bütün yaxşılıqların üçün Tanrı sənə əvəz versin,
Yemək və paltar sarıdan bu yaxşılıqların sənə xeyiri dəysin.



1480 Sağlamlıq içində uzun ömür sür,
Sevincin, ovuncun çoxlu el aşsın.
1481 Bu sözlərim sənə dərin sevgimin nişanəsidir,
Ey gözəlüzlüm, sağ-salamat qal.
1482 Ey dövlətli elim, artıq mən gedirəm,
Bağrımın odu olan oğlum qalır.
1483 Onu yalvararaq Tanrıya əmanət etdim,
İstəsə, Tanrı onu yanar od içində də qoruyar.
1484 Səndən xahişim var, ona nəzarət et,
Yoxsa o, yabanı bir tikan olar.
1485 Tanrı hər şeyə bir səbəb yaradır,
Bütün yaxşı-pisləri o, nəsib edir.
1486 Uşaqların yaxşı və pis olmalarına
Ata və ana səbəbdir.
1487 Onun atası olan mən bu gün ölürəm,
Oğlum kiçik yaşda yetim və başsız qalır.
1488 Əgər mən xidmətçinin səndə bir haqqı varsa,
Səbəb ol, onu doğru yola çək.
1489 Gözdən uzaq qoyma, ona ərdəm və bilik öyrət,
Bilik və ərdəmlə elə sahib olsun.
1490 Hərəkət tərzi, əxlaqi düz olsun,
Xidmətə layiq və məziyyət sahibi olsun.
1491 Sərbəst, özbaşına buraxma, möhkəm tut,
Möhkəm tutulan uşaq səadət tapır.
1492 Təcrübəli, anlaqlı ixtiyar,
Dünyanı sınamış, bilmiş insan nə deyir, eşit:
1493 "Uşağa biliyi kiçikkən öyrət,
Kiçiklikdən bilik öyrənən həyatda müvəffəq olar".
1494 Acıma, lazım olsa, oğula-qıza şillə yedirt,
Şillə oğul-qıza bilik öyrədir.
1495 Oğul-qız kiçiklikdə nə öyrənsə,
Qocalıb ölənədək onu yaddan çıxarmaz.

* * *

1496 Məktubu tamamladı, büküb bağladı,
Əlini uzadıb oğluna verdi.

* * *

1497 Dedi: – Oğul, bu məktubu saxla, itirmə,
Bu mənim mirasımdır, Elikə apar.
1498 Məktubumu oxusun, sözümü tutsun,
Ölümə hazırlaşsın, işini qursun.

* * *

1499 Uzun müddət susdu, sonra oğluna baxaraq
Dedi: – Sən bunu anla, doğruluqdan uzaq olma.
1500 Oğlunu qucaqlayıb yenə bağrına basdı,
Öpüb ağladı, göz yaşı üzünü bürüdü.

* * *

1501 Dedi: – Ey oğlum, məni indi görürsən,
Nə halda getdiyimi unutma.
1502 Sənə də şübhəsiz bu an yetişəcək,
Qafil olma, bir gün sən də öləcəksən.
1503 Mən lazımlı sözlər sənə söylədim,
Sözümü unutma, mənə dua qıl.
1504 Əgər bir gün Elik səni diləsə,
Ona xidmət və hörmətdə qüsura yol vermə.
1506 Yava olma, sərsəri dolaşma,
İşində və sözündə dürüst, mülayim ol.
1506 Gecə gec yat, ancaq erkən dur,
Yatıb erkən duran qutunu artırar.
1507 Tanrı buyruğuna həmişə itaət et,
Elikə xidmət et, bağrın ona isinsin.
1508 Pisə yaxınlaşma, ondan uzaq dur, qaç.
Həmişə yaxşılıq et, davranışını düzəlt.
1509 Sözünə diqqət et, salamat yaşa,
Özünü gözlə, sağlamlıqla qarı.

* * *

1510 Sözünü kəsdi, oğlunu qucaqladı,
Ah-vay etdi və təkrar peşmançılıq yedi.



* * *

1511 Dedi: – Ey bivəfa, inamsız dünya,
Niyə sən mənə cəfa edirsən?
1512 Bol nemətlə bəslənmiş vücudum,
Gözəl üzüm qara yerə girir.
1513 Bu gün anadan olduğum kimi,
Eyni əlacsızlıq içində, gedirəm,
1514 Ölmək üzrə olan və ölərkən peşman olan,
İnləyən qüvvətli insan nə demiş, eşit:
1515 – Məni qarından çıxardın, yenə qarına gedirəm,
Şəkərlə bəslədiyin bədəni ilana verirəm.
1516 Gəncliyimdən heyif, həyatımdan heyif,
Peşmançılıq və inilti ilə məzara girirəm.

* * *

1517 Aydoldu ağlını başına yığdı, ağlamaqdan əl çəkdi,
Malını-dövlətini miras kimi başqalarına payladı.
1518 Bütün qohum-qardaşla halallaşdı,
Canı mavi göyə doğru yol almaq istədi.
1519 Gözünü göyə dikib əlini qaldırdı,
Son sözü kəlmeyi-şəhadət oldu.
1520 Nurlu canı üzüldü, günü qaraldı,
Tanrı adı ilə son nəfəsini verdi.
1521 Pak və təmiz ruhu yüksəlmək dilədi,
Uçub getdi, boş bir qəlib qaldı.
1522 Ruh heç doğulmamış kimi qeyb olub getdi,
Bəlgə və nişan kimi dünyada adı qaldı.
1523 İndi dürüst qəlbli, qəflətdən oyanmış
İnsanın nə dediyini eşit:
1524 "Bu bəzəkli ev bədənin evidir.
O heykəl kimi bədənin, təmiz ruhun evidir.
1525 Ruh uçub gedəndə bədən boş qalır,
Ruhun hara getdiyini ancaq Tanrı bilir".
1526 Ey dövlətli, onun yeri yüksəklərdədir,
Onun yüksəlməsi səadət, aşağı enməsi fəlakətdir.

1527 Şəksiz, onun payı ikisindən biridir;
Ölümsüz, uzun, əbədi bir həyat sürməyə başlar.
1528 Fikir ver, insan nə qədər aciz məxluqdur,
Yeriyərkən yıxılır və səsi kəsilir.
1529 Haradan gəlir, haraya gedir?
Harada dayanır, barada yürüyür?
1530 Bilikli adam bunu necə izah edir?
Ağıllı başa düşürmü hakim nə deyir?
1531 Bu işi ancaq bilikli Tanrı bilir,
Bunun hikməti və sirri ancaq ona məlumdur.
1532 Bax, arada bir qeyb olur, görünmədən gəzir,
Arada göz önündə ikən yox olub gedir.
1533 İnsanın özü çox qısa ömür sürür,
Ancaq əməli uzun, dili və sözü böyükdür.
1534 İnsanın bu acizliyinə diqqətlə baxsan,
Pislərin niyə belə məğrur gəldiklərinə heyrət.
1535 Bu iki günlük gəldi-gedər dünyanı tapanda
Niyə qaya kimi kökslərini gərirlər?
1536 Oyanmış, ölümü anlamış, doğru yola girmiş
İnsan nə demişdir, eşit:
1537 – Ey pis ölüm, sən nə əcayib şeysən ki,
Minlərcə silah sənə qarşı heç nə edə bilmir?
1538 Kimin üstünə gəlsən, səndən yaxa qurtarmaz,
Yaxşı-pis hər şeyi tora salırsan.
1539 Gərək alimlər səadət içində ömür sürəydilər,
Gərək bütün biliksiz cahillər öləydilər.
1540 Yaxşı-pis heç kəs qalmır, hamı ölür,
Böyük-kiçik hamı qara torpaq olur.
1541 Ölümdən keçid, qurtuluş yoxdur,
İnsan nə qədər çox yaşasa da ölüm gələcək.
1542 Xalqın başçısı olan, bilikli, idraklı
Adam nə gözəl söz demişdir:
1543 – Nə gözəl olardı, ölüm olmasa,
Nə gözəl olardı, insan ölməsəydi.
1544 Həyatım mənə zövq və səadət verir,
Ölüm isə təməlimi pozur.
1545 Ölümə heyrət etmə, doğulan ölür,
Doğulan ölür və qara torpaq olur.



1546 *İnsana heyif deyil, insanlığa heyifdir,*
Fərdlərə heyif deyil, doğruluğa heyifdir.
1547 Dünyanın adəti, xasiyyəti budur,
İstər bəyən, istər bəyənmə, fərqi yoxdur.

## XXIV

## GÜNDOĞDU ELİKİN ÖYDÜLMÜŞÜ ÇAĞIRDIĞINI BƏYAN EDİR

1548 Aydoldunun yası keçəndən sonra Elik
Onun oğlunu yanına çağırıb öyüd-nəsihət verdi.
1549 Dedi: – Ey oğul, artıq kədərlənmək bəsdir,
Axır kədər ötər, sevinc gələr.
1550 Bu kədər yalnız sənə dəymədi,
Bu mənim üçün də sonsuz kədər və qayğıdır.
1551 Könlünü çökdürmə, özünü ovut,
Gəl mənim yanımda xidmətə gir.
1552 *Atan öldü, mən sənin atanam,*
Sənə atalıq edim, sən də mənə oğul ol.

### ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1553 Öydülmüş yeri öpdü və dedi:
– Ey Elik, Tanrı sənə uzun ömür versin.
1554 Mən sənin bir qulun, xidmətçinəm,
Canım hökmdara fəda olsun.
1555 Atamın canı hökmdara fəda olsun,
Tanrı sənə bu qulu da fəda etsin.

* * *

1556 Uşaq atasının məktubunu çıxardı,
Hörmət və ədəblə Elikə verdi.

1557 Elik məktubu aldı, açdı, oxudu,
Sözünü başa düşdü və dedi: – Heyif, ey ağıllı insan,
1558 Dedi: - Ey mərhəmətli insan, ey insanların xası,
Qapımı kimsəsiz, yerini boş qoydun.
1559 Diriykən xidmət edib haqqımı ödədin,
Öləndə də məni düşündün, halıma yandın.
1560 Mən sənin haqqını ödəyə bilmədim,
Sənin haqqını Tanrı özü ödəsin.
1561 Sən məni bu gün necə sevindirdinsə,
Tanrı da səni eləcə sevindirsin.

* * *

1562 Elik sözünü kəsdi, gözündən yaş axıtdı,
Öydülmüş kədər içində qalxıb oradan çıxdı.
1563 Könlü düşük halda evinə gəldi,
Bir neçə gün qapanıb dərd çəkdi.

* * *

1564 Aydoldu üçün oğlu yuğ təşkil etdi,
Yoxsullara gümüş, ipək payladı.
1565 Atasının yasını xeyirli işlərlə keçirdi,
Yaxşı adamları özünə dost etdi.
1566 Atasının nəsihətinə əməl etdi, doğruluqdan sapmadı,
Səadəti gündən-günə artdı, günəşi parladı.
1567 İndi eşit gör ağıllı, görüb-götürmüş,
Məmləkət işini bilən insan nə deyir:
1568 "Ata nəsihətini sən möhkəm tut,
Günün uğurlu olar, sənə sevinc gətirər.
1569 Atanı, ananı sevindirir, onlara xidmət et,
Bu xidmətin əvəzində minlərcə xeyir görərsən".

* * *

1570 Elik də o gündən etibarən çalışdı,
Gündən-günə yaxşı qanunlar qoydu.
1571 Xalq varlandı, eldə nizam artdı,
Xalqın dili Elikə dua qıldı.



* * *

1572 Elik bir gün yalnız oturmuşdu,
Əlindəki kitabı yerə qoyub uzun-uzadı düşündü.
1573 Bir yerdə ilişmişdi, başa düşmürdü,
Soruşmaq üçün adam axtardı, tapmadı.
1574 Aydoldunun ərdəmlərini xatırladı:
"Ah, heyif, o ərlər əri idi" dedi.
1575 O mənə yaxşı dost və səltənətimin həzəyiydi,
O hər işdə xalqın faydasını düşünürdü.
1576 Dostum yoxdur, yeri boş qaldı,
Onun yerini tutacaq adam varmı?
1577 Sonra birdən-birə Öydülmüşü xatırladı,
"Mən bu gözəl işi unutmuşdum" dedi.
1578 Aydoldu öləndə onu mənə tapşırmışdı,
Gör bir onu necə unutmuşam.
1579 Atası ölmüşsə də oğlu həyatdadır,
Birini itirdim, barı o birini tutum.

* * *

1580 Dərhal adam göndərib Öydülmüşü çağırtdırdı,
Bu işi beləcə həll etdi.

## XXV

## ÖYDÜLMÜŞ GÜNDOĞDU ELİKİN HÜZURUNA ÇIXDIĞINI BƏYAN EDİR

1581 Öydülmüş yüyürüb içəri girdi,
Sevinclə Elikin hüzuruna çıxdı.

### ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1582 Elik onu görüb yanına çağırdı,
"Fələk sənə nə etdi" deyə sordu.

1583 Günlərin necə keçir,
Düz yoldasan, yoxsa əyri yolda?
1584 Atandan sonra fələk sənə nə etdi,
Sevindirdi, yoxsa kədərləndirdi?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1585 Öydülmüş dedi: – Ey ağıllı Elik,
Tanrı uzun ömür versin, adın dünyaya yayılsın.
1586 Elikin qapısından bayırda, uzaq olduğum üçün
Fələk mənə hirslənib qaşını çatdı.
1587 Çox zaman keçdi, Elikin üzünü görmədim,
Qayğı və kədər içində üzüm gülmədi.
1588 Bu gün Elik məni xatırlayıb çağırdı,
Ümidvaram ki, tale mənə yar olacaq.
1589 Elikin əmrini eşidəndə
Gözüm parladı, mənə gün doğdu.

* * *

1590 Elik suallar verib onun biliyini yoxladı,
Öydülmüş onlara düzgün cavablar verdi.

## XXVI

## ÖYDÜLMÜŞ GÜNDOĞDU ELİKİN XİDMƏTİNƏ GİRDİYİNİ BƏYAN EDİR

1591 Elik dedi: – Ey oğul, bundan sonra,
Mənim xidmətimə gir, qəlbini buz kimi tut.
1592 Sənin atanın çox böyük xidməti vardı,
Onun haqqını ödəyə bilməmiş, borclu qalmışdım.
1593 Bu borcları sənə ödəməliyəm ki,
Kişilərin dili mənə tənə etməyə.
1594 Uc ordu bəyi nə demiş, eşit,
O, bu sözü bilərək və anlayaraq demişdir:



1595 "Sənə bir adamın əməyi keçibsə,
Onu unutma, ölü kimi hərəkətsiz durma.
1596 Ey əsil insan, insanlıqdan əl çəkmə,
İnsanlara həmişə insanlıqla rəftar et.
1597 Kimin sənə bir az əməyi keçsə,
Sən ona ondan da artığını elə.
1598 Başqasının əməyinə qiymət verməyən
Xalis öküzdür, ey dövlət adamı.
1599 Yürü, adın öküzə çıxmasın, insanlıq göstər.
İnsana qarşı insanlıqla hərəkət et, insan ol.
1600 İnsanla bu ad insanlığından dolayı verilmişdir.
İnsan insanlıqla adını yüksəldər".
1601 Öydülmüş yeri öpdü və dedi: – Ey Elik,
Hökmdarın razılığı mənim üçün hər şeydən üstündür.
1602 Mən xidmətçi qulunam, sən mənim böyük bəyimsən,
Böyük bəy xidmətçi quluna qiymət verər.
1603 İstəsən qiymət ver, istəsən ucuz tut,
Mən artıq özümü sənə fəda edirəm.

* * *

1604 Qalxdı, qapıya gəlib yavaşca çıxdı,
Bir az gəzdikdən sonra evinə gəldi.
1605 Bundan sonra Öydülmüş qollarını çırmadı,
Qapıdan ayrılmadan xidmətə girişdi.
1606 Səhər-axşam fasiləsiz xidmət etdi,
Yeməyini orada yedi, gecə də orada qaldı.
1607 Elik onun xidmətindən razı qaldıqca,
Dövlət ona əl uzatdı, qapılar açıldı.
1608 Nə demiş, eşit, xidmət edən ər,
Xidmətdən ötrü dövlət atını minən ər:
1609 "Ey bəyləri sevindirmək istəyən insan,
Hər şeyi bəylərin arzusuna görə et.
1610 Qul bəyin xoşuna gəlməyən bir iş görərsə,
Qəzəbə düçar olar, günahı özündə axtarsın.
1611 Bəylərin bəyənmədiyi kimi xidmət etsə, deməli,
Xidmətdə keçən həyatı boşuna xərclənib".

* * *

1612 Bax, Elik Öydülmüşü özünə yaxın tutdu,
Hər işin çəmini ona izah etdi.

* * *

1613 Yenə bir gün Elik oturub öz-özünə dedi:
“Heyif o, kamil insanı itirdim”.
1614 Qapıda çoxlu xidmətçim var,
Ancaq işimə yarayan seçkin ər hanı?
1615 Bütün işlərim pozuldu, iş bilənim yoxdur,
İşimi görəcək səmimi bir insan hanı?
1616 Eşit gör təcrübəli adam nə deyir,
Yaxşını-pisi ayırd edən adam nə deyir:
1617 “İnsan diləsə, bütün arzularına çatar,
Ancaq ürəyincə olan, yaxşılar xası olan adam tapa bilməz”.
1618 Bu xidmətçilərin sayı xeyli qələbəlikdir,
Ancaq içində inanılacaq adam yoxdur.
1619 Gərəkli adam işə yarayan adamdır,
İşə yarayan adam faydalı adamdır.
1620 Nə deyir, eşit, gör şeir qoşan,
Sözü məna ilə birlikdə düzüb bizə verən adam:
1621 “Ətrafda gəzənləri görürəm, işə yarayanı yoxdur,
İşə yarayan isə mənim ətrafımda deyil.
1622 Çoxlu qul-qaravaş var, ancaq
İçində faydalı bir adam yoxdur”.
1623 Elik davam etdi: – Bir məsəl var
“Soylu insan ölsə də, soyu qalar”.
1624 Yerə nə əksən, o da bitər,
Oğulun xasiyyəti ataya çəkər.
1625 Aydoldunun oğlu atasının bir parçasıdır,
Ata getsə, yerində oğlu qalar.
1626 Ata getdi, yeri boş və açıq qaldı,
Boşluğu doldurmaq üçün oğlunu münasib görürəm.
1627 Mən onu yetişdirdim, adam olsun,
Adam olan həmişə faydalıdır.



1628 Onun işə yarayacağını və yetişəcəyini görürəm,
Yaşının azlığından başqa bir qüsuru yoxdur.
1629 Xalqın böyüyü və adamları qutlusu olan
İlalı bir şəxsiyyət nə gözəl demişdir:
1630 “Bəylər kimə əl tutub yetişdirsə,
O, bəyə yaxın olur, sırada bəydən sonra o gəlir.
1631 Bəylər kimi özlərinə yaxın tutsalar,
Onun dilək və arzusu əlinin altında olar.
1632 Bəylər kimin üzünə gülsələr,
Xidmətçilər onun ətrafına yığılar”.
1633 Elik dedi: – Başqa çarəm yoxdur,
Onu tərbiyə etsəm, hökmən adam olar.
1634 Ona şəfqət və insanlıq göstərsəm,
Atasının haqqını ödəmiş olaram.
1635 Aydoldunun xidməti çox idi,
Onun əvəzində kişilik etməliyəm,
1636 İnsanlıq dediyim – yaxşılıqdır,
Bu, başqasını yedirmək, geydirməkdir.
1637 Kişi əsl yaxşılığı unutmaz,
Soylu adamın könlü bunu qəbul etməz.
1638 Eşit gör nə deyir atalar sözü,
Atalar sözünə əməl et, onu unutma, quzum:
1639 “Ey yaxşı insan, yaxşılığı davam etdir,
Yaxşılıq qarımaz, onun ömrü əbədidir.
1640 Yaxşılıq nə qarıyar, nə yıpranar,
Onun ömrü uzundur, adı məhv olmaz”.

* * *

1641 Elik Öydülmüşü bəyəndi,
Özünün yaxşı-pis bütün işlərini ona söylədi.
1642 Elik onu yüksəltdi, bax, təltif etdi.
Dövləti idarə etmək qanunlarına vaqif oldu.
1643 Qanun, asayiş və daxili işləri yürütdü.
Xidmətindən dolayı dilədiyi qapılar üzünə açıldı.
1644 Eybi fəzilət oldu, söz söz oldu,
Elik yatıb-duranda birinci gözü onu görürdü.

* * *

1645 Elik dedi: – İndi İşim düzəldi,
İçəridə və dişarıda hər şey yoluna düşəcək.
1656 Bunun mayası bəllidir,
Ona görə onu yedirtdim, bəxşişlər verdim.
1647 Artıq istədiyim adam oldu,
Yaşı artdıqca daha da inkişaf edəcək.
1648 Doğuşdan mərd olan oğlanın
Kiçikkən bütün ululuq nişanları bilinir.
1649 İndi buna bənzər bir beyti oxu,
Düşündükcə, mənası da anlaşılar:
1650 "Bütün olacaqların olacağını göstərən əlaməti var,
Kiçiklikdən böyüyüncəyədək o əlamət özünü göstərir".
1651 Meyyəni, yeyiləcək şeyi, neməti çiçək ikən gör,
Hər şeydə bunu ömək bil.

* * *

1652 Öydülmüş hüzurda xidmət etdi,
Gecə-gündüz heç bir xəta etmədi.
1653 Lüzumsuz hərəkətləri özündən kənar etdi,
Hər cür işi bacaracaq səviyyəyə çatdı.
1654 Elik bir çox zəhmətlərdən qurtuldu,
Xalqın yükü yüngül oldu, qazancı artdı.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1655 Elik bir gün Öydülmşü çağırdı,
Düşündükləri, bildikləri haqda onunla danışdı.
1656 Elik dedi: – İndi eşit, ay oğul,
Sənə söz deyirəm, mənə könüldən qulaq as.
1657 De görüm insana nələr xeyirdir?
Onların hamısını mənə say.



## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1658 Öydülmüş cavab verdi, dedi: – Ey bəy,
Sən bilik xəzinəsi, insanların xasısan.
1659 Kişi üçün bu iki dünyada faydalı şey
Yaxşılıq etməkdir, ey xoşəxlaq.
1660 İkincisi həya, üçüncüsü doğruluqdur,
İnsan bu üç şeylə səadət günəşinə çatar.
1661 Əməlisalehi bütün xalq sevər,
Qılığı xoş olan dör başa çıxar.
1662 Hər cür natarazlığa həya mane olar,
Həyasızlıq insan üçün çox pis xəstəlikdir.
1663 Xoşrəftar və əməlisaleh insanın
Hər iki dünyada günü xoş olar.
1664 Doğruluq, həya və yaxşı hərəkət –
Bu üçü kimdə birləşsə, o, sevinc tapar.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1665 Elik təkrar sordu: – Bunu eşitdim,
İnsan üçün pis və faydasız şey nədir?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1666 Öydülmüş cavab verdi: – Elik
Öz fərasəti ilə bunun cavabını tapar.
1667 Adama xeyir yox, həmişə çox zərər verər,
Bax, bu üç şey, ey qüdrətli dövlət adamı:
1668 Biri inadcıllıqdır, çox pis xasiyyətdir,
O biri isə yalan danışmaqdır.
1669 Biri də insanı alçaq edən xəsislikdir,
Bunun üçü də biliksizlikdən doğur.
1670 Kim bədxasiyyət və inadçı olsa.
Gün doğsa da, onun işi tərsinə dönər.
1671 Kim şöhrət tapıbsa yalançılıqla,
Bil ki, adam içrə rüsvadır.

1672 Xəsislikdən pis nə ola bilər?
Xəsis yığar, yeməz, malı qalar.
1673 Aqil xəsis haqda nə demiş, eşit:
Ey zavallı, ey yazıq, ey əli yumulu,
1674 Qızılı yığa bildin, amma yeyə bilmədin,
Qızılı yığdın, bircəciyini də heç kimə vermədin.
1675 Ey dünyanı dərib yeməyən kişi,
Yeyənlər hazırdır, hazırla aşı.
1676 O üç şey kimdə varsa, gəldi səadəti,
Bu üç şey kimdə varsa, batdı adı.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1677 Yenə dedi Elik: – Eşitdim bunu,
Daha bir sözüm var, ona cavab ver.
1678 İnsan anadan alim doğulur,
Yoxsa yaş ötdükcə alim olur?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1679 Öydülmüş dedi: – Ey dövlətli hökmdar,
Bu ərdəmin bir adı da bilik də ağıldır.
1680 İnsan biliksiz doğulur, yaşadıqca öyrənir,
Bilikli olduqdan sonra hər işi bacarır.
1681 Adam anadan biliksiz doğulur,
Bilik öyrəndikdən sonra dörə çatır.
1682 İnsan ağılı öyrənmir,
Tanrı onu insanın xəmirinə qatır.
1683 Ağıldan başqa bütün ərdəmliyi
İnsan öyrənir və biliyi artır.

* * *

1684 Elik bu sözləri eşidib sevindi:
– Mən axtardığımı tapdım, – dedi.



1685 Atasını itirsə də oğlu qaldı,
Doğru yolu bulub atasının yerini tutdu.
1686 İndi Tanrıya çox şükür etməliyəm,
Xalqı ona layiq idarə etməliyəm.
1687 Vəfalı görürəm bu Öydülmüşü,
O, dürüstlüklə görür hər bir işi.
1688 Ona da bu gün yaxşılıq etməliyəm,
Qoy yaxşı cavabının əvəzini hazır görsün.
1689 Eşit gör nə demiş insanların yaxşısı,
İnsanların və xalqın seçilmişi:
1690 "İnsanlıq edənə qarşı insanlıq göstər,
İnsana insanlığına görə cavab ver.
1691 Vəfaya qarşı vəfa insanlıq vəzifəsidir,
Vəfa qıl, kişi ol, adını yüksəlt".

* * *

1692 Elik onu gündən-günə yüksəltdi,
Adı və ünü bütün ölkəni tutdu.
1693 Dərəcəsi və nişanı xalq içində böyük oldu,
Xeyir-dua qazandı, şöhrəti dünyaya yayıldı.
1694 Tay-tuş arasında ulu oldu,
Bəylər arasında da sayıldı.
1695 Könlünü və dilini kiçik tutdu, mülayim oldu,
Hamı ilə dil tapdı, aylar-illər ötdü.
1696 Könlü alçaq, dili isə dadlı idi,
İçdən və dışarıdan xalqı özünə isitdi.
1697 Dostu, yoldaşı, tanışı çox oldu,
Dost, yoldaş, tanış insana arxadır.
1698 Kimin dostu, yoldaşı çoxdursa,
Demək, kürəyini möhkəm və yalçın qayaya söykənmişdir.
1699 Kimin arxası varsa, güclü olur,
Güclü adamın səadəti möhkəm olur.
1700 Təmiz ürək səadətə çox yaraşır,
Alim təmkinli olsa, çox gözəl olur.
1701 Nə gözəl söyləmiş ağıllı kişi:
"Ağıllının sözünə əməl edənin işi düz gedər".

1702 Səadət kimə qonaq gəlsə,
O, təvazökar və safqəlbli olmalıdır.
1703 Səadət gəlib insanın üzünə gülsə,
Səadəti təvazökarlıq tutub saxlayır.
1704 Səadət hər kəsə üz verə bilir,
Onun cidarı təmiz könüllülükdür.
1705 Təmiz ürəkli insan nə qədər gözəl olur,
Onun işi həmişə qaydasında gedir.
1706 Böyüklük iddiasında olan təkəbbürlü insan sevilmir,
Onun etibarı gündən-günə azalır.
1707 Səadət hər kəsə üz verə bilir,
Ancaq o, ağıllı adamla daha da uzlaşır.
1708 Ey gözəl və mərd insan, indi
Buna bənzər beyti oxu və anla:
1709 "Dövlət gəlib biliksizə yanaşsa da,
Bilikliyə daha artıq yaraşar.
1710 Əgər səadət biliksizlə də yaşaya bilirsə,
Bilikliyə daha köklü şəkildə bağlanacaq.
1711 Biliksiz dövlət ilə böyük, yüksək olursa,
Bilikli dövlət, şan və şöhrətlə ondan da yüksək olacaq.
1712 Biliksizə dövlət və səadət gəlsə də,
Bu dövlət onunla çox qala bilməz".
1713 Bu söz ona şahiddir,
Oxu bunu sən, ey könlü düz:
1714 "İnsana səadət gələr və onu yüksəldər,
İnsan düz hərəkət etsə, yüksəliş davam edər.
1715 Mənfi adama dövlət və səadət gəlsə
O, həmin dövləti qaçırdar".

* * *

1716 Elik Öydülmüşü sınadı,
Hər işi dürüstlüklə ifa etdiyini gördü.
1717 Bəzən yüksəltdi, ucaya qaldırdı,
Bəzən nöqsan görüb ucuz tutdu.
1718 Yüksələn zaman heç kimi incitmədi,
Ucuzluq vaxtı da xidmətdən bezmədi.



1719 Elikə sədaqətlə bağlanıb ona sipər oldu,
Elik xəzinəni və malı ona tapşırdı.
1720 Boynuna böyük bir əmanət aldı,
Əmanət qoruyan ərə canım fəda olsun.
1721 Öydülmüş daha böyük sədaqətlə işini davam etdirdi,
Elik onu gündən-günə özünə yaxınlaşdırdı.
1722 Bütün işlərini açıq-aşkar gördü,
Hər birinin hesabını ayrıca qeyd etdi.
1723 Hər şeydən özünü saxladı,
Xidmətdə tük qədər əyrilik etmədi.
1724 Yaşı ötmüş kişi, eşit nə deyib,
Həyatda nadir, dürüst kişi nə deyib:
1725 "İnsan üçün qızıl, gümüş qiymətlidir,
Lakin özünə hakim olan adam gümüşdən qiymətlidir.
1726 Gümüşə nəfs salmayan dürüst adam
Xoşbəxt olar və dünyaya dəyər".
1727 Bilikli şəxs biliyiylə bu öyüdü verib:
"Doğru-dürüst insan görsən, onu sürmətək gözünə çək".
1728 Bax, ağıl isə bundan da yaxşı deyil:
Mehriban insana can fəda etmək azdır.
1729 Doğru dəyib söylərlər hanı o doğru ki,
Əmanət günü doğruluq göstərsin?
1730 İnsanlar içində arayıb-axtarmalı
Və kimin əməli düzsə, ona ər deməli.
1731 İnsanlar içində kimi mədh etmək olar,
Comərd öyülməyə, xəsis isə söyülməyə layiqdir.
1732 İnsanoğlu nə qədər zavallıdır,
Bütün günü yığar, ancaq yeməyə bir şey tapmaz.
1733 Kimi durmadan qaçar, dünyanı gəzər,
Kimi canını fəda edər, dənizə girər.
1734 Kimisi dağ qazar, kimisi qayaların dibinə enər,
Kimisi yeri qulaclayar, piyada gedər.
1735 Kimisi təpələr aşar, dərələr keçər,
Kimisi yer qazar, suyu quyudan içər.
1736 Kimisi qoşunda qılınc və balta yeyər,
Kimisi qalada əsgər olub orda qocalar.
1737 Kimisi oğru, əyri, cibgir, fırıldaqçı,
Kimisi zalım, yırtıcı, dağıdıcıdır.

1738 Bunlar hamısı boğaz və əyin üçündür,
İnsan mal yığar, yeyə bilməz, əməyi zay olar.
1739 Bunlar biliksiz insanların işidir,
Biliksizlər bir heyvan sürüsüdür.
1740 Tanrıya inanan bilikli insan
Qismətində olan aşı yeyər.
1741 Eşit gör nə deyir ağıllı insan,
Hərəkətli, canlı, ehtiyatlı insan:
1742 "İstər yat, istər dünyanı gəz, dolan,
Qismətində nə varsa, sənə ancaq o çatar".
1743 Könlünü və dilini doğru tut, ey bilikli hakim,
Vaxt gələndə ruzin yetişər.
1744 Baylıq və dünya varı diləsən,
Bunları doğruluqla əldə etmək olar.
1745 O biri dünyanı da qazanmaq istəsən,
Bunun çarəsi ədalət və imandadır.
1746 Yaxşı demiş təcrübəli, ağıllı ər,
Doğruluqla bu dünyanı tutmuş ər:
1747 "Bu dünyada varlı olmaq istəsən,
Doğru ol, sözünü doğruluq üstə qur.
1748 Əgər axirəti qazanmaq istəsən,
Özünü, sözünü, könlünü təmiz saxla".
1749 Ey Elik, gör bu kişilərin həyatını,
Onların həyatının bəzəyi doğruluqdur.
1750 Doğruluq və imanı özünə yoldaş et,
Bütün işləri insanlıqla gör.

* * *

1751 Öydülmüşün səadəti gündən-günə artdı,
Xalqa məsləhət verdi, onu da dinlədi.
1752 Elik onu hər üzünə sınadı,
Onun doğru-dürüst hərəkət etdiyini gördü.
1753 Elik Öydülmüşün səadətinə inandı,
Bütün əməllərinin doğru və şübhəsiz olduğuna inandı.
1754 Eşit gör bilikli alim nə deyir,
Ey biliksiz, dinlə və bu sözə boyun əy:



1755 "Bəylər xidmətçilərə fikir verməli,
Onları ciddi sınamalıdır.
1756 Qul öz bəyinə yararlı görünsə,
Bəy ona ehsan yolunu açmalıdır.
1757 İş bəyin ürəyincə olsa, xidmətçi böyüyər,
Xidmətçi böyüsə, bəyin adı da ucalar".
1758 Çox gözəl demiş bu Yağma bəyi,
Bütün işlərə onun biliyi və ağlı vaqif imiş:
1759 "Ey bəy, işi bilikliyə ver,
Yararlı adama, düz yolla gedənə ver.
1760 Əgər bəy işi yarıtmaz adama tapşırsa,
Yarıtmazlıq başqasına deyil, bəyə aiddir.
1761 Tanrı kimi xoşbəxt etmək və yüksəltmək istəsə,
Ona yararlı və doğrucul xidmətçi verər.
1762 Yüksəltdiyini yenidən endirmək istəsə,
Ona günü qaranlıq edən xidmətçi verər.
1763 Bəsdir o biliksiz, bəsdir o nadan ki,
Bütün iş pozulsun, yer-göy qopsun, toz dumana qarışsın".

* * *

1764 Bax, Elik Öydülmüşü yüksəltdi,
İnandı, bütün işləri ona tapşırdı.
1765 Bütün elə onu hakim etdi,
Əlini, dilini, sözünü uzun etdi.
1766 Rütbə, damğa (möhür), at və libas verdi,
Çox yüksəltdi, iqbalı çox oldu.
1767 Çoxlu gözəl yarlıqla, min-min gözəl sözlə
Elik onu baratladı, özünə yaxın qıldı.
1768 Qapıdakı kiçik-böyük bütün xidmətçilər,
Ona can fəda etdiklərini bildirdilər.
1769 Nə qədər işçi varsa hamısı gələrək
Ona təzim edib edib hədiyyələr verdilər.
1770 Öydülmüş gözəl qanunlar çıxartdı,
Hər kəsə göz yetirib təqdir etdi.
1771 Bütün güc və təzyiqi xalqın üzərindən götürdü,
Özünü bütün bəd əməllərdən uzaqlaşırdı.

1772 Qanunlar düzüldü, el nizama düşdü,
Elik rahat oldu, ölkə möhkəmləndi,
1773 Elik sıxıntıdan qurtuldu, sevincə qovuşdu,
Həyatdan ləzzət aldı, şad-xürrəm oldu.
1775 Bu mənfəət bilikdən doğur,
Ağıldan, kamaldan, xoşxasiyyətdən doğur.
1776 Necə öyülməsin ağıllı kişi,
Necə pislənməsin ağılsızın işi.
1777 Ağıllının işi həmişə ölçülüdür,
Nadanın işi isə gəlişi gözəl olur.
1778 Ağıllıya səadət çox yaraşır,
Ağıllıya və xoşrəftara səadət çox uyuşar.
1779 İla bəyi nə deyir, eşit,
Bunun mənası sənin sözlərinin təməli olsun:
1780 "Biliksizə dövlət yetişib, səadət nəsib olsa,
Xalqın arasına nifaq, el içinə fəlakət düşər.
1781 Əgər bəylik ağıllı adamın əlinə keçsə,
El rahatlığa çatar, buna inan".

* * *

1782 Elik rahat oldu, günü parladı,
Tanrıya şükür qıldı, onu öydü.
1783 Gözünü göyə dikdi, əlini qaldırdı,
Dedi: – Ey rəbbim, bilik verən sənsən.
1784 Bilik verib məni hakim etdin,
Könlümə qüvvət ver, məni düz yoldan sapdırma.
1785 Mənə qüvvət bağışla ki,
Təbəəmin yükünü çəkə bilim.

* * *

1786 Kasıblara çoxlu mal və əşya payladı,
Hər işdə Tanrıya könül bağladı.
1787 Günlər və aylar beləcə sevinclə ötdü,
Ölkə əhalisi varlandı.
1788 Adamların yaxşısı bax belə olur,
Hayıf ki, bu cür adamlar da ölür.



1789 Hansı xalqın belə bəyi varsa, o, xoşbəxt olar,
Xalqının səadətini istəyən bəy yaxşı bəydir.
1790 Pis, yaxşı – kim ölsə, torpaq olur,
Torpağa çevrilsələr də adları qalır.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1791 Elik bir gün təkcə oturmuşdu,
Öydülmüşü çağırıb sözə başladı.
1792 Dedi: – Ey Öydülmüş, indi bax mənə,
Atanın sənə heç bir zəhməti keçmədi.
1793 Atan ölən zaman sən kiçik idin,
Kiçiklərə yolu böyüklər göstərir.
1794 Atan sənə ərdəm və bilik öyrətmədi,
Məndən də sənə bu işdə kömək olmadı.
1795 Bəs bu qədər ərdəm səndə hardandır,
Sən mənə bunu söylə.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1796 Öydülmüş cavab verdi:
– Elikin ömrü və dövləti uzun olsun.
1797 Tanrı kimə inayət və qismət versə,
O, diləyinə çatar, adı yüksələr.
1798 Buna bənzər türkcə bir məsəldə,
Görüb-götürmüş ağsaqqal demişdir:
1799 İnsan Tanrının fəzli ilə böyüyər,
Diləyinə çatar, işi gündən-günə qaydaya düşər.
1800 Tanrı verənə xalq heç vaxt mane ola bilməz,
Qara yerlə mavi göy birləşsə belə.
1801 Bütün işlərə Tanrı dayaq olsa,
İnsan hər bir diləyinə qovuşa bilər.
1802 Ey Elik, uşaq atadan nə qədər çox alqış alsa,
Oğula sevinc və dua o qədər çatar.
1803 Atam mənə xeyir-dua qılmışdı,
O dua ilə mən bu yerə çatdım.

1804 Qadir rəbbim Eliki də səbəb qıldı,
Mən də bu ərdəm və bilikdən xali qalmadım.
1805 Elik əl tutdu, məni qiymətləndirdi,
Fələk imkan verdi, mən yüksəldim.
1806 Bəylər kimə qiymət versə, üzünə gülsə,
Arzuladığı şeylər başından yağar.
1807 İnsanın könlü bağdır, onu yetişdirən su isə
Bəylərin sözü ilə nəsihətdir.
1808 Hansı bağa daim su dəysə,
Orda minlərlə rəngli, ətirli çiçək açar.
1809 Bəy qulu haqqında xoş söz söyləsə
Qulun könlü açılar, üzü gülər.
1810 Əgər bəy onun haqqında xoş söz deməsə,
Yaşıl çiçəklər tez quruyar, bunu bil.
1811 Qul daim Tanrının fəzlini və inayətini istəməlidir,
Tanrının fəzli olsa, qapılar açılar.
1812 Şair buna bənzər bir söz söyləyib,
İndi dinlə və anla, ey yaxşı insan:
1813 – Tanrı qulu öz fəzli ilə yüksəldər,
Ona bilik qapısı açılar, yolu avand olar.
1814 "İnsanın biliyi olsa, səadəti günbəgün artar,
Özü nə qədər kiçik olsa da, yeri böyük olar".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1815 Elik yenə dedi: – Ey Öydülmüş,
Biliklilər biliyi necə əldə edirlər?
1816 Kişi öyrənməklə hakim olur,
Yoxsa anadan belə doğulur?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1817 Öydülmüş cavab verib sözə başladı,
Dedi: – Bu sözün əsasını izah edim.
1818 Yaradarkən Tanrı insana ağıl və könül bəxş edərsə,
Oğul bilik üçün maya əldə etmiş olur.



1819 Günbəgün inkişaf edir, daim ağıllanır,
Nəyi istəsə, öyrənə bilir.
1820 Beləcə biliyə çatır, bir gün alim olur,
Öz biliyi ilə elə çox xeyir verir.
1821 Yaradanın razılığı olmadan
İnsan heç bir diləyinə çata bilməz.
1822 Bir şərt də var; uşaq bilik istəsə,
Kiçik ikən biliyə əl uzatmalıdır.
1823 Kiçik uşaq biliyi tez öyrənir,
Böyüyəndə diləyinə qovuşur.
1824 Bilik, ərdəm, mərifət və hərəkət
Öyrənənin yolu avand olur.
1825 Biliyi, ərdəmi insan öyrənə bilər,
Ancaq ağıl insanla birlikdə doğulur.
1826 Buna bənzər türkcə bir atalar sözü var,
Onu oxu və faydalan:
1827 İnsan öyrəndikcə biliyi artar,
Biliyi çoxalsa da, ağıl artmaz.
1828 Ağıllı olmaq Tanrı vergisidir,
Əgər ağıl fitrətlə gəlmişsə, olamətini göstərir.
1829 Ağıl ancaq Tanrının ehsanıdır,
İnsan ağılla min qismətə, nemətə nail ola bilər.
1830 Ağıllı insan insanların ulusudur.
Ağıl insan üçün min ərdəmin başıdır.
1831 Ağılsız insana insan demək olmaz,
Nə deyirsə-desin, ona inanmaq olmaz.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1832 Elik yenə dedi: – Bunu eşitdim,
Bir sözüm də var, ona cavab ver.
1833 Ağlı bilikdən fərqli bir şey kimi ayırdın,
Bununla nə demək istəyirdin, doğrusunu söylə.
1834 Ağlın yeri haradır, o harda durur,
Hardan çıxır, çıxsa hara gedir?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1835 Öydülmüş cavab verib dedi ki, ağıl
İnsan üçün qiymətli və əzizi bir şeydir.
1836 Ağlın yeri üstdə, beyindədir,
Qiymətli olduğu üçün onun yeri başdadır,
1837 Ağıl insan üçün bir cidardır,
Hərəkəti doğru, işi ölçülüdür
1838 Bax, mərhəmətli Tanrı qulunu seçmiş,
Əməlini və dilini ağıl ilə cidarlamışdır.
1839 Ağılsız ölüdür, ağıllı isə diridir,
Ağıl insanları bir-birindən bu dərəcədə fərqləndirir.
1840 İnsan gecə kimi qaranlıq bir evdir,
Ağıl bir məşəl kimi oranı işıqlandırır.
1841 Hər cür yaxşılığın mənbəyi ağıldır,
İnsan biliklə böyüyüb təmizlənir.
1842 İnsan oğlu bu iki şeylə yüksəlmişdir,
O, doğruluq yolunda bu iki şeylə müvəffəq olur.
1843 İnsan heyvandan biliklə seçilir,
Bilikdən böyük nə ola bilər?
1844 Ağlın buna bənzər bir sözü vardır,
Ağlı işə tətbiq etsən, faydası çox olar.
1845 İnsanı heyvandan bilik ayırmışdır,
İnsan oğlu biliklə hakim olmuşdur.
1846 Yürü, heyvan olma, ağıllı ol,
Biliklə danış ki, sözün dinlənilsin.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1847 Elik dedi: – Daha bir sözüm var,
Ona da cavab ver, ey gözəlüzlüm.
1848 İndi mənə ağlın tərifini izhar et,
Onun mahiyyəti necədir, adı nədir?
1849 Üzü, görünüşü, hərəkəti, əməli necədir?
Yaşı, dərəcəsi, boyu necədir, nə ilə ovunur?



## XXVII

## ÖYDÜLMÜŞ ELİKƏ AĞLIN TƏRİFİNİ BƏYAN EDİR

1850 Cavab verdi Öydülmüş, dedi: – Ağılın
Əməli doğrudur, güvənci isə çoxdur.
1851 Üzü, görkəmi gözəldir, yaşı daima gəncdir,
Hər bir yaxşılığa keçid verəndir.
1852 Həlim, sağlam və sakit təbiətlidir,
Bütün canlılar üçün şəfqətli bir könüldür.
1853 Hara əli dəysə, ora düzələr,
Hara sözü çatsa, etibar görər.
1854 O, xoşüzlüdür, hamıya sevimlidir,
İnsanlar ondan fayda görərlər.
1855 İtigözlüdür, uzaq görəndir,
Hansı işə əl atsa, ayağını möhkəm basar.
1856 Necə bulanıq iş olsa, onu süzər,
Necə tərs düyün olsa, onu açar.
1857 Sağdan, soldan, öndən, arxadan baxar,
Hər işin həllini və vaxtını bilər.
1858 Qaçana yetişər, uzanı tutar,
Sınığı sarıyar, pozuğu düzəldər.
1859 Ağılsız heyfsiləndi, dedi: – Ey ağıl,
Sənsiz mənim sıxıntım çox-çoxdur.
1860 Mənə səndən pay qismət olmadı,
Sənsiz insan qəlbi ölüdür.
1861 Ağıl bir məşəldir, kor üçün gözdür,
Ölü tən üçün candır, lal üçün sözdür.
1862 Ağıllı ağıla dedi: – Ey yoldaşım,
Sən işlərimi düzəldən yaxşı yoldaşsan.
1863 Ağıl sağdan gedər, onun solu yoxdur,
O, doğru-dürüstdür, onun hiyləsi yoxdur.
1864 Ağıl kimdə isə, bunlar onun bəlkəsidir,
Bu bəlkələr onun bilgisidir.
1865 Ağlın tövrü və hərəkəti daimidir,
Ay, il keçsə də, düz yoldan çıxmaz.

1866 Ağıllı dürüstdür, dili, sözü yumşaqdır,
Hərəkəti doğruluq üzrə qurulmuşdur.
1867 O, həlim, sakit, dözümlü, səbirlidir,
İşə diqqətlə baxar, sona çatdırar.
1868 Hərəkəti qocadır, yaşısa gəncdir,
Onu həm ögə[1], həm də tikit[2] arzular.
1869 İndi buna bənzər bir sözü oxu,
Diqqət etsən, mənası çox dərindir:
1870 Ağlın əməli qoca, yaşısa gəncdir,
Ağıl hara olsa, get ona yapış.
1871 Gəncliyi sevimli, qocalığı sakitdir,
Özü həlim, sadədil və çox faydalıdır.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

1872 Bu sözlə eşitcək Elik sevindi və dedi:
– Ey sözü ağıl və bilikdən ibarət oynamış adam,
1873 Tanrı mənə bütün nemətləri bol-bol verdi,
Sən də mənə Tanrının bir ehsanısan.
1874 Bu əmək çəkilməsi ağır olan bir yükdür,
Onu daşıyan yaxşılığa yetişər.
1875 Kim yaxşılıq diləsə, ağır yük daşıyar,
Ağır yük daşıyan diləyinə çatar.
1876 Yükünü daşısan, diləyin və işin olar,
Mən rahat olaram, sənə zəhmət olar.
1877 Allah mənə bacarıq və güc versin,
Haqqını birə üç ödəyə bilim.
1878 Mənə necə xidmət etdiyini bilirəm,
Məni fikirləşməyin mənə candan bağlılığından gəlir.
1879 Sadiq xidmətçi öz nəfsini deyil,
Bəyin mənfəətini güdən şəxsdir.
1880 Xidmətçinin dili gör nə deyir, eşit:
"Xidmətçi qul bəyini dincliyə qovuşdurar.

[1] Ögə – çox ağıllı adam; dövlət müşaviri
[2] Tikit - təgin, təkin, şahzadə



1881 Bəy məmnun olar və səadətə qovuşar,
Əgər qul sadiq olsa, işini görsə,
1882 Bəy xidmətçi sayəsində köksünü qabardar,
Qul yaxşı xidmət etsə, bəy rahat olar.
1883 Qul sıxıntı, yük və zəhməti ortadan qaldırmalı,
Bəyinə arzu yolunu açmalıdır.
1884 Hansı bəy bu cür xidməti tapsa,
Bu ona Tanrıdan böyük bir hədiyyədir.
1885 Bizdən əvvəl ölən dünya bəylərinin çoxu
Bu arzu ilə dünyadan köçmüşdür".

* * *

1886 Dünya xalqı rahat oldu, səadət tapdı,
Bütün xalq Eliko dua qıldı.
1887 Başqa ellərin adamları da bunu eşitdi və
Onun üzünü görmək istədi.
1888 Bu arzu ilə illər, aylar, günlər keçdi.
Elik yaxşı qanunlarla elini idarə etdi.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1889 Elik bir gün Öydülmüşü yanına çağırıb dedi:
– Səndən bir şey soruşacağam, fikrini de.
1890 Adam öz vücuduna, yeddi əndama baxsa, zövq alar,
Bunların hər biri öz payını toplayar.
1891 Könlün zövqü nədir, gözün zövqü nədir?
Bu iki zövqdən mənim payım nədir?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1892 Öydülmüş cavab verdi, dedi: – Zövq
Könlün arzuladığı və həsrət qaldığı şeydir.
1893 Sevdiyi üzü görmək göz üçün zövqdür,
Könül üçün arzusuna qovuşmaq zövqdür.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1894 Elik təkrar soruşdu: – Ey Öydülmüş, söylə,
Sevgilinin nişanəsi nədir, de.
1895 Hamı sevindiyini iddia edir,
Bu iddianın mənası nədir?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1896 Öydülmüş cavab verdi: – Baş üstə,
İnsan sevgilinin üzünə baxan kimi sevdiyini anlayır.
1897 Göz baxanda hər şey örtülü ola bilər,
Könül üçün örtülü heç nə yoxdur, bunu bil.
1898 Sevib-sevmədiyini bilmək istəsə,
İnsan könlünə baxsın, könüldən öyrənəcək.
1899 Sevənlərin üzündə bunu göstərən əlamət olur,
Göz-gözə gələndə bir-birlərini başa düşürlər.
1900 Şair buna bənzər bir söz demişdir,
Dinləyib anlamağa çalış, ey insanların qarpızı:
1901 Sevən insan üzündən bilinir,
Ağzına açsa, sözünün mənasından sevgi görünür.
1902 Sevib-sevmədiyini bilmək istəsən,
Adamın gözünə bax, sənə baxanda gözündən biləcəksən.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

1903 Elik dedi: – Bu sözü eşitdim, anladım,
Bir sözüm də var, onu başa sal.
1904 Səndən vacib bir şey soruşacağam,
Yaxşı düşün və cavab ver.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1905 Öydülmüş cavab verdi: – Ey müdrik Elik,
Bəylər adlarını biliklə yüksəltmişlər.



1906 Bəylərin özləri bilik sarayıdır,
Qul biliksiz olur, qul sözünün nə qiyməti var?
1907 Soruşmaq asan, cavab vermək çətindir,
Verəcəyim cavab Elikin bilik dairəsindədir.
1908 Asan olanı hökmdar aldı, ey igid qəhrəman,
Çətin olanı mənim öhdəmə qoyma.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

1909 Elik dedi: – Soruşan möhtacdır,
Özü bilmədiyini başqasından soruşur.
1910 Bu belə olduqda sən sevinməlisən,
Soruşduğum sözə cavab verməlisən.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1911 Öydülmüş cavab verdi: – Ey nizam sahibi,
Dinləmək söyləməkdən daha yaxşıdır.
1912 Söz söyləyənin canı üzülər,
Dinləyən rahat olar, kökələr.
1913 Rütbəli hakim nə demiş, eşit:
– Çox söz söyləmə, dinlə və düşün.
1914 İnsan dinləməklə alim olar,
Çox danışanın başı gedər.
1915 Dinləmək qulaq üçün zövqdür,
Çox söz söyləməkdə fayda yoxdur.
1916 Söylənməyən söz külçə qızıldır,
Ağızdan çıxanda misə çevrilir.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

1917 Elik belə dedi: – İndi doğru söylədin,
Sən indi belinə səadət qurşağı bağladın.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1918 Cavab verən Öydülmüş: – Ey ağıllı Elik,
Mən qul olmağa üstünlük verirəm.
1919 Bəyinin rahat olması üçün,
Ağıllı qul canını əsirgəməməlidir.
1920 Mən öz bildiyimi söyləyirəm,
Elik dinləsin, səhvlərimi bağışlasın.

## XXVIII

## BƏYLİYƏ LAYİQ BİR BƏYİN NECƏ OLMASINI BƏYAN EDİR

1921 Elik bunu eşitcək dedi:
– Soruşmaq istədiyim şey elə budur.
1922 Bir olan Tanrı insan oğlunu yaratdı,
Onların arasında böyüyü, kiçiyi, yaxşı və pis adı olanı var.
1923 Bilikli, biliksiz, kasıb, varlı var,
Ağıllı, ağılsız, axmaq var, söylə.
1924 Bəy necə olmalıdır ki, onların başına keçsin,
İşini görsün, ad-sanı dünyaya yayılsın.
1925 Ölkəsi nizamlı, xalqı varlı olsun,
Dünyadan köçəndə yaxşı adı qalsın.
1926 Gümüş və axça ilə xəzinəsi dolsun,
Düşmən boyun əysin, qarışıqlıq olmasın.
1927 Əsgər yığılsın, güclü elə sahib olsun,
Lazımlı biliklə ölkəni idarə etsin.
1928 Şöhrət qazansın, adı dünyaya yayılsın,
Gündən-günə yüksəlsin, səadəti artsın.
1829 Rahat ömür sürsün, uzun illər hakim olsun,
Bütün canlar fəda olsun, o yaşasın.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1930 Öydülmüş cavab verdi və
"Elik məndən çətin bir şey soruşdu dedi".



1931 Bu bəylik işini bütün bəylər bilirlər,
Qanun, nizam, adət onlardan gəlir.
1932 Bəy doğularkən bəyliklə doğulur,
Görərək öyrənir, yaxşını ayırd edir.
1933 Tanrı bu bəylik işini kimə versə,
Ona müvafiq ağıl və könül də verir.
1934 Tanrı hər kimi bəy tək yaratmaq istəsə,
Ona müvafiq ağıl, qol-qanad da verir.
1935 Bu bəylik işi bəylərin işidir,
Bəylərin işini bəy olan bilər.
1936 Bu işi Elik məndən yaxşı bilir,
Atası bəy idi, özü də bəydir.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

1937 Elik dedi: – Anladım, bunlar hamısı doğrudur,
Doğru söz söylədin, söz müşk kimi ətirlidir.
1938 İşi görən adam öz vəzifəsini yerinə yetirər,
Bunun qüsurlu və ya məziyyətli olduğunu görən adam bilər.
1939 Mən işləyənəm, sən onu görənsən,
İşləyən qiymətini görəndən alar.
1940 Tanrı sənə ağıl və könül verdi,
Ağıl və könül sayəsində sən iş görürsən.
1941 Kiçiklikdən mənim yanımda böyüdün,
Yaxşı qanunları görüb öyrəndin, bildin.
1942 Bütün işləri anladın və qavradın,
Mənə işinlə və sözlərinlə candan bağlasın.
1943 İnsan ona ürəkdən bağlı adamla məsləhətləşər,
Sadiq adam özünü başqasına fəda edər.
1944 Mənə candan bağlı olduğun üçün sənə inanıram,
Sözlərimə səmimiyyətlə cavab ver.
1945 Eşit gör nə demiş şəfqətli adam:
"İnsanlığın başı mərhəmətdir".
1946 Ağıllı adam şəfqətlini çox öydü,
Şəfqətli adam insan üçün əzizdir.
1947 Şəfqətli adam tapsan, onu bağrına bas,
Bilik və ağıl mənə belə dedi.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

1948 Öydülmüş cavab verdi, dedi: – Elik,
Ey üstün əl, sağ ol, rahat yaşa!
1949 Bəy nəcabətli nəsildən olmalıdır,
Bəy igid, cəsur, qəhrəman, şirürəkli olmalıdır.
1950 Atası bəydirsə, oğul bəy doğular,
O da ataları kimi bəy olar!
1951 Bəy bilikli və ağıllı olmalıdır,
Comərd və xoşxasiyyət də olmalıdır.
1952 Bəylər biliklə xalqa baş oldular,
Ağılla elin-günün işini gördülər.
1953 Bəy adı bilik sözü ilə bağlıdır,
Biliyin lamı getsə bəy adı qalar[1].
1954 Bəy çox ağıllı olmalı, ağlın qiymətini bilməlidir,
Bilikli insanın düşməni çox olar.
1955 Nə deyir, eşit gör bilik bilən ər,
Başına çox hadisələr gələn ər:
1956 "Qəfil iftiraya uğramamaq üçün
Bəy bilikli, ağ4ıllı və sayıq olmalıdır.
1957 Adının yaxşıya çıxması və boyanın tutması üçün
Xoşəməl və hərəkətlə min əziyyət lazımdır".
1958 Bütün insanların mənşəyi birdir,
Seçilmiş adamlar biliklə fərqlənirlər.
1959 Kökü yaxşı olsa, ər əsilli doğular,
Yaxşı olduğu üçün dör başa keçər.
1960 Bəylik müqəddəsdir, təmizlik istər,
Xalqın da təmiz və ayıq olması lazımdır.
1961 Xalq üçün bəy igid və cəsur olmalıdır,
Böyük işlərə ancaq bu keyfiyyətlər lazımdır.
1962 Eşit gör Ötügən bəyi nə deyir
Ağıllı, təcrübəli, sözü sınanmış bəy:
1963 "Xalq üçün bəy seçkin olmalıdır,
Sözü doğru, təbiəti isə sakit olmalıdır.

[1] Müəllif «bilik» sözünün ərəb əlifbası ilə yazılışını nəzərdə tutur: lam (ل) hərfi olmasa, həmin söz «biy» və ya «bəy» oxunar.



1964 Bilikli, ağıllı, xalqa qarşı xoşrəftar,
Comərd, gözütox, könlü dolu olmalıdır.
1965 Hər cür yaxşılıq üçün əl uzatmalıdır,
Abırlı, həli, əməlisaleh olmalıdır.
1966 Belə bir bəy xalqa yaraşar, böyük olar,
Ondan da yaxşı nəsil törəyər.
1967 Adam hər işə biliklə başlar,
Ağılla sona çatdırar.
1968 Bəy xalqı biliklə əlində saxlar,
Biliyi olmasa, ağlı işə yaramaz".
1969 Bu bəylər yanılsa, ey dövlətli Elik,
Demək, onların bəyliyi xəstələnmişdir, sağaltmaq lazımdır.
1970 Bəylik xəstəliyinin dərmanı ağıl və bilikdir,
Ey xoşrəftar, onu ağıl ilə müalicə et.
1971 Bəy bilikli, ağıllı və zəkalı olmalıdır,
Bəyliyin xəstəliyinin dərmanı ancaq bunlardır.
1972 Bilikli, ağıllı və müdrik bəylərin
Hər iki dünyada yeri yüksək olar.
1973 Hər iki dünyanı bilən adam xoşbəxt olur,
Bütün səadətlərin başında olur.
1974 Şair buna bənzər bir söz demişdir,
Diqqət etsən, bunun mənası cahil üçün gözdür.
1975 Rahatlıq nədir? Bunu mənə izah et,
İnsanlar arasında kim xoşbəxtdir?
1976 Özü yaşayıb, başqasını da yaşadır, dünyada xoş gün görürsə,
O biri dünyada da baş tərəfə keçər.
1977 Xasiyyəti xoş, əməlisalehsə, bax,
O bəyin həyatı səadətlə keçər.
1978 Tanrı kimə versə bu xoşxasiyyəti,
Bu xoşxasiyyətlə yaxşı yolu qismət etsə.
1979 Bu dünya hər cür nemətlə onun olar,
İstəsə özü yeyər, istəsə paylayar.
1980 Allah quluna səadət və fəzilət versə,
Onun məcazi xoş, əməli yaxşı olar.

1981 Minlərlə xoşəməl və hünər lazımdır ki,
O, eli, şəhərləri idarə etsin, dumanı dağıtsın.
1982 Bu xoşxasiyyət nə gözəl şeydir,
Xoşxasiyyət adamın həyatı da gözəldir.
1983 Bayat kimə pis təbiət vermişsə,
Fələyin oxu onu incidəcəkdir.
1984 Bədxasiyyət bəyin işi tərs gətirər,
Üzü sevinc görməz, daim kədərli olar.
1985 Bəy təqva sahibi və təmiz olmalıdır,
Əsli təmiz olan daim təmizlik dilər.
1986 İbadət sahibi xəta işləməkdən qorxur,
Könlü xətadan qorxan bəy işini düz tutur.
1987 Bəy iman sahibi və təmizqəlbli olmasa,
Heç vaxt təmiz və dürüst hərəkət edə bilməz.
1988 Səbir və yumşaqlıq bəyin bəzəyidir,
Bunlar bəyliyin əsas məziyyətləridir.
1989 Bəy işini bilərək başlamalıdır,
Sona yetirmək üçün ağıllı olmalıdır.
1990 İşi ağıllı adamlar bacarırlar,
Ağılsızları işdən iraq tutmaq gərəkdir.
1991 Könül olmasa, gözün faydası yoxdur,
Ağıl da olmasa könlün xeyiri yoxdur.
1992 Ey elin başçısı, eşit,
Sakit, xoşəxlaq, təcrübəli insan nə deyir:
1993 "Kimdə ağıl və anlayış varsa,
Onu nə qədər tərifləsən, yeridir.
1994 Ağıl, anlayış və bilik kimdə birləşirsə,
Pisdirsə, onu yaxşı; kiçikdirsə, böyük bil".
1995 İnsan üçün ağıl çox gözəl şeydir,
Ağıllıya müşavir gözü ilə baxmaq lazımdır.
1996 Tələskənlik hər iş üçün pisdir, qorxu nəticəsində
Əgər bu, bəydə olsa, onun rəngi bozarar.
1997 Tələskənlik, kəvəzəlik və pis əməl –
Bunlar biliksizlik əlamətidir.
1998 Tələsik görülən işin nəticəsi acı olur,
Tələsik yeyilən aş, içilən su xəstəlik gətirir.
1999 Hər işdə sakitliyə riayət et,
İbadətdə tələs, cəld tərpən.



2000 Bəy gözütox, həyalı və həlim olmalıdır,
Sözündə və əməlində açıq olmalıdır.
2001 Acgöz adam heç nə ilə doymaz,
Acgözə bütün dünya neməti az gələr.
2002 Acgözlük dava-dərmanı olmayan xəstəlikdir,
Bu dünyanın bütün kahinləri onu sağalda bilməz.
2003 Bütün aclar yeyib-içər, axır doyarlar,
Acgözün aclığı ölümlə bitər.
2004 Acgöz adamı heç nə doyurmaz,
Dünyaya sahib olsa da, yenə acgöz və kasıbdır.
2005 Bəy həmişə abırlı və adamların seçilmişi olmalıdır,
Abırlının əməli və hərəkəti bütöv olar.
2006 Abırlı adam xoşxasiyyət olar,
Ona yaraşmayan işə əl vurmaz.
2007 Tanrı kimə həya və göz suyu vermişsə,
Ona dövlət və üz suyu da vermişdir.
2008 Bütün mənfi işlərə həya mane olur,
Bütün müsbət işlərə yetirən də həyadır.
2009 Həya insan üçün böyük şey və zinətdir,
Həya insanı ancaq gözəl işlərə sövq edir.
2010 Bəyin dili dürüst, qəlbi doğru olmalıdır ki,
Xalq üçün xeyirli olsun, günəşi doğsun.
2011 Əgər bəylərin könlündə xəyanət olsa,
Xalqa xeyiri dəyməz, ondan vaz keç.
2012 Bəyin könlü, dili və təbiəti düz olmasa,
O eldən səadət qaçar, yaxın gəlməz.
2013 Sözündən qaçan bəyə ümid bağlama,
Ömrün boşuna keçər, peşman olarsan.
2014 Bəy çox ehtiyatlı və sayıq olmalıdır,
O, etinasız olsa, başqalarına sədəmə toxunar.
2015 Hər elin bağı və kilidi iki şeydir:
"Biri ehtiyat, biri qanun" – bunlar əsasdır.
2016 Ehtiyatlı bəy elini qoruyar,
Yağının boynunu əyər, onu kəməndə salar.
2017 Eldə doğru qanun yaradan bəy isə
Eli nizama salar, gününü ağ eylər.
2018 Bəyliyin əsası bu iki şeydir;
Bu iki şey tam olsa, bəy bəylik edər.

2019 Ehtiyatla hərəkət edib, yağısını yenən
Cəsur savaşçı nə demiş, eşit:
2020 "Ey ölkə bəyi, elini qorumaq istəsən,
Elin hər tərəfində ehtiyat tədbirləri gör.
2021 Ehtiyatlılıqla bəyin ölkəsi genişlənər,
Məsuliyyətsizlik bəyliyin təməlini dağıdar.
2022 Ehtiyatlılıqla sən yağıya boyun əydirərsən,
Xalqa hökm edər, rahat yaşayarsan.
2023 Bəy iki şeylə öz bəyliyini pozar,
Əyri yola girər, doğrudan Sezar.
2024 Biri zülm, digəri məsuliyyətsizlikdir,
Bunun ikisi də bəyin elini viran edər.
2025 Düşmənin belini qırmaq istəsən,
Gözün və qulağın tətikdə olmalıdır.
2026 Bəylər düşməni ehtiyatlılıqla əzmişlər,
Məsuliyyətsizlik isə hər şeyi pozmuşudur.
2027 Bəylər etinasız olsalar, işləri getməz,
Etinasızlıq davam etsə, bəylik bitər.
2028 Ehtiyatlı adam həmişə sayıq olar,
Ehtiyat etinasızlığa tələ qurar.
2029 Bəy ehtiyatlı olsa, elə yad əl dəyməz,
Əgər dəysə, ağıl, fikir və biliklə qarşılaşar.
2030 Zalım adam uzun müddət bəy ola bilməz,
Zalımın zülmünü el də qəbul etməz".
2031 Bilikli adam bu haqda nə deyir, eşit:
"Zalım adam elə uzun müddət hökm edə bilməz.
2032 Zülm yanar oddur, yaxınlaşanı yandırar,
Qanun – sudur, axsa nemət bitirər".
2033 Ey hakim, uzun zaman hökm etmək istəsən,
Qanuna əməl etməli, xalqı qorumalısan.
2034 Qanun ilə el genişlənər, dünya nizama düşər,
Zülm ilə ölkə kiçilər, dünya qarışar.
2035 Zalımın zülmü çox saraylar yıxdı,
Zalımın özü axırda acından öldü.
2036 Bəylərin qəlbi düz, qanunları dürüst olsa,
Bəylik pozulmaz, daim ayaqda durar.
2037 Hər şeydən pisi isə, ey ağıllı Elik,
Bəylərin adının yalançıya çıxmasıdır.



2038 Bəyin sözü düz, əməli doğru gərəkdir,
Ta ki, xalq inansın, səadət içində yaşasın.
2039 Yalançı insanlar vəfasız olar,
Vəfasız adamlar xalqa xəyanət edər.
2040 Eşit, gör vəfalı insan nə deyir:
"İnsan üçün insanlığın başı vəfadır.
2041 Yalançının əməli, hərəkəti cəfadır,
Kim cəfa verirsə, o heyvandır.
2042 Yalançı adamdan vəfa gözləmə,
Bu, uzun zamandan bəri sınanmış sözdür.
2043 Bəy cəsur, igid və cürətli olmalıdır,
Bəy cəsarəti ilə düşmənə qarşı çıxmalıdır.
2044 Qorxaq əsgərin cəsarət alması üçün
Sübaşı[1] qəhrəman və cəsur olmalıdır.
2045 Cəsur adam qorxaqların başına keçsə
Hamı ondan cəsarət alar.
2046 Bu sözə şahid kimi bu beyti oxu,
Bu sözü könlünə və ağlına yaz:
2047 "Əgər aslan itlərə başçı olsa,
Hər it qarşısındakına aslan kəsilər.
2048 Əgər it aslanlara başçılıq etsə,
O zaman aslanların hamısı it kimi olar.
2049 Bəyə comərdlik və sadəlik lazımdır,
Sadəliklə bərabər xoşxasiyyət olmalıdır.
2050 Bəylər comərd olsa, adları dünyaya yayılar
Onların ad-sanı ilə dünya qorunar.
2051 Ətrafına ər, at və qoşun yığışar,
Ər, at və qoşun olsa, bəy arzusuna çatar".
2052 Eşit, gör nə deyir savaşçı ər:
"Ey qəhrəman, vur-al, aldığını təkrar igidlərə ver.
2053 Comərd ol, bağışla, yedirt və içirt,
Malın azalsa, vur – al, yenə varlan.
2054 Cəsur və ürəkli insan üçün mal,
Ağ şahin üçün yem əskik olmaz.
2055 Qılıncı, baltası, ox-yayı, gücü, cəsarəti varsa,
İgid ər sərvət qayğısı çəkməməlidir.

[1] Sübaşı – sü əski türkcə qoşun, sübaşı sərkərdə

2056 Dünyanın hakimi bəy üçün xəzinə toplayar,
Harada əsgər varsa, oradan hazır xəzinə alar.
2057 Ölkə tutmaq üçün çoxlu ər, at, qoşun lazımdır,
Əsgər saxlamağa sərvət və mal gərəkdir.
2058 Sərvəti əldə etmək üçün xalq varlı olmalıdır,
Xalqın varlı olması üçün yaxşı qanunlar lazımdır.
2059 Bunlardan biri unudulsa, dördü də heç olar,
Dördü də unudulsa, bəylik puç olar.
2060 Ad-sanı yayılsın deyə bəy
Bu beş şeydən uzaq olmalıdır.
2061 Birinci – tələsmək, ikinci – xəsislik, üçüncü – qəzəb,
Bunlara heç vaxt məğlub olma, müqavimət göstər.
2062 Bəyə əsla yaraşmayan dördüncü şey inaddır,
Yaramaz şeylərin beşincisi isə yalançılıqdır.
2063 Bunlardan bəylər uzaq olmalıdırlar,
Yoxsa adları pisliyə, sözləri yalana çıxır.
2064 Bunların ən pisi inadkarlıqdır,
İnadkar adam çox möhnət çəkər".
2065 Şair buna bənzər bir söz söyləmişdir,
Şair sözünə qiymət verənin sözü zənginləşər:
2066 "İnadkarlıq insan üçün ağır bir yükdür,
Ondan qurtul və onunla döyüş.
2067 O, insana düşməndən çox pislik edər,
Demək, inadkarlıq da düşməndir".
2068 Ey Elik, çoxlu ölkə tutmaq istəsən,
Bu üç şeyə əməl et:
2069 Sağ əlin qılınc tutub vuruşsa,
Sol əlin qoy mal paylasın.
2070 Dilin şəkərdən şirin söz desin,
Onda bəy – qul, böyük-kiçik hamı sənə boyun əyər.
2071 Ey Elik, hakimə bir neçə keyfiyyət lazımdır ki,
Xalq onu sevsin, etibar göstərsin.
2072 O, gülərüz, şirinsiz, xoşqılıq olmalıdır,
Bütün hərəkətlərində buna uyğun davranmalıdır.
2073 Bəy sadədil, comərd olmalıdır,
Mərhəməti də bunlara uyğun gəlməlidir.
2074 Hər cür ərdəmi bütünlüklə əldə etməli,
Yaraşmayan şeylərdən iraq olmalı!



2075 Belə bir bəy adamların yaxşısı, elin yaraşığıdır,
Seçilmiş və yaxşı adam kiçilməyən aya bənzər.
2076 Bütün dünya xalqı ona qul olar,
Belə bəylər dünyaya hakim olar, arzuya çatarlar.
2077 Qaşqabaqlı, qaba sözlü, təkəbbürlü adama
Hamı nifrət edər, onun işini düzəltməz.
2078 Axmaqlıq, tələskənlik, zəvzəklik cahillər üçündür,
Bəy bu qüsurlardan uzaq olmalıdır.
2079 Cahillərin təbiəti bəyə yaraşmaz,
Əgər yaraşsa, bəyin etibarı olmaz.
2080 Qara – qul rəngidir, bəy rəngi ağdır,
Ağla qara belə ayırd edilmişdir.
2081 Seçkin bəy ola bilmək üçün
Ərdəmə qiymət verilməlidir, ey adı məşhur.
2082 Adı bəy, xasiyyəti cahil olan adam
Xalq arasında cahildən də aşağıdır.
2083 Bəy gözəlüzlü, yaraşıqlı, ortaboylu,
Eyni zamanda adlı-sanlı olmalıdır.
2084 Üzünü görən hər kəs onu sevməlidir,
Eli-günü ona baxıb inamla yaşamalıdır.
2085 Yağıya qarşı mərd və cəsur olmalı,
Gözəlliyi görən gözü parlamalıdı.
2086 Bilik baxımından boyunun uzun olması lazım deyil,
Boyca çox kiçik olması da yaramaz.
2087 Ona görə ortaboylu olmalıdır,
Çünki orta boylu olması daha yaxşıdır.
2088 Eşit, gör nə deyir sınanmış adam,
Başına çox iş gəlmiş, qocalmış adam:
2089 "Qısaboylu, balaca adam çox xırçın olur,
Haraya getsə qalmaqal salır.
2090 Boy – orta, hər şey ona mütənasib olmalıdır,
Ey bilikli insan, hər işdə orta yolu tut.
2091 Bəy içki içməməli, fəsad qurmamalıdır,
Çünki bu iki şey nəticəsində iqbal korlanar.
2092 Dünya bəyləri şərabın dadına alışsalar,
Ölkənin, xalqın bundan çəkdiyi zəhmət çox acı olar.
2093 Əgər hakimlər qumara qurşansalar,
Ölkəni xaraba qoyar, xalqı möhtac edərlər.

2094 Dövlət işləri vaxtında görülməsə,
Onu ov quşu ilə də qovsan tuta bilməzsən.
2095 Bilik verən və biliksizi tənqid edərək
İçkiyə nifrət edən insan nə deyir, dinlə:
2096 – Ey içki düşkünü, boğazının əsiri, içki içmə,
İçki içsən kasıblıq yolu üzünə açılacaq.
2097 Cahil içkiyə qurşandı, sərvəti yel kimi sovruldu,
Bəy içkiyə mübtəla olsa, ölkə qalarmı?
2098 İçki və meyxanaçı düşməndir, pulunu alır,
İçki içən xırçın və davakar olur.
2099 İnsan sərxoş olsa, dəli olur, ağlını itirir,
Dəli də heç düz hərəkət edərmi?"
2100 İman sahibi insan nə deyir, eşit,
Ey boğazının qulu, bu sözə əməl et:
2101 "Görülməli çox işlər içki üzündən görülməz,
Görülməməli çox işlər isə sərxoş vaxtı görülər.
2102 İçkinin ucbatından çox pis işlər baş verir,
Necə yaxşı işlər içkinin ucbatından baş tutmur.
2103 Bəy sərxoşluq və qumarla vaxt keçirsə,
Ölkənin işini düşünməyə imkan tapmaz.
2104 Fəsad olan yerdən səadət qaçaq düşər,
Fəsad həmişə bəyliyə xələl gətirər.
2105 Səadət və iqbal həmişə təmizdir, təmizlik arzular,
Səadət duru, həmişə saflığa tərəfdardır.
2106 Bəy içki düşkünü, fitnəkar və qaba olsa,
Onun xalqı da bütünlüklə əyyaş olar.
2107 Xalqın çatışmazlığını bəylər həll edər,
Bəs bəyin çatışmazlığını kim düzəldə bilər?
2108 Natəmiz şeyləri su ilə yuyub təmizləmək mümkündür,
Əgər su natəmizdirsə, o nə ilə və necə təmizlənər?
2109 İnsan xəstələnəndə onu həkim müalicə edər,
Həkim xəstələnsə onu kim sağaltmalıdır?
2110 Bəylərin hərəkətləri təmiz və doğru olmalıdır.
Çünki xalq bəyin yolu ilə gedir.
2111 Bəylər adət-ənənəyə necə əməl etsinlər,
Xalq da eyni cür hərəkət edər.
2112 Bax elə söz də ona şahiddir,
Diqqət etsən, mənası buna uyğundur.



2113 Bəylər hansı yolla getsələr,
Onların yolu qulun da yoludu.
2114 Bəy yaxşı, yolu isə doğrudursa,
Qul o yolla daha rahat gedəcək.
2115 Bəy məğrur, qaba və təkəbbürlü olmamalıdır,
Qürur insanı doğru yoldan çıxardır.
2116 Bəylər ancaq səadətlə böyük olurlar,
Böyük olmaq üçün təvazökar olmalıdır.
2117 Eşit, gör nə deyir ağıllı adam,
Xalq arasında tanınmış bilikli adam:
2118 – Bəylər təkəbbürlü, müştəbeh olsalar,
Ay oğlu, onların etibarı ucuz olar.
2119 Məğrurluq insanı göyə yüksəltməz,
Təvazökarlıq isə onun işini pozmaz.
2120 Qürur faydasızdır, o, insanları səndən soyudar,
Təvazökarlıq isə insanı yüksəldər.
2121 Bəy təvazökar və sadə olmalıdır,
Əgər belə deyilsə ondan əlini çək.
2122 Bəy təvazökar və mərhəmətli olmalı,
Günahkarların günahını bağışlamalıdır.
2123 Xidmətindəkilər ona alışarlar,
Alışsalar, yaxşı xidmət edərlər.
2124 Xalq başçısı olan bəyə bu himmət gərək,
Himmətlə birlikdə mürüvvət gərək.
2125 Himmətlə mürüvvət və ad-san çıxarsa,
Diləyinə çatar, ov onun ayağına gələr.
2126 Himmət sahibi olmayan şəxs ölüdür,
O hər iki dünyadan binəsibdir.
2127 Himmətlə birlikdə siyasət də lazımdır,
Bəyə siyasət üçün rəyasət gərəkdir.
2128 Bəy eli və qanunu siyasətlə nizamlayar,
Xalq öz hərəkətini onun siyasətinə uyğunlaşdırar.
2129 Bu beytlər bu sözə cavab və şahiddir,
Şahid haradadırsa, dəlil də oradadır.
2130 Bəylərin qapısını siyasət bəzəyər,
Bəy siyasətlə elini nizama salar.
2131 Pis adamlara qarşı siyasət işlətməli,
Xalq arasında qarışıqlığı siyasət yatırar.

2132 Elin dirəyi, təməli və sağlamlığı,
Əsası və kökü iki şeyə bağlıdır.
2133 Bunlardan biri xalq üçün yaxşı qanun,
Digəri isə xidmətçilərə verilən gümüşdür.
2134 Xalq qanun sayəsində sevinc içində yaşamalı,
Pulu görən xidmətçilərin üzü gülməlidir.
2135 Bu ikisi bəydən razı qalsa,
Bəyin eli nizamlı olar, bəy rahat olar.
2136 Əgər bəy xalqa qanun verməsə,
Xalqı qorumasa, ölkə talanar,
2137 O bəy xalqın içinə od atmış olar,
El dağılar, bəyliyin təməli yıxılır.
2138 Hansı bəy əsgərlərini sevindirməsə,
Onda qılınclar qından çıxmaz,
2139 Bəylər ölkəyə qılıncla hökm edirlər,
Qılıncsız bəy hökmran ola bilməz.
2140 Qılıncla balta ölkənin keşikçisidir,
Xalqın başçısı ölkəni qılıncla alar".
2141 Dünyanı tutan adam eşit, gör nə deyir,
Qılınc və balta ilə yağını yenən nə deyir:
2142 "Ey ölkəyə sahib olan, onu qoru,
Zəhər yeyən onu qafillikdən yeyir.
2143 Ey qüdrətli adam, qılınc və balta keşikçin olsun,
Qılınc keşikçi olsa, bəy rahatlığa qovuşur.
2144 Qılınc tərpəndikcə düşmən tərpənə bilməz.
Qılınc qına girsə, bəyin rahatlığı pozular.
2145 Qılınc vuranı sevindirir, ey bəy,
Onda özün də sevinər, zəhmət üzü görməzsən".

* * *

2146 Öydülmüş təkrar dedi: – Ey qutlu Elik,
Elin işləri ağır, şərəfi böyükdür.
2147 Xalqa başçılıq etmək ağır və böyük işdir,
O, baş ağrıdan və əziyyətli işdir.
2148 Bu işin sevinci az, qayğısı çoxdur,
Öyəni az, söyəni isə çoxdur.



2149 Haraya baxsan, orada bir təhlükə var,
Sevincini sorsan, o da lap azacıqdır.
2150 Sevməyəni çox, sevəni azdır,
Zəhməti çox-çox, rahatlığı azdır.
2151 Heç bir yerdə könlün rahat olmaz,
Könül narahatlığı insan üçün iztirabdır.
2152 Diqqət etsən, onun hər işində bir xətər var,
Xətərli işin dadı qaçar.
2153 Eşit, gör ağıllının sözü nə deyir,
Ağıllı söz bir qatar inciyə bənzər:
2154 "Hökmdarın boynu tük, başı bürc kimidir,
Ağıllı adam ona çox inanmaz.
2155 Bəylik baş üstündən asılmış qılınc kimidir,
Hər gün bəyliyə min xətər toxuna bilər.
2156 Bəyliyin hər işi belədir,
Kimini rahatlığa qovuşdurar, kiminin başını yeyər.
2157 Həm bu dünyanı, həm axirəti tapmaq istəsən,
Bu bir neçə işi əldən qoyma, bacarsan elə.
2158 Könlünü, dilini doğru tut, Tanrıya sığın,
Allahın əmrlərinə boyun əy.
2159 Rəbbimdən nə gəlsə, qəbul elə,
Hər şeyə razı olmaq qul işidir.
2160 Xalqa səmimi bir mərhəmət göstər,
Həmişə yaxşılıq elə, yaxşılıq tap".
2161 Xalqa xeyir ver, zərər vurma,
Yaxşı hərəkət et, pisləri zərərsizləşdir.
2162 Dünya və həyat sənin oldu,
Sağ ikən ondan sevinclə istifadə elə.
2163 Can çıxsa da ümidini üzmə,
İnan ki, Allah yaxşıya-yaxşı yol göstərər.

* * *

2164 Onu ki, mən dedim, Elik eşitdi,
Bəyə belə ərdəm və bilik lazımdır.
2165 Kimdə belə ərdəm və tərbiyə varsa,
Onu bəy kimi ölkədə yüksəltmək lazımdır.

2166 Belə adam əla bəy və xalqa başçı olar,
İnsanlar ondan çox yaxşılıq görərlər.
2167 Bilikli və zəkalı adam nə deyir, eşit:
"Bilikli və müdrik adamın biliyi ölkəyə zinətdir.
2168 Bəy bilikli, ağıllı, adil olmalıdır,
Ad-sanı naminə cəsur və tədbirli olmalıdır.
2169 Ölkəsini yaxşı idarə etmək üçün
Nəcabətli, abırlı, xoşqılıq, mərhəmətli olmalıdır.
2170 O, gözütox, səbirli, təvazökar,
Şəfqətli və sakit təbiətli olmalıdır.
2171 Bütün ərdəmlərdə hamıdan üstün,
Xalqa qarşı ədalətli olmalıdır.
2172 Hansı ölkənin bəyi belə olsa,
O ölkənin xalqı dərddən xilas olar.
2173 Orada səadət günəşi doğar, asayiş olar,
Təəssüf ki, belə adamlar tez ölərlər".

* * *

2174 Ey Elik, mənim bildiklərim bunlardır,
Düşündüklərimi sənə söylədim.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

2175 Elik dedi: – Eşitdim doğru sözlərini,
Mənə lazım olan bu idi, birlikdə yanılma
2176 Səndən soruşacağım bir söz də var,
Onu da mənə açıqca söylə.
2177 Bəy əgər ərdəmlə dolu olsa,
Bəs onun vəziri necə olmalıdır ki?
2178 Qızıl-gümüşlə zəngin bir xəzinə yığsın,
Ölkə nizama düşsün, şəhərləri çoxalsın.
2179 Ölkəni tənzim etsin, doğru qanunla idarə etsin,
Xidmətindəkilər yaxşılıq görərək ona isinsinlər.
2180 Xalq rahatlığa qovuşsun, kimsə ona əl uzatmasın,
Bəyin adı yaxşılıqla dünyaya yayılsın.



# XXIX

## ÖYDÜLMÜŞ BƏYLƏRƏ VƏZİRLİK EDƏ BİLƏCƏK ADAMIN NECƏ OLMASINI BƏYAN EDİR

2181 Öydülmüş cavab verib dedi: – Ey Elik,
Vəzir bəylərə uzanmış əl deməkdir.
2182 Şübbəsiz, bəyə vəzir gərəkdir,
Vəzir yaxşı olsa, bəy rahat yatar.
2183 Vəzir bəylərin yükünü çəkəndir,
Vəzir bəyliyin təməlini bərkidəndir.
2184 Bu işə xalq içindən seçilmiş adam lazımdır,
Ağlı, könlü yetkin, işini ürəkdən sevən olmalıdır.
2185 Ağlı çox, biliyi dəniz olmalıdır,
Hər işi bacarmalı, bəyin üzünü güldürməlidir.
2186 Nəcabətli, iman sahibi, doğrucul olmalı,
Həyatını belə keçirməlidir.
2187 Bu, mühüm işdir, ona xüsusi adam gərəkdir,
O, doğru və xoşəxlaq olmalıdır.
2188 Həm ağıllı, həm də bilikli,
Həm müdrik, həm də qılıqlı olmalıdır.
2189 Nəcabətli, ağıllı adam hər yerdə yüksələr,
Heç bir şeydən məhrum olmaz.
2190 Vəzir imanlı və tərtəmiz olmalı,
El və xalq ondan əmin olmalıdır.
2191 Vəzir seçkin insan və ibadət sahibidir,
Bütün möhtaclara dava-dərmandır.
2192 İmanlı adam işində tədbirli olar,
Yaramaz işə yaxın durmaz, işin vaxtını bilər.
2193 Bəydən sonra ölkəyə əli çatan,
Xalqa sözü və hərəkəti ilə hökm edən adam vəzirdir.
2194 Nəcabətsiz adamlar natəmiz olar,
Natəmiz adamdan vəzir çıxmaz.
2195 Soylu insan vəfalı olar,
Natəmiz adamsa cəfalı olar.
2196 Qanun adamı nə demiş, eşit:
"Qanun adamı hər yerdə yuxarı başa keçər".

2197 Soyluların hərəkəti zərif olar,
Xalqa vəfalı əl uzadarlar.
2198 Natəmizin hərəkəti vəfasız cəfadır,
Nə qədər şəkər və ilig yedirtsən, xeyiri yoxdur.
2199 Vəzir abırlı, gözütox və bütöv olmalıdır,
Abırsız adam insanların ən alçağıdır.
2200 Gözütox olmalı, mala həris olmamalıdır,
Acgöz adam bu dünyanı yenə də, doymaz.
2201 İnsanların seçkini abırsız olandır,
Abırlı adam insanların başıdır.
2202 Kimdə abır varsa, işi ona tapşır,
İnsan abırla alçağın yolunu kəsər.
2203 İnsanların alçağı abırlı olandır,
Abırsızın dilindən doğru söz çıxmaz.
2204 Abırlı, xoşxasiyyət adam nə deyir, eşit,
O, yazığı gəldiyi üçün sənə nəsihət verir:
2205 "Abırsız adamdan iraq ol, iraq,
Həyasız gördüyünü inkar edən gözdür.
2206 Həyasızın üzü sanki ətsiz sümükdür,
Həyasızın özü isə qapanmaz bir gedikdir.
2207 Həya ilə insanın şərəfi artar,
Buna görə həyalının gözü parlar.
2208 Vəzirin üzü gözəl, cizgiləri kamil,
Özü də xalqın haqqını vermək üçün adil olmalıdır.
2209 Hərəkəti doğru, təbiəti mülayim olsa,
Xalqa aylar, illər boyu yaxşılıq edər.
2210 Xidmətçilərin başı olan vəzir düz xidmət etməsə,
Bəylərin işi bütünlüklə əyri gedər.
2211 Xidmətçi doğru və düzgün olmalıdır ki,
Bəylər ona inanaraq iş tapşırsın.
2212 Gözəl insanın təbiəti də gözəl olar,
Əməli də gözəl olsa, elə faydası dəyər.
2213 Kimin üzü və zahiri gözəldirsə,
Zahiri kimi batini də gözəl olar".
2214 Eşit, gör nə deyir sınamış adam,
Sınaqla yaxşı-pisi seçən adam:

2215 "İnsanın daxili təbiəti zahirinə bənzər,
Üzü və cildi ilə hərəkəti uyğundur.
2216 İnsanın zahirini batininə şahid bil,
Zahiri batini, batini də zahiri kimidir".
2217 Saç-saqqalı səliqəli vəzir zabitəli olar,
Vəzir zabitəli olsa, işlər yolunda gedər.
2218 Vəzir hesab bilən, alim və müdrik,
Bilikli və müxtəlif yazıları bilən olmalıdır.
2219 Vəzirin işi hesabla görülər,
Hesab bilməsə, xidmətçinin işi getməz.
2220 Adam bütün işlərini hesabla görər,
İli, ayı, günü, vaxtı hesabla təyin edər.
2221 Hesabın adı hesablı olmaqdan hesab olub,
Diqqət etsən, hesab çox hesablı bir işdir.
2222 İnsan zəkalı olmasa, işini bacarmaz,
İnsan işini zəka ilə görər.
2223 İnsan bildiklərini yazı ilə yazar,
Yazsa, nə etmiş olduğunu bilər.
2224 Bu yazı zəkalılıq əlamətidir,
Yazı bilən adam zəkalı olar.
2225 İnsan oğlu, yazını bilməsəydi,
İlin, ayın və günün sayını necə bilərdi?
2226 Alimlər kitablar yazıb qoymasaydılar,
Hesab aparmaq necə mümkün olardı?
2227 Tanrı bu dünyanı yaratmazdan əvvəl
Lövhə ilə qələmi yaratmışdır.
2228 Qulun nə etdiyini mələk yazar,
Sonra tanrı sabah o işi soruşar.
2229 Vəzir təvazökar, dili yumşaq olmalıdır,
İnsan özünü başqalarına bu cür sevdirər.
2230 Təvazökarlıq insanı başqalarına sevdirər,
Sevilən adamlar dostlarını sevindirərlər.
2231 Təvazökar və sakit insan nə deyir, dinlə:
"İnsan üçün təvazö çox gözəl şeydir.
2232 Təvazökar adamı xalq sevər,
Təkəbbürlü və kinli adamı sevməzlər.
2233 Təvazökar adama həmişə etibar var,
Təkəbbürlülər və kinlilər böyüklüyə çatmazlar.

2234 Vəzirliyə yetişmiş adam lazımdır,
O, savadlı və çox ağıllı olmalıdır.
2235 Dili, könlü bir, əməli dürüst,
Abırlı, mehriban, xalq içrə tanınmış olmalıdır.
2236 Gözütox, sayıq, ehtiyatlı, işbilən,
Yararlı ilə yararsızı seçən adam olmalıdır.
2237 Xidmətə hazır, vəfalı, könlü təmiz,
Əmanətə qarşı sədaqətli olmalıdır.
2238 Bu ərdəm və bilik kimdə olsa,
Elik vəzirliyi ona tapşırmalıdır.
2239 Bəyin belə bir vəziri olarsa,
Bəy də, xalq da rahatlığa qovuşar.
2240 Hökmdarın işi dilədiyi kimi olar,
Ölkə nizama düşər, xalq varlanar.
2241 Yararsızı biri ölkədə vəzir olarsa,
Ölkədə kasıb, varlı – hamı pozular.
2242 Vəzirin yaxşı olması xalqa xeyirlidir,
Xalq üçün faydalısa, hökmdar üçün zövqdür".
2243 Nə deyir, eşit, bir biliyi dərin,
Biliklə köksü, könlü aydınlanmış şəxs:
2244 "Bəyin sözü və könlü yaxşı olsa,
Onun xidmətçiləri doğru yolla gedərlər.
2245 Əgər bəylər zalım və pis olsa,
Xidmətçiləri də pis yola düşərlər.
2246 Bəy yaxşı olsa, onun işçisi
Xoş əməl sahibi olar, zərərsiz olar.
2247 Bəylər özləri pis olmadıqca
Pis adamları yaxınlarına qoymazlar.
2248 Pislik hardadırsa, pislər də oradadır,
Ey yaxşı insan, sən yeri və yaxşı yoldaş axtar.
2249 Pis yaxşı ilə heç vaxt dil tapa bilməz,
Doğru olan əyri ilə başa çıxa bilməz.
2250 Qaranlıq gecə nurlu gündüzə yaxınlaşa bilməz,
Mavi su qızıl alovla qonaq ola bilməz.
2251 Tanımadığın adamı tanımaq istəsən,
Kimi tanıdığını soruş, onda tanıyarsan.
2252 Hər şey öz cinsindən olanlara qatışar,
Sən halallıqla yaşa, əyrilərə qoşulma".



2253 Bu sözü təsdiq edən bu beyti oxu,
Bu beyti oxu və könlünə toxu:
2254 "Yeriyən və uçan hər bir şeyi gör,
Hərəsi öz tay-tuşunu yoldaş seçər.
2255 Pis yaxşıya qoşulmaz, qaçar,
Bu qayda hər şeyə tətbiq edilir.
2256 Vəzir həmişə bəyin müşaviridir,
Müşavirlər daim müqayisə ilə hərəkət edərlər.
2257 Pisə qoşulma, onun işi qaradır,
Bu ağır yükü çiyninə alma.
2258 Bəylər yaxşı adamları başlarına yığsalar,
İşləri yaxşı gedər, yaxşı ad çıxararlar.
2259 Əgər pis adamları başına yığsa,
Adı ləkələnər, ölkənin işi pozular".
2260 Ey Elik, belə bir vəzir olsa,
O, bəyini və xalqını rahatlığa qovuşdurar.
2261 Bəy onun vasitəsilə arzularını gerçəkləşdirər,
Vəziyyət necə olsa da, nizama düşər.
2262 Xalqı varlanar, ölkəsi nizama düşər,
Xəzinə artar, bəyin həyatı xoş keçər.
2263 Onun adı-sanı heç vaxt qocalmaz,
Özü yaşlansa da, yeri möhkəm olar.
2254 O, bu dünyanın da səadətini ələdə edər,
Axirətdə də uzun zaman xoşbəxt yaşar.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2265 Elik dedi: – Bu sözlərini başa düşdüm,
Bu gün çox yaxşı sözlər söyləndi.
2266 İndi de görüm, sübaşı necə olmalıdır ki,
Bəylərin işini yaxşı görsün.
2267 Ordunun başına keçsin, işini görsün,
Heç vaxt səhvə yol verməsin?
2268 Mənə de görüm, bu işə kim yarayar,
Qoşunu götürüb düşməni qırar?

## XXX

## ÖYDÜLMÜŞ ELİKƏ SƏRKƏRDƏNİN NECƏ OLMASINI BƏYAN EDİR

2269 Öydülmüş cavab verib dedi: – Ey Elik,
Həmişə düşməndən üstün olasan!
2270 Sülhə gəlməyən düşmənin yuxusunu qaçırmaq üçün
Bəyə bir ordu sərkərdəsi lazımdır.
2271 Bu işə çox çevik, sərt, təcrübəli,
Bütöv bir şir ürəkli adam lazımdır.
2272 Orduya sərkərdəlik etmək,
Qoşuna rəhbərlik və düşməni qırmaq böyük işdir.
2273 Bu iş üçün seçkin ər lazımdır,
O, məsuliyyətli, ehtiyatlı və sayıq olmalıdır.
2274 Comərd, igid, təvazökar,
Duz-çörəkli, soyuqqanlı olmalıdır.
2275 Ətrafına cəsur adamların yığılması üçün
Ordu başçısı çox comərd olmalıdır.
2276 O, bütün malını əsgərlərə dağıtmalı,
Çoxlarıyla dost, yoldaş, silahdaş olmalıdır.
2277 Özünə bir at, geyim və silah ayırsın,
Məşhur olub dünyaya səs salmaq ona bəsdir.
2278 Oğul, qız, arvad üçün mal yığmamalı,
Yer, yurd, bağ üçün gümüş toplamamalıdır.
2279 O bütün arzusunu qılıncıyla istəməlidir,
Vurmalı, alıb verməli, şöhrətini artırmalıdır.
2280 Silahdaşlarını yedirib– içirtməli, geyindirməlidir,
Onlara çoxlu at, qız, oğlan hədiyyə etməlidir.
2281 Bax, onda başına ərlər-ərənlər yığılar,
Canlarını fəda edib dağ-qaya yıxarlar.
2282 Həm ürəkli, həm də çox zəkalı olmalı,
Həm mərd, həm də təvazökar olmalıdır.
2283 Ürəksiz adam döyüşdə gərəksizdir,
Qorxaq adamlar qadınlara bənzəyirlər,
2284 Qorxaqlar qoşunu pozarlar,
Qoşun pozulsa, insan insanı tapdayar.



2285 Döyüşdə ürəkli igidlər lazımdır,
Yağı atla gəlsə, toplaşmaq gərəkdir.
2286 Ölüm üçün, şübhəsiz, əcəl gəlməlidir,
Əcəl gəlməsə, heç bir igid ölməz.
2287 Ölümü unudaraq yağını qıran adam,
Cəsur və şirürəkli adam nə deyir, eşit:
2288 "Anadan doğulmuş heç kim əcəlsiz ölməz,
Yağını görcək niyə qorxursan?
2289 Düşmənə hücum et, ər kimi vuruş,
Əcəli gəlməyincə insan əsla ölməz.
2290 Sərkərdə heysiyyət sahibi olmalı,
Düşməndən qisas almadan geri dönməməlidir.
2291 O, şərəf duyğusuzla yağını tar-mar edər,
Döyüşdən ancaq şərəfsizlər qaçarlar.
2292 Qorxaqlar da şərəf naminə qəhrəmana çevrilər,
Öyünməkdən ötrü özlərini fəda edərlər.
2293 Cəsurlar heysiyyət sahibi olurlar,
Heysiyyətlilər ancaq vuruşaraq ölürlər.
2294 Sərkərdə xoşxasiyyət və təvazökar olmalı,
Beləliklə, özünü xalqa sevdirməlidir.
2295 Təvazökarlar insan qəlbini özünə isindirər,
Dili acı və qəzəblilər adamı özündən uzaqlaşdırar.
2296 Ordu sərkərdəsi təkəbbürlü olsa,
Yağıdan hökmən təpik yeyər.
2297 Təkəbbürlü adam etinasız olur,
Etinasız isə ya tar-mar olur, ya vaxtsız ölür.
2298 Cəsur, zabitəli, saç-saqqalı səliqəli olmalı,
Adı və şöhrəti, mərdliyi yayılmalıdır.
2299 Ondan qorxsunlar deyə pislərə zabitəli olmalı,
Sevsinlər deyə yaxşılara xoş üz göstərməlidir.
2300 Sərkərdə siyasətdə iş görməyi bacarmalıdır,
Ordunun işi siyasətlə bağlıdır.
2301 Siyasət işlədilsə ordu başsız qalmaz,
Ordunun başçısı olsa, əsgərlər bir-birini qoruyar.
2302 Başsız ordudan əlini üz,
O ordu pozular, ey Elik, çox yaşa.

2303 Pislərə qəzəb və siyasət,
Yaxşılara həmişə hörmət etmək lazımdır.
2304 Yaxşı adamlara hər cür yaxşılıq et,
Sevindir, onlara yük yükləmə.
2305 Bütün insanlar bu yaxşılıqları axtarırlar,
İnsan yaxşılıq gördüyü adama qul olar".
2306 Xoşxasiyyət adam enə deyir, eşit,
Bu beyti oxu və təsəlli tap:
2307 "Sərbəst və azad adamlar yaxşılığa quldur,
Sən yaxşılıq elə, doğruluq yolunu aç.
2308 İnsan kimi hərəkət etmək üçün daim insan ol,
İnsan insanlığın təməlini belə qoymuşdur.
2309 Sərkərdə bu bir neçə keyfiyyətə malik olmalıdır ki,
Düşmənə qarşı səfərə çıxa bilsin, ordunu idarə etsin.
2310 Onun ürəyi döyüşdə aslan ürəyi kimi,
Biləyi isə qaplan biləyi kimi olmalıdır.
2311 O, qaban kimi inadkar, qurd kimi qüvvətli,
Ayı kimi azğın, çöl sığırı kimi kinli olmalıdır.
2312 Eyni zamanda qırmızı tülkü kimi hiyləgər,
Erkək dəvə kimi qisasçı və kinli olmalıdır.
2313 Özünü sağsağandan ehtiyatlı tutmalı,
Qaya quzğunu kimi gözü uzaqlarda olmalıdır.
2314 Aslan kimi həmiyyətə böyük əhəmiyyət verməli,
Bayquş kimi gecələr yatmamalıdır.
2315 İnsan bu keyfiyyətlərlə hərbiçi ola bilər,
Hərbiçi, həm də yararlı hərbçi ola bilər.
2316 Hərbiçi həmişə silah daşıyan adamdır,
O, düşməni vuraraq zəfər qazanar.
2317 Onun duz-çörəyi bol olmadı,
Atı, paltarı, silahı da buna uyğun olmalıdır.
2318 Adamı duz-çörək, yemək-içmək məşhur edər,
Bu həyatın mübarizəsi yemək-içmək üstədir".
2319 İladan olan məşhur adam nə deyir, eşit:
"Ey xoşbəxt insan, duz-çörəyin bol olsun.
2320 Şan-şöhrət istəsən, duz-çörək ver,
Yaşamaq istəsən, yenə onu təkrar elə.
2321 İnsanpərvər, etibarlı, səxavətli adama
Əsgərlər duz-çörək haqqını ödəyərlər.



2322 Böyüklük arzu etsən, yemək-içmək ver,
Uzun ömür də onunla əldə edilər.
2323 İşdə müvəffəqiyyət, səfərdə uğur qazanmaq üçün
Sərkərdədə bu bir neçə məziyyət olmalıdır.
2324 Sözlər doğru, etibarlı olmalıdır,
Böyüklər yalançı olsalar, xalq onlara inanmaz.
2325 İkincisi, səxavətli, comərd olmaqdır,
Almağa alışanlar xəsisdən uzaq qaçarlar.
2326 Üçüncüsü, cəsurluq, köksü qalxan olmaqdır,
Qorxaq adam yağını görcək xəstələnib yatağa düşər.
2327 Dördüncüsü, hiylə və al bilməkdir,
Hiylə ilə aslanı da ram etmək mümkündür.
2328 Orduları yarıb-keçmək üçün səbatlı,
Əsgəri coşdurmaq üçün qərarlı olmalıdır.
2329 Sərkərdə bu məziyyətlərə sahib olsa,
Düşməni məğlub edər, şöhrətini məhv edər.
2330 Qoşuna belə bir sərkərdə başçılıq etsə,
Yağıya həmişə qalib gələr.
2331 Sərkərdə düşmənlə üz-üzə gələndə
Həmişə ayıq olmalı, yatmamalıdır.
2332 Çox adama lüzum yoxdur, əsgər seçmə,
Onun silahı-sursatı da tam olmalıdır.
2334 Təcrübəli bir hərbiçi demişdir ki,
On iki minlik qoşun da böyük qüvvədir.
2335 Ordular yenmiş qəhrəman adam isə
"Mənim üçün dörd min əsgər tam bir ordudur", – demişdir.
2336 Qələbəlik qoşun yayılanda içindən qarışar,
Nizama salmaq mümkün olmaz, vəziyyət pisləşər.
2337 Şöhrətli, cəsur və qəhrəman igid demişdir:
Orduda seçmə və əla silahlı igidlər gərəkdir".
2338 Dünyaca məşhur bir hərbçinin sözünü eşit,
Dinlə, ona uyğun hərəkət elə:
2339 "Çox əsgər istəmə, seçmə əsgər istə,
Əsgərin seçmə və tam təchizatlı olsun.
2340 Az saylı bir ordu çoxdan yaxşıdır,
Çoxları iri ordularla məğlub olmuşlar.
2341 Sərkərdə düşmənə hücum edərkən,
Əsas qüvvələri ətrafına toplayır.

2342 Avanqardı və kəşfiyyat dəstələrini ayırmalı,
Sayıq olmalı, gözü-qulağı uzaqlara dikilməlidir.
2343 Kəşfiyyatçılar yağının avanqardı ilə rastlaşdıqda
Lazım olsa, geri dönüb hücum etməlidirlər.
2344 Təlim və qayda üzrə alayını düzməlidir,
Heç kəs nə geri qalmalı, nə irəli keçməlidir.
2345 Ayıq-sayıq növbətçilər qoymalıdır,
Durulacaq yerləri təsbit etməlidir.
2346 Bayraqdarlar hərəkatı dəqiq izləməlidir,
Bütün əsgərlər düşmənə hücum etməlidir.
2347 Qərargah üçün yaxşı yer seçməli,
Əsgəri toplu halında saxlamalıdır.
2348 Sərkərdə çox ayıq-sayıq olmalıdır,
Etinasız olsa, düşməndən zərər görər.
2349 Avanqardla düşmənə lap yaxınlaşmalıdır,
Qərargahı otlu-sulu yerdə qurmalıdır.
2350 Əsgərini qorumalı, dil tutmalıdır,
Dildən düşmənin sayını öyrənməlidir.
2351 Hər şeydən əvvəl dil tutmağa çalışmalı,
Düşmənin vəziyyətini aydınlaşdırmalıdır.
2352 Aldığı məlumata görə işini qurmalıdır,
Onda yağının boynu kəsilər, yaxud başı əzilər.
2352 Belə hərəkət etmək ayıq-sayıqlıq deməkdir,
Savaşı ehtiyatlı tərəf qazanar.
2354 Sayıq bəyin əsgəri əjdaha rəhbərliyi altında
Aslana minmiş qılınclı-qamçılı ordıya bənzər.
2355 Yağını vurmaq üçün bu iki silah lazımdır,
Onlar düşmənə ölüm gətirər.
2356 Ən əsas məsələ hiylə və aldır,
Hiylə ilə yağının bənizini al etməlidir.
2357 İkincisi, ehtiyat və sayıqlıqdır,
Döyüşdə ehtiyatlı tərəf udar.
2358 Döyüşdə kim ehtiyatlı və sayıq olsa,
Düşməni də o, fəlakətə uğradar.
2359 Əgər düşmənin əsgəri çox, səninki azsa,
Tələsmə, ona uyğun tədbir gör.
2360 Danışıq imkanı varsa, danışıq apar,
Yoxsa zirehini gey, onunla tutaş.



2361 Düşməni rahat qoyma, gecə basqını təşkil et,
Qaranlıqda əsgərinin azlığı görünməz.
2362 Qələbə çalmağa imkan yoxdursa,
Elçi göndər, sülh istə.
2363 Sözlə aldat, sülh elə, özünü qoru,
Döyüşməyə tələsmə, bu qədər.
2364 Belə olmasa, düşmən razılaşmasa,
İsrarla döyüşmək istəsə,
2365 İşi uzatma, əsgəri yığ və döyüş,
Əsgərə mal payla, coşdur, təşviq et.
2366 Döyüşü uzatsan, düşmənin ağlı başına gələr,
Sənin gücünün dərəcəsini anlayar.
2367 Düşmənə qalib gəlmiş, sınaqlardan çıxmış,
Təcrübəli igid nə deyir, dinlə:
2368 – Uzaqdan yağının şöhrəti böyük görünür,
Əyan olduqda onun şöhrəti kiçilir.
2369 Düşmənə yalın hücum et, sursatın ələ keçməsin,
İşi uzatsan, uduzarsan, ayağını möhkəm tut.
2370 Əsgərin bir qismini pusquya qoy,
Piyada oxatanları işə sal, özün öndən yürü.
2371 Düşmən qabağına təcrübəli igidləri çıxar,
Qoy əsgərləri onlar aparsınlar.
2372 Döyüşdə saç ağardanlar yaxşı vuruşurlar,
Onlar əsl hərbiçidirlər, bu işi yaxşı bilirlər.
2373 Gənc və naşı igidlər çox odlu olurlar,
Ancaq üzləri dönsə, bu oddan əsər qalmır.
2374 Önə və arxaya etibarlı adamlar qoy,
Bir hissəsini də sağa və sola yerləşdir.
2375 Əsgərlər yaxınlaşıb üz-üzə gələndə,
Hər kəs nərə çəkib qabağındakı ilə vuruşmalıdır.
2376 Əvvəlcə uzaqdan oxla vuruşmalı,
Üz-üzə gələndə süngü ilə savaşmalı.
2377 Cərgələr pozulanda qılıncla, balta ilə vuruş,
Dişlə-dırnaqla hücum et, yaxasından yapış.
2378 Tab et, düşmənə heç vaxt arxa çevirmə,
Ya öldür, ya da vuruşaraq orada öl".
2379 Eşit, gör düşmən içinə girən ər nə deyir:
"Tab et, tab edən düşmənini əzər.

2380 Gəlin qızların sevincli anları zifaf gecələridir,
Cəsur, igid kişilərin iftixar günləri hərbdir.
2381 Məğrur igid ordusunu sürətlə çəkər,
Şahin quşa hücum edirmiş kimi cumar, qan tökər.
2382 İgid, qəhrəman, düşməni görcək tozu dumana qatar,
Başqalarına imkan verməz, özü hər tərəfə atılar.
2383 İgid, qəhrəman, əsgər görəndə aslana dönər,
Cumar, vuruşar, ya öldürər, ya ölər.
2384 O, düşməni gördükdə üzü qızarar,
Düşmənlə qarşılaşdıqda al qaraya dönər.
2385 At, zirehlər qızıl rəngə çalar,
Qırmızı od kimi yanan yanaqlar yamyaşıl olar.
2386 Düşmən atla sənə hücum çəksə,
Döz, arxa çevirmə, hücum boşa çıxar.
2387 Düşmən hərəkət etsə, sən də hərəkət et,
Hazır ol, onun hər hərəkətini qarşıla.
2388 Əgər düşmən qaçmağa başlasa, onu təqib et,
Əsir almağa çalış, əgər belə etməsən
2389 Düşməni əzən igidlərin cərgəsi pozulsa,
O dönüb təkrar hücum edər, qalib gələr.
2390 Düşmən qaçsa, onu ehtiyatla qov, uzağa getmə,
Çünki düşmən geri dönsə qaça bilməzsən.
2391 Düşmən ümidsizliyə düşsə, ölümü gözə alar,
Ona görə də bütün gücü ilə vuruşar.
2392 Ey oğul, belə olduqda özünü yaxşı qoru,
Ya qoru, ya da hər şeyi gözə al.
2393 İnsan etinasız olsa, yeriyərkən də ölər,
Etinasız olmasa, diləyinə yetər".
2394 Təcrübəli adam mənə belə dedi:
"Sınanmış söz, sözlərin başıdır.
2395 Düşmən qaçsa, qovub çox uzağa getmə,
Çox uzağa gedən doyunca qamçı yeyər.
2396 Su odu söndürəndə, od bir də alovlanmaz,
Düşmən də dağılsa bir də toplanmaz.
2397 Ümidsizliyə düşənlər ölümü axtararlar,
Ölümü istəyənlər əvvəl öldürər, sonra ölərlər.
2398 İgidlik göstərənə dərhal mükafat vermək,
Bununla onun üzünü güldürmək lazımdır.



2399 Əsiri tutanı öymək və mükafat vermək lazımdır,
Qoy o da mükafatla öyünsün.
2400 Pis adam təriflə yaxşı insana çevrilir,
Yaxşını öysən, gör necə olar?
2401 Əsgəri öysən, əli ilə aslan tutar,
Atı oxşasan, qaçar, uçan quşa çatar.
2402 Yaralı varsa, baxdır, müalicə elətdir,
Əsir düşən varsa, qurtar, geri al.
2403 Əgər ölən varsa, hörmətlə qaldır,
Arvad-uşaqları varsa, haqlarını ver.
2404 Əsgərlər bunu görəndə sevinirlər,
Savaşda canlarını fəda edirlər.
2405 Dadlı söz, gülər üz, bir də mal verməli,
Bu üç şey insan üçün qaydadır.
2406 Azad və sərbəst adamlar ona qul olarlar,
Bu qul onu sevindirmək üçün canını fəda edər.
2407 Ey hakim, buna bənzər bir söz vardır,
Bunun doğruluğunu sən də təsdiq edərsən.
2408 Onlara güləruz göstər, şirin söz de, mal-mülk ver,
Azad və sərbəst adamlar bu üç şeyin başına yığılar.
2409 Son qulu qızıl və gümüşlə alma,
Bu üç şeyi ver, kimi desən sənə gətirsin.
2410 Ordu sərkərdəsi belə olmalıdır,
Orduya beləsi başçılıq etsə yaxşıdır.
2411 Sən qızılını, gümüşünü, malını payla,
Nə qədər qızıl versən, onlar da o qədər
çox fədakarlıq edərlər.
2412 Xidmətçilər bu üç şey üçün ona qul olurlar,
Bəylər buna görə hərəkət etsin, bu, hər şeyin təməlidir.
2413 Əgər belə bir sərkərdə tapılsa,
İşini təhlükəsiz başa vurar.
2414 Sərkərdə belə olsa, işi düz gedər,
Özü də həmişə təriflənər.
2415 Yaxşı vəzir istəsən, elə olmalıdır,
Yaxşı sərkərdə istəsən, belə olmalıdır.
2416 Belə bir adama bəylər inana bilərlər,
Bəy onun əliylə arzusuna çatar".

2417 Öydülmüş yenə dedi: – Ey müdrik Elik,
Bu iki böyük işdir, ululuğun adıdır.
2418 Biri vəzirlik, ikincisi sərkərdəlikdir,
Onlardan biri qılınc tutar, o biri qələm.
2419 Ölkənin cilovu bu iki əldədir,
Bu ikisi əl-ələ versə, cilovu kim qopara bilər?
2420 Bunlar çox seçilmiş adamlar olmalıdır,
Əgər bəyə qarşı çıxsalar, başları gedər.
2421 Faydalı olsalar, ölkəyə xeyirləri dəyər,
Üsyan etsələr, ölkəyə çox ziyan vurarlar.
2422 Bəy insanların gözü olduğu kimi,
Bu iki şəxs də xalqın yaxşısı olmalıdır.
2423 Bunlardan ölkəyə çox xeyir dəyər,
Bəy də onların sayəsində rahatlığa qovuşar.
2424 Ölkə idarə edən hakim nə deyir, eşit,
Hakim sözünü tapsan, aş kimi ye:
2425 "Qılıncla almışdır bu eli alan,
Qələmlə tutmuşdur, bu eli tutan.
2426 Qılıncla ölkə tutmaq asandır,
Qələmsiz onu əldə saxlamaq çətindir.
2427 Qılınc və qüvvə ilə ölkə tutmaq olar,
Ona uzun zaman zorla, intiqamla saxlamaq olmaz.
2428 Hansı şəhər və əyalət qələmlə idarə edilsə,
Orda hamı öz diləyinə yetər".

* * *

2429 Ey Elik, mənim bildiklərim bunlardır,
Soruşdunuz, ərz etdim.

ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2430 Elik dedi: – Bunu gözəlcə anladım,
Bir sözüm də var, ey şöhrətli insan.
2431 İndi mənə fikirləşib de görüm,
Ulu xas hacib necə olmalıdır ki,



2432 O digər hacıblərə başçı olsun,
Sədaqətlə bəyə can fəda etsin?
2433 Həm bəy, həm ölkə ona inansın,
Xalqın dili ona duaçı olsun?

* * *

2434 Elik dedi: – Bu sözümə cavab ver,
Bunu da izah et, məni sevindir.

## XXXI

## ÖYDÜLMÜŞ ELİKƏ ULU XAS HACİBİN NECƏ İNSAN OLMASININ GƏRƏKLİYİNİ BƏYAN EDİR

2435 Öydülmüş sözə başlayıb açdı dilini:
– Elik şad-xürrəm min yaşasın.
2436 Ulu xas hacib etibarlı, dürüst, doğrucul,
Üstəlik yaxşı və dini bütöv şəxs olmalıdır.
2437 Əsli-soyu gərək tər-təmiz olsun ki,
Xalqa günəş və ay kimi doğsun.
2438 Soylu adamlar xeyirxah olurlar,
Xeyirxah adam xalqa yaxşılıq istər.
2439 Xeyirxah adamlardan xeyirxahlıq gələr,
Yemək, içmək, geyim və minik xüsusunda.
2440 Əməli yaxşı olan sözünü ölçüb-biçib söylər,
Sözünü ölçüb-biçənin işi çox təmiz olar.
2441 Gözütox, abırlı, nəzakətli olmalıdır,
Zəkalı və min cür biliyə sahib olmalıdır.
2442 Gözütox adam vəzifə başında rüşvət almaz,
Hacib rüşvət alsa, bəy gülünc vəziyyətə düşər.
2443 Yoluna düşən işi rüşvət pozar,
Rüşvət bişmiş işi çiy edər.
2444 Hacib abırlı, təmiz, nəzakətli olsa,
Ondan işdə və sözdə xeyir gələr.
2445 Həyalı adam pis iş tutmaz,
Yararsıza yaxınlaşmaz, qabalıq etməz.

2446 Nəzakətli adam səadəti həzm edər,
Nəzakətli adam sərvətə layiqdir.
2447 İnsan zəkalı olsa, sərvətə möhtac qalmaz,
Bilikli olsa, işində heç vaxt yanılmaz.
2448 Bilikli və böyük adam çox gözəl söyləmiş:
"Qismətinə ən çox qovuşan bilikli adamdır.
2449 Bəylərin işini görməyə bilikli adam gərəkdir.
Biliksiz adam heç bir şeyə yaramaz.
2450 Bilikdən nəsibini almamış adama
Diri demək düz deyil, onu ölü san.
2451 İnsan biliklə böyüyər, şöhrətə çatar,
Hamıdan üstün olar, hər işi bacarar.
2452 Biliksiz adam boş bir qəlibdir,
Bilikli adamın yeri göydən də ucadır.
2453 Hacib işində sayıq və anlayışlı olmalıdır,
Oyaq adamın boyağı tutar.
2454 Ağıllı olmaq çox faydalıdır,
Bütün yaxşılıqlarda ağılın payı var.
2455 Ağılsız adam meyvəsiz ağacdır,
Ac adam meyvəsiz ağacı neyləsin?
2456 Ancaq ağıllı adamlar hər iki dünyanı qazanar,
Əsilliyin vəsfini ancaq ağıllı adam bilər.
2457 Ağıllı və bilikli adam – adamdır,
O, insanların yaxşısı, xalqın gözüdür.
2458 Hacibin üzü, qiyafəsi, saç-saqqalı səliqəli,
Səsi gur, sözü aydın olmalıdır.
2459 Üzü və *qiyafəsinin gözəlliyi onu sevdirər*,
Hüzura girib-çıxanda mərdanəliyi xoş təsir buraxar.
2460 Saçı-saqqalı səliqəli kişi həşəmətli olur,
İnsan həşəmətlə hörmət qazanar.
2461 Hacib imanlı və dindar olmalıdır,
Təbiəti təmizsə, hərəkəti də təmiz olar.
2462 İman sahibi, təmiz, dindar adam usanmaz,
Həmişə başqalarına xidmət edər.
2463 İmanlı insan başqalarının qayğısını çəkər,
İnsanların ən yaxşısı imanlı adamlardır.
2464 Hacib həmişə göz qabağında olduğu üçün
Onun çöhrəsi gözə gözəl görünməlidir.



2465 Bu gözəl üzü gördükdə insanın üzü gülər,
Qəlbi açılar, ürəyi zövq alar.
2466 Bilikli adam buna bənzər bir söz deyib,
Bilikli sözünə əməl et, ey xoşəxlaq insan.
2467 İnsanda bu üz gözəlliyi çox gözəl şeydir,
Üz gözəlliyi qarşısında gözlər parıldayır.
2468 Qumral gözəlinə bax, onu özünə fal tut,
İşin düz gətirər, başqa lafa qulaq asma.
2469 Hacib könül sahibi və ağıllı olmalıdır,
Bir də sakit təbiətli olsa, əla olar.
2470 Könül sahibi verdiyi sözü unutmaz,
Könül sahibi olmayan sözünü tutmaz.
2471 Könül olmasa insan dost seçə bilməz,
Ağıl olmasa iş görmək mümkün deyil,
2472 Könülsüz insan quru bir qəlbdir,
İnsan hər işi könüllə görməlidir.
2473 O çox ağıllı, təvazökar olmalıdır,
Kasıb, dul və yetimlərə mərhəmətli qəlb gərəkdir.
2474 Müdrik olmalı, qanunu yaxşı bilməlidir,
Dünyanı bəzəyən şeylər zəkanın məhsuludur.
2475 Hamıya qarşı sadə və təvazökar olmalıdır,
Dili yumşaq, şəkərdən dadlı olmalıdır.
2476 İnsanlara açıq və gülər üz göstərməlidir,
Başqaları ilə xoş rəftar etməlidir".
2477 Təvazökar adam nə demiş, eşit:
"Ey boş insan, könlünü alçaq, dilini qısa tut,
2478 İnsan təvazökar olsa, səadət onu tapar,
Hamı gülərüz, dadlı söz ətrafına yığışar.
2479 Gülərüzə, dadlı sözə insan alışır,
Kimə alışsa, ona qul-kölə olur.
2480 Hacib səbirli və özünə hakim olmalıdır,
Gözünü gözləməli, dilini kəsməlidir.
2481 Qulağı deşik, ağlı-biliyi geniş,
Hərəkəti doğru, sözü və işi bir olmalıdır.
2482 Ərdəm və qələm əhli olmalıdır,
Hər işi biliklə görməlidir.
2483 Ulu hacib işində müvəffəq olmaq üçün,
Bu ərdəm və biliklərin hamısına sahib olmalıdır.

2484 Fikir versən, xidmətlər arasında
Ən incə xidmət haciblikdir.
2485 Qabağa düşüb yol göstərmək üçün
Hacibə bu bir neçə keyfiyyət lazımdır".
2486 Buna bənzər bir şair sözü var,
Şair sözü biliksizə gözdür:
2487 "Haciblik üçün on şey lazımdır.
İti göz, dəlik qulaq, geniş qəlb,
2488 Üz, qiyafə, boy, dil, anlayış, ağıl, bilik,
Tövr və hərəkəti də bunlara uyğun olmalıdır.
2489 Elik çox-çox yaşasın,
Lakin bəyin görən gözü hacibdir.
2490 Qanunu, adət-ənənəni yerinə yetirmək incə şeydir,
Ulu hacib bunu tənzim edər, yolu, qapıları açar".
2491 Bir alimin buna bənzər bir sözü var,
Eşidən bu sözə könül versin və mənimsəsin:
2492 "Bu haciblik işi çox böyük işdir,
Bunu ancaq çox yetkin adam bacarar.
2493 Hacibin, yaxud bəyin işi olsun, böyük-kiçik olsun,
O bütün şikayətlərə qulaq asmalıdır.
2494 Xəzinədar və ya katib kimi məmurlar
Dərzilər və ya çəkməçilərlə münasibətdədir.
2495 Xarici elçilərin qəbuluna, yola salınmasına,
Onlara lazımi hədiyyələr verilməsinə o baxır.
2496 Elçilərin iqamət və iaşəsini təyin edir,
Hədiyyəli və hədiyyəsizlərin çarəsinə baxır.
2497 Səfər vaxtı adamlara bələdçilik edir,
Mərasim və adətin düzgünlüyünə göz qoyur.
2498 Yoxsul, dul və yetimlərin diləklərini dinləyir,
Bunları bəyə ərz edir.
2499 Haqsızlığa uğramışları qəbul etməli,
Onların haqqını qorumalı, yol göstərməlidir.
2500 Bu səpkidən bir çox işləri,
Şübhəsiz, hacib həll etməlidir.
2501 Xaricdə də daxildə çatışmazlıq görsə,
Mane olmalı, ortadan qaldırmalıdır.
2502 Bu işlərdə bütün kömək ondandır,
Əgər işlər pozulsa, günahkar odur".



2503 Ey Elik, haciblər bir çox şeydə ehtiyatlı olmalı,
Bu xüsusda çox əmək sərf etməlidirlər.
2504 Birincisi, hacib bəyin sözündən çıxmamalı,
İkincisi, həvəslərinə ağılla yüyən vurmalıdır.
2505 Üçüncüsü, hüzurda sərvaxt olmalı,
Ağzına gələn hər sözü söyləməməlidir.
2506 Rüşvət almamalı, öhdəsinə düşən işləri görməli,
Uzaqlaşmış adamları bəyinə yaxınlaşdırmalıdır.
2507 Ey alim, əgər bir adamda bu iki şey varsa,
Ona iş tapşırma, yaxınlıq vermə:
2508 Bunlardan biri yalançılıqdır,
İkincisi, adamı doğru yoldan çıxaran pis xasiyyətdir.
2509 Bu iki xasiyyət kimdə varsa,
Onu özünə yaxın qoyma, ey Elik.
2510 Daha üç şey də var ki,
Xidmətçinin başını yeyə bilər:
2511 Birincisi eşitdiyin hər şeyi faş etmək,
İkincisi, görməməli şeyə göz yummaqdır.
2512 Üçüncüsü, özünə hakim olmalı,
Doğru yaşamalıdır, onda ömrü səadətlə keçər.
2513 Hakim və alim nə demiş, dinlə,
Buna əməl etsən, sənin üçün yaxşı olar:
2514 "Başını qorumaq istəsən, bəyin sözünü sən demə,
Dövlət cinayəti işləyərək öz başını yemə.
2515 Cahil adam ölkəyə qarşı suç işləsə, başı gedər,
Danışanda suç işləsə, dişi qırılar.
2516 Çox görmüşəm, ölkəyə qarşı suç işləyən
Ləyaqətsizlərin boynu vurulmuşdur.
2517 Çox eşitmişəm, dil ehtiyatsız danışmış,
Könlün sirrini faş etmiş, danışanı yaralamışdır".
2518 Alim və hakimlər belə demişlər:
"Özünə hakim olmayan adam öz başını yeyər.
2519 Haciblər özlərini çox qorumalıdırlar,
Hüzurda gözlərinə və sözlərinə diqqət etməlidirlər.
2520 Zamanı gəlməsə, içəri girməməlidir,
Soruşulmasa danışmamalıdır".
2521 Ağıllı insan nə demişdir, dinlə,
Ağıllının dili məna yolunu açıb:

2522 "Mələklərə *vaxtı gələndə* üzünü göstər,
Soruşduqları vaxt danış, ancaq suala cavab ver.
2523 Hər şeyin öz vaxtı və zamanı var,
Vaxt gələndə iki göz bunu görür.
2524 Bütün ərdəm və biliklər belə olmalıdır,
Bu keyfiyyətlərə malik ulu hacib vəzifəsinə başlasın"

* * *

2525 Ey Elik, mənim bildiklərim bunlardır,
Soruşulduğu üçün ərz etdim.

### ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2526 Elik dedi: – Bunları dinlədim, anladım,
Səndən bir şey də soruşacağam.
2527 Mənə de görüm qapıçıbaşı
Necə bir adam olmalıdır?

## XXXII

## ÖYDÜLMÜŞ ELİKƏ QAPIÇIBAŞININ NECƏ OLMAQ LAZIM GƏLDİYİNİ BƏYAN EDİR

2528 Öydülmüş cavab verib dedi: – Ey Elik,
Rahatlıq içində uzun zaman yaşa, ey xoşqılıq.
2529 Qapıçıbaşı çox sədaqətli olmalıdır,
İşini can-başla yerinə yetirməlidir.
2530 Qaranlıq gecəni xidmət qapısında ağartmalı,
Parlaq günəşi həmin qapıda batırmalıdır.
2531 *Xidmət edərkən* qayda-qanunu, təlimatı bilməli,
Təbiəti, tövr və hərəkəti mülayim olmalıdır.
2532 Duz-çörəkli, özü də comərd olmalı,
Altun-gümüş verərək ətrafına adamlar yığmalıdır.



2533 Gecə vaxtı yatmazdan əvvəl
Saray növbətçilərini təyin etməlidir.
2534 Başqa yerdən olan yad keşikçiləri öyrənməli,
Onların qoçaqlarını işə götürməlidir.
2535 Saray qapısını gözü önündə bağlatdırdıqda
O günün xidməti başa çatmış olur.
2536 Səhər qalxıb qapıda vəzifəsinə başlamalı,
Axşam-səhər keşikçiləri təyin etməlidir.
2537 Qəbul vaxtı çatanda tabeliyindəkiləri yığaraq
Onlarla birlikdə hüzura çıxmalıdır.
2538 Hüzurda çox ləngiməməli, görünüb çıxmadı,
Bu zaman qapıda öz yerinə adam qoymalıdır.
2539 Keşikçilər komanda halında hüzura çıxanda
O buna layiq olanlarla-olmayanları nəzərdən keçirməlidir.
2540 Qəbul bitdikdən sonra hansı keşikçinin ərzi varsa,
Onunla təkrar *hüzura* girməlidir.
2541 Onların istədiklərini ərz etməli,
Arzularının yerinə yetməsinə kömək etməlidir.
2542 Onlara hökmdardan qızıl-gümüş qoparmalı,
Vəzifə və rütbəyə təqdim etməlidir.
2543 Bəzi xidmətçilər ürəkdən xidmət edir,
Bəziləri isə boş-boşuna gəzir.
2544 Bəziləri vəzifəsinə uyğun və faydalıdır,
Bəziləri gələcəkdə faydalı ola bilər.
2545 Bunları bəyə bir-bir ərz etməli,
Layiq olanı yüksəltməlidir.
2546 Bəyin təltif və təşəkkür yarlıqlarını şəxsən bildirməli,
Xidmətçilərin qəlbini qızdırmalıdır.
2547 Qapıda oturma və gözləmə yerlərini nizamlamalı,
Elə etməlidir ki, heç kəs açıqda qalmasın.
2548 *Gələn yad və yabançıları qarşılamalı,*
Bu zaman dost-yoldaşa hörmət etməlidir.
2549 Yemək məcməyisi gələndə ona nəzarət etməli,
Münasib olmayan şeylərə mane olmalıdır.
2550 İçki gələndə ona diqqət etməli,
Heç kimin toxunmasına yol verməməlidir.
2551 Yemək gələndə məcməyilərə nəzarət etməli,
Bəyə layiq şəkildə paylanmasını təmin etməlidir.

2552 İçəridə və dışarıda hamıya çatsın deyə
Neçə qab yemək lazım olduğunu bilməlidir.
2553 Bəyin şöhrətini iki şey artırar:
Kənarda – tuğu, içəridə – süfrəsi.
2554 Bu iki şey qapının bəzəyidir,
Onlar bəyə şöhrət gətirər, səadətə yol açar.
2555 Bunlardan biri – azad insan olan ulu hacib,
Biri də ölkənin yararlı qapıçıbaşıdır.
2556 Qapını bu iki şəxs tənzim edər,
Bəyin adı böyüklüklə hər yana yayılar.
2557 Qapıçıbaşı şərabçı, döşəkçi, aşpaz
Və tuğçuları nəzarətdə saxlamalıdır.
2558 Durub evinə gedəndə yar-yoldaşını
Özüylə aparıb yemək verməlidir.
2560 Yeyib-içirdikdən sonra boş yola salmamalı,
Nəyi varsa, onlara bağışlamalıdır.
2561 Ona bir at, bir dəst paltar və silah yetər,
Qalanını başqalarına paylamalıdır.
2562 Yad bir adam xidmətə girsə, qarşılaşmalı,
Ona qalacağı yeri, yoldaşlarını göstərməlidir.
2563 Hüzura çıxmazdan əvvəl onu görməli,
Yeyib-içməsilə, yeri, atı, paltarı ilə maraqlanmalıdır.
2564 Xidmətçilərin kefini soruşmalı,
Ac, tox olmaları ilə maraqlanmalıdır.
2565 Əli darda qalan, aşağı olan varsa,
Kömək etməli, haqqını ödəməlidir.
2566 Əgər xidmətçilərdən biri qapıya, işə gəlməsə,
Nə baş verdiyini soruşmalıdır.
2567 Əgər xəstədirsə, halını soruşmalı,
İşdən yayınırsa, mane olmalıdır.
2568 Bütün bunlar onun bəyə sədaqətini göstərir,
Bunu bəyi razı salmaq üçün etməlidir.
2569 Eşit gör nə deyir xidmət etmiş ər,
Xidmətdə bəyindən təqdir görmüş ər:
2570 "Xidmətçi bəyinə sədaqətli olmalıdır,
Sədaqətli adam ürəkdən xidmət etməlidir.
2571 Sədaqətlə və ürəkdən xidmət edən qul
Bəyliyin təməlini gündən-günə möhkəmləndirir.



2572 Candan xidmət edən öz xeyirini düşünməz,
O ancaq bəyin mənfəəti üçün çalışar.
2573 Əgər tikan faydalısa, mən onun quluyam,
Çiçək faydasızsa, mən onu kökündən qopararam.
2574 Sədaqətli xidmətçinin qiyməti
Fərsiz övladdan daha yüksəkdir.
2575 Faydasız və dəyərsiz adam qardaşın da olsa, uzaqlaş,
Faydalı insanla dost ol, xeyirini gör.
2576 Qapıçıbaşının sözü dadlı, özü həlim,
Könlü açıq, gülərüz olmalıdır.
2577 Qaşqabaqlı üz, acı söz insanı soyudar,
Bunun təsiri ömür boyu könüldən getməz.
2578 İndi buna bənzər bu beyti oxu,
Sözü ilə birlikdə mənası də anlaşılar:
2579 – İnsan sözlə söyər, dillə acılayarsa
Bu, sümüyə – sızı, könülə – od qoyar.
2580 Vurulan qamçı yarası tez sağalar, keçər,
Dil acısı illərlə sızıldayar.
2581 Əgər bəylər atlanaraq səfərə –
Ova, cıdıra və ya gəzməyə çıxsalar:
2582 Bəyini diqqətlə qorumalı,
Başına bir iş gəlməsinin qabağını almalıdır.
2583 Bəylərin başına bir bəla və ya fəlakət
Ov zamanı, səfər vaxtı gələr.
2584 Etibarsız adamları onun yanından uzaqlaşdırmaq,
Şübhəli adamları nəzarətə almaq lazımdır.
2585 Bəyi sevən doğru-dürüst, sədaqətli adamları
Bəyin ətrafına yığmalı, onu qorumalıdır.
2586 Sərkərdə mühafizə alayını təmizləyərkən
Heç kimin geri qalmasına, irəli getməsinə yol verməməlidir.
2587 Kiçik rütbəlilər böyüklər arasına girməməli,
Uzaqda və dışarıda duranlar yaxın gəlməməlidir.
2588 Kimin qapıdakı mövqeyi, yeri nədirsə,
Hərəkət vaxtı da elə olmalıdır, ey böyük.
2589 Qapıçıbaşı olan insan,
Bu cür sadiq olmalıdır, ey ulu.

2590 Qapını qoruyan və bəyin çörəyini yeyib
İşini görən insan belə olmalıdır".

* * *

2591 Mən bunu söylədim Elik eşitdi,
Seçkin ər istəsə bu biliyə dəyər versin.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2592 Elik dedi: – Bunu yaxşı anladım,
Bir söz də soruşum, ona cavab ver,
2593 Şübhəsiz, bilirsən dünya bəyləri
Ölkədən-ölkəyə elçi göndərirlər.
2594 Mənə məlumat ver görüm,
Bir ölkədən o birinə elçi yollayarkən,
2595 Bu elçi necə bir adam olmalıdır ki,
Bəy ona etimad göstərib yollasın?

## XXXIII

## ÖYDÜLMÜŞ ELİKƏ ELÇİ GÖNDƏRMƏK ÜÇÜN NECƏ İNSAN GƏRƏK OLDUĞUNU BƏYAN EDİR

2596 Öydülmüş cavab verib dedi: – Elik
Bu işə çox ciddi fikir verməlidir.
2597 Elçi gərək insanlar arasında seçkin,
Ağıllı, bilikli və ürəkli adam olsun.
2598 Tanrı qulları arasında ən seçkinləri,
Adamların ən yaxşıları elçilər idi[1].
2599 Bir çox işləri elçilər görürlər,
Bir çox nəticələr elçilər vasitəsilə əldə edilir.

[1] Burada söz oyunu var. Elçi əski türkcədə, o cümlədən bu mətndə «yalavac» deməkdir. Bu söz həm elçi (səfir), həm də peyğəmbər mənasını verirdi.



2600 Elçi çox ağıllı və təmkinli,
Sözü düz ifadə etmək üçün bilikli olmalıdır.
2601 Yəni sözün həm içini, həm dışını bilməlidir ki,
İşini müvəffəqiyyətlə yerinə yetirə bilsin.
2602 Dünya bəyi, xalqı idarə edən,
Bilikli və yaxşı insan nə demiş, eşit:
2603 "Ağılda yüksək adamın qiymətini bil,
Bilikli adamı xalqa rəhbər et.
2604 Hansı işdə ağıl təşəbbüskar olsa,
O iş yaxşı nəticə verir, bunu çox sınamışam.
2605 Alim hansı işdə biliyini tətbiq etsə,
O işi həll edir, həyata keçirir.
2606 İnsan ağlı və biliyi ilə işə başlasa,
Girişdiyi hər işdə müvəffəq olar.
2607 Elçi gözü, könlü tox, sədaqətli, etibarlı,
Doğru-dürüst təbiətli bir adam olmalıdır.
2608 Sədaqətli xidmətçi bəyin xeyirini istər,
Bəyin xeyirini istəyən bəyini sevər.
2609 Bil ki, sədaqətli adam bəyinə ürəkdən bağlıdır,
Sənə bağlı adam tapsan, onu bağrına bas.
2610 Sədaqətli xidmətçi insanın bağrı kimidir,
Bağıran daha yaxın, ürək qanı kimidir.
2611 Acgöz adam özünə hakim ola bilməz,
Hərislər elçiliyə layiq deyil.
2612 Gözütox kasıb olsa belə varlı sayılar,
İnsan səbat etsə, hər işdə müvəffəq olar.
2613 Həris adam tamahkar olar, bu pisdir,
Çünki tamahkara dilənçi deyərlər.
2614 Gözütox adam nə demiş, eşit.
– Gözütox adam ən varlı adamdır.
2615 Acgözlülük kimi kasıb etmişsə,
Dünya onu nə qədər doyursa da varlanmaz.
2616 Tamahkarlığın əsiri olanlar
Bu əsirlikdən ancaq ölümlə xilas olarlar.
2617 Acgözə öyüd və nəsihət verən
Bilikli adam çox gözəl söyləmişdir:
2618 – Doğrudan da varlı olmaq istəsən,
Şübhəsiz, könül zənginliyi arzula, ey şanlı igid.

2619 Gözü tox olan, qul olsa belə bəydir,
Həris adamın bəyliyindənsə qul olmaq yaxşıdır.
2620 Hansı bəy hərisdirsə, o quldur,
Hansı qulun gözü toxdursa, o, könlü zəngin bəydir.
2621 Elçi abırlı, sakit, nəzakətli olmalı,
Helmlə bərabər elmli olmalıdır.
2622 Abırsız adam acgöz və bayağı olar,
Həyalı adam doğru hərəkət edər.
2623 Sakit təbiətli insana həlim deyərlər,
Nəzakətli adama hamı hörmət edər.
2624 İnsanda zəka ilə birlikdə bilik də olsa,
O, biliyi ilə hər şeyə müvəffəq olar".
2625 Bu beyti oxu, nə deyir, dinlə:
"Hər işə biliklə başla, biliklə hərəkət et.
2626 İşi ağılla anla, bilik ilə bil,
Könlün şad olsun, səadətlə yaşa.
2627 İnsan arzusuna zəka ilə çatar,
Əvvəlcə bilik qazan, sonra işə giriş.
2628 Elçi zəkalı və savadlı olmalıdır,
Savadlı adam zəkalı olar.
2629 Yazsa, oxusa, başqasının sözünü dinləsə,
Bu şəkildə insan alim olar.
2630 O, hər cür hünəri mükəmməl bilməlidir,
Bu fəzilətlər insanın üzünü ağardır.
2631 O, çox kitab oxumalı, gözəl danışmalı,
Şeiri başa düşməli, özü də şeir yazmalıdır.
2632 Nücumu, tibbi bilməli, yuxu yozmağı bacarmalı,
Yozması sözü ilə çin olmalıdır.
2633 Hesabı və həndəsəni bilməli,
Rəqəmlərin əslini, sahə ölçülərini bilməli,
2634 Bundan başqa, yaxşı nərd və şahmat oynamalı,
Rəqiblərini möhkəmcə sıxışdırmalıdır.
2635 Çövkən oyununda mahir olmalı, yaxşı ox atmalı,
Quşçuluq və ovçuluqda üstün gəlməlidir.
2636 Bütün dillərdə danışa bilməli,
Bütün yazıları yaza bilməlidir.
2637 Elçiliyə bütün bu qabiliyyətlər gərəkdir,
Belə elçi işində uğur qazanar.



2638 Elçi zəkalı, alim və sayıq olsa,
Xoş qarşılanar, bəyinə xeyir verər.
2639 Elçi pis, qaba və boş olsa,
Şübhəsiz, bəyin etibarı itər.
2640 Elçi gedəcək adam, necə olmalıdır,
Hər cür işə ürəklə yanaşmalıdır.
2641 Neçə ərdəmlilərlə qarşılaşsa da,
O, rəqiblərini məğlub etməli, özünü saydırmalıdır.
2642 O, hər cür adamın sözünü dinləməli, anlamalı,
Ancaq bunu üzə vurmamalıdır.
2643 Elçi hər cür ərdəmə sahib olsa,
Getdiyi ölkədə bəyinin adını yüksəldər".
2644 Bu işləri bilən Kök Ayuk nə deyir eşit,
Bu sözü anlamayan adamın ağlı yoxdur:
2645 "Ərdəmli adamın adı hər yana yayılar,
Ərdəmsiz adamın adı qarıyıb gedər.
2646 İnsan başqasından hünərlə üstündür,
Hünəri çox olan uçarlar kimi yüksələr.
2647 Fəzilətlə əlini uzadan adam
Uca dağların başını əyib yerə endirər.
2648 O, söz anlayan, hazırcavab olmalıdır ki,
Suallara düzgün cavab verə bilsin.
2649 O, şərab içməməli, nəfsi bütöv olmalıdır,
Nəfsi bütöv olsa səadətə yetişər.
2650 Bilikli adam şərab içsə, biliksiz olar,
Biliksiz üstəlik də sərxoş olsa, daha nə qalar?
2651 İçki biliyin və ağlın düşmənidir,
İçkinin adı əslində qovğa və mərəkədir.
2652 İnsan nə qədər bilikli və ağıllı olsa da,
İçkiyə qurşansa, işi pozular.
2653 Nə qədər abırlı, nəzakətli, xoş təbiətli olsa da,
İçki içən insan qabalaşar.
2654 İnsan öz həyasını, ağlını, biliyini,
Təəssüf ki, bu pis içkiyə qurban edir, ey yumşaq insan.
2655 İçki içmə, yoxsa səadətin əlindən çıxar,
İçki içənin adı dəliyə, axmağa çıxar.
2656 Şərab mədəyə daxil olub sözü bayıra çıxarar,
Bu çıxan söz də təkrar insanı yandırar".

[2657] Bu beyti söyləyən nə demiş eşit,
Oxusan onun içini-çölünü anlarsan:
[2658] "Əgər sərxoşluq şərabını içsən,
Könlünün sirrini açar, içindəkiləri faş edərsən.
[2659] Bilikli adam içki içsə, biliksiz olar,
Biliksiz adam içki içsə, kiçik uşağa dönər.
[2660] Elçi tuti dilli və könül sahibi,
Sözlə usta, ağılda üstün olmalıdır.
[2661] Tuti dillilər hər yerdə yaxşı qəbul edilirlər,
Sözdə usta adam işi də yaxşı yarıdır.
[2662] Hafizəsi güclü olmalı, sözü unutmamalı,
Necə söz eşitsə onu yadda saxlamağı bacarmalıdır.
[2663] Üzü gözəl, yaraşıqlı, saç-saqqalı səliqəli,
Boy-buxunu da seçkin olmalıdır.
[2664] Elçi himmətli, mərd olmalıdır,
İnsanın qiyməti bu iki şeylə ölçülür.
[2665] Sözü yumşaq, qənd kimi şirin olmalıdır,
Şirin söz kiçik-böyük – hamını yumşaldır.
[2666] Elçinin işi sözlə keçər,
Sözü xoş olsa arzusuna çatar.
[2667] Dövlətli hakim belə bir adam tapsa,
Onu elçi kimi seçə bilər.
[2668] İstər yad ellərə, istər yaxına – öz adamlarına
Onu elçi kimi göndərə bilər".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

[2669] Elik dedi: – Dinlədim və anladım,
Bir sözüm də var, ona cavab ver.
[2670] Sən mənə fikrini söylə,
Mən sənin haqqını ödəyim.
[2671] Ey ağıllı, bəs katib necə olmalıdır ki,
Bəy ona inanıb yazı yazdırsın?



# XXXIV

## ÖYDÜLMÜŞ ELİKƏ KATİBİN NECƏ OLMASINI BƏYAN EDİR

[2672] Öydülmüş cavabında söylədi: – Elik
Bu işə dərindən yetirsin bilik.
[2673] Öydülmüş davamla söylədi: – Ey bəy,
Bunu izah edim öz bildiyim tək.
[2674] Nə qədər çox bilik bilsə bəy özü,
Bir katib lazımdır yazmağa sözü.
[2675] Katibə sirləri söyləmək gərək,
Az yaxud çox olsun, o, bunları gizli saxlamalıdır.
[2676] Bu sirlərə vaqif olan insan
Dürüst və dininə bağlı olmalıdır.
[2677] Katib sirri saxlaya bilməsə,
Bəyin sirri faş olar, bu da katibin məhvinə səbəb olar.
[2678] Bəylər sözlərini necə gizləsələr də,
Onları iki adama deməyə məcburdurlar.
[2679] Bunlardan biri katib, biri vəzirdir,
Onlara sirri açmağa dəyər.
[2680] Bu iki adama sirri açmaq,
Sonra da nazlarını çəkmək gərəkdir.
[2681] Bütün sirlər bu iki adamda olur,
Sirri qorumasalar, öz işlərini pozarlar.
[2682] Ötükən bəyi çox gözəl söyləmiş,
Sözlərin yaxşısını sənə dili ilə çatdırmışdır.
[2683] Ey bəylərin etimadını qazanmış insan,
Sirri saxla, yoxsa başını bədəndə saxlaya bilməzsən.
[2684] Hesab et ki, ağız bir hindir,
Söz oradan çıxsa səhər yelinə dönər.
[2685] Dünyaya yayılar, yığmaq olmaz,
Onu el eşidər, ört-basdır etmək mümkün olmaz.
[2686] Ağızdan bəzən od, bəzən su çıxar,
Bunlardan biri qurar, biri yıxar.
[2687] Lüzumsuz söz yanar od kimidir,
Ağzından çıxarma, özünü yandırar.

2688 Xoş söz isə su kimidir,
Haraya axsa, orada gül bitər.
2689 Ey mərd, tanınmış bilikli hakim,
*Könül öz sirrini möhkəm saxlamalıdır.*
2690 Bu beyti oxu, gör nə deyir:
"Könül sirrini gizlə, ey könlümü doyuran.
2691 Könül sirrini gizlə, onu söyləmə,
Söyləsən, illərlə peşman olarsan.
2692 Qızıl dil qara başın amansız düşmənidir,
Bu qorxulu düşməni möhkəm tut, rahat yaşa.
2693 Katib bilikli, ağıllı olmalı,
Xətti gözəl, yazısı bəlağətli olmalıdır.
2694 Məktub gözəl xətlə yazılsa, könül açar,
Onu görən oxumaq istər, könlü ovunar.
2695 Gözəl xətt bəlağətlə birləşsə,
Yazılı söz mükəmməl ifadə edilər".
2696 İlalı katib nə deyir, eşit:
"Yazılı söz üslubu mükəmməl bir üslubdur.
2697 Hər cür yaxşı söz kitablardadır,
Yazılmış söz unudulmaz, qalar.
2698 Yazanlar kitabları yazmamış olsaydılar,
Bu hikmət və bilikləri necə öyrənəcəkdik?
2699 Alim və filosoflar yazıb qoymasaydılar,
Bizdən əvvəl gələnlərdən kim bəhs edəcəkdi?
2700 İnsanlar arasında yazı olmasaydı,
Dillə söylənən sözə kim inanardı?
2701 İnsan daim bir yerdən başqa yerə xəbər göndərir,
Yazı olmasa, o fikrini necə ifadə edər?
2702 Yazı çox lüzumlu bir şeydir,
Bəylər ölkə işini yazı ilə tənzim edirlər,
2703 Bəylərin işinə yarayan adamlar
Bu üç növ adamlardır, ey ölkə başçısı:
2704 Biri bilikli, ağıllı və hakim şəxs,
Biri sirr etibar olunan katib.
2705 Üçüncüsü cəsur, mərd və ürəkli igiddir,
Düşmənə və qurda qarşı beləsi lazımdır.



2706 Müdrik, bilikli, ağıllı və hakim şəxs
Məsləhət üçün faydalıdır, ona söz yox.
2707 Ölkənin işini nizamlayan şey yazıdır,
Müdrik adam ölkənin gəlirini yazı ilə təsbit edər.
2708 İgid adamsa əlinə qılınc alaraq
Düşmənin boynunu vurar, onu ayaqlar.
2709 Bu üçü harada bir yerə yığışsa,
İnsan orada öz arzusuna çatar.
2710 Bunlardan kənarda qalanlar isə
Bu üçünə uyaraq yeriyən köşklərdir.
2711 Ölkələri tutmağa qılınc,
Ölkələri idarə etməyə qələm lazımdır.
2712 İnsan ölkəni bilik və ağılla nizama salar,
Bu üç şeydə insan dünyanı duru hala salar.
2713 Bəy ölkəni və qanunları biliklə işlədər,
Bütün işləri ağılla görər.
2714 Qılınc ölkəni zəbt edər, zəfər çalar,
Qələm ölkəni tənzimləyər, xəzinə doldurar.
2715 Qılıncdan qan damcılasa, ölkə alar,
Qələmdən mürəkkəb damcılasa, qızıl gələr.
2716 Həm keçmişdə, həm də gələcəkdə,
Dünyanın bizə verib-verəcəyi bu iki şeydir.
2717 Ey bəy, bu iki şey böyük fəzilətdir,
Ağıllı hökmdar bunu özünə düstur etməlidir".
2718 İndi buna bənzər bir söz var,
*Ey gözəl insan, ona qulaq ver:*
2719 "İnsanın bilikli olması çox böyük fəzilətdir,
İnsanın qılınc oynatması daha üstün fəzilətdir.
2720 Gözəl bir ölkə qılıncla tutular,
Qələmlə tənzimlənər, hər kəs diləyinə qovuşar.
2721 Katib gözütox olmalı, tamahkar olmamalıdır,
Doğru, səmimi və könlü tox olmalıdır.
2722 Gözütox adam mala qarşı etinasız olar,
Belə adam dünya malına aldanmaz.
2723 Tamahkar insan nəfsinə əsir olar,
Ey dolğun ay kimi gözəlüzlüm, onu bağışla.
2724 Tamahkar bəy olsa belə quldurdu,
O, daim alçaq adam olaraq qalır.

2725 Katib həris olsa biliyini pis şeyə sərf edər,
Tamahkarlıqdan yazını təhrif edər.
2726 Qızıl və gümüş görsə, aldanar,
Ağasının başını yeyər, yaxud öz başı gedər.
2727 Sadiq xidmətçi astananı yastıq edər,
İstənilən zaman qapıda hazır dayanar.
2728 Vəfalı xidmətçi bəyin xeyirini istər,
Tənini, malını, canını bəyə fəda edər.
2729 Katib içki içməməli, təmiz təbiətli olmalı,
Ona yaraşmayan hər şeydən uzaq durmalıdır.
2730 Katib içki içsə bilikdən uzaqlaşar,
Bilikdən uzaqlaşan yazıda çaşar.
2731 Katib axşam-səhər qapıda durmalı,
Lazım olduğu an hazır olmalıdır.
2732 İnsanlar arasında bu iki insanı seç,
Onlara bu iki işi həvalə elə:
2733 Biri yazmağı bacaran katib,
Biri danışmağı bacaran elə.
2734 Yaxında – yavuqda, yaxud iraqda – yadda
İnciklik düşsə, bil ki, bunların işidir.
2735 Biri yazıda özü yanlış yazsa,
O biri dili ilə onu düzəltməlidir.
2737 Ey Elik, katib belə olmalıdır,
Ancaq beləsinə inanmaq olar.
2738 Belə bir adama inanmaq olar,
İnsanlıq istəsən, onda taparsan".

* * *

2739 Bu idi, ey Elik, mənim bildiyim,
Söylədim Elikə, tükəndi işim.

### ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2740 Elik cavab verdi: – Anladım bütün,
Daha bir sözüm var, cavab ver bu gün.



2741 Söylə, görüm, xəzinədar necə olmalıdır ki,
Bəy ona inansın, xəzinəni həvalə etsin?
2742 Xəzinədə qızılı, gümüşü qorusun,
Ona verilən işləri bacara bilsin?

## XXXV

## ÖYDÜLMÜŞ ELİKƏ XƏZİNƏDARIN NECƏ OLMASINI BƏYAN EDİR

2743 Öydülmüş cavab verdi: – Ey ağıllı Elik,
Qızıl və gümüş sevilәcək şeydir, can dərmanıdır.
2744 Bəyin şübhələnməməsi üçün və onu işdə saxlaması üçün
Xəzinadar təmiz, inanılan, yaxşı adam olmalıdır.
2745 Nə deyir, eşit gör tacirbaşı,
Dünyanı dolaşıb sərvət yığmış kişi:
2746 "Can çox seviləcək şeydir,
Qızıl və gümüş ondan daha sevimlidir.
2747 Pərişan könülləri gümüş rahat edər,
Əyilməz başları gümüş əyər.
2748 Gümüşü görüb ona bağlanmayan insana
Həqiqi mələk demək olar.
2749 Qızıl görüncə çox ürəkli igidlər yumşalar,
Qaba sözlü adamın sözü yumşalar.
2750 Gərək gözütox, əməlisaleh ki,
Sərvət gündən-günə səadətlə artsın.
2751 Çox mal görərək gözü doymalıdır,
Qəlbində Tanrı xofu olmalıdır.
2752 Halal və haramı yaxşıca ayırd etməli,
Yarayanla yaramayanları seçə bilməlidir.
2753 Gözütox adamların malına dəyməzlər,
Doğru-dürüst adamlar özlərini ləkələməzlər.
2754 Kiçikliyindən gümüş-qızıl görmüş adam
Özünü mal hərisliyinə tutdurmaz.
2755 Əgər onda Allah xofu varsa,
O, şübhəsiz ki, doğruluq yolunu tutar.

2756 Doğruluq sərmayədir, yaxşılıqlar onun nəticəsidir,
Bununla insan əbədi zövq tapmışdır.
2757 İnsan doğru olsa, günü yaxşı olar,
Günü yaxşı olsa, əbədi səadətə qovuşar.
2758 Nə deyir, eşit, gör səmimi adam,
Bu sözə əməl et, ey dünyanın təməli:
2759 – Könlünü, dilini doğru tut, hərəkətini bütöv
Sənə səadət və dünya nemətləri qismət olar.
2760 Doğru olsan günün qutlu olar,
Sevinclə, qutla salamat yaşayarsan.
2761 Xəzinədar səmimi, sayıq və zəkalı olmalıdır,
O, hər işə zəka ilə müvəffəq olar.
2762 O ağıllı, tədbirli, həm də abırlı olmalıdır.
Həyasız adamdan uzaq dur, həzər ondan.
2763 İnsanı pis əməldən həya çəkindirər,
Bədxasiyyət adamları həya islah edər.
2764 Xəzinədar içki içməməli, nəfsini qorumalıdır,
Nəfsinə hakim olan insan səadət tapar.
2765 İçki içsə, mal ilə səxavət edər,
Malı dağıdar, əvəzini ala bilməz.
2766 Bu işə əli xəsis adam daha yaxşıdır,
Xəzinə malını xəsis qorumalıdır.
2767 Sadiq xidmətçi sadiq olar,
O, öz boyini varlı edər.
2768 Səmimi adam insanların yaxşısıdır,
Beləsindən bərk yapış, ey insanların yaxşısı.
2769 Xəzinədar ayıq olsa, işlər pozulmaz,
Malı hesablı tutar, özünü də yandırmaz.
2770 Ağıllı insan heç bir şeyi unutmaz,
İşini hesablı görər, yanılmaz.
2771 Ağılsız adam adətən unutqan olar,
Ağılsız xəzinadar öz işini pozar.
2772 Hər cür hesabı görməyə zəka lazımdır,
Zəkasız adam haqq-hesabı qarışdırar.
2774 Hesabdar gəliri-çıxarı yazıya almalıdır,
Yazıya alınmasa, iş pozular.
2775 İl, ay və gün yazılsa, tarix bilinər,
Rəqəmlər açıq və aydın bilinər.



2776 Hesabın doğruluğu yazı ilə olar,
Hər şeyi qeyd etmək qapıya yol açar".
2777 Səmimi insan nə deyir, eşit:
"İşçi işinin hesabını bərk tutmalıdır.
2778 Yazılmayan şey yadda qalmaz,
Yaddaşa inanma, yaz, ey oğul.
2779 Söz yazılsa qalar, yazılmasa – qalmaz,
Etinasız işçi haqq-hesab zamanı inlər.
2780 Xəzinədar haqq-hesabın bütün növlərini bilməli,
İşini sağlam tutmalıdır.
2781 Haqq-hesabda etinasız işçilər,
Hesabat zamanı inlər, başını yerə döyər.
2782 Xəzinədar barmaq hesabını yaxşı bilməli,
Ağlını-könlünü haqq-hesab tutmağa alışdırmalıdır.
2783 Barmaq hesabından sonra
Həndəsi hesabı öyrənməlidir.
2784 Bax, həndəsi hesab incə hesabdır,
Onunla yer-göy hesabları aparılır.
2785 Bilikli adamın sözü yemək kimidir,
Eşit, gör alim hakim nə deyir:
2786 – Həndəsi hesablama dərin hesabdır,
Bu hesab hakimlərin də başını fırladır.
2787 Bir dənə kimi yeddiqat göyü yarar,
Ova evə təpələri bir-birindən saçma dənəsi kimi ayırar.
2788 Xəzinədar bilikli, ağıllı, hərəkəti düz olmalıdır,
Ağıllı adamların işi həmişə yaxşı gedir.
2789 Biliklilər hər yerdə doğru-dürüst olurlar,
Doğru adamların həmişə günəşi parlayır.
2790 Ağılı olmasa, insan özünü tuta bilməz,
Biliyi olmasa, işini görə bilməz.
2791 Xəzinədarın işi sarayın içindədir,
Hakimə yaxın olanlar çox diqqətli olmalıdırlar.
2792 Könlünü, dilini doğru tutsa, əməli düz olsa,
Ona odun-alovun tüstüsü toxunmaz.
2795 Gözünü və dilini yaxşı qorumalı,
Ağlı ilə arzu və həvəsini cilovlamalıdır".
2796 Bilikli adam çox yerində bir söz demişdir:
"Ey igid, gözünü və könlünü qoru.

2797 Bədən, yeddi əndam könülə tabedir,
İnsanın könlü ağır yüklə yüklənmişdir.
798 Könülsüz insan bir şəkil və qəlibdir,
Könülsüz insan alim adını itirər.
2799 Xəzinə və sərvəti israf etməmək üçün
Xəzinədar əldən simic, ehtiyatlı olmalıdır.
2800 Səxavət yaxşı şeydir, ondan əl çəkmə,
El malı ilə səxavət göstərmə.
2801 O, tacir olmalı, ticarəti bilməlidir,
Ticarəti bilməsə, qazancı olmaz.
2802 Bütün əşya və malları tanımalı,
Bahasını-ucuzunu bilməlidir.
2803 Hər şeyin qiymətini bilməlidir ki,
Alverdə zərərə düşməsin.
2804 Alverdə rəftarı mülayim olmalı,
Böyüyə-kiçiyə qarşı şirin dil işlətməlidir.
2805 Borc aldığı şeyi vaxtında ödəsə,
Ona istədiyi malı dərhal verərlər.
2806 Ticarətdə mülayim, əməli düz olsa,
Onun malı heç vaxt əskik olmaz.
2807 Əgər bəylər qoşuna axça ehsan etsə,
O, üz-gözünü turşutmadan buna əməl etməlidir.
2808 O, ehsana mane olsa, qoşun inciyər,
Əsgər incisə, bəyin adı ləkələnər".
2809 Səxavət kanı nə deyir, eşit,
Ey xəsis insan, bunu qulağına sırğa et:
2810 "Sevilləni gözdən salmaq istəsən,
Dilin vəd etdiyini verməmək kafidir.
2811 Verilməyəcək şeyi vəd etməməli,
Vəd olunmuşsa, ona mane olmamalı.
2812 Bəy sözündə durmasa, etibarı itər,
Etibarı itsə, mal əldən gedər.
2813 Xəzinədar sayıq olmalı, çaşmamalıdır,
Çaşqın olsa, işlər pis şəklə düşər.
2814 Bəy qapısında işləyənlərin hamısı
Ehtiyac üzündən xidmətə girmişlər.
2815 Xidmətçi dara düşsə, möhtac olsa,
Bəy eşidib yardım fərmanı göndərməlidir.



2816 Xəzinədar işi uzatsa, yardım olunanı verməsə,
Möhtac xidmətçi ondan üz çevirər.
2817 Möhtac olduğun şeyi vaxtında tapsan,
Bir çöp də fil boyda görünər".
2818 Eşit gör bu ağsaqqal sənə nə deyir:
"Ey qəhrəman, möhtacın işinə yara.
2819 Möhtac adam istədiyini vaxtında tapsa,
Əvəzində öz canını fəda edər.
2820 Ehtiyac zamanı bir çöp fil boyda olur,
Hər şeydə elə bunun kimidir.
2821 Əgər Elik belə bir adam tapsa ki,
Ağıllı, bilikli, abırlı, yumşaq;
2822 Qoy xəzinəni və var-dövləti ona versin,
İnansın, onun haqqını gözləsin".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2823 Elik dedi: – Anladım, məni başa saldın,
Bir sözüm də var, ona da cavab ver.
2824 Aşpaz qabları və süfrəni idarə edir,
Bu aşpaz necə olmalıdır ki.
2825 Bəy şübhə etmədən onun əlindən yemək alsın,
Ona etibar etsin, həyatı təhlükəyə düşməsin.
2826 Ey hakim, şübhəli insanın əlində olsa,
Bu yemək-içmək işi çox çətin məsələ olar.
2827 Bunu da mənə söylə indi,
Bilim, anlayım, ey mərd qəhrəman.

## XXXVI

## ÖYDÜLMÜŞ ELİKƏ AŞPAZIN NECƏ OLMASININ LAZIM GƏLDİYİNİ BƏYAN EDİR

2828 Öydülmüş cavab verib dedi: – Ey Elik,
Bu işə bütöv və təmiz adam gərəkdir.

2829 Doğru-dürüst və seçkin adam tapmaq,
Yemək-içmək işini ona tapşırmaq lazımdır.
2830 Bu işə çox dürüst adam axtar,
O, mehriban, işə sadiq, abırlı olmalıdır.
2831 Səmimi, doğru-dürüst insan
Tənini, canını, başını bəyə fəda fəda edər.
2832 Bəy üçün təhlükə boğazdan gəlir,
Aşpaz işini görəndə kim ona nəzarət edir?
2833 Bəylər hər şeydə özlərini qorumalıdırlar,
Yemək-içməkdə ehtiyat gözünü xüsusilə açmalıdır.
2834 Xalqın başında duranın düşməni çox olar,
Kimin düşməni varsa, ona tələ qururlar.
2835 Aşpaz etibarlı, doğru, kamil adam olmasa,
Yemək-içmək işində bəyin vəziyyəti pis olar.
2836 Bu iş üçün köhnə bir işçi lazımdır ki,
Yeməyi zövqlə və vaxtında hazırlansın.
2837 Bu işi bəy o adama etibar edə bilər ki,
Onun uzun xidməti, çox əməyi olsun.
2838 *Eşit gör nə deyir kişilərin* yaxşısı,
Zəkası bu məziyyətlərə malik olan şəxs:
2839 Hansı işə çox zəhmət çəkilmişsə,
– İnsan onu sevər və əziz tutar.
2840 Hansı işə ömür sərf edilmişsə,
O iş sevilməli, can qədər əziz olar.
2841 Ömür əziz deyil, əmək əzizdir,
Əməyə sərf olunmayan həyata hayıf!
2842 Ömür keçər, insan ona heyifsilənməz,
Əmək boşa getsə, adam ona uzun illər yanar.
2843 Aşpazın könlü zəngin, gözü tox olmalıdır,
Təmiz üzü, qiyafəsi ay kimi parlamalıdır.
2844 İmanlı, dinə, şəriətə vaqif olmalıdır,
Belə adamdan doğruluq gözləmək olar.
2845 Bəylər və onları yaradan dörd ünsür təmizdir,
Yemək təmiz olmasa, iştahla yeyilərmi?
2846 Təmiz aşpaz təmiz yemək verər,
Yemək təmiz olsa, iştahla yeyilər.
2847 Acgöz adam yeməyə qarşı həris olar,
Yeməyə əlini soxar, onu bərbad edər.



2848 Acgöz adam çiy tövrlü olar,
Bu, insana yaraşmayan xəstəlikdir.
2849 Necə etibarlı, doğru-dürüst adam tapsan da,
Bil ki, ən etibarlı, düz adam özünsən.
2850 Bütün doğru və yetkin adamlara güvən,
Ancaq insan daha çox öz-özünü qorumalıdır.
2851 Buna bənzər belə bir söz var,
Ey gözəl insan, bu sözü unutma:
2852 "Hamıya güvən, ancaq özünü gözlə,
Sənə ən munis olan öz gözlərindir.
2853 Hər şeydən daha çox canın əzizdir,
Əziz canı qoru, uzatma sözü.
2854 Onun üzü, qiyafəsi, saç-saqqalı səliqəli,
Yaraşıqlı özü-sözü bir olmalıdır.
2855 Belə gözə bir adam gözə təmiz görünər,
Yemək təmiz olmasa, adamın boğazında qalar.
2856 Tanrı təmizliyi sevir,
Təmizliklə insan yaxşı ad qazanar.
2857 Təmizliyi bütün insanlar sevər,
Yemək təmiz olsa, insan onu arzulayar.
2858 Natəmizi yeməyə yaxın qoymamalı,
Natəmizin işi də təmiz olmaz.
2859 Aşpaz doğru-dürüst, sədaqətli olmalıdır,
Doğru olmayan insan gedişini düzəldə bilməz.
2860 Əgər aşpaz özü əyri olsa,
Onun işçiləri də əyri olarlar.
2861 Bu xam insan sürüsü, aş oğruları mətbəxə toplaşsalar,
Bəyin süfrəsi necə gözəl olar?
2862 İnsana doğruluq, xoş hərəkət lazımdır,
İnsan bunlara arzuladığı sevinci tapar".
2863 Doğru hərəkətli insan nə deyir, eşit,
Belə adam bütün nemətlərə nail olar:
2864 "Doğru harda olsa günü uğurlu olar,
Doğrunun gündüzü gecəyə dönməz.
2865 Xain haraya ayaq bassa,
Bərəkət oradan qaçaq düşər.
2866 Xain adam bir yerə əl atsa,
Dəniz də olsa, quruyar.

2867 Aşpaz sadiq olmalı, bəyini sevməli,
Nəfsinə hakim, abırlı olmalıdır.
2868 Aşpaz ağıllı və bilikli olmalı,
Yemək vaxtı çatanda davranmalıdır.
2869 Qaydaya uyğun hərəkət etməli,
Girib-çıxanda önünə baxmalıdır.
2870 Ağlından istifadə edərək özünü qorumalı,
Biliyindən istifadə edərək gözünü qorumalıdır.
2871 Yaxşı ad diləyərək bəyə vəfa etsə,
Bu yaxşı adla öz adını da əbədiləşdirər.
2872 Ağıllı adamlar yaxşı ad istərlər,
Bilikli adamlar etimada layiq olarlar.
2873 Ağıllı insandan insanlıq gələr,
Bilikli adam insanların insanı olar".
2874 Ağıllı insan nə deyir, eşit:
"İnsanların yaxşısı ağıllı insandır.
2875 Ağıllı, vəfalı adam insanların gözüdür,
O özünü daim başqasına fəda edər.
2876 Natəmiz, cəfakar və hiyləgər adam
Söz vermiş olsa da, sözündən qaçar".

* * *

2877 Ey Elik, bunları dedim indi,
Aşçıbaşı belə olmalıdır.
2878 Belə adam süfrə və qabları idarə edər,
Bəysə şübhələnmədən onun bişirdiyini yeyər.

* * *

2879 Ey Elik, mənim bildiyim bunlardır,
Yadıma düşənləri ərz etdim.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2880 Elik dedi: – Bunu anladım, eşitdim,
Bir sözüm də var, ona cavab ver.



2881 İndi mənə saqibaşını anlat,
İçki işlərinə baxan necə olmalıdır ki,
2882 Bəy ona bütün qəlbi ilə inansın,
Onu doğru sanaraq əlindən içki içsin.

## XXXVII

## ÖYDÜLMÜŞÜN ELİKƏ SAQİBAŞININ NECƏ OLMASINI BƏYAN EDİR

2883 Öydülmüş cavabda söylədi: – Elik
Bu işə gərək çox yetirsin bilik.
2884 Bu öz qardaşlarından, yaxud illərcə sınanmış,
Nəfsinə hakim, doğru yolda gedən birisi olmalıdır.
2885 İnanılmış, sadiq, doğru, gözü-könlü tox,
Təbiəti də atılmış ox kimi doğru olmalıdır.
2886 Bu işə içkini saxlaya bilən,
Onu hazırlamağı bilən adam lazımdır.
2887 Saqibaşı hər cür otları hazır saxlamalıdır,
O, həzm, qüvvə və ya ishal dərmanı hazırlayır.
2888 Onda yeyilən, içilən, yalanan
Hər cür lazımi dərman olmalıdır.
2889 Meyvə, quru meyvə, içki və şərab –
Bunlar onun əli ilə boğaza girir.
2890 Bəyə hər cür təhlükə boğazından gəlir,
Boğazın dadı aşpazın və saqinin əlindədir.
2891 Aşpaz vo içkiçi inanılmış adam olmasalar,
Bəyin rahatca yeyib-içməsi çox çətin olar.
2892 Boğaza fikir vermək, yavaş-yavaş yemək lazımdır,
Eşit gör bilikli və hakim insan nə deyir:
2893 "Boğazı qorumaq başa faydadır,
Az yeyəndə ağız dada gəlir.
2894 Çox gördüm, boğazını gözləməyən adam
Başına qıydı, ömrü hədərə getdi.
2895 Xəstəlik və narahatlıq boğazdan gəlir,
Müalico və dərman da boğazdan keçir.

2896 O, ağıllı və çox bilikli olmalıdır,
Ağıllı adamdan insanlıq gəlir.
2897 Ağıllı adam pis işə qarışmaz,
Bilikli isə doğru-düzgün hərəkət edər.
2898 Ox düz olmasaydı, düz getməzdi,
İnsan düz hərəkət etməsə, başqasına əsir olar.
2899 Ey qəhrəman bəyim, sən doğruluqla işlə,
Məncə, ən yaxşı şey doğruluqdur.
2900 Saqibaşılığa çox diqqətli adam lazımdır,
Onun qəlbi, könlü, ağlı doğru olmalıdır.
2901 Bütün işləri doğruluqla görməli,
Yararsız və pis adamları özündən uzaqlaşdırmalıdır.
2902 İçkini şəxsən öz əli ilə qarışdırmalı,
Özü möhür vurub qorumalıdır.
2903 Yeməyə və içkiyə otları şəxsən qatmalı,
Onların təmizliyinə nəzarət etməlidir.
2904 İçkini şəfqət, sevgi və sədaqətlə qoruyaraq
Bəyinin haqqını ödəməlidir.
2905 Meyvə, quru meyvə, gül balı, gül içkisi –
Bütün içkiləri özü hazırlayıb saxlamalıdır.
2906 Bəyinin xidmətində onun əməyi olar,
Bu əmək qulun faydasını təmin edər.
2907 İnsanın nəyə əməyi keçsə,
Onun canı o şeyə bağlanar".
2908 Xoşəxlaq insan buna bənzər bir söz deyib,
Belələrinin sözü başdan-başa bilikdir:
2909 "*İnsanın nəyə əməyi keçsə*,
O şey əziz can kökü kimi sevilər.
2910 Ömür boyu zəhmət çəkdiyi şeyi sevməli,
Yükü artdıqca əzaba qatlaşmalıdır.
2911 Belə bir içkiçibaşı tapılsa,
İçki işi ona tapşırıla bilər.
2912 Xidmətin yaxşılığı ilə razı qalmaq üçün
Bu işə təmiz təbiətli adam lazımdır.
2913 İçkiçibaşının saqiləri
Yeniyetmə və gözəl olmalıdır.
2914 Hələ üzü tüklənməmiş bu gənclərin çöhrəsi hilal,
Boyu fidan, saçı qara, üzü şəkil kimi gözəl,



2915 Belləri incə, çiyinləri geniş,
Təni ağ, yanaqları al olmalıdır.
2916 Yaşıl, göy, sarı, al, pənbə paltarda
Gəzib, yemək daşımaları xoş olar.
2917 İçkini tükdən, çör-çöpdən qorumaq üçün
Saqi saqqalsız və tər-təmiz olmalıdır.
2918 İçkidən tük çıxması yaxşı deyil,
*İçkiyə və yeməyə tük düşməsi dilxorçuluq yaradar.*
2919 Bilikli elə buna görə demişdir ki:
"Qədəh dolduranlar saqqalsız olmalıdır".
2920 Qədəhçi təmiz və xoşliqa olsa,
İçki nuş olar, cana sinər.
2921 Gözəl, zərif adam nə təqdim etsə, yaraşar,
Bax, göz ondan canın payını alar".
2922 Bu beyti deyən nə deyir, dinlə,
Ey bilən insan, bunu sən eşit:
2923 "Saqinin üzü-gözü təmiz, özü zərifsə,
O nə versə, zövqlə içilər.
2924 Onun üzünü görmək ac adam üçün xörəkdir,
Susamış adam üçün doyulmaz bir içkidir.
2925 İçkiçibaşı belə olmalıdır,
Saqilər də elə olmalıdırlar.
2926 Bəylər onlara inanar, doğru insan kimi
Özlərinə yaxın bilərlər".

* * *

2927 Ey Elik, bu bir neçə iş üçün
Sadiq, gözütox, abırlı, yaxşı adamlar tap:
2928 Biri – elçi, biri – katib,
Biri – içkiçibaşı, biri – aşçıbaşı.
2929 Bunlardan hər birini diqqətlə seç,
Yoxsa sonra peşman olarsan.
2930 Elçi ilə katib yetkin adam olmasalar,
Ey müdrik insan, bundan ölkəyə xələl gələr.
2931 Əgər içkiçibaşı və aşçıbaşı çiy olsalar,
Həyatın əsası olan cana zərər dəyər.

2932 Çalış, bu bir neçə insanı diqqətlə seç,
Sonra işləri onlara tapşır, ey Elik.

* * *

2933 Öydülmüş davam etdi: – Ey qutlu Elik,
Bəylərin işi kimi adı da böyük olur.
2934 Böyük işin hər cür dərdi olur,
Dərdləri sağaltmasan, bəylik ortadan qalxar.
2935 Məşvərətdə bəyin önünə bir yığın inci tökən
Xüsusi müşavir eşit gör nə demişdir:
2936 – Rahatlıq axtarma, zəhməti ortadan qaldır,
Rahatlıqla zəhmət əkizdir, ey bəyim.
2937 Bəy zəhmətlə ölkəni tənzim etsə, xalq varlanar,
Xalq varlansa, bəy arzusuna çatar.
2938 Ey rahat yaşayan bəy, rahatlığa çox sevinmə,
Axırda rahatlığı zəhmət əvəz edər.
2939 Aşçıbaşı və içkiçibaşıya sən
Nə qədər inansan da, ey cəsur qəhrəman,
2940 Səni onlardan çox qoruyan elə özünsən,
Sözün qısası, bu, səndən başqa heç kəs deyil.
2941 Yaxşı müşavir nə tövsiyə edir, dinlə,
Bunu unutma, yaz, daim oxu:
2942 "Axtardım, əziz can üçün özümdən daha
İnandığım başqa bir adam tapa bilmədim.
2943 Çalış qoru, onu sağlam saxla,
Can getsə, ona çarə tapılmaz".

* * *

2944 Ey xoşbəxt Elik, suallara cavab verdim,
Onun necə olmasını, çarə və tədbirini bildirdim.
2945 Bəylər belə adamlarla yüksələr,
Düşmənin başını əzər, öz adını yayar.
2946 Bunları sənə açıqca söylədim,
Başqa bir neçə sözüm də var.



* * *

2947 Elik istəsə onu da söyləərəm,
İstəməsə, sözüm burada qalsın.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

2948 Elik cavab verib dedi: – Ey hakim,
Deyəcəyin nədir, söylə mənə.
2949 Sənin hər sözünü dinləmək lazımdır,
Sən bilik dənizi, ağıl dəryasısan.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

2950 Öydülmüş cavab verib dedi: – Ey Elik,
Ölkəyə hər cür bilik hökmdardan gəlir.
2951 Xidmətin yolunu, qulun bəyə xidmətinin,
Necə olmalı olacağını Elikə ərz etdim.
2952 Xidmətçi qullara bəy nə etməlidir,
Bəylər bunu da bilməlidirlər.
2953 Qulların üstündə bəyin haqqı çoxdur,
Qulların da bəy üstündə haqqı yoxmu?
2954 Qullar xidmətlə bəyin haqqını verirlər,
Xidmətə görə bəy də qulun haqqını verməlidir.
2955 Xidmətçi yaşamaq üçün xidmət edir,
Yaşaya bilməsə, o, zülmə uğramış olar.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

2956 Elik dedi: – Mənə açıqca söylə,
De görüm, xidmətçinin haqqı nə deməkdir?

## XXXVIII

## ÖYDÜLMÜŞ ELİKƏ XİDMƏTÇİLƏRİN BƏYLƏR ÜZƏRİNDƏKİ HAQLARININ NƏLƏR OLDUĞUNU BƏYAN EDİR

2957 Öydülmüş dedi: – Bəylərin üstündə
Xidmətdən əvvəl də xidmətçinin haqqı var.
2958 Ona əvvəlcə yemək-içmək verməli,
Xidmət alətlərini hazırlamaq lazımdır.
2959 Xidmət çox ağır zəhmətli işdir,
Bəylər onu qiymətləndirsələr, xidmətçi daha da səy edər.
2960 Xidmətçi bədənini, canını fəda edir,
Bəyini razı salmaq istər.
2961 İstidə, soyuqda, ac, tox, piyada, çılpaq halda
Qılınc, balta və oxa məruz qalırlar, ey Elik, bunu bil.
2962 Onlar önə, arxaya, sağa və sola gedir,
Orada bəyin rahatlığı üçün çalışır, zəhmət çəkirlər.
2963 Düşmənlə ön cərgədə vuruşurlar,
Bəyin yaşaması üçün ölümə atılırlar.
2964 Beləcə bəyin rahatlığını diləyir,
Gecə-gündüz zəhmət çəkirlər.
2965 Bu zəhmətlər üçün bəy onların haqqını ödəyib,
Onlarla mehriban rəftar etməlidir.
2966 Xalq arasında seçkin, doğrucul
Uc Ordu xanı nə deyir, eşit:
2967 "Ey xalqın böyüyü, bəy olan şəxs,
Xidmətçi qullara yaxşı bax, onları yüksəlt,
2968 Bəylər hakimiyyəti onların vasitəsilə əldə edirlər,
Hökmdar xidmətçilərlə ölkəni nizama salır.
2969 Bəyin əsli ulu, özü böyük olsa belə,
Onun adı xidmətçilərlə yüksəlir".
2970 Ey Elik, insanlıq bir mürüvvət,
Mürüvvətsə insan üçün bir təriqətdir.
2971 Şübhəsiz ki, mürüvvət və təriqət,
İnsan əməyinin təqdirlə haqqını verməlidir.



2972 Xidmətçi qapıda ümidlə xidmət edir,
Bəy onun umduğunu verməsə, mürüvvət gedər.
2973 Bəy baxıb görür ki, xidmətçi necədir?
İşə yarayır, yoxsa yaramır?
2974 İşə yarayana ehsan etməli,
Xidmətçi müqabilində haqqını ödəməlidir.
2975 İnsan heyvandan aşağı məxluq deyil, ey bəy,
Bunu müqayisə etsən, iş ölçüsünə görə olar.
2976 İnsan əvvəlcə heyvanın qarnını doyurur,
Sonra ondan istifadə edir.
2977 Bəylər ehsan edib xoş sözlə onu həvəsləndirsələr,
Xidmətçi özünü bəyə fəda edər.
2978 Xidmətçi onda bəyi sevər, ürəkdən bağlanar,
Bəyin rahatlığı üçün özü zəhmət çəkər.
2979 Zəkalı insan buna bənzər bir söz demişdir,
İnsan biliklə ətrafına hakim olar.
2980 İnsan yaxşılıq əvəzində əziz canını verər,
Bir yaxşılığa qarşı on yaxşılıq edər.
2981 Mənfəəti olsa, insan qul olar,
Başqasına kölə olar, zəhmət çəkər.
2982 Ona xidmətinə görə ehsan etməli,
Çılpaqsa – geydirməli, acsa – yedirmək lazımdır.
2983 Ey dövlətli bəy, o necə bəydir ki,
Quldan kasıblıq adını götürə bilmir?
2984 Yaşlılar nə deyirlər, eşit,
Onların sözü gənclərin gözüdür:
2985 "Biri o birinə çörək verərsə,
O da əvəzində insanlıq edər.
2986 Çörəyi tapdayan adama insan deyilməz,
Ona insan yox, heyvan deməli.
2987 Xidmətdəkilər iki cür olurlar,
Biri hürr olur, biri qul olur.
2988 Qul öz ixtiyarı xaricində xidmət edir,
İşi görməsə, bəydən yumruq yeyir.
2989 Sərbəst şəxsə bax, özünü qul edib, xidmət edir,
Ona qiymət vermək, haqqını ödəmək lazımdır.

2990 Sərbəst və azad adamlar yaxşılığın quludur,
Onlara daim yaxşılıq yolu açıq olmalıdır.
2991 Sərbəst adamı qulla bir tutmaq olmaz,
Azada azad kimi, qula qul kimi yanaş.
2992 Bəylərin qapısı rahatlıq qapısıdır,
Buraya qapılınaq hər kəsin öz mənfəəti üçündür.
2993 Xidmətçi varlansa, bəy ad qazanar,
Bu ad dua ilə əbədi qalar".
2994 Ey Elik, xidmətçi-bəy münasibəti
Tam alıcı-satıcı münasibəti kimidir.
2995 Satıcı mal satır, sərmayə qazanır,
Alıcı malı alır, ölkədən-ölkəyə gəzdirir.
2996 İl, ay, gün keçdikcə qazanc artır,
Təkrar qarşılaşırlar, hər biri öz qazancını alır.
2997 İndi xidmətçi də buna bənzəyir,
O, beylə ortaq hesaba bağlıdır.
2998 Bəy qula mal verir, sözlə həvəsləndirir,
Xidmətçi isə bədəni ilə ona qulluq edir.
2999 Qul canını fəda edib qılınc vurur,
Onun qazancı ölkədəki şəhər və vilayətlərdir.
3000 Düşmənin başını əzir, xəzinə toplayır,
Dilək, arzu, nemət bir-birinin ardınca gəlir.
3001 Bunların hamısı gəlir və qazancdır, ey bəyim,
Qazanc gətirənə yaxşı baxmaq lazımdır.
3002 Eşit gör nə deyir bu tacirbaşı,
Qazanc yolunda dünyanı dolaşmış insan:
3003 "Xeyirli qul mənə oğuldan yaxın,
Xeyirsiz oğulu yağı bil, saqın.
3004 Bütün insanlar mənfəət güdürlər,
Mənfəət güdməsəydi, ovçu evində qocalardı.
3005 Qoşun bəylərin qanadlarıdır,
Ey bəylərbəyi, qanadsız quş uçmaz.
3006 Bəylərin gücü-qüvvəsi qoşunla bilinir,
Bəylər düyünü qoşunla açarlar.
3007 Bəyin ətrafına cəsur qoşun yığılsa,
O dünyaya sahib olar.
3008 Hansı bəydə bütün ərdəmlər birləşsə,
İstədiyi hər şey onun ətrafında olar.



3009 Dünya hakiminə min bir fəzilət lazımdır,
O, bu fəzilətlərlə dünyanı idarə edir.
3010 Ey oğul, fəziləti qiymətsiz sanma, öyrən,
Bu fəzilətin təbiəti ağ quşa bənzəyir.
3011 Bu fəzilətin səadəti ağ quşunku kimidir,
Haydı, fəzilətə quş adını ver.
3012 Nə deyir eşit gör ağsaçlı kişi,
Dünyanı qarıtmış ixtiyar kişi:
3013 Bilik və hünər öyrən, ona hörmət et,
Bu hünər sonra sənə hörmət gətirər.
3014 Bilik, anlayış sahibi ol, boş gəzmə,
Vaxtı gələndə o sənə yaxşılıq gətirər".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

3015 Elik bu sözləri eşidib sevindi,
Dedi: – Ey ağıllı, soyu təmiz.
3016 İnsanlığın təməlini düzgün göstərdin,
Bu, doğrudan vəfalı adamların yoludur.
3017 Mən xalq üzərində hakim oldum,
Əlim hər yana çatır, sözüm hər yerdə keçir.
3018 İndi nə bəyliyə çatdığım üçün,
Nə də öz rahatlığımı dilədiyim üçün öyünmürəm.
3019 Əsl diləyim budur, xidmətçilərim varlansın,
Sayəmdə qüdrət və nüfuzları artsın.
3020 Bu bəylərin sevinci sabahın qazancıdır,
Mənə qılınan xeyir-dua mənə bəsdir.
3021 Bu xəzinəni, bu qızıl-gümüşü
Qoşuna paylamaq üçün yığmışam.
3022 Ad qazanmaq üçün bunları paylayıram,
Qoy çox dua qazanım, Tanrı adımı dünyaya yaysın
3023 Diləyim odur ki, xidmətçilərim
Heç zaman sıxıntı çəkməsinlər.
3024 Mən köçüb gedəcəyəm, xalq qalacaq,
Qoy onda məni dua ilə xatırlasınlar.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3025 Öydülmüş cavab verib dedi: – Ey Elik
Bu işi ağıl və biliklə yaxşı qavradın.
3026 Ölən adam üçün özündən sonra
Xoş adından başqa nə qala bilər?
3027 Bu dünyanı istəyən gümüş paylamalıdır,
O dünya üçün də qurtuluş yolu budur.
3028 Ey Elik, qızıl və gümüş payla,
Hansı ölkəni istəsən, ora hakim olarsan.
3029 Hakim bəy gör nə deyir, eşit,
Bu dövlət işinin təməlini o qoymuşdur:
3030 "Bəy mal paylamalı, qoşun saxlamalıdır,
O zaman yağının ölkəsini də tuta bilər.
3031 Xəzinə nəyə gərək, çox qoşun lazımdır,
Bəy varlı olmasa da olar, xalq varlı olmalıdır.
3032 Qoşun olduqda bəyin vilayətləri çox olar,
Əsgər olmasa, bəy o vilayətlərdə hakim olmaz.
3033 Qoşun bəydən razı qalsa,
Bəy istədiyi vilayəti əlində tuta bilər.
3034 Dünya bəylərinin əliaçıq olarsa,
Onlar hər iki dünyada yuxarı başa keçərlər".
3035 Bilikli adam nə deyir, eşit:
"Xəsis bəy ölkəyə hakim ola bilməz:
3036 Bu iki zidd şey bir-birindən qaçar,
İnsan xəsisin yanına yox, comərdin yanına gedər.
3037 Bütün fəzilətli adamlar xəsisdən uzaq gəzər,
Comərdin yanında arzu-diləyə qovuşar.
3038 Xəsisliklə bəylik bir-birinə düşməndir,
Xəsisə hər şeydə üsyan edərlər.
3039 Ölkəni qoruyan iki şey də var,
Biri – külçə qızıl, biri qılıncdır
3040 Ölkəni səxavət ilə qorumaq lazımdır,
Ey Elik, bəy səxavətlə böyük olar.
3041 Cəsur, qəhrəman ildırım tək qılınc vursa,
Azğın savaşçıların ödü partlayar.
3042 Qızıl verməkdən əli qabar olan bəy
Ölkəni sözlə də, qılıncsız idarə edə bilər".



3043 Ölkəni bu iki şeylə tənzim etməli,
İnsan bu iki şeylə böyük olar, ey Elik.
3044 Qaşqabaqlı üzləri külçə qızıl güldürər,
Pozulmuş işləri külçə qızıl düzəldər.
3045 Qılınc haradırsa, gümüş də oradadır,
Gümüş haradadırsa, qılınc ora yönələr.
3046 Ey Elik, gümüş sən, qoy igidlər yığılsınlar,
Gümüşü özünə saxlasan, qılınclı igidlər dağılışar.
3047 Qılınclı cəsur igid gümüşün girovudur,
Yığılmış külçə qızıl qılınca fəda olsun.
3048 Xəsis bəy mal yığar, xəzinə toplar,
Comərd bəy bunu qılınc vura-vura alar.
3049 Bu dünyada adət belədir ki,
Xəsisə söyərlər, comərdi öyərlər.

* * *

3050 Öyüdülmüş sözünü bitirdi, yeri öpdü,
Hökmdara dua, Tanrıya şükür etdi.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3051 Elik bu sözləri eşidib sevindi,
Əlini qaldırıb Tanrıya dua etdi.
3052 Sonda dedi: – Ey inandığım, rəhmli rəbbim,
Ey çətin anlarda sığındığım rəbbim.
3053 Mənim səndən başqa pənahım yoxdur,
Güvəndiyim sənsən, ümidim sənədir.
3054 Mənə hər cür yaxşılıqlar etdin,
Bütün arzularımı yerinə yetirdin,
3055 Ey əbədi Tanrım, doğru deyirəm,
Sənə layiqli qulluqdan acizəm.
3056 Səndən qüdrətli köməyini istəyirəm,
Məni həmişə doğru yola yönəlt.
3057 Bütün yaxşılıqların arasında indi
Ruhumu doyuran bu Öydülmüşdür.
3058 Onu sən mənə ehsan etdin,
Buna görə sənə min dəfə şükür et deyirəm.

3059 Mənim yolumda canını, tənini fəda edir,
Bu fani həyatımda mənə çox alqış qazandırır.
3060 Mənə qüvvə ver onun haqqını ödəyim,
Razı qalsın, mənə qəlbən bağlansın.
3061 Elik Öydülmüşə belə dedi:
– Ağıllı, bilikli hər kəs səni öymüşdür.
3062 Ağıllı diləsəm, ağıllı sənsən,
Bilikli diləsəm, bilikli sənsən.
3063 Sadiq, səmimi, doğru, təmizsən,
Doğruluqla ad çıxarmışsan.
3064 Sənin xidmətin mənim ehsanımdan çoxdur,
Yerinə yetirmədiyin iş yoxdur.
3065 Məndən öz haqqını almalısan,
Ödəyim, həyatını ona uyğun qur.
3066 Mənim könlüm səndən nə qədər razıdırsa,
Tanrı səni o qədər sevindirsin, ey oğul.

* * *

3067 Elik sözünü bitirdi, dayandı, susdu,
Öydülmüş yeri öpdü, ayağa qalxdı.
3068 Hüzurdan şad-xürrəm çıxdı,
Sonra atına minib evə gəldi.
3069 Sidq-ürəkdən axşam-sabah xidmət etdi,
Xidməti bəyənildi, üzünə dövlət qapısı açıldı.
3070 Vaxt ötdükcə, dövranın yardımıyla
Biliyi və ağlı daha da yetkinləşdi.
3071 Səadəti məşhur, adlı-sanlı,
Şöhrətli adam nə deyir, eşit:
3072 Kimə dövlət gəlsə, onunla uyuşsa,
Onun başını yüksəldərək göyə qaldırar.
3073 Səadət gəlsə dövlət yığılsa,
Könül rahat olar, üz sevinclə gülər.
3074 Ağsaqqal buna bənzər sənə bir söz deyib,
Ey qəhrəman igid, bu sözə yaxşı qulaq as:
3075 – Kimə dövlət gəlsə, qüdrəti artar,
Əyrisə – doğru, hər sözü – hikmət olar.



3076 Dünyanın filosofu nə qədər natiq olsa da,
Sərvəti yoxdursa, dili cidarlıdır.
3077 Dünyanın xasiyyəti dönüklükdür,
Sərvətin adı belə çıxmışdır.
3078 Pis adamın üzünə gülsə, şərəfli olar,
Kiçiyin üzünə gülsə, o, böyük olar.
3079 Bu sərvət kimə nəsib olsa,
Onu qaydaya salar, hər şeyini düzəldər.
3080 Sərvət kimə gəlsə, özüylə hər şey gətirər,
O, dünyada tanınar, adı hər yana yayılar.
3081 Sərvət getsə, hər şeyi aparar,
Yüksəltdiyi başı qara torpağa əyər.
3082 Ağıllı, könüllü, dərrakəli, ayıq insan,
Bu dünyanı sevmə, işi bilinməz.
3083 Bu qaranlıq yer üzü nəyinə gərək,
Duru və əbədi ölkə üçün hazırlıq gör.
3084 Bu dünya zindandır, ona könül bağlama,
Yüksək saray və ölkə istə, rahatlıq tap.
3085 Bütün işlərdə könlü dürüst olan,
Könlü duru insan nə deyir, eşit:
3086 "Ey himmət sahibi, gözəl bir dünya arzula,
Gözəl şeyi istəyənin səadəti artıq olar.
3087 Bu dünyadan əl çək, axirət dünyasını istə,
Sən dünyadan əl çəkməsən, o səndən əl çəkər.
3088 Bu dünya cəfakeşdir, sən də ona cəfa ver,
Nə qədər cəfa etsən, o qədər ram olar.
3089 Ey yoldan azmış, başını itirmiş adam,
Dünyaya könül vermə onun dibi bataqlıqdır.
3090 Bataqlığa düşən dibə batar, çıxa bilməz,
Sən orada sevinc axtarma.
3091 Özünü yuxarı çək, bataqlıqdan xilas ol,
İbadət və qulluqla məşğul ol.
3092 Onun yanına qayıt, diləyinə yetərsən,
Bu qədər, başqa bir söz qalmadı".
3093 Bundan sonra Elik könlünü doğrultdu,
Xalq üçün yaxşı qanunlar verdi.

3094 Xalq rahatlandı, arıq kökəldi,
Onu sevənlər böyüdü, yağısı zəiflədi.
3095 Gününü güvənc və sevinclə keçirdi,
Şanı-şöhrəti bütün dünyaya yayıldı.
3096 Bir müddət hər şey belə davam elədi,
Qurdla quzu tən-bərabər oldu.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

3097 Elik bir gün yalnızdı, Öydülmüşü
Çağırtdı, dedi: – İşin-gücün necədir?
3098 Ey Öydülmüş, günlər, aylar necə keçir?
Eldə yoxsul çoxdur, yoxsa varlı?
3099 Eldə yararsız, pis nə var?
Məni xalqın halından hali et, heç nə gizləmə.
3100 Xalqın dilinin sözü necədir?
Söyüş çoxdur, yoxsa öymək?
3101 Qüsurum çoxdur, yoxsa fəzilətim?
Mənə de, əmin olum, tədbirlər arayım.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3102 Öydülmüş söylədi: – Ey Elik,
Diləklər yerinə yetdi, hər şeyə əl çatdı.
3103 Elikin dövlətindən dünya bəzəndi,
Kədər qısa, sevinc uzun oldu.
3104 Xalq varlandı, rahatlandı,
Kənd-şəhər bəzəndi, könül sevindi.
3105 Xalq gündüzləri nəşə ilə,
Gecələri də sevinclə keçirir.
3106 Bütün dillər sənə şükürlər deyir,
Nəfəs alan hər canlı sənə dua edir.
3107 Qanun su kimidir, zülmsə atəş kimi,
Sən saf su axıtdın, od söndü.



3108 Qanunu düz tətbiq etdin, dünya bəzəndi,
Eldə kimsənin gözünə zülm dəymir.
3109 Ey Elik, üç şey zülmə səbəb olur,
Biri bəyin etinasızlığıdır, müsibət gətirir,
3110 İkinci – xalqın başçısının zəifliyi,
Üçüncü – xalqın bağrını yeyən tamahkarlıqdır.
3111 İndi bu üçündən hər biri səndə yoxkən
Ölkənin harasında zülmkar törəyə bilər?
3112 Ey adil, həlim və təmiz bəy,
Tanrı sənə ağıl, bilik, ərdəm verdi.
3113 Hər cür yaxşılıq üçün Allah sənə güc verdi,
Xalqın qarnı doydu, çılpaqlıqdan qurtardı.
3114 Tanrıya şükür et, ibadət et, sevin,
Şad ol, bir az rahatlıqla ömür sür.
3115 Dışarıda bir yanlışlıq olsa,
Mən sənin köməyinə qoşan qulunam.

* * *

3116 Elik şükür etdi və çox sevindi,
Əlini qaldırdı, Tanrıya dua etdi.
3117 Dedi: – Ey rəhmdil rəbbim, sən böyüksən,
El çində mən qulunu etibarlı qıldın.
3118 Sən mənə hər cür yaxşılıq lütf etdin,
Şükür etmək boynumun borcudur.
3119 Bu şükürün haqqını nə zaman ödəyə bilərəm,
Mənim şükür borcumu sənə özün ödə.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

3120 Elmik yenə dedi: – Ey Öydülmüşüm,
Hayatın lütfüdür səni tapmağım.
3121 Hər cür yaxşılığa sən səbəb oldun,
Həm zülmü yox etməyə, həm də qanun qoymağa.
3122 Tanrı bu gün mənə çox yaxşılıq lütf etdi,
Sən onlardan on dəfə qiymətlisən.

3123 Bəy təkcə nə qədər çalışsa da,
Qul kömək etməsə, bu, uzun çəkməz.
3124 Bəy içəridə olur, gözü qıraqda görür,
Sadiq qul isə onun həm gözü, həm də sözüdür.
3125 Sən də mənim gözüm, dilim, əlimsən,
Ey mərd igid, sayəndə yaxşı ad qazandım.
3126 İndi eşit gör nə deyir xaqan dili,
Dünyanı tutmuş, elləri basmış adam:
3127 "Bəylər axtarıb sadiq qul tapsalar,
Onu qızıl-gümüşə tutmalıdırlar.
3128 Doğru-dürüst inanılmış adam tapsalar,
Rahat olarlar, ömürləri səadətlə keçər.
3129 Seçkin xidmətçi ürəkdən bağlı olur,
Beləsini kim axtarıb tapa bilər?
3130 Seçkin və sadiq adamlar olmasaydı,
Bəşər necə kamala yetərdi?
3131 İndi çox təəssüf edirəm ki,
Atandan mənə təkcə sən yadigar qalıbsan.
3132 Sənin kimi birisi də olsaydı,
Səndən ya əvvəl, ya sonra eyni yolu keçərdi.
3133 Ey dürüst təbiətli, mənim yanımda sən yeganəsən,
Səni itirsəm, başqasını hardan taparam?
3134 Bu yeganəliyinə özüm də qorxuram,
Kaş sənə tay olaydı, ey qüdrətli insan.
3135 Bütün bu əmək sənə yüklənməzdi,
Mən də daha çox dua qazanardım.
3136 Axtar gör qohum-qardaş arasında
Sənə uyğun biri varmı, öyrən".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3137 Öydülmüş cavab verdi: – Elik sağ olsun,
İşə əli yetən adamlar çoxdur.
3138 Hökmdar daim sağ və əsən olsun,
Bütün arzu-diləyinə qovuşsun.
3139 Mənim əməyimin əvəzində Elikin qızılı var,
Qoy qayğı çəkməsin, qəlbini doğru tutsun.



3140 Mən rahatlıq üçün zəhmət çəkirəm,
Rahatlıqla zəhmət yan-yana yürüyür.
3141 Əgər Elik el üçün xeyirli,
Xalqa rəhbər olacaq adam axtarırsa,
3142 Hikmətilə hər gün yeni tədbir axtaran
Hakim dövlət adamı nə deyir, eşit:
3143 "Ölkənin işinə çoxlu köməkçi tap,
Onda böyük bəy rahatlığa qovuşar.
3144 Ölkədə xeyirli, ağıllı adam nə qədər sox olsa,
İşləri onlar görər, bəy rahat olar.
3145 Qohumların arasında yox deyil,
Çox bilikli belə bir adam var.
3146 Hər cür ərdəm və iman sahibidir,
Sayıqdır, əlindən də hər cür iş gəlir.
3147 Əməlisalehdir, adı Odqurmuş,
Bütün yaxşılığa əlini vurmuş.
3148 Və lakin çevirdi bu dünyadan üz,
Qalxıb dağa çıxdı, qıldı könül düz.
3149 Tanrı ibadətlə özünə zəhmət verir,
İbadətlə günah xəstəliyini sağaldır.
3150 Mənimlə olsaydı əgər o qardaş.
Hər işə olardı bilik ilə baş.
3152 Eli qızıla əl atmadan könüldən inanaraq,
Dünyanı idarə edər, sevinclə yaşardı".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

3153 Elik dedi: – Arzum-diləyim budur,
Onu tapsaydım, könül rahat olardı.
3154 Bu işin çarəsi nədirsə ona bax, ey müdrik,
Onu mütləq mənim yanıma gətir.
3155 De necə çağırım onu buraya,
Mən kimi göndərim getsin oraya?
3156 Ya məktub lazımdır, ya da ki sözün,
Bu işə çarə qıl, amandır özün.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3157 Öydülmüş: – Elikin sualına
Cavabım belədir, – dedi.
3158 – Var belə qohumum, söylədim özüm,
Gələrmi, gəlməzmi? Yox buna sözüm.
3159 Gəlsə, demək, sözünüzə hörmət göstərdi,
Gəlməsə, demək, fərmanınıza əhəmiyyət vermədi.
3160 Elikin qızılı təsir edərmi?
Mənim sözüm ona keçərmi?

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3161 Elik dedi: – Mən söz söylədim sənə,
Sən də bildiyini bildirdin mənə
3162 Çağır, gəlsə – gələr, əgər gəlməsə,
Sənin suçun yoxdur, sözümü dinləməsə,
3163 Sən onun hər cür ərdəmini öydün,
Buna görə də mən onu çağırmalıyam.
3164 Sən onun ağlını, biliyini tərifədin,
Həvəsə düşmən olduğu üçün onu arzuladım.
3165 Ancaq ağıllıdır, biliklidir insandır,
Yerdə qalanlar heyvan kimidir.
3166 İşi ağıllı, bilikli insan bilər,
İşi ağıllı, bilikli adam bacarar.
3167 Buna bənzər bir söz var,
Ey mərd qəhrəman, bunu dinlə:
3168 – Bütün düyünlər biliklə açılar,
Bilikli, idraklı ol, biliklə yaşa.
3169 Biliklə iş gör, sözün doğru olsun,
Həmişə öyrən, gününü bada vermə.
3170 Qohumundan təkcə mənə xeyir gəlməyəcək,
O sənə də xeyir və zövq verəcək.
3171 İnsanın qohumu yanında olmalıdır,
Qohumu yoxsa, yoldaş tapmalıdır.
3172 Dinlə, ölkə hakimi çox yerində demişdir:
"Qohumlu adam hamıdan güclüdür.



3173 Qohumlu adamın adı-sanı böyükdür,
Dostu olanın adı və sözü mötəbərdir.
3174 Qohumun yoxsa, özünə dost tap,
Yaxşı dost elə qohum deməkdir".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3175 Öydülmüş söylədi: – Ey qutlu Elik,
Onu gerçəkdən istəyirsənsə, çalışaram.
3176 Elik əmr edirsə, özüm gedərəm,
Onu çağıraram, sözümü deyərəm.
3177 Bilik, ağıl və zəkamı səfərbər edib
Ona hər cür dil tökərəm.
3178 Elik öz əliylə bir məktub yazsın,
O ağıllı insan fərmanı şəxsən oxusun.
3179 İnansın ki, bu təkcə mənim arzum deyil,
Fərmanı da eşidib yola gəlsin.
3180 Mən onu sözlə nə qədər təşviq etsəm də,
Hökmdar fərmanı, məktubu başqa şeydir.
3181 Əsli inək kimi qiymətli olan gör nə deyir:
"Bəyin yarlığı xalqın könlün ovlar".
3182 Bilikli nə qədər gözəl söyləmiş:
"Bəyin sözü qapalı könülləri açır.
3183 Bəylərin dili qula xoş söz desə,
Qul onu illər uzunu unutmaz.
3184 Bəyin dili yumşaq və dadlı olsa,
Onu böyük-kiçik – bütün xalq sevər".

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3185 Elik dedi: – İndi budursa yaraq,
Bir məktub yazaram, ona olsun ağ[1].
3186 Sənə getmək lazımdırsa, hazırlaş,
Mən də məktub yazıb sənə verim.

[1] A ğ – əski türkcə tələ

## XXXIX

## GÜNDOĞDU ELİKİN ODQURMUŞA MƏKTUB YAZIB GÖNDƏRDİYİNİ BƏYAN EDİR

3187 Mürəkkəb-kağız aldı, Elik yazaraq,
Məktubla işini yoluna qoydu.
3188 Tanrı adı ilə sözə başladı,
Törədən, bəsləyən, köçürən, – dedi.
3189 Sonra davam etdi: – Tanrının adını yazdım.
Bu ad hər cür dərdə dəvadır.
3190 Çoxlu təriflərlə minlərcə səna,
Tanrıya qılıram, o deyil fəna.
3191 Bütün tərpənənləri dilədi və yaratdı,
Onlara ruzi və həyat verdi.
3192 Qadirdir, adildir, qanunverici,
Can vermiş xilqətə – yetişir gücü.
3193 Mavi göy yaratdı, nurlandı gün, ay,
Zil gecə, parlaq gün – hesablı il, ay.
3194 Yaratdı fələyi, daima dönür,
Tanrı hökmü ilə fırlanır, çönür.
3195 Yaratmazdan əvvəl qəza təyin etdi,
Qəzaya razı ol, ona boyun əy.
3196 Nə istədisə etdi, nə istəsə edər,
Nə dedisə oldu, nə desə olar.
3197 Bu, Elikdən salam – könül məktubdur,
Sağlıq arzusuyla yazdım, ey ağıllı insan.
3198 Canın-başın, söylə, sağ-salamatını,
Fələyin yükünü necə çəkirsən?
3199 Sənin xoşxasiyyət və əməlisaleh olduğunu,
Bu dövrdə sənə tay olmadığını eşitdim.
3200 Tanrı sənə lütflə bilik vermişdir,
Ərdəm, ağıl və idrak nəsib etmişdir.
3201 Belə olduğunu eşitdim özüm,
Səni arzuladım, ey gözəl üzlüm.
3202 Yanına qohumun Öydülmüşü göndərdim,
Sözümü və anlayıb bildiklərimi sənə deyəcək.



3203 Sən qohum-qardaşdan uzaqlaşmısan,
Şəhər, kənd və qəsəbə xalqından üz çevirmisən.
3204 İbadət üçün təkcə dağa getmisən,
Ancaq bu ibadət çox uzun çəkmişdir.
3205 Axı nə etmişlər qohumlar sənə,
Niyə üz çevirdin, bunu aç mənə.
3206 Əgər sənə zülm – təzyiq toxunmuşsa,
Bəri gəl, dərdini, qayğını mənə söylə.
3207 Mən qüdrətimlə sənin haqqını qoruyum,
Burada şad-xürrəm yaşa.
3208 Qohum qohumdan xeyir görər,
Xeyirdən insan oğlu zövq alar.
3209 Barışmaq lazımdır qardaşlar ilə,
Qarışmaq lazımdır adaşlar ilə.
3210 Harada yaraşıq və yaxınlıq varsa,
O işdə xeyir var, bunu duşun.
3211 Bu şeri qoşan, eşit gör nə deyir:
"İki insan bir-birinə yaraşsa, hər zaman xeyir görərlər.
3212 Qara yerlə mavi su bir-birinə yaraşdı,
Ortada gülə-gülə minlərcə çiçək açdı.
3213 Yaxın-əqrəba bir-birinə yaraşarsa, uyarsa,
Onlardan təzə qohum-qardaş törəyər.
3214 Əgər ibadət üçün oraya getmisənsə,
Şəhərdə ibadət et, din yolu budur.
3215 Çünki şəhərdə Tanrının böyük əmrlərini
Yerinə yetirmək üçün daha çox imkan var.
3216 İbadətdən əvvəl çoxlu bilik öyrən,
Biliksiz ibadətdən fayda yoxdur.
3217 İki cür adama insan deyərlər,
Biri öyrədən, biri öyrənən.
3218 İkisindən başqa hamısını heyvan say,
Hansını diləyirsən onu da seç".

## ELİKİN ODQURMUŞA NƏSİHƏTİ

3219 İndi sən hansısan, bunu mənə aç,
İkisindən biri ol, üçüncüdən qaç.
3220 Çoxlu öyrənərək bilik bilmisən,
Onu indi zəhmət çəkmədən işlət.
3221 Hələ öyrənməyibsənsə, bilik öyrən,
İbadətə isə ondan sonra başla.
3222 Biliklə taət və ibadət edən,
Bilik verən insan nə deyir, eşit:
3223 "Allah ibadətinə bilik ilə yaxınlaş,
Bilik cəhənnəm qapısını möhürləyər.
3224 Biliklə edilən ibadətin savabı çoxdur,
Kim biliksiz ibadət etsə, savab qazanmaz.
3225 Biliksizin ibadət etməsindən,
Biliklinin yatmasının savabı daha çoxdur.
3226 Kənddə və şəhərdə çox ibadətlər var,
Orada bunun heç yarısı da olmaz.
3227 Sənin oradakı ibadətini biri namaz,
Biri də tutduğun orucdur, ey oğul.
3228 Bunlardan başqa orada nə ibadət var,
Mənə göstər, dillə söylə.
3229 Sən indi zahid adını aldın,
Bu ad sənə böyük fəlakət oldu.
3230 Bununla aldadırsan indi özünü,
Bu ibadət boşunadır, saxla sözünü.
3231 İbadət et, onu xalqdan gizlə,
İbadət nə qədər çox olsa da, onu az say.
3232 İnsanların yaxşısı ibadət edərkən
Onu xalqdan gizlədi, qapısını bağladı".
3233 İndi bu sözün mənası nədir, eşit,
Ey xeyirxah, bu sözə görə hərəkət et:
3234 "Əsl insan başqalarının yanında özünü gizləmiş,
Yüz il ibadət etmiş, bunu az saymışdır.
3235 İbadəti gizli elə, başqası görməsin,
Bu sözüm sirr idi, özüm söylədim.
3236 Buraya gəl, şəhərdə və ya kəndə ibadət et,
Sənin üzünə bütün yaxşılıq qapıları açılsın.



3237 Xalqa xeyir ver, möhtaclara kömək elə,
Qohumlara yaxşılıq elə, bağrını aç.
3238 Bax, burada çoxlu yetim, dul,
Aciz, kor, götürüm, topal var.
3239 Fərz namazlarını camaatla qıl,
Yoxsullar həcci olan olan cümə namazları qıl.
3240 Halal dünya malı qazan, yoxsula payla,
Adamlara əl tut, xoşrəftar göstər.
3241 Bu saydıqlarım hamısı ibadətdir,
Bu ibadətləri edənlər şad olarlar.
3242 Bunlardan əl çəkdin, ey əsil təbiətli,
Təkbaşına oruc tutur, namaz qılırsan.
3243 Namazla oruc öz xeyirin üçündür,
Ancaq öz xeyirini düşünən xudbin olur.
3244 İnsanların seçkini və yetkini,
Mərhəmətli insan çox gözəl söyləmiş:
3245 – Yaxşı adam odur ki, öz xeyirindən əl çəkir,
Zəhmətə qatlaşaraq başqasının xeyirinə çalışır.
3246 İnsan rəhmli olmalıdır,
Pislərə acıyaraq doğru yol göstərməlidir.
3247 Diri ikən insan xeyirxah olmalı,
Xeyirxah olmayan doğulsa da, ölməlidir.
3248 İnsanların yaxşısı başqasına xeyir verəndir,
Xalq üçün gərəkli olanlar beləleridir.
3249 Qul əgər ibadətə güvənirsə, demək,
Tanrının sevgisinə yol tapmamışdır.
3250 Tanrını razı salmaq istəyirsənsə,
Müsəlmanlara sevinc dilə, sözü uzatma.
3251 Sənin taətinə möhtacmı Tanrı?
Özün qulluq elə, yaxşı ad qazan.
3252 Adı qul olanın işi-gücü ibadətdir,
İbadətsiz qulun adı qul deyil, məcazdır[1].
3253 İbadət, durmadan ibadət et, qulluq budur,
İbadətə diqqət elə, bu yoldan ayrılma".
3254 Biliyi geniş hakim çox yerində demiş,
Buna görə hərəkət et, ey əliaçıq insan:

[1] Yəni, o dünyaya yox, bu dünyaya bağlanmış adamdır.

3255 “İbadət, taət deyib çox da öyünmə,
İbadətə davam elə, ibadət edən əzizdir.
3256 İbadət et, Tanrıya qulluğun budur,
İbadət etdim deyib ağlını itirmə.
3257 Dəvət eləyirəm yanıma səni,
Xudbin adlandırıb qınama məni.
3258 Əgər durub gəlsən, xeyiri var sənə,
Yox, əgər gəlməsən, ziyan yox mənə,
3259 Səni xalqın xeyiri üçün çağırıram,
Xalqın xeyirinədir, buna qarşı çıxma.
3260 Mənim sözlərimə diqqətlə yanaş,
Doğru hesab etsən, ordan bura gəl.
3261 Mənimlə birgə ol, mənə kömək et,
Yoxsula yardım et, vəziyyətini düzəltsin.
3262 Bu sənə savabdır, mənə yaxşı ad,
İki dünya verər yerinə Allah.
3263 Məni yaxşı elə, özün yaxşı ol,
Kişi yaxşı ərdən alar yaxşı yol.
3264 Mənim yaxşılıq etməyimə bu gün səbəb ol,
Allah əvəzini verər, ey pəhləvan”.
3265 Nə deyir, eşit bir iranlı alim,
Onların yayılıb şöhrəti, səsi:
3266 “Bəy xalqa qarşı yaxşı olsa,
Bütün xalqa fayda dəyər, xalq xoşbəxt olar.
3267 Öz xeyirini istəsən – bəyin yaxşı olmasını istə,
Bəyin yaxşı olması – xalqın mənfəətinədir.
3268 Xalq yaxşı olarsa, özüyçün olar,
Bəy yaxşı olarsa, xalqı gün görər.
3269 Ancaq o adama insan demək olar ki,
O, başqalarına fayda versin, iş görsün.
3270 Bütün bəni-adəm xeyiri sevər,
Yaxşı haradadırsa, onu tərifləyərəm.
3271 Yaxşılıq odur ki, xalqa xeyir olsun,
Bu xeyirdən dolayı xalqa zövq versin.
3272 Yaxşı insan xalqa mehriban olur.
Mərhəmətli olsan, sən də yaxşı insan olarsan”.



3273 Bunu söylədim, məktubu bitirdim,
Sözümü qurtardım, qələmi qurutdum.
3274 Əgər bundan başqa olsa bir sözüm,
Qohumun deyəcək, sənə ayüzlüm.

* * *

3275 Məktubu qatladı, bağladı, üstünü möhürlədi,
Uzatdı, verdi, Öydülmüş yaxınlaşıb aldı.

* * *

3276 Elik dedi: – Yola düş, daha nə kimi
*Lazımlı söz varsa, ona çatdır, ey hakim.*
3277 İndi çalış, onu yanıma gətir,
Onsuz qayıtma, ey igid.
3278 Bilikli nə demiş, eşit bir özün,
Müdrik elçi göndər hər sözünü tapşır.
3279 İndi nə tapşırım sənə başqa söz,
Bütün söz səndədir, de, ey könlü düz.
3280 Nə söz lazım olsa, söyləsin dilin,
Necə lazım gəlsə, hərəkət edin.

* * *

3281 “Baş üstə!” dedi, durub çıxdı Öydülmüş,
O gözəl tərbiyə sahibi imiş.
3282 Atına minərək evinə çatdı,
Soyundu paltarı, qurşağı atdı.
3283 Günəş döndü, başını yerə əydi,
Dünyanın parlaq üzü qırmızı sisə büründü.
3284 Niqabını saldı, üzü tutuldu,
Gözəl zülfü hər tərəfi örtü.
3285 Gecə abdəst aldı, qıldı o, namaz,
Döşək saldı yatdı, uyudu bir az.
3286 Birdən silkələnərək oyandı, başını qaldırdı,
Sis göy üzünü qara zənciyə döndərmişdi.

3287 Abdəst alıb, danüzü namaz qıldı,
Dua etdi, təsbeh çevirdi bir az.
3288 Üzünü örtən ipək qalxan sıyrıldı,
Gülən parlaq üz kimi dünya aydınlaşdı.

## XL

## ÖYDÜLMÜŞÜN ODQURMUŞUN YANINA GETMƏSİNİ BƏYAN EDİR

3289 Tutub atının tərkini yəhərlədi,
Evdən durub qohumunun yanına gəldi.
3290 Gəlib qohumuna yaxınlaşınca
Atından enib düşdü, qapıya gəldi,
3291 Əlilə yavaşca yapını döydü,
Odqurmuş ibadəti dayandırıb yerindən qalxdı.
3292 Qapını açıb çıxdı, qohumunu gördü,
Qucaqlaşıb öpüşərək salamlaşdı.
3293 Əlindən tutub dərhal evə apardı,
Əlindən tutaraq yer göstərdi, oturtdu.
3294 Qohumunu gördüyünə çox sevindi,
Allaha çox həmd-səna, şükür etdi.
3295 Ayrılıqdan sonra təkrar görüşmək,
Gəlib adamı salamat görmək böyük səadətdir.
3296 Qohumlardan uzaqlaşdıqdan sonra
Yaxınlıq hiss ilə təkrar qovuşmaq nə xoşdur.
3297 Qohumları bir-birinə mehribanlıq,
Yaxınlıq göstərməsi çox gözəl şeydir.
3298 Qohumun-qohuma mərhəmətlə,
Könüllə bağlı olması nə gözəldir.
3299 Eşit gör nə deyir mehriban qadaş,
Yaxınlıq göstərən könüldaş adaş:
3300 "Bir-birini itirmiş, sonra görüşmüş adamların
Qəmi qısa olar, sevinci uzun.
3301 Ayrılıqdan sonra iki adamın,
Sağ-salamat qovuşması nə gözəldir".



### ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

3302 Odqurmuş qohum-qardaşı soruşdu,
Öydülmüş: – Salamatdırlar, – deyə xəbər verdi.
3303 Odqurmuş soruşdu: – Söylə bir mənə,
Nə yaxşı gəlibsən, nə oldu sənə?
3304 Eşitdim olursan Eliklə birgə,
*Xalqa xeyirin dəyir biliklə birgə.*
3305 Xalqa yük çəkirsən, ağırdır yükün,
Necə qoyub gəldin buraya bu gün.

### ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3306 Öydülmüş söylədi, dedi ki, özüm
Səni arzuladım, ey gözəl üzlüm.
3307 Səni çox maraq elədim, ona görə də
Səni görmək üçün durub gəlmişəm.
3308 Çoxdan can atırdım səni görməyə,
İndi fürsət tapdım gələ bilməyə.
3309 Xeyli vaxt keçibdir, səni görmədim,
Səninçün darıxdım, imkan bulmadım.
3310 Vaxtı bu gün imiş, axır ki, yetişdim,
Sənə qovuşduğum üçün şükür edirəm.
3311 İnsan sağ olsa, arzusuna çatar,
Ey mənim mehriban quzum.
3312 Dövranını tez keçib-getdiyini,
Sınamış kişi eşit nə deyir:
3313 "İnsan salamat olsa, arzusuna çatar,
Həyat dilək üçün bir sərmayədir.
3314 – İnsan sağ olarsa, arar-tapşırar,
Sağ olsa, ayrılar, yenə qovuşar.
3315 Dirilik dilə sən, dilək diləmə,
Diləyə çatmaqdı dirilik köməkdir.
3316 Allah verdi axır diləyimi mənə,
Sağ-salim yenidən sənə qovuşdum.
3317 Bundan başqa bir sözüm də var,
Dinləsən, onu da deyərəm".

## XLI

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA SÖHBƏTİNİ BƏYAN EDİR

3318 Odqurmuş söylədi, dedi ki, sözünü
Eşitdim, sən də sözümü eşit.
3319 Çəkdiyin qayğının yerinə Allah,
Ehsan etsin min-min yaxşı ad.
3320 Başqa söyləyəcəyin nə söz varsa,
Onu da söylə, qoyma qalsın.

### ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3321 Öydülmüş söylədi: – Bax sözüm budur,
Səni görən kimi gözümə işıq gəldi.
3322 Adam bir diləklə yerisə yolu,
Düşməz çox zəhmətə, ey biliyi ulu.
3323 Sınamış adam nə deyir, eşit,
Mənaya diqqət et, ey könlü rahat:
3324 "Can atsa bir işə arzu və dilək,
Arzu hər addımda olacaq kömək.
3325 Diləklə gedənə uzaq yer yaxındır,
Üzünü görəndə ürək can tapır".
3326 Öydülmüş davam etdi, dedi: – Özüm,
Daim səni düşünürdüm, dilimdən düşmürdün.
3327 Kəndi, şəhəri, qohum-qardaşı atdın,
Adamlardın uzaqlaşdın, burda tanış-bilişin yoxdur.
3328 Təkbaşına ağır zəhmətə qatlaşdın,
Ac, çılpaq qalıbsan, özünə zülm edirsən.
3329 Sənə qohumların ürəyi yanır,
Görmək istəyirlər, tapa bilmirlər, ürəkləri sıxılır.
3330 İnsan oğlu təkbaşına yaşaya bilməz,
Sən burda yalnızsan, xəstələnə bilərsən.
3331 Bu qayğı məni evdə yatmağı qoymadı,
Qüssə-qayğı ilə bacara bilmədim, gəldim



3332 Tanrı cəhənnəmi sənin üçün yaratmadı,
Bu əzabların hamısını sənə ayırmadı,
3333 Qəmlə özünü nə üçün üzürsən,
Mənə bunu açıq söylə, bilim.

### ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3334 Odqurmuş söylədi, dedi: – Sözünü,
Eşitdim, sən özün də sözümü eşit.
3335 O söylədiyin sözlər sənin mehribanlığından xəbər verir,
Bu, qohumluq nişanəsi, yaxınlıq əlamətidir.
3336 Qohum qayğısını qohum çəkməsə,
Yad çəkməz, onun nə vecinə.
3337 Mən də qohum-qardaşdan ayrılaraq,
Niyə bu qədər müddət burada qaldım?
3338 Baxıb gördüm ki, dinimin mənfəəti,
Özümün də mənfəətim buradadır.
3339 Ona görə qalxıb bu yerə gəldim,
Xəlvətə çəkilib Allaha ibadətə başladım.
3340 Bu dünya işinə qarışmış kişi,
Tutmaz ibadətlə axirət işi.
3341 Xalqa qapısını tamam bağlamayınca
İnsan yaradan rəbbə ibadət edə bilməz.
3342 İnsan ibadətdən zövq ala bilmək üçün
Həvəsini, nəfsini içində boğmalıdır.
3343 Nə deyir, eşit bir imanlı kişi:
"Nəfslə vəhdətdə olmaz din işi.
3344 Dinin düşmənidir hava-nəfs, ulu,
Yolunda azdırır ikisi qulu.
3345 Nəfsinə qapılan insan onun qulu olur,
Tənin arzusuna uysam, məni qul edər.
3346 Nəfsinə basılma, ağıl ilə kəs,
Tənin baş qaldırsa, bilik ilə bas.
3347 Buna görə şəhəri, kəndi qoyub,
Ağır zəhmətə düşərək buraya sığındım.
3348 İnsanlardan ayrı yaşamaqla
Boş söz danışmıram, qeybət etmirəm.

3349 Tənha yaşayırsan dedin, ay qardaş,
Zikrullah mənə yox kafidir, adaş.
3350 Yaxın qohum-qardaşdan uzaq oldum,
Ac və tox vaxtımda onlara yük olmadım.
3351 Xalqın könlü yuxadır, onu qorumaq çətindir,
Burada könül sınsa, adil Tanrı var.
3352 Məndən xalqa xeyir dəyməsə də,
Onlar məndən zərər də görməzlər.
3353 Fayda və zərər, yaxşı və pis,
Allahdandır, onun təqdiridir.
3354 Yuxarıdakı ərşlə aşağıdakı torpaq arasında
Hər şey eyni şəkildə Tanrıya məxsusdur.
3355 Ey şöhrətli, insanlar arasında nə var –
Fayda, yaxud zərər, ziyan – sən onu bilirsən.
3356 İbadətin nə xeyiri var deyə soruşursan,
İbadət qulluqdur, qula qapıları açır.
3357 Qul adı ona görə qula ünvan oldu,
O, dağa çəkilib gecə-gündüz ibadət etməlidir.
3358 Qadir Tanrı yaratsa da, yaratmasa da,
Qula ad verilməmiş olsa da.
3359 Bu yalnızlığın mənə zərəri yoxdur,
Din və can sağlığını mən bunda tapdım".
3360 Bu beyti söyləyən nə deyir, eşit,
Onun zahirinə yox, daxilinə və mənasına bax:
3361 "Ey mahir insan, yalnız və yoldaşsız yeri,
Bax, tutuquşu danışmağı tək öyrəndi.
3362 Qul yalnız və təkbaşına ibadət etsə,
Bu yalnız adamdan xalqa zərər dəyə bilərmi?
3363 Xalqa qarışmağı sən öydün, qardaş,
De necə qarışıb olmalı yoldaş?
3364 Yanıma gələndən bəri mən bu gün,
İbadət etmədim, bir bunu düşün.
3365 Təkcə sənin ilə görüşmək üçün
Bunca ziyan çəkdim, güc göstərmə.
3366 Yaxşı, indi durub xalqın arasına getsəm,
Onda ibadətə əlim çatarmı?"



## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3367 Öydülmüş söylədi: – Sözünü eşitdim,
Sən də məni eşit, üzünü çevirmə.
3368 Sən deyən sözlərin hamısı düzdür,
Həqiqətdə isə bunlar bir bəhanədir.
3369 İstəsən yüksəlsin, yayılsın adın,
Xalqa xeyir ilə keçsin həyatın.
3370 İnsanlar insandan bir fayda görməsə,
Onun yaşadığı nədən bəlli olar?
3371 İnsan evlənməli, oğul-uşaq sahibi olmalıdır,
"Övladsızdır" sözü insana söyüşdür.
3372 İnsanların seçkini nə deyir, eşit:
"Nəslin kəsilməməsinin dərmanı qadındır".
3373 Sonsuz adam öləndə peşman oldu:
"Ey məndən sonra gələn, oğul-uşaq sahibi ol" dedi.
3374 Kimin ki, öləndən sonra oğlu qalıb,
Ona "yaşamayır" demək olmaz.
3375 Övladsız ölənin nəsli kəsilər,
Dünyada adı itər, yeri boş qalar.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3376 Odqurmuş cavab verdi, dedi: – Düzdür,
Lakin bunun başqa bir şəkli də var.
3377 Əgər oğul-qız yaxşı olarsa,
Bu iş sən deyən kimidir.
3378 Xeyirsiz olarsa, uladar səni,
Öldünmü, o saat unudur səni.
3379 Pis olsa adına qarğış edərlər,
Yadlar, yabançılar goruna söyüş edərlər.
3380 Qız-oğul yağıdır, yağı nə gərək,
Yağısız yaşamaq daha yaxşıdır.
3381 Yağıdan insana nə xeyir gələr,
Ata əleyhinə şahidlik edər.
3382 Nə xoş bilik vermiş bilik ustadı,
Qaçılmaz kölgədir övladın adı.

3383 Biliklinin buna bənzər bir sözü vardır,
Diqqət et təmizqəlbli insan düz deyir:
3384 "Özünü üzürsən oğul-qız deyə?
Qiymət verən övlad varmı əməyə?
3385 Haram mal yığarsan öləndə, qalar,
Əzabla gedərsən, başlar yeməyə.
3386 Gəmiyə minmişdir sanki evlənən,
Dənizə çıxacaq gəmiyə minən,
3387 Oğul-qız doğulsa, gəmi dağılar,
Gəmi suda sınsa, hamı boğular.
3388 Oğul-qız atasına qarşı rəhmli ol,
Oğul-qız atasının yediyi ağıdır.
3389 Xeyirsiz oğul-qız atadan sonra
Ata-anasının adını anmaz.
3390 Belə bir uşaqdan gəl gözlə vəfa,
Onun işi pislik, əməli cəfa.
3391 Oğul-qız atası min cəfa görər,
Bəlanı, möhnəti fil kimi çəkər.
3392 Dost-yoldaş, qardaş tap dedin,
Bu yaxşıdır, ancaq onların yükü ağırdır.
3393 Bilikli hakim yenə gözəl demişdir ki,
İnsanın qəlbi yuxadır, onu qorumaq çətindir:
3394 "Könül şüşə kimidir, ey oğul,
Onu qoru ki, qırılmasın.
3395 Könül çox nazlıdır, sınanmış olar,
İstidə əriyər, soyuqda donar.
3396 Dostun könlü sınsa, kəsilər yağı,
Yağı olan yerin nə yaşamağı?
3397 Yağı olan həyat qaydasız olar,
Harda yağı varsa, faydasız olar.
3398 Nə qədər kiçik də görünsə sənə,
Ey igid, düşməni böyük say yenə.
3399 Çibin düşmən olub fillə döyüşər,
Nə vaxt fili sancsa, atılıb-düşər".
3400 Eşit gör nə deyir yağılı kişi,
Yağıyla döyüşmək olubdur işi:
3401 "Sən kiçik düşməni böyük san hər vaxt,
Qorxuram söyləmə, dayan, dur, sarvaxt.
3402 Düşmənin var isə, ayıq ol daim,
Yağıya yağı ol, yaxşıya – xoşbəxt".

ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3403 Öydülmüş cavab verdi, söylədi:
– Sözümü dinlə, qəlbinə yerləşdi.
3404 Bilərək yaratdı dünyanı Tanrı,
Halal ruzi verdi ki, həyat var olsun.
3405 Xoş olar taparsa insan yaxşı eş,
Eşi yaxşı olsa, yaxşı gedər iş.
3406 Fayda verə bilsən, xalqla qayna-qarış.
İnsanlara xeyir vermək insanın özünə xeyirdir.
3407 Ey comərd, tək-tənha yaşayan adam
Başqalarına nə fayda verə bilər?
3408 Faydasız hər adam ölü kimidir,
Ey igid, xeyir ver, sən ölü olma.
3409 İnsanın çox olsa tanış-bilişi,
Yayılar şöhrəti, görülər işi.
3410 Yetər bu dünyada duz-çörəyinə,
Axirət dünyada hər diləyinə.
3411 Sənə fəda olar pis gündə özü,
Şad olsan sevincindən parlayar gözü.
3412 Dostlar ərdəmini ölkəyə yayar,
Sənin qüsurunu örtər, bağlayar.
3413 Ər yatsa, yağıdır onu oyadan,
Ərdəmin, qüsurun ellərə yayan.
3414 Yağı olmasaydı, ərin mərdliyi,
Adı və kökü ölkədə bilinməzdi.
3415 Kimin ki, ərədəmi çoxdur dünyada,
Onun yağısı da çoxdur dünyada.
3416 Kimin ki, ərdəmi, soyu yüksəkdirsə,
Ölkənin hər yerində düşməni də o qədər çoxdur.
3417 Bax, yaxşı adamın düşməni çoxdur,
Pis adam ölüdür, düşməni yoxdur.
3418 Kimin ətrafına çoxlu düşmən yığılmışsa,
Bil ki, onun ərdəmi digərlərindən çoxdur,

3419 Düşmənlə çarpışa-çarpışa ərin adı böyüyür,
Düşmənsiz adamın adı böyüməz.
3420 Eşit gör nə deyir bu ərdəmli ər:
"Ərdəmlə hər adam arzuya yetər.
3421 Ona min ağızdan alov saçılar,
Gör necə ərdir o, min yağısı var.
3422 Min köpək ulayıb düşər dalına,
Onların önündə qaçar canavar.
3423 Tək olanda qeybət qılmıram, dedin,
Dilimi günaha batırmıram, dedin.
3424 De, kimin haqqında danışacaqsan,
Yanında heç kim yox, xalqdan uzaqsan.
3425 Ər odur ki, xalq arasında gəzər,
Dilini qoruyar və yuxarı başa keçər.
3426 Qaba sözə yumşaq cavab vermək,
Acı sözə şirin cavab vermək lazımdır.
3427 İnsan yük daşıyar, özü olmaz yük,
Cəfa göstərənə göstərər vəfa.
3428 Könüldən atmalı qisası, kibri,
Eyni olmalıdır sözü və fikri.
3429 Eşit gör nə deyir bu yaxşı insan,
Yaxşılıq eləyib qazanmış ad-san:
3430 Qaba söz söyləsən kiməsə əgər,
Könlün o acını çox illər çəkər.
3431 Kim sənə söysə, onu öy,
Onda onu axmaq, səni nəcabətli bilərlər.
3432 Cəfa eyləyənə sən göstər vəfa,
Mərd vəfa göstərər, pis adam cəfa.
3433 Qohum-qardaş səndən uzaqlaşsa da,
Sən həmişə onlara yaxınlaş, ey dost.
3434 Zalım sənə zülm eləsə,
Onu bağışla, dinin yolu budur.
3435 Qul-qaravaş günah etsə, bağışla,
Bu bağışlama axirətdə sənə azuqə olacaq.
3436 İgidlik budur, ona görə ərlər zəhmət çəkir,
Səbirlə ölümü gözləyirlər.
3437 Bu gün sən bir evdə yalqız qalmaqdan
Nə fayda gözləyirsən, ey xoşxasiyyət?



3438 Rahatlıq, arzu və neməti gözünlə görmədin,
Gümüş, cəvahir, qızıl, heç misə də sahib olmadın.
3439 Sarayın, mülkün, yerin, yurdun yoxdur,
Atın, araban, qızın, oğlun da yoxdur,
3440 Adamlar üstündə hakimiyyətin yoxdur ki,
Ondan sui-istifadə etməyəsən, təmiz ad qazanasan.
3441 Nə tapdın ki, ondan vaz keçdin,
Hansı dəli səni zahid adlandırdı?
3442 Əsl adam çox yerinə aza qail olar,
Belə adam zahidlik mərtəbəsinə yüksələ bilər.
3443 Ancaq axtardığını tapmayan kəs zahid olar,
Səbirdən başqa çıxış yolu olmaz.
3444 Əsl adam odur ki, min arzuya çatır,
Ondan mərdliklə üz çevirə bilir.
3445 Malını kasıba yedirib-içirir, paylayır,
Bayata sidq-ürəkdən ibadət edir.
3446 Gələn nemətlərə könül bağlamaz,
Əlindən gedənə qəmlə ağlamaz.
3447 Arzusuna yetmək üçün qüvvəsi olduğu halda,
Özünü saxlayar, könlünə, dilinə hakim olar".
3448 Diqqət etsən bu sözün mənası buna uyğundur,
Dinlə və ona əməl et, ey xoşqılıq:
3449 "Ər odur hər şeyə onda ərk ola, lakin
Nəfsə qapılmaya, özünü bərk tuta.
3450 Ərənlər içində əsl ər odur ki,
Bir arzusuna nail olan tək ona hakim olur".

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3451 Odqurmuş cavab verdi: – Doğru söylə,
Arzun nədir, ey ay kimi gözəlüzlüm?
3452 Mən nə desəm, rədd edirsən,
Sözümü bəyənmir, etiraz edirsən.
3453 Açıqca de görüm, dinləyin nədir?
Nə istəyirsən, açıq de və istə.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3454 Öydülmüş söylədi: – Buraya özüm
Bir məqsədlə gəlmişəm, sözümü açım;
3455 Bu Gündoğdu Elik tanıyır səni,
Sən ona gərəksən, göndərdi məni.
3456 Səni görməyi çox arzu etdi,
Səni çağırmaq üçün məni dəvətçi göndərdi.
3457 Nə qədər ağır olsa da getməlisən,
Elikə dəyib onunla görüşməlisən.
3458 Elik çox mehriban, gözəl insandır,
Xalqın çox sevdiyi yaxşı insandır.
3459 Üzünü kim görsə, bil sevinir,
Hər iki dünyada o, mutlu olur.
3460 Nə deyir, eşit el-şəhər bəyi,
Ölkənin işində ağıl sahibi:
3461 – Qanuna riayət edən bəy əsl bir səadətdir,
Onun səadətindən hamıya pay düşür.
3462 Harada yüksəlsə əsil bəy adı,
Oraya gedən insan səadət qazanar.
3463 Bil, adil qanunlar göyə dirəkdir,
Qanun düz olmasa, göy düşəcəkdir.
3464 Belə adil bəylər olmasa diri,
Tanrı düz tutammaz yeddiqat yeri.
3465 Adil bəyin üzünü kim görsə şad olar,
Savaba girər, günahdan qurtular.
3466 Bilirsən, bu gün mənim adam olmağıma,
Səbəb Elikdir, o mənə kömək etmişdir.
3467 Tanrı mənə dərrakə, ağıl və bilik verdi,
Ona görə hər yaxşılığı etməyə əlim çatdı.
3468 Allah bütün yaxşılara bacarıq verdi ki,
Xalqın yükünü çəksin, ona xeyir versin.
3469 Səni də çağırır o Elik bu gün,
Çalışaq əl-ələ, açılsın düyün.
3470 Məni sənin yanına dəvətçi göndərdi,
Ey mərd igid, məni tək qaytarma.
3471 Sənə öz əli ilə məktub yazdı,
Oxu gör nə yazır.



* * *

3472 Çıxartdı məktubu Odqurmuşa verdi,
Odqurmuş aldı, bir az qayğılı açdı.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

3473 Məktubu oxudu, düşündü uzun,
Dedi: – Mənası var burda hər sözün.
3474 İndi Elik gəl deyir, dəvət edir,
Hər cür yaxşılıqları bir-bir sayır.
3475 Bunlar mənim üçün çox böyük bir işdir,
İndi mənə bir məsləhət ver.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3476 Öydülmüşü cavab verdi, dedi: – Elik
Həmişə səndən bəhs edir, dilindən düşmürsən.
3477 Dilini tərpədəndə adın onun ağzından çıxır,
O səni dörd gözlə gözləyir.
3478 Könül kimi sevərək arzulasa,
Hər sözdə adı dilindən düşməz.
3479 Bu beyti oxu gör, özünü sevdirmiş adam nə deyir,
Sevgilinin üzü könlü doyurar:
3480 Könül kimi sevsə, görər gözündə,
Gözü hara baxsa, uçar üzündə.
3481 Könüldə nə arzu, diləyi varsa,
Sözə başlayınca, gələr dilinə.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3482 Odqurmuş cavab verdi, söylədi: – Mənə
Bir məsləhət ver, nə edim, ey igid?
3483 Mehriban qardaşım, sənsən ən yaxın,
Bir söz de, sən ödə qohumluq haqqın.

3484 Səndən bu işdə məsləhət,
Biliyinlə məsləhətə münasib söz gözləyirəm.
3485 Qardaşsan, istəyirsən məni dost qəbul elə,
Qardaşla dost arasında elə bir fərq yoxdur.
3486 Doğrudan bağlısan bu gün sən mənə,
Mənə məsləhət ver, möhtacam sənə.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3487 Öydülmüş cavab verdi, dedi: – Bunu sən
Məndən soruşma, ey müdrik insan.
3488 Elik məni dəvətçi olaraq göndərdi,
Mən sənə nə məsləhət verə bilərəm?
3489 "Varalım" deməkdən başqa yox sözüm,
Sənə necə "varma" deyim mən özüm?
3490 Səninlə birlikdə olmaq mənə xeyirdir,
Öz xeyirini bilməyənlə məsləhətləşməzlər,
3491 Eşit gör nə demiş bilikli çigil[1]:
"Ey biliksiz, həm dinlə, həm boyun əy.
3492 Mənafeyi olan adamla məsləhət etmə,
Bundan sənə xeyir gəlməz, ey müdrik insan.
3493 Yalnız o adama gənəş ki, ay qardaş,
Onun bu işdə xeyiri yoxdur.
3494 Öz xeyirini, mənfəətini dilədiyi üçün
Qəsdən yarayana yaramaz deyər.
3495 Bəzi işləri hökmən genəşmək lazımdır,
Ancaq yenə də işi könül istəyincə görməlisən.
3496 Özünə hamıdan yaxınsan özün bilirsən,
Məndən bu işə məsləhət istəmə.
3498 Buraya səni görmək üçün qalxıb gəldim,
Məsləhətim budur: qalx, yürü, oraya gedək.
3499 Xalq arasında savab və yaxşılıq
Bu yerdə olmaz, bu, şübhəsizdir.
3500 Kənd-şəhər içində yaxşılıq çoxdur,
İndi sənə onları bir-bir açıq söyləyim.

[1] Ç i g i l – qədim türk boylarından biri



3501 Bunları doğru söylədiyimi bilirsən,
Rəbbim bilir ki, sənin yaxşılığını istəyirəm.
3502 İnsanlardan qaçırsan, onlar sənə nə etdilər,
İnsanlara qarış, kişi işi gör.
3503 Müsəlman işi gör, xeyirə yara,
Sonra da cənnətə yaxşı yer ara.
3504 Dilin, könlün doğru, əməlin bütün,
Harada istəsən xoşbəxt ömür sür".
3505 Tək-tənha yaşama kişilər ara,
Eybi özgədə yox, özündə ara.
3506 Buna bənzər bu beyti, ey hakim,
Oxu və öz işinə tətbiq et:
3507 "Haraya istəsən yeri, yaxşı yol,
Kök-əsil istəmə, özün yaxşı ol,
3508 İnsanın yaxşı unutmaz özün,
Haraya gedərsə, istər doğru yol.
3509 İnsan gərək daim yaxşılıq edə,
Elə adam həmişə sevinc tapar.
3510 Yaxşılıq hər yerdə yaxşıdır,
Yaxşılığın qarşılığı da yaxşılıqdır.
3511 Sən yaxşılıq elə, pis olma,
Onda qorxmadan istədiyin yerdə gəzə bilərsən".

## XLII

## ODQURMUŞ ÖYDÜLMÜŞƏ DÜNYANIN EYİBLƏRİNİ BƏYAN EDİR

3512 Obqurmuş söylədi: – Mən səni dinlədim,
İndi sən mənim sözlərimi dinlə.
3513 Bu dünya özünü sənə çox sevdirmiş,
Onun bütün eyibləri sənə məziyyəti kimi görünmüşdür.
3514 Sənə heyrət etmirəm, bir məsəl də var:
Sevilən şeyin eybi görünməz.
3515 Dünya özünü sevdirdiyi üçün bütün eyibləri
Sənə fəzilət görünmüşdür, ey ulu.

3516 Sevmiş insan nə deyir, eşit:
"Sevgilinin eybi sevən üçün ən böyük fəzilətdir".
3517 Ey şöhrətli, sevgilinin əlaməti budur,
Sevilənin qüsurları hünər sayır.
3518 Sənin dünyanı sevdiyinin əlaməti budur,
Könlün bütün qüsurları hünər sayır.
3519 Sən necə öyərsən dünyanı mənə,
Onun yüz eybini sayaram sənə.
3520 Adəm günaha batdı, Tanrı onu cəzalandırdı,
Qadir Tanrı bu dünyanı ona zindan elədi.
3521 Zindanda nə arzu, nə dilək axtarırsan?
Dilək, arzu, səadət ancaq cənnətdə olur.
3522 Bax, Adəm cənnətdə buğda yedi,
Bu dünya ona təmizlənmə yeri olaraq yaradıldı.
3523 Şeytanın sevdiyi şey Tanrının qamçısıdır,
Tanrının sevib atdığını o daha çox sevər.
3524 Tanrı sevdiyi quluna dünya malı vermir,
Bu qayda ilə onun yolunu təmizləyir.
3525 Bu dünya səadəti heç də yaxşı şey deyil.
Adamı Tanrıdan uzaqlaşdırır, bu, din üçün fəlakətdir.
3526 "Allahamı" deyə gərilən adam
Dünyanı tutmaq istədi, it kimi gəbərdi.
3527 İnsan varlandıqca zayı çıxır,
Təvazökarlıq kasıblıqla mümkündür.
3528 Çılpaq doğulmuş adam çılpaq da ölməlidir.
Qoyub gedəcəksənsə, dünya malı yığma.
3529 Ey fani insan, özünü niyə aldadırsan,
Sən burada iki günlük qonaqsan.
3530 Bilirsən ki, həyat ölmək üçündür,
Ölüm hazır durub vaxtını gözləyir.
3531 Bir qapı açıldı – dünya qapısı,
İkinci qapı ölüm qapısıdır, hamı ordan keçəcək.
3532 İki günlük ovunmaq üçün
Özünü göz görə-görə oda atma.
3533 Dönük dünya vəfasızdır, səadəti qərarsızdır,
Nə versə, tez geri alır.
3534 Nə bəyə, nə də qula fərq qoymur,
Bu yaxşı, bu pisdir deyə ayırmır.



3535 Birini özünə bəy seçir, ancaq
Sabah digərini bəyliyə dəvət edir.
3536 Diqqət etsən, dünya kölgə kimidir,
Qovsan – qaçır, qaçsan ardınca düşür.
3537 Buna bənzər belə bir söz var,
Ey saflürəkli, bunun mənasını anla:
3538 "Kim ki, dünyanı qovar, dünya ondan qaçar,
Kim dünyadan qaçsa, dünya onu qovar".
3539 Dünyanın malı dinlə düşməndir,
Dünya malı dini unutdurur.
3540 Dünya bəzənərək hamının qarşısına çıxır,
Bəzəkli gəlin kimi könül ovlayır.
3541 Könül versən, qır-saqqız olur,
Yaxandan, qolundan yapışır, üyüdüb-tökür,
3542 Xasiyyəti, hərəkəti də vəfasızdır,
Əri ilə üç aydan artıq yola getmir.
3543 Kim ona könül verirsə bədbəxtdir,
Həyatını boş-boşuna fəda edir.
3544 Bu ömrün hər günü qızıldır,
Boş yerə sərf etmək düz deyil.
3545 Həyat hər cür yaxşılıq üçün sərmayədir,
Ey qüvvətli insan, onu boşuna xərcləmə.
3546 Bu dünya malının üç vəsfi vardır:
O halal, şübhəli, ya da haramdır.
3547 Halala hesab var, harama cəza,
Əgər şübhəlisə, ondan uzaq gəz.
3548 Dünya əvvəlcə özünü sevdirir, sonra sevəni qovur,
Rahatlıq içində ovudur, sonra ondan bezir.
3549 Gülər üzlə onu bəsləyir, kökəldir,
Sonra qayğı ilə yenə arıqladır.
3550 Sevincinə fikir ver, sonu qayğıdır,
Qayğı ilə keçən ömrün sonu sevincdir.
3551 Təpəsi nemətdirsə, dibi minnətdir,
Başı möhnətdirsə, sonu nemətdir.
3552 İmanlı, oyanmış insan nə deyir, eşit:
"Uzaq dur, bu dünya malından sənə zərər toxunar".
3553 Sənin sərvətin, bax, kasıblıqdır,
Sənin nəzərində kasıb əsl varlıdır.

8555 Qurduğun bu nizam pozulacaqdır,
Bu yazdıqların təkrar dağılacaqdır.
3556 Bu dünya tezliklə gedəcək,
O dünya tez gələcək, ayıq ol.
3557 Gedən, gündən-günə uzaqlaşıb gedər,
Gələn, qısa bir zamanda gəlib çatar.
3558 Bilikli adam fani şeyə könül verməz,
Ağıllı adam gələcək şeyə hazırlaşar.
3559 Ölümü bilən dünya səadətinə qapılmaz.
Öləni görən uzun müddət ovunmaz.
3560 Yolçu yol üstündə ev tikməz,
Köçən adam əşyasını evdə qoymaz.
3561 Sən qonaq, dünya isə mehmanxanadır,
Adam mehmanxanada çox qalmaz.
3562 Dünya malı heç də yaxşı deyil,
Ona sahib olanın xasiyyətini dəyişdirir.
3563 Təriqət sahibi malını-mülkünü haqqa verdi,
Zahid isə bu əsassız dünyanı tərk etdi.
3564 Tələ quran sənin gözünə görünməsə də,
Onun tökdüyü yem dünya malıdır.
3564 İnsan cahil, həm də acgözdür,
Beləsi tələyə necə düşməsin?
3566 Eşit gör nə deyir inanmış kişi,
Bu dünya işində sınanmış kişi:
3567 "Tələçi görünməz, yemini göstərər,
Bəzəkli gilin kimi könül ovlayar.
3568 Gözün aç, özün həris və cahilsənsə,
Yemini dadarsan, ayağın bağlanar.
3569 Dünya nemətlərini bir adam əlinə yığsa,
Rahatlıq içində min il də ömür sürsə,
3570 Nə xeyiri, mənzili qara torpaqdır,
Bu qara torpağın altıdır, çuxurudur.
3571 Keçirdiyin həyat sənə yuxu kimi görünəcək,
Nə etdinsə, onun əvəzini görəcəksən.
3572 O gün peşman olma, faydası yoxdur,
İl, ay, gün sənin əməllərinə şahiddir.
3573 Bütün dünyanın dadı bu üç şeydədir,
Üçünün də dadı bir-birinə bərabərdir:



3574 Bu üç şeyin biri yemək-içmək,
Biri də kişinin ovudan qadındır.
3575 Üçüncüsü isə sağlamlıqdır,
Ən əfzəli do elə budur.
3576 Bu üç şeyin sevinci, dadı
Digər üç şeyə dəyməz, ey ölkə başçısı,
3577 Yemək-içməkdir zövqlərin biri,
Əvəzində onların çıxması çox pisdir, ey dost.
3578 Bu dada üç barmaqlıq boğaz üçündür,
Ordan o yana keçəndə qarın doyar.
3579 Yemək həzm olmasa, ünsürlər pozular,
Ünsürlər pozulsa, adam yorğan-döşəyə düşər.
3580 Xəstəlik insan üçün ölüm müjdəçisidir,
Ey ayıq insan, ölümdə zövq yoxdur.
3581 Başqa bir zövq isə qadın zövqüdür,
Əvəzində soyuq su ilə yuyunmaq lazımdır.
3582 Ondan sonra oğul-qız doğulur,
Oğul-qız yükü ağır yükdür".
3583 Bu beyti söyləyən nə deyir eşit:
"Qadın və oğul-uşaq kişini gücdən salar.
3584 Qadınla bərabər olmaq çox dadlıdır,
Əvəzində soyuq su ilə yuyunmaq çətindir.
3585 Harada zövq varsa möhnət də oradadır,
Harada şirinlik varsa acılıq da oradadır.
3586 Əgər həyatın zövqü budursa,
Dünya dadsız bir möhnət yoludur.
3587 Zövq içində keçən dünya dadlıdır,
Axırda acı ölüm bunu dadsız edir.
3588 Dünyanın zövqü bu üç şeydir, ey xoşqılıq,
Bunların ardınca gələn möhnətləri eşitdin.
3589 Dünya bir düşməndir, bədən bir düşmən,
Bu iki düşmənin toru hər yana yayılmışdır.
3590 Üçüncü düşmən şeytan, din oğrusudur,
Tanrı bunlardan qorusun.
3591 Bunlardan ən sərt və yava düşmən bədəndir,
Ən çox xətada ondan çıxar.
3592 Allahın adını çəksən şeytan qaçıb gedər,
Dünyadan əl çəksən ondan xilas olarsan.

3593 Ancaq bədəndən necə əl çəkə bilərsən,
Onu ancaq ölüm səndən ayıra bilər".
3594 Bilikli hakim çox gözəl söyləmişdir,
Onun sözünü dinləmək lazımdır:
3595 "Bədənim mənə əzab-əziyyət verir,
Bəzən güldürür, bəzən də ağladır.
3596 Onun arzusuna əməl edərək dünyanı dolaşıram,
Bəzən ac, bəzən də tox yatıram.
3597 O bir arzusuna çatsa, başqa arzuya düşür,
Ona yetsə, insana tam hakim olur.
3598 Bədənimə qalib gəlib ona hakim ola bilmərəm,
Mərhəmətli rəbim, özün hakim ol.
3599 Bədən çox pis tinətlidir,
Onu qüvvətləndirdikcə, daha da azdır.
3600 Kökələn at qudurar və azar,
Sahibini yerə çırpar, ondan qaçar.
3601 Bədənə bax, sanki ov itidir.
Kökəlsə, sahibinin haqqın tanımaz.
3602 Qarnı doysa, ovun dalınca qaçmaz,
Sahibinin sözünə baxmaz, dayanar.
3603 Bədən kiçik uşağa bənzər,
Qarnı doyunca yaşıdlarının yanına qaçar.
3604 Qarın doysa, bədən tənbəlləşər,
Diləyincə olsun deyə, istədiyini vermə.
3605 Həyat cəmi-cümü üç gün sürür,
Bunlardan o yana bir neçə yuxu və gecə var.
3606 Bu üç gündən biri – sabahdır, biri keçən gündür,
Bu günkü həyat sabaha çatacaqmı?
3607 Bundan başqasını həyat sayma,
Sənə bunları izah etdim.
3608 Qadınla bir-iki saat olmaq
Ərin odunu söndürmək üçündür.
3609 Kişi odu necə gəldi söndürür;
Gözəl olsun, çirkin olsun, qucaqlar.
3610 Bütün boğaz dadı qarnı doydurmaq üçündür,
Qarın doydu, ən dadlı şeydən də əl çəkilməlidir.
3611 Qarın doysa arpa, ya halva birdir,
Artıq qalar, keçəcəyi yol bağlanmışdır



3612 Şəkər, halva, arpa, darı yesə də,
Doyub yatan səhər yenə ac qalxar.
3613 Mal sarıdan yoxsul olduğu halda
Gözü, könlü tox imanlı kasıb nə deyir, eşit:
3614 – Sən şirin dünya nemətləri yedin,
Mənsə gücüm çatan darı və kəpək yedim.
3615 İkimiz də doyaraq gecə yatdıq,
Gəlmiş günün saatı keçib getdi.
3616 Dünyanı nə qədər yığıb-yığışdırsan da,
Ondan iki parça bez götürəcəksən.
3617 Ölümdən sonra varlı ilə kasıb
Qara torpaq altda bərabər olurlar.
3618 Həyatda iki günlük rahatlıq üçün
Niyə öz-özünü aldadırsan?
3619 Sən dünya malını yığmaq üçün,
Ölümsə səni yaxalamaq üçün çalışır.
3620 Həyat hər gün səndən bir az da uzaqlaşır,
Bu ölüm fənadır, sənin kökünü qazır.
3621 Diri olan, şübhəsiz, öləcək,
Nə vaxt öləcəyini bilən yoxdur.
3622 Kiçik uşaq saqqalının çıxmasını,
Çıxdıqdan sonra ağarmasını gözləyir.
3623 Saqqal ağardısa, demək, ölüm gəlir,
Silah, ox-yay ölümə qarşı faydasızdır.
3624 Özünü göz görə zorla yandırma,
Bu dünya uğurunda özünü oda atma.
3625 Bax, sanki dünya malı acı sudur,
İçirsən, doymursan, heç damağın da nəmlənir.
3626 Quru qumuna bənzər bu insan özü,
İrmaq axsa, doymaz onun ac gözü.
3627 Bu dünya şərabdır, gözündən uçar,
Nə qədər qovarsan, o qədər qaçar.
3628 Nəfsi özündən uzaqlaşdıran və ibadətə gedən şəxs
Gözə görünməyən düşmənə fürsət verməz.
3629 Bədənə təslim olma, boyun əymə,
Ovutması iztirab, diləyi oyundur.
3630 Ötən həyat bir də qayıtmayacaq,
Qalan nə qədər davam edər, bilinmir.

3631 Barı qalan günü keçirmə sən boş,
Ölümə hazırlaş, ibadətə qoş".
3632 Eşit gör nə deyir oyanmış kişi,
Hər cür bulanıqdan süzülmüş kişi:
3633 "Dünən gecəni keçirdin,
Gələn gün də şübhəsiz keçəcək.
3634 Keçmişlə gələcək arasında bircə mənzil var,
Bir mənzillik həyat üçün bu qədər səs-küy salma.
3635 Xeyli zamandır ki, burda yaşayıram,
Vaxt keçdikcə nəfsin belini qırdım.
3636 İndi məni şəhərə, kəndə dəvət edirsən,
Orda nəfsimə əsir düşsəm, kim məni qurtarar?
3637 Bədən düşmən, özü də amansız düşməndir,
O hər yerdə tələ və tor qurmuşdur.
3638 Diləyinə uyma, dirən, müqavimət göstər,
Ağıllı adamlar bədənə təslim olmazlar".
3639 Eşit gör özünə hakim kəsilən ər,
Nəfsini yenərək özünü tutmuş ər nə deyir:
3640 "Bədənə əsir olma, ey bilikli ulu,
Əsir olsan, dinin əvəz, hədiyyə istəyər.
3641 O kişi bilikli adlana bilməz ki,
Nəfsinə qalib gəlnəyi bacarmasın.
3642 Ey diri könüllü, bədənə əsir olana
Ağıllı insan demək olmaz.
3643 Bədənə təslim olan adam
Doğurdan da biliksiz adamdır.
3644 Ey qardaş, özünü hava və həvəsə
Qapdıranlar ağılsız adamlardır".

* * *

3645 Bil ki, bu dünya belədir,
Onun bütün qüsurlarını saydım, özün fikirləş.



# XLIII

## ÖYDÜLMÜŞ ODQURMUŞA DÜNYA VASİTƏSİLƏ AXİRƏT QAZANILMASINI BƏYAN EDİR

3646 Öydülmüş cavab verdi, dedi:
– Ey mübarək insan, söylədiklərini dinlədim.
3647 Bir də buna qulaq as, çünki
Bu söz bilikli və ağıllı adam üçün ölçüdür.
3648 Dünyanın halı nə qədər pis olsa da,
Sən həyatı özünə çox da zəhər eləmə.
3649 Bu gün dünyanı özünə zorla daraltma,
Günahkar qul üçün Tanrının fəzli çoxdur.
3650 Əzabı çoxdursa, rəhməti də boldur,
Günahkar üçün rəhmət əziz bir şeydir.
3651 Əzabından qorx, nemətindən ümidini üzmə,
İbadət et, qul adını doğrult.
3652 Bütün dünya xalqı kəndləri, şəhərləri buraxıb
Ağır yük yüklənərək dağa getsəydi,
3653 Dünya pozular, hər tərəf boş qalardı,
Adəm oğlunun nəsli kəsilərdi.
3654 Tanrı bütün bu xalq üçün iki ev yaratdı,
Birinin adı cənnət, birinin adı isə cəhənnəmdir.
3665 Yenə bütün insanlar dünyanı əldə etmək üçün
Gecəni gündüzə qataraq yüyürsələr,
3666 Halal nemət qazanıb yeməli,
Bir qismini kasıblara paylamalı.
3667 Kaş bu pal-paltar və boğaz olmayaydı,
Təəssüf ki, onlarsız mümkün deyil.
3668 Danma Tanrı adından qorxaraq yaşa,
Ancaq onun fəzlindən də naümid olma,
3669 Qulluq bu ikisinin arasıdır, onu bil,
Yol budur, bu qulluq yolunu itirmə.
3670 Nə gözəl söyləmiş bilik verən,
Biliksizo öyüd nəsihət verən:
3671 "Rica ilə xofu özünə qanad et,
Bu ikisinin arasındakı yoldan çıxma

3672 Tanrı əmrlərini, qulluğunu yerinə yetir,
Saraya uça-uça gir, rahatlığa qovuş.
3673 Rica ilə xof iki qanad kimidir,
Bu ikisilə uçan göyə yol tapar.
3674 Suçum çoxdur deyə, ümidini kəsmə,
İbadətə güvən, ancaq ifrata varma.
3675 İbadət et, qulluq ancaq xidmətdən ibarətdir,
Adı qul olanın şüarı xidmətdir.
3676 Tanrı əmrini üstün, özünü ucuz san,
Özünü ucuz tutsan qiymətli olarsan.
3677 İbadətdə özünü yoxsul bil, yoxsul,
İbadətdə yoxsul, günahda varlı bil.
3678 Özün də, sözün də yaxşı olsa,
İnsanlar arasında özünü pis hesab et".

* * *

3679 Mən bildiklərimi sənə söylədim,
Sözə qulaq assan, sabah əvəz görərsən.
3680 Əgər sözlərimi qəbul etmirsənsə,
Cavab ver, ey mərd igid, mən geri qayıdım.
3681 Söz-söhbət çox uzun oldu,
Bu uzatmağın artıq faydası yoxdur.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3682 Odqurmuş başını əlləri arasına aldı,
Uzun-uzadı düşündü, başını qaldırdı,
3683 Dedi: – Ey qardaş, zəhmət çəkdin,
Qardaşlıq naminə bunları mənə dedin.
3684 Mənim yaxşılığımı düşünərək bunları dedin,
Tanrı əcr versin, qayğımı çəksin.
3685 Diqqət etdim, indi bu işdə mənə
Çıxış yolu görünmür, ey qəhrəman.



3686 Könlüm qəbul etmir, bu işdən qaçır,
Könülsüz işdən xətər gələr.
3687 Nə gözəl bilik vermiş biliyi böyük,
Özünü sevdirmiş qəlbi təmiz adam:
3688 "Hansı işi görmək istəsən,
Bu haqda könlünlə məsləhətləş.
3689 Sonra başqaları ilə məşvərət qıl,
Qəlbinə yatmasa, o işdən uzaq ol.
3690 Hamıdan yaxınsan özünə-özün,
Qəlbinə yatmayan işdən vaz keç, vəssalam.
3691 Ey könlü diri, könül bəyənməyən işdən
İnsana heç bir fayda gəlməz.
3692 Könül bu işi sevərək arzu etmədiyi üçün
Mən də ondan vaz keçərəm.
3693 Mən səndən üzr istəyirəm,
Ey seçkin insan, məni yerimdən etmə.
3694 Elikə xeyiri dəyəcək ərdəmlərim yoxdur:
Nə təbiətim, nə hərəkətim, nə də sözlərim.
3695 Özüm dünyadan qaçıb buraya gəldim,
Təkrar necə geri qayıda bilərəm.
3696 Özünü Tanrı qulluğuna həsr etmiş adama
İnsan qulluğuna yaraşarmı, ey xoşqılıq?
3697 Məni qoy Tanrı ibadətinə davam edim,
Sənin yaxşılığına dua edim.
3698 Bir-birimizi arzulayıb görüşmək istəsək,
Sən gəlmə, mən özüm səni taparam.
3699 Mən zəhmət çəkərəm, sən narahat olma,
Elikin xidmətində xalqın xeyiri üçün çalış".
3700 Səmimi, ürəkdən xidmət edən,
Qəlbən bağlı olan insan nə deyir, eşit:
3701 "Könül həyəcanlanaraq insanı hərəkətə gətirərsə,
Bil ki, arzu etdiyin iş tezliklə olacaq.
3702 İnsan arzu ilə yola çıxsa,
Yorulub yolda qalmaz, diləyinə çatar.
3703 Diləyə yetmək üçün yeriyən insan
Diləyinə çatar, yarı yolda qalmaz.
3704 Vəfası ilə şöhrət tapmış, sevmiş,
Özünü də sevdirmiş insan gözəl demişdir:

3705 – Könül yaxındırsa, iraq da yaxın,
Yaxını görməkçin ürəyə baxın.
3706 Şərqdən qərbə bir addım yoldur,
Sədaqətlə ödənsə yaxınlıq, haqqı".

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3707 Öydülmüş söylədi: – Eşit sözümü,
Sözünü eşitdim, tutdum özümü.
3708 Diləyin budursa sənin, ey qardaş,
Səndən incimirəm, qəlbini qırma.
3709 Kəsildi sözlərim, sağ-salamat qal,
Elikə məktub yaz, məni xəcil etmə.
3710 Elik öz əlilə sənə məktub yazıb göndərdi,
Sən getmirsən, heç olmasa məktub yaz.
3711 Sözlərini ölçüb-biçərək mənə cavab ver,
Mən geri qayıdım, ey müdrik alim,
3712 Həm söylə dilinlə, həm də məktub yaz,
Mən geri qayıdım, ey müdrik alim.

## XLIV

## ODQURMUŞUN ELİKƏ MƏKTUB YAZIB GÖNDƏRDİYİNİ BƏYAN EDİR

3713 Odqurmuş söylədi: – Bir az gözlə,
Məktub yazım, ey müdrik alim.

* * *

3714 Mürəkkəb-kağız istədi, əlinə qələm aldı,
Elikə məktub yazmağa başladı.
3715 Tanrı adı ilə sözə başladı;
Törədən, bəsləyən, köçürən, – dedi.



* * *

3716 Çoxlu tərif, saysız şükür söylər dilim
Tanrıya illər, aylar uzunu.
3717 Quru yeri, mavi göyü, günü, ayı
Qaranlığı, nuru, kasıbı, varlını o yaratdı.
3718 Sonsuz varlıqları, saysız canlıları xəlq etdi,
Hamısını ruzi verir, ac qoymur.
3719 O özü birdir, lakin yaratdığı ikidir,
Onun birliyi hesaba qatılmaz.
3720 O birdir, vardır, niyəsiz, necəsizdir,
Könüldən iraq tut, o, bənzərsiz, oxşarsızdır.
3721 UluIuq onundur, böyüklük onundur,
Qadir və hakimdir, yeganədir.
3722 Bütün bu saysız-hesabsız qulları o yaratdı,
Dilədiyinə hər cür ehsanı bəxş etdi.
3723 Bu qübbə evin içi palçıqdandır, qaranlıqdır,
Onun hakim qüdrəti buranı günəşlə işıqlandırdı.
3724 Mavi göyü yaratdı, yüksəklərə çıxardı,
Günəş, ay və ulduzlarla üstünü bəzədi.
3725 Altı qara yer və mavi sudur,
Üstü süzülmüş yel ilə oddur.
3726 İsti ilə soyuğu, quru ilə yaşı
Yaraşdırdı, xalqa qismətini verdi.
3727 İstədiyini istədiyi kimi yaratdı,
Bu işdə köməyə ehtiyacı olmadı.
3728 İstəsə yaramaz qulu əzizləyər,
İstəsə qulluq edəni zəlil edər,
3729 "Ol!" desə istədiyi dərhal olar,
Öz hökmünü hər şeydə keçirər.
3730 Min-min şükürlər əziz elçiyə,
O, yaxşı rəhbərə, doğru yolçuya.
3731 Elikə duaçı sifətlə məktub yazıram,
Ey müdrik, sənə salam edir, sağlıq arzulayıram.
3732 Elik lütf edərək mənə məktub yazmışdır,
Məktubu oxudum, gözüm sevinclə parladı.
3733 Mənə göndərdiyin fərmandakı sözlərlə
Mənə çoxlu öyüd, nəsihət verilmişdir.

3734 Bir də mavi mənsəb barədə,
Yemək-içmək haqda vədlər vardır.
3735 Bütün insanlar bunu arzu edirlər,
Bunlara yetmək üçün dünyanı gəzib-dolaşırlar.
3736 Əgər bu nemətlərə zəhmətsiz nail olsam,
Bu səadəti necə bəyənə bilərəm?
3737 Lakin bunun bir neçə qüsuru da var,
Özüm ora gəlsəm, bu yaxşılıqları zərər təqib edəcək.
3738 Bunlardan birini mən şəxsən bacarmıram,
Gəlib xidmət edə bilməsəm, üzüm ağ olmaz.
3739 Məndə üsul-ərkana, uyğun davranış yoxdur,
Üsul bilməyən xidmətçi nəyə lazım?
3740 İkinci – dünyanın mənə cəfa edəcəyini bilib,
Onu qabaqladım, mən ona cəfa etdim.
3741 Tanrıya sığındım, nəfsimə hakim oldum,
Rəbbim bu din və imanımı qorusun.
3742 Yeməyə, geyimə o qədər də ehtiyacım yoxdur,
Ondan artığı mənə yükdür.
3743 Boğazima yeməyi, əynimə geyimi
Yaradan Tanrı mənə yetirər.
3744 Məni o yaratdı, bu günədək bəslədi,
Ey dünya bəyi, o məni bundan sonra da bəslər.
3745 O sənə hər cür nazü-nemət verdi,
Verən rəbbim mənə də verməzmi?
3746 Ey comərd igid, bütün yaxşılığı, pisliyi,
Yoxsulluğu, varlılığı Tanrıdan görürəm.
3747 Mən Tanrının qapısını tutdum, ona qulluq edirəm,
Bütün xalqın yığılacağı əsl qapı budur.
3748 Sənə yaxud sənin qapına gəlsəm,
Can qoysam, səndən nə istəyə bilərəm.
3749 Biz ikimiz də Tanrı quluyuq,
Bu qulluqda eyni mərtəbədəyik.
3750 Qulun qula qulluq etməsi yaraşmaz,
Xidmətçiyə xidmət edənin qiyməti olmaz.
3751 İnsan himmət sahibisə, belə olmalıdır,
Tanrıya mətanətlə qulluq etməlidir.
3752 Alim, ağıllı, durmuş-oturmuş,
Təmiz qəlbli insan nə gözəl demişdir:



3753 "Acana, doyana qulluq etmə,
Niyə qulluq üçün büt axtarırsan?
3754 Durmadan tək Tanrıya tapın,
Gecə-gündüz açıq olan qapıdan ayrılma".
3755 Ey Elik, bu dörd hacəti yerinə yetir,
Mən də əl-üz öpərək sənə tapınım.
3756 Mən ölümsüz bir həyat,
Qocalığı olmayan gənclik istərəm.
3757 Sən məni daim sağ-salamat saxla,
Varlı et, kasıb və sərvətsiz qoyma.
3758 Bu dörd şeyi mənə vəd et, sənə qulluq edim,
Əziz canımı fəda qılım.
3759 Ey Elik, bu şeyləri mənə verə bilsən,
Mən də özümü qul edib sənə bağlanaram.
3760 Əgər bunları təmin edə bilməsən,
Məndən nə üstünlüyün var, söylə.
3761 Yemək və geyimdirsə, onlar varımdır,
Yenə lazım olsa, rəbbim verəcək.
3762 Əziz və ya ucuz olmaq Tanrıdandır,
Ölüm və həyat da ondandır.
3763 Bu həqiqəti bilən ağıllı, bilikli adam,
Ey elin rəhbəri, başqa cür hərəkət edərmi?
3764 Məni Tanrı qoruduğu kimi
Sən qoruya bilməzsən, ey əsil bəy.
3765 Gecələr gərək mən səni qoruyam,
Məni qoruyan isə Odur, sözümü açıq dedim.
3766 Sən doymamış mənə yemək gəlməz,
Məni doyduran kişi özü yemək yeməz.
3767 Araçı nə gərək, dara düşsəm özüm,
Dilim tərpənməmiş eşidir sözüm.
3768 Qapıçı və ya yol göstərən mənə mane olmaz,
Heç bir özündən razı, zorakı mənə söz deməz,
3769 Suç işləsəm, sən məni bağışlamayacaqsan,
Min suçum olsa da, rəbbim məni əfv edər.
3770 Nə deyir, gəl eşit günahkar qulu,
Açdı qəlb sirrini, danışır dili:
3771 "Ey əsl vəfalı, rəhmdil rəbbim,
Səndən rəhmdilini tapa bilmədim.

3772 Dara düşsəm, istədiyimi verirsən,
Kimsəsizlərə sən kömək edirsən.
3773 Xəstəliyimə şəfa, kədərimə sevinc, dərdimə dərmansan,
Sıxıntılı vaxtımda məni ovudansan.
3774 Güvəncim, ovuncum, sevincim,
Hamısı sənin icazənlədir, ey Ulu.
3775 Sənin qarşında günahlarım çoxdur,
Sənin rəhmətin qarşısında bu günah çox azdır.
3776 Günahımdan keç, bunun sənə zərəri yoxdur,
Məni cəzalandırmağın sənə xeyiri yoxdur.
3777 Günahım çoxdursa, sənin rəhmətin də var,
Mənə qarşı rəhmdil ol, sənə bu yaraşar.
3778 Düzdür, mən cəzaya da layiqəm,
Bağışlasan – bağışla, sən də buna layiqsən.
3779 Bilirsən ki, səni "bir" rəbbim bilirəm,
Bilirəm ki, sənə "bir" dediyimi bilirsən.
3780 Mən anlaqsızam, buna görə əzabdayam,
Sən həlimsən, həlimlik səndən gəlir,
3781 Bu gedəcək olan can əmanətidir,
Əmanət başqasına əmanət verilərmi?"
3782 Ey Elik, bu dünya müvəqqətidir,
Gün keçdikcə həyat əksilir, tükənir.
3783 Nəyə güvənərək uzun əməllər bəsləyirsən,
Nəyə sevinərək özünü ovundurursan,
3784 Ölənləri görürsən, sən də öləcəksən,
Bütün canlılar bir gün torpaqla örtüləcəklər.
3786 Qafil olma, ey Elik, oyan,
Özündən sonra yaxşı ad qoy.
3887 Keçən günlərin hədər olsa da,
Barı gələcək günlərin hədər olmasın.
3788 Keçən gün içindən gərək olan şeyləri al,
Köçürən gələnədək hazırlaş.
3789 Mən öz gücümlə bunları görə-görə,
Sənin yanına necə gəlim?
3790 Bu cəfakeş dünyadan könlümü çəkdim,
Rahatca, vəfalı rəbbimə sığındım.
3791 Ey Elik, sən məni öz halımda qoy,
Mən burada sənə duaçı olaram.



3792 Mən sənin nəyinə faydalı ola bilərəm,
Sözümü dinlə, özün-özünə faydalı ol.
3793 Mən insanlardan üz çevirdim, sən də çevir,
Sənə, mənə insanlardan xeyir yoxdur.
3794 Mən indi bu qalmış günlərimi ibadətlə,
Tanrının şəfqətini diləməklə keçirmək istəyirəm.
3795 Olanım mənə bəsdir, artığını istəmirəm,
Ey tamahkar, bu dünyanın dibi qurumaz bataqlıqdır.
3796 Həyat qasırğa kimi keçəndə oyandım,
İndi içim yanır.
3797 Əynim qalın, qarnım tox oldu,
Dünya yerə batsın, onun başqa nə faydası var?
3798 Əyni qalın, qamı tox nə deyir eşit:
"Bu mənə bəsdir" deyən adam xoşbəxt bəy olar.
3799 Çox gözəl söyləmiş qail olmuş ər,
Qənaət içində qane olmuş ər:
3800 "Qarnı doyuracaq yemək bəs edər,
Əynini örtəcək geyim bəs edər.
3801 Həyat davam etdikcə yemək taparam,
Lazım olanda yeganə rəbbim kifayət qədər verər.
3802 Elik məni fayda vermək üçün çağırırsa,
Məndə o qədər bilik və ağıl yoxdur.
3803 El üçün xeyirli olmamı arzu edirsə,
Məndə elə bir qüdrət yoxdur, doğru deyirəm.
3804 Əgər iş-güc haqda söhbət gedirsə,
Qardaşım sənə min adamın işini görər.
3805 Əgər məni xeyirxahlığımdan ötrü istəyirsənsə,
Özün xeyirxah ol, bu səni sevindirər.
3806 Mən yaxşının ayağından tutunca, sən
Bircə dəfə öz yaxandan yapış.
3807 Dünya şöhrətli minlərcə ərən
Elikin başına yığışmışdır.
3808 Elikə məndən nə xeyir gələ bilər,
Faydasız işdə bir xeyir yoxdur.
3809 Üzr istəyirəm, deyirəm sənə,
Məndən əlini üz, sarılma mənə.
3810 Başqa necə sözlər demişəmsə,
Qardaşım eşitdi, sənə ərz edəcək".

* * *

3811 Sözünü bitirdi, məktubu bükdü, bağladı,
Uzatdı, ağıllı qardaşı məktubu aldı.

* * *

3812 Dedi: – Mən arzumu və sözümü yazdım,
Şifahi dediklərimi də eşitdin.
3813 Bunları dilcavabı ərz et, Elik eşitsin,
Məni öz halımda qoysan, əlini üzsün.
3814 Elçi söz çatdırar, cavabını istər,
Cavabı eşitdin, onu apar, ey qüdrətli insan.
3815 Birər həqiqət olan sözləri hər yana yayılmış
Uc-Ordu xanı nə demiş, eşit:
3816 "Sözü tam və doğru çatdırsa, söyləsə,
Elçiyə heç bir zaval yoxdur".
3817 Türk xanı bundan gözəl demişdir:
"Sözü olduğu kimi çatdıran elçini qınama.
3818 Elçi eşitdiyini doğru-dürüst çatdırsa,
Ona ölüm və zaval yoxdur.
3819 Elçi olan kəs belə olmalıdır,
O nə söyləsə də, ona zaval yoxdur.
3820 Elçi tapşırılmış sözü söyləsə,
Bəxşiş ver, təriflə; budur, xülasə".

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3821 Öydülmüş cavab verib dedi:
– Dediyin sözlərin hamısını eşitdim.
3822 Məktuba cavab yazdın,
Qoy onu aparım, ey müdrik alim.
3823 Ancaq ey qardaş, mənim şübhəm budur:
Elik səni özündən uzaq qoymayacaq.
3824 Ey təmizqəlbli insan, səni təkrar dəvət üçün
Elik məni yenə buraya göndərəcək.
3825 Çox çəkməz, məni yenə buraya göndərər,
Sən getmədikcə o da israr edəcək.



## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3826 Odqurmuş cavab verib dedi:
– Qardaşım, belə demə, könlüm qırılır.
3827 Mən qalxıb buradan oraya gedən deyiləm,
Zəhmət çəkib bir də buraya gəlmə.
3828 Əldə olunmayacaq şeyi istəmək düz deyil,
Təsirsiz söz desən, söz ucuzlaşar.
3829 Biliyi çox olan adam
Yaxşını-pisi təcrübə etmiş adam nə demiş, eşit.
3830 İstəməklə alınmayacaq şeyi zorla istəmə,
Axtarmaqla tapılmayacaq şeyi zorla axtarma.
3831 Yeriməklə varılmayacaq yerə piyada getmə,
Əgər getsən, özünə əziyyət vermiş olarsan.

* * *

3832 Odqurmuş əlavə etdi: – İndi yürü,
Bir də buraya gəlmə, ey mərd igid.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3833 Öydülümüş ayağa qalxdı, dedi:
– Daha sözüm yoxdur, mən gedirəm,

* * *

3834 Qardaşı durub Öydülmüşü yola saldı,
Sözlə dediklərini də ona tapşırdı.
3835 Öydülmüş atına mindi, evə gəldi,
Atdan endi, yatıb bir az dincəldi.
3836 Günəş yerə endi, üzünü gizlədi,
Göy üzü parlaq bir samur kürkünə büründü.
3837 Dünya öz üzünə kömür rəngli boya sürtdü,
Görən gözlər qapandı, oyaqlar uyudu.
3838 Öydülmüş döşək istədi, bir az da yatdı,
Sonra yenidən oyandı.

3839 Şərqdən od kimi alov qol-budaq atdı,
Təzə gəlin üzünü açırcasına dünya nurlandı.
3840 Mizraq və qalxanı yüksəlməyə başladı,
Dünya üzü bəyaz cövhər kimi oldu.

* * *

3841 Öydülmüş qalxıb evdən çıxdı, saraya getdi,
Yol istəyib Elikin hüzuruna çıxdı.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

3842 Elik əvvəlcə Odqurmuşu soruşdu,
Sonra dedi: – Nə qərara gəldiniz?
3843 Nə danışdınız, iş necə oldu,
Diləyin nə oldu, qohumun gəlirmi?

* * *

3844 Öydülmüş əvvəlcə məktubu verdi,
Elik aldı, açdı, diqqətlə oxudu.
3845 Üzündə gah sevinc, gah qəm göründü,
Sonra təkrar güldü, xeyli düşündü.
3846 Qardaşın çox sərt cavab verib dedi:
"Mən ona ipək göndərdim, o, tikan işləyib.
3847 Zərər yox, bu sözü doğru söyləyib,
Doğru söz sərt olar, sərt söyləyib.
3848 Şifahi nələr söylədi,
Eşitdiklərini mənə söylə".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3849 Öydülmüşü Elikə eşitdiyini dedi,
Nə danışmışdılar hamısını ərz etdi.



* * *

3850 Dedi: – Aramızda müxtəlif söz-söhbət oldu,
Onun dediyi sözlərə imkan dairəsində cavab verdim.
3851 Mənim hər sözümə cavab verdi,
Mən onu tutanda gözlərini bərk-bərk yumdu.
3852 Nə elədimsə, buraya gəlmədi,
Kəsə söylədi, könül vermədi.

* * *

3853 Elik onun sözlərini dinlədi,
Sözləri anlayış, ağıl və biliklə dolu idi.
3854 Onu təkrar arzuladı, könlü coşdu,
Könlünün coşması insana dərd olur.
3855 Bax, igidlərin başı gözəl söyləmiş:
"Könlünə əsir olan özünə hakim olmaz.
3856 Könül bəydir, bədən onun quludur,
Bəy hara getsə qul onun dalınca düşər.
3857 Könül coşsa, bir sevdaya tutulsa,
Diləyinə çatmadan sakit olmaz"

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3858 Elik dedi: – Ey Öydülmüş,
Qardaşın gerçəkdən çox kamil adammış.
3859 Kaş onun sözlərini eşitməyəydim,
Əxlaqı, hərəkəti, biliyi haqda heç nə bilməyəydim,
3860 Ancaq eşitdim, könlümdə ona yer verdim,
Çalış, məni bu arzuma çatdır.
3861 Mənim öz elimdə bir diləyim olsun,
Mən ona yetməyim, – bu yaramaz.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3862 Öydülmüş dedi: – Ey Elik,
Xalqın seçkin bəyi, ey yumşaq təbiətli,

3863 Gələndə qohumuma dedim ki,
Elik məni bir də sənin yanına göndərəcək.
3864 Səndən əl çəkməyəcək yanına aparacaq,
Hörmət elə, bəri başdan get.
3865 Ümidimi qırdı, dedi: – Daha gəlmə,
Getməyəcəyəm, israr etmə, mənə güc eləmə.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3866 Elik dedi: – Eşitdim, anladım sözünü,
Bu sözlərin xeyiri yoxdur, özünü aldatma.
3867 Bu qədər arzuladığı halda
Arzusuna çatmayan bəy necə bəydir?
3868 Öz ölkəsində buyruğu işləməyən adam
Necə xalqın böyüyü və hakimi ola bilər?
3869 Həqiqi böyüklüyün əlaməti,
Şübhəsiz, arzuladığı şeyi ələdə etməkdir.
3870 Könül bir şeyi arzu eləsə,
Bunun tək çarəsi onu diləyinə qovuşdurmaqdır.
3871 Bu arzu mənim üçün artıq bir xəstəlik oldu,
Burada müalicə olmazsa, gərək oraya gedəm.
3872 Bu beyti oxu, nə deyir, eşit,
Mənasını anla, ey könlümü doyuran:
3873 "Hər xəstəliyin öz dərmanı və çarəsi var,
Onu müalicə edən qam[1] da bulunar.
3874 Könül arzu nəticəsində xəstələnsə,
Arzuya çatmaqla şəfa tapar".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3875 Öydülmüş cavab verdi: – Ey xoşbəxt Elik,
Dünyada dərmansız nə dərd var?
3876 Elik sağ-salamat, çox yaşasın,
Mən sənə qurban olum.

[1] Qam – əski türkcə şaman, həkim, təbib



3877 Bu gün dediklərim üçün illərlə peşman olacağam,
Ancaq bunun heç bir faydası yoxdur.
3878 Dinlə gör nə demiş ağıllı insan:
"Sözü düşün, söylə, ey qəhrəman.
3879 Sözü danışmağın faydası çoxdur,
Bu dilim danışmaqla məni peşman etdi.
3880 Söyləmədiyin söz sənə quldur,
Söylədikdən sonra o səni qul edir.
3881 Sözü düşünərək söylə, tələsmə, səbirli ol,
Səbirsiz söylənən sözdən sabah peşman olarsan".
3882 Odqurmuş çox yetkin bir insandır,
Çağırılınca gələcəyin zənn etmişdin.
3883 Elik bir istəyirsə, mən min istəyirəm,
O mənə hər gün onqat faydalı olacaqdı.
3884 Arzum onunla birlikdə işləmək,
Əl-ələ daha yaxşı xidmət etmək idi.
3885 Mən nə qədər çox israr etdimsə,
O da nə qədər müqavimət göstərdi, dadını qaçırdı.
3886 Təkrar getmək lazımsa, mən gedirəm,
Nə demək lazımsa, ona deyərəm.
3887 Elik bir məktub da yazıb mənə versin,
Odqurmuş onu oxuyub mənə inansın.

## ELİKİN ODQURMUŞA CAVABI

3888 Elik dedi: – Bir məktub göndərdim,
Ona daş və dolu kimi cavab verdi.
3889 Ona təkrar necə məktub yazım, ey müdrik,
Məktub yerinə sən özün gedirsən.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

3890 Öydülmüş cavab verdi: – Ey xoşbəxt Elik,
Belə olsa da bir məktub yaz.
3891 Elçi nə qədər dürüst, təmkinli və mahir olsa da,
Məktub olmasa, qəlbində şübhə qalar.

3892 İnanmayan adam üçün məktub bir dəlildir,
Dəlil olsa, hiyləyə yer qalmaz.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

3893 Elik dedi: – Əgər arzun budursa,
Sözə yol açmaq üçün məktub yazım.
3894 Qoy bu sözləri məktubda da yazım,
Ancaq sən məktuba güvənmə, özün də çalış.
3895 Nə demək lazımsa, söyləsin dilin,
Bu dəfə onunla bərabər gəlin.

## XLV

## GÜNDOĞDU ELİKİN ODQURMUŞA İKİNCİ MƏKTUB GÖNDƏRDİYİNİ BƏYAN EDİR

3896 Elik mürəkkəb-kağız istədi,
Əlinə qələm alıb, məktub yazdı.
3897 Tanrı adı ilə sözə başladı,
Yaradan, bəsləyən, köçürən, – dedi.
3898 O qadir Tanrıya min şükür-səna,
Doğruya, əyriyə ilk hökmü o verir.
3899 O safdır, təmizdir, arıdan arı,
Yoxu var qılır o, qılır yox varı.
3900 Onu tək bil, şükür et, könüldən inan,
İbadət et, könlünü, dilini doğru tut.
3901 Nəyə hökm eləsə, hökmü yerinə yetir,
Nəyə "Ol!" desə, olur.
3902 Bütün canlılara o, ruzi verir,
Həyat da, ölüm də onun əlindədir.
3903 Əzizlik, ucuzluq onun hökmüdür,
Böyüyə kiçiyə yol açan odur.
3904 Onun dilədiyi şeyi bilən yoxdur,
İlahi qəzasına kimsə mane ola bilməz.
3905 Tanrı minlərcə salamımı əziz elçiyə,
O doğru yolçuya yetirsin.



3906 Onun əshabələrinə də çoxlu salamımı
Allah daima yetirsin.
3907 Elikdən çoxluca salam, ehtiram,
Sənin hüzuruna, ey ağlı tamam.
3908 Xatir və könlünü sormaq üzrə
Sənə məktub yazdım, ey müdrik, necəsən?
3909 Qohumunu yanına göndərmişdim,
Mənim yanıma gəlməyini istəmişdim.
3910 Sən yanıma gəlməyi, mənimlə görüşməyi,
Üzümü görməyi qəbul etməmisən.
3911 Məktubuma cavab yazmısan,
Sözlə dediyini də qohumun çatdırdı.
3912 Məktubunu oxudum, sözlərin anlaşıldı,
Mənim sözümü də eşit, özünü gizləmə.
3913 Sənə şəkərdən şirin söz göndərdim,
Əvəzində zəhərdən də acı söz gəldi.
3914 Mənim sözlərimi bir dəfə də dinlə.
Ey təmizqəlbli insan, onlar haqda fikirləş.
3915 Sən bu zahid adını istədin, adın zahid oldu,
Özün də dağlara çəkildin.
3916 Bu şöhrətlə adın yayıldı,
İnsanlar arasında böyük nişanə oldu.
3917 Bu ada görə ibadətlə məşğul olursan,
Sən zorla öz nəsibini hədər etmə.
3918 Əgər ibadət xalqın gözü önündə edilirsə,
O, əsassız və mənasız olur.
3919 Bütün ibadətlər gizlində edilməli,
Bu pərdə bu gün də heç kəsə açılmamalıdır.
3920 Tanrı sevdiyi qullarını gizləmişlər,
Xalq bu qullar arasında onları tanıya bilməz.
3921 Belə qul Tanrıya düşməndir, yoxsa dostdur,
Bunu heç kəs bilməz.
3922 Buraya gəl, kənddə-şəhərdə yaşa.
Xalqa qarış, kim olduğunu bilməsinlər.
3923 Halal dünya malı qazan, özünə xərclə,
Acları doyur, çılpaqları geydir.
3924 Halal mal sahibi hər iki dünyaya nail olur,
Onun yeməyi-içməyi əskik olmaz.

3925 Ey buraya gəlmək istəməyən, bu sözü dinlə,
Saf bilikli və böyük bağ sahibi nə deyir:
3926 Əgər dünya malı yaxşı insana rast gəlsə,
O hər iki dünyada onun rahatlığını təmin edər.
3927 Dünya malını tapıb yeyə bilməyənin nəsibi
Çəkilməsi çətin olan hesabdan ibarətdir.
3928 Ey hakim, Tanrının qullarına faydalı ol,
İnsanlara faydalı olanlara insan deyilir.
3929 Ey zahid, mən səni müsəlmanların faydası naminə
İsrarla buraya çağırıram.
3930 Buraya gəl, insanlara xeyir ver,
Xeyirsiz adam dirilər arasında bir ölüdür.
3931 Öz mənfəətini güdən insan deyil,
İnsan olan xalqın mənfəətini güdər.
3932 Mal paylamaq hələ comərdlik deyil,
Əsl comərd bədənini, canını fəda edəndir.
3933 Özünü qoruyan rəhmdil adam deyil,
Əsl rəhmdil başqaları üçün çalışandır.
3934 Yaxşı insan deyirlər, o, haradadır,
Ey alim hakim, mənə xəbər ver.
3935 Yaxşı adam deyirlər, bu yaxşı adam kimdir,
Yaxşı adam dərdlilərə dərman olandır.
3936 Ey duru könüllü, ey biliyi çox olan,
Bu sözlər üzərində diqqətlə düşün.
3937 Düşün gör, söylədiklərim doğrudurmu,
Doğru isə nəfsinə hakim ol, gəl burada yaşa.
3938 Söz uzun olarsa, usandırar,
Ağıllı adamlar sözü qısa kəsərlər.
3939 Bu sözü kafi gör, başqa bir şey söyləmə,
Ağıla və biliyə qarşı etiraz etmə.
3940 Başqa bütün sözlərimi qohumuna söylədim,
O sənə çatdıracaqdır.

* * *

3941 Məktubu bitirdi, bükdü, bağladı,
Sərin bir külək əsdi, məktubu qurutdu.
3942 Üstünə möhür vurdu, əlinə aldı,
Uzatdı, Öydülmüş məktubu götürdü.



* * *

3943 Elik davam etdi, dedi: – Ey Öydülmüş,
Məktubu götür, qalanını da dilcavabı de.
3044 Başqa nə lazımsa, onu da elə.
Çalış onu bura – şəhərə gətir.
3945 Buraya gəlincə, onun üçün hər şey edər,
Bütün arzularını yerinə yetirərəm.

* * *

3946 Öydülmüş, o gözəl dost "baş üstə" dedi,
Qalxıb çıxdı, yüyürüb evinə gəldi.
3947 Gəlib evə girdi, oturdu,
Yedi-içdi bir qədər dincəldi.
3948 Rum qızı[1] üzünü yerdən gizlədi,
Dünyanın üzü zənci dərisi kimi oldu.
3949 Hava tamamı qaraquş rəngi aldı,
Bütün dünya qaraquş tüküylə doldu.
3950 Yataq istədi, yatdı, düşündü ki,
Qohumu ilə rastlaşanda nələr deyəcək.
3951 Bir az yuxuya daldı, təkrar oyandı,
Gecə sönmüş kömür kimi qapqara idi.
3952 Yuxusu qaçdı, ayağa qalxdı,
Qaranlıq gecə ətəyini yuxarı qaldırdı.
3953 Günəş yerdən başını qaldırdı,
Sevimli üzün təbəssümü kimi dişləri göründü.
3954 Qalxıb yuyundu, sübh namazı qıldı,
Namazdan sonra bir müddət oturub dua etdi.
3955 Xidmətçiyə tez atını hazırlatdı,
Şad-xürrəm evindən çıxdı.
3956 Gəlib qohumunun evinə çatdı.
Hörmət naminə bir az aralıda atdan endi.

* * *

3957 Yeriyib gəldi, yavaşca qapını vurdu.
Qohumu ibadəti dayandırıb ayağa qalxdı.

[1] Rum qızı – günəşə işarə

3958 Dərhal qapını açdı, çıxıb salamlaşdı,
Əllə görüşdülər.
3959 Odqurmuş onun əlindən tutdu, içəri girdi,
Ona hörmətlə başdan yer göstərdi.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

3960 Sonra dedi: – Ey qardaşım, zəhmətə qatlaşdın,
Yəqin bu dəfə də yanıma elə-belə gəlməyibsən.
3961 Sənə qəti dedim, sən də eşitdin,
Niyə məni israrla bu işə cəlb edirsən.
3062 Bilik verən insan, nə deyir, eşit,
Təcrübə ilə yaxşını pisdən ayıran, nə deyir, eşit:
3963 "Sınamaq üçün insanı bir dəfə görsən yetər,
Arzusunu anlamağa onun bir neçə sözü kafidir.
3964 İnsan qızılla misi ayıra bilməsə,
Bir daş alıb azca sürtmək kafidir".

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

3965 Öydülmüş cavab verdi, dedi: – Qardaşım,
Məndən incimə, könlümü yaralama.
3966 Xidmətçi gözünü açıb önündə bəyini görür,
Bəylər nə əmr etsə, yerinə yetirərlər.
3967 Məktubunu Elikə verdim,
Dediklərini də eynən söylədim.
3968 Bunlara cavab verdi, məktub göndərdi,
Məktubu çıxarıb əli ilə uzatdı.

## *ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI*

3969 Odqurmuş məktubu alıb açdı, oxudu,
Baxıb öz-özünə düşündü.
3970 Sonra dedi: – Ey qohum, sənin nə əskikliyin var ki,
Bəyin məni israrla təqib edir?



## XLVI

## ÖYDÜLMÜŞÜN İKİNCİ DƏFƏ ODQURMUŞLA MÜBAHİSƏ ETDİYİNİ BƏYAN EDİR

3971 Öydülmüş sözə başladı: – Ey qardaşım,
Sözümü dinlə və bil ki,
3972 Elik sənin haqqında xoş məramlıdır,
Yaxşılıq içində sənə yaxşı yol axtarır.
3973 Bilirsən ki, buradakı ibadətin
Sənə bir çox yaxşılıqların qapısını açacaq.
3974 Şəhər və kəndlərdə də dediyim kimi,
Bir çox yaxşılıqlar var, ey igidim.
3975 Bu dünya səadətini taparaq
Öz adını yüksəltmək fəna deyil.
3976 Ey zahid, axirəti istəyirsən, onu da taparsan,
Orada da nemətə, savaba çatarsan.
3977 Dünya malını pisləmək doğru deyil,
Onu xərcləmək və paylamaqla xalqı sevindirmək olar.
3978 Comərdlərbaşı nə gözəl söyləmiş,
Ey yaxşı insan, sən bunu dinlə:
3979 "Hər cür yaxşılığa yol göstərən sərvətdir,
Hər cür xəstəliyi sağaldan da sərvətdir.
3980 Varlı insan ağılı və biliyi tapar,
Hər cür yaxşılığa qadir olar.
3981 Sərvətlə insan mavi göyə yüksələr,
Sərvət çox mühüm köməkdir.
3982 Həccə getməyə mal-sərvət gərəkdir,
Qazi olmağa yenə sərvət lazımdır.
3983 Verəcək malı olmasa,
İnsanın hər bir yaxşılığa əli qısa olar.
3984 Bu yaxşılıqlardan niyə üz çevirirsən,
Niyə bu öyüd-nəsihətləri qəbul etmirsən?
3985 İbadətə necə inansan da olar,
İnsan ibadət etməsilə öyünsə, müflis olar.
3986 Qul Tanrını ibadətlə tapmaz,
Qulun yolu çox incə bir yoldur.

3987 Neçə min qul illərlə ibadət etdi,
Can çıxan anda yolu itirdi.
3988 Neçə min asi, günahkar qul isə
Son nəfəsi kəsiləndə doğru yolu tapdı.
3989 Bilirəm ki, Tanrının bütün eşqi
İtaət və ibadət içindədir, ey ulu.
3990 Əsl ibadətin nə olduğunu bilməyən,
Etdiyinin hansının ibadət olduğunu bilməz.
3991 Onda bütün zövqləri tapmaq üçün,
İbadətlərin hamısını etmək lazımdır.
3992 De görüm, sənə söylədiklərim
Düzdür, yoxsa düz deyil?
3993 Əgər sənə söylədiyim şəkildədirsə,
Etiraf et, sözümü tut, ey safqəlbli insan.
3994 Nəfsin əsirin olma, könlünü doğrult,
Camaata qayna-qarış, onlarla yaşa".

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

3995 Odqurmuş cavab verdi: – Ey qardaş,
Məni kədərləndirdin, aşımı zəhər etdin.
3996 Tutaq ki, sənin dediklərini dinlədim,
Elikin yanına gedib xidmətə başladım.
3997 İnsan xidmət üçün yolu-üsulu bilməlidir,
Onun tərz-hərəkəti mərasimə uyğun olmalıdır.
3998 Girib-çıxmağı, oturub-durmağı bilməlidir,
Xidməti bacarmasan, o, boşuna gedər.
3999 Təşrifatı bilən adam gör nə deyir,
O ən azı bu üç şeyi sınamışdır:
4000 "Bəylərə xidmət etmək istəsən,
Dilin, sözün doğru olsun, özünə hakim ol.
4001 Qayda-qanuna görə xidmət etməyi öyrən,
Bunu bilsən, xidmətdə yüksələrsən.
4002 Mən hamıdan uzağam, yol-məl bilmirəm,
Xidmətə yarar sözüm, dilim, hərəkətim yoxdur.
4003 Sənin bəyinə necə xidmət edim,
Bu yol mənim üçün bağlıdır.
4004 Niyə məni sıxışdırır, hər sözümə etiraz edir,
Elikin xidmətinə girməyə zorlayırsan?"

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4007 Odqurmuş dedi: – Ey kamil insan,
Bu söz də o qədər yerində deyil.
4008 Yol-üsul bilmədən şaşqın-şaşqın gəzmək
Nə sənə, nə də mənə yaraşmaz.
4009 Bu bəylər dünyaya ona görə gəlmişlər ki,
Ölkəni tənzim, xalqı idarə etsinlər.
4010 Eli-günü idarə etmək bəylərin işidir,
İnsan işi davranışa və adətə uyğun görər.
4011 Ona görə bəylər ölkəyə hakim oldular,
Ağılla sözlərini həyata keçirdilər.
4012 Dünya hakimi nə gözəl söyləmiş,
Bilikli, ağıllı, millət başçısı:
4013 "Dünyanı tutan kəs ağıllı gərək,
Xalqın başçısına mərd ürək lazım.
4014 Bu ikisindən sonra, xidmətçilər də
Davranış qaydalarına vaqif olmalıdırlar.
4015 Bəylər güclərini bununla artırırlar,
Düşmənləri əzir, qisas alırlar.
4016 Biz indi gərək özümüz yol-ərkanı şərh edək,
Yoxsa ki, qaydaları pozmaq bizə yaraşmaz".

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4017 Öydülmüş cavab verib dedi: – Ey qardaş,
Aş bişsin, necə olsa da yeyilər.
4018 Mən bu qanunu və ədəb-ərkanı bilirəm,
İndi sənə deyim, diqqət et, öyrən.
4019 İnsan bilmədiyi şeyi öyrənər, bilər,
Bildikdən sonra diləyinə yetər.

4020 Bu haqda biliyi açıq şəxs bir söz demişdir,
Kim ona əməl etməsə, biliyi yarımçıq qalar:
4021 "İnsan anadan alim doğulmaz, sonra öyrənər,
İnsan doğulan kimi danışmaz, sonra danışar.
4022 İnsan öyrənərək alim olar,
Bilikli olsa, bütün işləri yoluna düşər".

### ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

4023 Odqurmuş cavabında dedi: – Sənin
Diləyin budursa, mənim sözüm yoxdur.
4024 Bu gün mənim canımı çox sıxırsan,
De görək, bu xidmət necə olur?
4025 Sözünü eşidim, görüm könlümə yatırmı,
Öyrənə bilərəmmi, bunu başa düşüm.
4026 İndi mənə neçə cür davranış
Qaydası olduğunu bir-bir söylə.

### ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4027 Öydülmüş cavabında dedi: – Ey müdrik insan,
Çox əla bir söz söylədin.
4028 Əvvəlcə tutduğun yol ağıldan uzaq idi,
Sən indi təməlini doğruluq üstündə qurdun.
4029 İndi mən söyləyim, sən dinlə, anla,
Öyrən, bu düyün sənin üçün açılsın.
4030 Əgər lap indicə öyrənmək istəsən,
Sən danışma, mənə qulaq as.

## XLVII

### ÖYDÜLMÜŞ ODQURMUŞA BƏYLƏRƏ XİDMƏT ETMƏYİN QAYDA-ÜSULUNU BƏYAN EDİR

4031 Xidmətçi iki cür olur,
Xidmət etsə, işi gündən-günə yoluna düşər.



4032 Bunlardan biri uşaqlıqdan xidmətə girir,
O biri böyüdükdən sonra bu işə başlayır.
4033 Kiçikkən xidmətə girib könülünü buxovlayanlar
Bu ikisinin ən yaxşısıdır.
4034 Bunları sənə söyləyərkən sözümü
Kiçikləri nəzərdə tutaraq deyirəm.
4035 Bişkinlik istəsən, sözü bişir,
Bütövlük diləsən, özünü bütöv tut.
4037 Ər xidmətə qapı açmaq istəsə,
Bu işə kiçik oğlan ikən başlamalıdır.
4038 Davranış tərzini öyrənməli, hərəkətini düzəltməli,
Giriş-çıxış qaydasını bilməlidir.
4039 Sübhdən durub xidmətə hazır olmalı,
Könlünü, dilini kiçik tutmalıdır.
4040 İşi vaxtında və sürətlə görməli,
Gözü və qulağı tətikdə durmalıdır.
4041 Özündən böyüyə xidmət etməli,
Dilini gözləməli, sözünə diqqət etməlidir.
4042 Belə bir gənc xidməti bacarsa,
Bəyinə yaxın olmalı, keçidləri keçər.
4043 Bundan başqa, girib-çıxarkən
Ərzləri qaydasına uyğun bildirməlidir.
4044 Kiçik rütbəlilər bu yerə gəlib çatsa,
Bəy özü onlara növbəti təyinat verər.
4045 Xidmətçi ağıllı və dürüst təbiətli olsa,
Hökmdara ərzi-halçı olar, tez yüksələr.
4046 Yaxşı nişançı və cəsur isə, ox-yayçı olar,
Doğru təbiətli isə, möhürdar olar.
4047 Tövrü, hərəkəti təmiz, üzü gözəl isə,
Bəy onu saqi təyin edər, ey xoşəxlaq.
4048 Yazı və hesabı bilsə, xəzinədar,
Dərrakə və zəka sahibi isə – katib olar.
4049 Bu rütbədən hansına çatarsa-çatsın,
Diqqətli, ayıq olmalı, yaxşı xidmət etməlidir.
4050 Eşit gör xidmətçi insan,
Xidmətlə diləyinə yetən insan nə deyir:
4051 "Bəyin hüzurunda çox diqqətli ol,
Görülməyəcək şeylərə baxma, onları görmə.

4052 Hərəkətini, tövrünü düzəlt, özünü gözlə,
Könlün, gözün dürüst olsun, qısa danış.
4053 Hər bir iş xidmətlə yoluna düşər,
Xidmət sayəsində adam dost-yoldaş qazanar.
4054 Yaxşılıq diləsən, əvvəlcə xidmət et,
Xidmət sənin üzünü güldürər.
4055 Bəyin hüzurunda olduğun zaman,
Gözün yerdə, qulağın yuxarı başda olsun.
4056 Əllərini çarpazla, ayaqlarını bitişdir,
Sağ əlinin sol əlinin üstünə qoy.
4057 Qapıdan girəndə əvvəlcə sağ ayağının at.
Sənə buyruq veriləndə ağlın-fikrin bəydə olsun.
4058 Bir şey ərz edərkən əllərini aşağı sal,
İki dizi üstə çök, sakit ərz elə.
4059 Qıya baxma, sağa-sola boylanma,
Özünü əymə, sözü diqqətlə dinlə.
4060 Səndən söz soruşsa, düzünü söylə,
Cavab versə, əmrini sədaqətlə yerinə yetir.
4061 İçki içmə, avara, boş-boşuna gəzmə,
Lüzumsuz, fəna işlərdən uzaq qaç.
4062 Eşitdiyin sözü eşitməmiş ol,
Gördüyün şeyi görməmiş ol.
4063 Belə xidmət etsə, özünü bəyəndirsə,
Gəncin səadəti gündən-günə artar, işi düzələr.
4064 Kimisi hil alır, olur hilbaşı[1]
Kimisi – at-ayqır üstə elbaşı[2]
4065 Kimisi subaşı, kimisi hacib,
Kimi sirr katibi olur, söz açıb.
4066 Bu qata yetişsə, xidmət etsə ər,
Böyüyər, hər cürə arzuya yetər.
4067 Kimi ağlı ilə ögəliyə[3] yüksəlir,
Kimi də kök-ayuqluq ilə şöhrət tapır.

[1] Hil – ərəbcə dəstə, manqa
[2] Elbaşı – dövlət adamı
[3] Ögə, kökayuq, inanc, çağrı, tigin, çavlı, yavqu, yurğuş, ərögi – qədim türk dövlət quruluşunda rütbə



4068 Kimi inanc bəy, kimi çağrı bəy,
Kimisi tigin bəy, kimisi çavlı bəy,
4069 Kimi yavqu, kimi yurquş, elbəyi,
Kimi də ünvanının tayı-bərabəri olmayan ər-ögi olur.
4070 Xidmətin dərəcələri buraya qədərdir,
Onlara bundan sonra yüksəliş yoxdur.
4071 Xidməti bu rütbəyə qalxsa, demək,
Bəy onun haqqını layiqincə ödəmişdir.
4072 Xidmətçi bu rütbəyə qalxsa,
Bəyinə faydalı olar, arzusuna qovuşar.
4073 Əgər bu vəzifələri qanmaz və cahillər tutsalar,
Onlardan bəyə böyük ziyan toxunar.
4074 Ağıllı və hakim insan çox gözəl söyləmişdir,
Ləyaqətsizlərə bu vəzifələri vermək olmaz".
4075 Bilikli adam bundan da gözəl demişdir:
"Ey bəyim, biliksizin əlindən tutma.
4076 Ağılsız adamlar biliyi təhrif edər,
Biliksizlər isə xalqı pis günə qoyarlar.
4077 Əgər bəy biliksizi yüksəldib ona rütbə versə,
Bəri başdan bil ki, o bəyinə sadiq olmayacaq.
4078 Ağılsız adam böyüklüyə çatsa,
Ey böyük hökmdar, o, ağasının başını yeyər.
4079 İndi gərək bəylər xidmətçi qullarını
Onların biliyi ölçüsündə yüksəltsin.
4080 Qulu tərzi-hərəkətinə görə sınamaq,
Sonra ona rütbə vermək lazımdır.
4081 Qul sadiq olmalı, daim bəyini qorumalıdır,
Belə qullara bəy ehsan etməlidir".
4082 Qanun qoyan və qanunla
Bəyinin işini nizamlayan şəxs nə deyir:
4083 "Nə qədər yüksəlsə də, qulun adı quldur,
Onu yüksəldən bəyə xidmət etməyimdir.
4084 Nə qədər kiçik olsa da, bəyin adı bəydir,
Onun adı xidmətçi adından daim yüksəkdir.
4085 Ey bəylər sayəsində böyük olmuş ər,
Bəyinə qarşı çıxma, onu böyük bil, əziz tut,
4086 Heç vaxt bəylərlə rəqabətə qalxışma,
Bəyə məxsus sözü söyləmə, düşün.

4087 Onlar iqbaldırlar, iqbalın hər yerə əli çatar,
Onlar yanar oddurlar, başqalarını yandırarlar.
4088 Onlar zəmanədirlər, zəmanə ilə
Uyğunlaşmaq gərəkdir ki, ər sevinib-gülsün".
4089 Sınayaraq bilən, xidmətlə yüksələn,
Diləyinə yetən ər nə gözəl demişdir:
4090 "Sənə bəylər gülər üz göstərsələr,
Buna sevinmə, qürrələnmə.
4091 Xidmətə güvənib həddini aşma,
Səhv etsən, bəylər sənə qaşlarını çatarlar.
4092 Böyük-kiçik, şanlı-şöhrətli olsun,
Xidmətçi elə xidmətçidir ki, var.
4093 Bəyə qarşı qüsur göstərməməyə çalış,
Xidmət yolundan uzaqlaşma.
4094 Bəylər səni özlərinə nə qədər yaxın tutsalar da,
Özünü unutma, düz yeri.
4095 Sənə nə qədər yaxşı münasibət bəsləsələr də,
Özünü onlara tay tutma, özünü gözlə.
4096 Onlar bəzən od, bəzən su olurlar,
Bəzən güldürür, bəzən ağladırlar.
4097 Sən bu üç şeyə yaxın qonşu olma:
Yanar od, axar su, bəylərin adı-sanı.
4098 Bax, bəy düz aslana bənzəyir,
Öyərək yaxınlaşsan, yumşalar, ipək kimi olar.
4099 Əgər qabalıqla yaxınlaşsan, qəzəblənər, baş kəsər,
Damarını deşər, sorub qanını içər.
4100 Qəzəbli vaxtında bəyinə yaxınlaşma,
Əgər yaxınlaşsan, ucuz olacaqsan.
4101 Soruşsa cavab ver, çağırsa yanına get,
Sağ-salamat yaşa, həmişə xoşbəxt ol.
4102 Çox sözünü eşidib, eşitməz ol,
Gözünlə gördüklərini içində gizlə".
4103 Vaxtında girib hökmdara ərzi-hal bildirən,
Nəfsinə hakim olan ər nə deyir, eşit:
4104 "Gir desələr, böyük bir hörmətdir,
Çıx desələr, insana həqarətdir.
4105 Gözünə və nəfsinə hakim ol,
Nəfsinə hakim olan insan bu dünyada əzizdir.



4106 Çalış bu üç işdən uzaq dur:
Özünü bəy kimi aparma – vəssalam.
4107 Biri – yalan, o biri – tamahkarlıqdır,
Bunun üçü də insanı sonunda məhv edər.
4108 Başqaları haqqında dedi-qodu etmə,
Düz danış, doğru sözü gizləmə.
4109 Hər cəhətdən özünü təmiz tut,
Bəylər təmizdirlər, təmizliyi sevirlər.
4110 Saraya gedəndə diqqətli yeri,
Kimdən hörmət görsən, ona hörmət et.
4111 Əlini-qolunu yellədərək yerimə,
Salamlaşarkən özünü dartma.
4112 Oturanda yerini bil, adamları incitmə,
Onlara qarşı nəzakətli ol.
4113 Bərkdən gəyirmə, tüpürmə,
Bu qabalıq olar, yaxşı qarşılanmaz.
4114 Bardaş qurma, yayxanma,
Yüksəkdən qəhqəhə çəkib gülmə.
4115 Dırnaq tutma, ayaqlarını uzatma,
Yoxsa ucuz, iqbalsız olarsan.
4116 Səndən böyük bir söz desə,
Danışmağını kəsib onu dinlə.
4117 Doğru söz söylə, bu səni güldürər,
Öz həddin olmayan sözü söyləmə.
4118 İçib saraya getmə, özünü qoru,
Sərxoş adam qaba, kobud olur.
4119 Bu sözü dinlə, özünü qorumusan,
Bu üç şey başını qopardar:
4120 Biri – bəyin sözünü sözlərin bəyi kimi
Qəbul edib cani-dildən sevməkdir,
4121 İkincisi – dürüstlük, ölkəyə sədaqətdir,
Qarışıq günlərdə özünü qorumalısan.
4122 Üçüncüsü-sarayda doğru hərəkətdir,
Uyğunsuz, yaramaz işlərdən uzaq ol.
4123 Bu üçündən birini edən insanın
Nə qədər böyük olsa da, başı bədəndən uçar.
4124 Ey saray içində gəzib-dolaşan, həlim insan,
Vaxtı çatmadan hüzura girmə.

4125 Öz curlarına oturursansa,
Çağıran kimi dərhal qalx, hüzura gir.
4126 Bəylər bir şey soruşsalar, cavab ver,
Ancaq sözü çox uzatma, ey cəsur insan.
4127 Soruşsa, bildiyini ərz et,
Sözünü kəssə, daha davam etmə.
4128 Səni bəylər ziyafətə dəvət etsələr,
Yeməyi ədəblə ye, bunu yaxşıca öyrən.
4129 Yeməyi sağ əlinlə ye, ey hakim insan,
Yeməyə bismillahla başla.
4130 Başqalarının önündəki yeməyə əl uzatma,
Ey təmizqəlbli, qabağındakını ye.
4131 Orda bıçaq işlətmə, sümük sıyırma,
Başqalarına yemək uzatma, adam səsləmə.
4132 Acgöz kimi yemə, tələsmə,
Qadın kimi də çox nazlanma.
4133 Nə qədər tox olsan da, bəy aşını ye,
Bəy aşı əzizliyin başıdır.
4134 Sənə necə iş tapşırılsa, onu
Ürəkdən yerinə yetir, xoşbəxt olarsan".
4135 Bilikli nə gözəl söyləmişdir,
Bu sözü tutan adam külçə qızıl tapar:
4136 "Əgər sənə bəylik nəsib olarsa,
İşini biliklə idarə et, ey şöhrətli.
4137 Əgər misilsiz yavqu olsan,
Nə qədər güclü olsan da, vəfalı ol.
4138 Əgər sənə qoşunbaşılığı nəsib olsa,
Ey mərd igid, ayıq və comərd ol.
4139 Sənə hilbaşı və ya on otaq rütbəsi verilsə,
Malını payla, qılınc və yaya sarıl.
4140 Vəzirlik tuş gəlsə, əlinə hakimiyyət keçsə,
Pis qanunlar qoyma, daim həlim və yumşaq ol.
4141 Birinə ögəlik qismət olsa, ağıllı olmalı,
Bəyi yanılanda doğru yol göstərməlidir.
4142 Əgər kök-ayuqluq nəsib olarsa,
Özünü gözləməli, o, səadət kəməri taxmaq deməkdir.
4143 Özün subaşı və ya elbaşı olsan,
Doğru ol, qulağını, gözünü iti tut.



4144 Əgər hacib olsan, rüşvət alma,
Yoxsul, dul və yetim sözünü dinlə.
4145 Səni xəzinadar qoysalar,
Etimad qazan, qazan, doğru-dürüst ol.
4146 Əgər katib və ya sirr katibi olsan,
Könül sirrini bərk tut, ağzından söz qaçırma.
4147 Əsl mənsəb sahibi xidmətçilər bunlardır.
Digərləri onlara tabedirlər.
4148 Döşəkçi, quşçu, aşçılar kimi
Digər bir sıra işçilər də var.
4149 Bu cür xidmətlərdən uzaq dur.
Onların rahatlığı az, zəhməti çoxdur.
4150 Həmişə hörmət görmək istəsən,
Başqalarına hörmət et, ey yüksələn insan.
4151 Böyüyü böyük tut, hörmətini gözlə,
Sənə də dövlət və ululuq səadəti gələr".
4152 Dinlə atalar sözü nə deyir,
Atalar sözünə əməl edənin gözü açılar:
4153 "Böyüklər möhtərəmdir, bu, dünyanın qanunudur,
Böyük adam gəlsə ayağa qalx.
4154 Kiçiklər böyüyə hörmət etməlidirlər,
Böyük də kiçiyə eyni münasibət bəsləməlidir".

* * *

4155 Öyüdülmüş sözünü kəsb dedi:
Bax, bəy, belə xidmətçi də elə olur.
4156 Mən dedim, ən eşitdin, öyrəndin,
Xidmətin necə olmasını anladın.
4157 Bəyə göstəriləcək xidmət belədir,
Xidmət bəyənilsə, bağlı qapını qulun üzünə açar.
4158 Xeyirli xidmət budur, bunu bilsən yetər,
Bunu öyrənsən, bəyə yaxın adam olarsan.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

4159 Odqurmuş cavab verdi, dedi:
Ey möhtərəm zat, bu sözü eşitdim.

4160 Sənə deyiləsi bir sözüm də var,
Onu da mənə söylə.
4161 Mən Elikə xidmət üçün şəhərə ensəm,
Hər gün onun qapısına getməliyəm,
4162 Orada dostluğun, yaxınlığın nişanəsi nədir,
Həyat həmişə dostlarla birlikdə keçir.
4163 Xidmətçilərlə, şəksiz, münasibət qurmalısan,
Onlarla müəyyən şəkildə keçinmək lazımdır.
4164 Bu gün mənə bunu da söylə görüm,
Onlarla necə rəftar etməli, öyrənim.

## XLVIII

## ÖYDÜLMÜŞ QAPIDAKI XİDMƏTÇİLƏRLƏ NECƏ KEÇİNMƏK GƏRƏK OLDUĞUNU BƏYAN EDİR

4165 Öydülmüş cavab verdi, dedi:
– Bu çox mühüm bir məsələdir.
4166 Bunu da indi sənə öyrətməliyəm ki,
Onun yolunu – üsulunu biləsən.
4167 Həyat onlarla keçir, ey qardaş,
Onların bəzisini dost, bəzisini özünə yoldaş tut.
4168 Qapıdakılarla münasib olmalı,
Onlara qarışıb-qaynamalısan?
4169 Qapıdakılarla xoş keçinməsən,
Ey gözəl insan, həyatın zövqünü dadammazsan.
4170 Xidmət edən və qapı işlərini
Qaydaya uyğun tənzim edən nə deyir, eşit:
4171 "Yaxınlıq diləsən özün bəy ilə,
Qapıdakılarla yaxınlıq dilə.
4172 Sən ululuq tapmaq istəsən,
Əratla[1] yaxşı keçin, ey həlim insan.
4173 Bəylər səni özlərinə nə qədər yaxın tutsalar da,
Əratla yaxşı münasibət qur, dürüst ol.

[1] Ə r a t – xidmətçi



4174 Qapıdakılar üç sinfə ayrılırlar,
Həyatın işi bunlardan keçir.
4175 Bunlardan biri sənin rəisindir,
Ona xidmət etsən, səadətə yetərsən.
4176 Onları böyük bil, sözlərini əziz tut,
Sənə gülər üz göstərib hörmət etsinlər".
4177 Nə gözəl söyləmiş bilikli hakim,
Hakimlər sözünü ucuz tutma:
4178 "Kiçiyə böyüklük böyükdən gələr,
Böyüyə xidmət etsə, kiçik səadətə çatar.
4179 Böyüklərin sözünü dinlə, əmrlərinə yürü,
Böyük sözü tutan arzusuna yetər.
4180 Böyüklər iqbaldır, iqbala qovuşmaq istəsən,
Xidmət et, iqbalın rəhni xidmətdir.
4181 Bir də səninlə eyni rütbəlilər var, ey qardaş,
Onları uzaq tutsan – düşmən, yaxın tutsan dost olarlar.
4182 Tay-tuşun olan bu adamlarla qayna-qarış,
Onların münasibətinə eyni cür cavab ver.
4183 Bir də rütbəcə səndən kiçiklərdir,
Həyatın acısı-şirini onlarla keçir.
4184 Çalış ki, kiçiklər səni saysınlar,
Onlarla zarafatlaşma, dilini saxla.
4185 İşdə bir səhvləri olsa, cəzalandır,
Başlı-başına qoyma, nəzarət et.
4186 Çoxlu dost-yoldaş tap, tez-tez görüş,
Dostun çox olsa səni öyərlər.
4187 İnsanları bilmədən özünə düşmən etmə,
Düşməni olanlar sevinc tapmazlar.
4188 Düşmən nə qədər az olsa da, zərəri çoxdur,
Düşmən xeyirlidir deməyə dilim gəlməz".
4189 Ey könlü oyaq, eşit gör nə deyir,
Düşməndən ziyan görmüş adam:
4190 "Düşmən bir olsa da, zərəri mindir,
Min dostun olsa da, biri çatışmır.
4191 Heç kim düşmənindən fayda görmədi,
Əgər görmüşsə, öz məharəti sayəsində görmüşdür.
4192 Dostun sənə necə münasibət bəsləyirsə,
Sən də elə et, qoy sevinsin.

4193 Özünə tən adamla dost ol,
Dost-dosta tən gərəkdir.
4194 Sən yaxşı ad qazanmaq istəsən,
Pis yox, yaxşı otur-dur.
4196 Hər şey öz həmcinsi ilə gəzir,
Adam, heyvan, qur-quş öz həmcinsini tanıyır.
4197 Nə deyir eşit bir, ey elin başı,
Yoldaşına baxınca gördüm ki, ikisi də qaradır.
4198 Sığırçın qazlar arasında uçurdu,
Yoldaşına baxınca gördüm ki, ikisi də qaradır.
4199 Bax, qağayı qu quşlarına qarışmır,
Qara quş da ağ quşdan uzaq gəzir.
4200 Uçan quş cinsini tanıyır, sürüsünü tapır,
Sən insansan, içinə qarışdığın adamları tanı, seç.
4201 Yaxınlıq işi iki cür olur,
Bu iki şey üçün insan dost tapır:
4202 Biri ilahi sevgi ilə dost olandır,
Bu dostluğun içində əyrilik yoxdur.
4203 Bir də öz xeyiri üçün dost olandır,
Bu, güclə dostluqdur, təməli olmaz.
4204 Əgər ilahi dostluq qurmaq istəsən,
Onun yükünü çək, üzünü turşutma, qaşını çatma.
4105 Bunda xeyir gəzmə, səbirli ol,
Onun xeyirini sabah Tanrı verər.
4206 Əgər dostluqdan mənfəət güdürsə,
Belə adamla dostluğu kəs".
4207 Nə deyir eşit bir adaş tutmuş ər,
xeyirini-şərini çox sınamış ər:
4208 "Dostu xeyirdə-şərdə sına,
Bu işdə möhkəm olsa, ondan bərk yapış.
4209 Dostunun könlünü öyrənmək istəsən,
Sözlə onu əsəbləşdir, qaşqabaq tök.
4210 Səni sevib-sevmədiyini bilmək istəsən,
Çox sevdiyi bir şeyini istə, anlayarsan.
4111 Əgər bunların hər ikisində narazı qalmasa,
Bu insanı tanış kimi əziz tut.
4212 İftiraçı adamdan uzaq qaç,
Onun dilində yanar od vardır.



4213 Dünyada qarışıqlıq iftiradan yaranır,
Ey mərd, iftiraçının başını kəs.
4214 Bir də mənfəətpərəstlə yaxın olma,
O, şübhəsiz, sənə düşmən olacaqdır.
4215 Əgər o, umduğunu əldə etsə,
Səninlə kiçik və ya böyük qardaş münasibəti saxlar.
4216 Əgər əldə etməsə, səndən üz çevirər,
Görməzliyə vurar, uzaqlaşar.
4217 Mənfəət gözləməyən dost-yoldaş tap,
Onlara inan, qayğısız yaşa.
4218 Dost-yoldaş sevincdə, qayğıda,
Pisdə-yaxşıda insana fayda verər.
4219 Səni daha çox sevmələrini istəsən,
Onlarla duz-çörək kəs, gülərüz ol.
4220 Bu iki hərəkət insanı özünə isindirər,
Yaxşıda-pisdə ona arxa olar".
4221 Bilikli buna bənzər bir söz demişdir,
Bu sözə əməl et, ey təmizqəlbli:
4222 "İnsanlara gülə-gülə duz-çörək yedirt,
Onlara gülərüz göstər, şirindil ol.
4223 İnsanı qul edən bu iki şeydir,
Mən başqasını tapmadım, varsa, sən tap.
4224 Düşmən də iki cür olur,
Düşmənin varsa, sənə tələ qurur.
4225 Düşmənlərdən biri din düşmənidir,
Bu kafir elə hər zaman düşməndir.
4226 Bir də mənfəət üzündən düşmənlik var.
Bu düşmənliyi intiqam üçün edirlər.
4227 Kafir düşmənlə möhkəmcə savaş,
Bu işə könüllü şəkildə özünü fəda et.
4228 Sənə kimsə mənfəət üzündən düşmən olsa,
Ey comərd, öz xeyirindən vaz keç, onunla barış.
4229 Beləsi xeyir görsə, sənə yaxınlaşar,
Zərərin yerinə sənə faydası toxunar.
4230 Düşməni dost etməyə çalış,
Onunla barış, rahat yaşa.
4231 Düşmən olmaqda heç bir fayda yoxdur,
Bunu bil, faydasız işə əl atma.

4232 Yaxşı xidmət et, düşmən qazanma,
Düşməni olanın başına min dərd gələr.
4233 Yaxşı və seçkin adamlarla dost ol,
İnsanın dostu pis çıxsa, peşman olar".
4234 Seçkin adamla yaxınlıq qurmaq istəsən,
Bu arzuya iki cür adamla yetmək mümkündür:
4235 "Biri nəzakətli seçkin adamdır,
Onunla dost ol, ey yetkin insan.
4236 Biri imanlı, Allahı tanıyandır,
Ondan hər cür insanlıq gələr.
4237 Bu cür insana yaxınlıq göstər,
Bunlar sənə yaxşılıqla cavab verərlər.
4238 Pisliklə ad çıxarmış adamdan uzaq dur,
Belələrinin əməli qara olur.
4239 Ey ağ təbiətli, qaraya yaxınlaşma,
Bax, qara ağa tez bulaşar".
4240 Nə gözəl bilik vermiş alim – müşavir,
Bunu oxuyan bilikli düşünər, sayıq olar:
4241 "Pislərlə oturub-durma, ey gözəl insan,
Yoxsa sənin təbiətin də pis olar.
4242 Ey seçkin, nadir insan, pisə yaxınlaşma,
Adın pisə çıxar, səadətinə xələl gələr.
4243 Yaramaz adama yaxın getmə,
Yoxsa sonra yaxandan əl çəkməzlər.
4244 Yaxşı ad qazanmış çox adam gördüm,
Pislərə qarışınca işləri pozuldu.
4245 Pis yoldaş üzündən zərər görən,
Adı-sanı zorla silinən yaxşı adamlar gördüm.
4246 Bu bəylər evinin adı qarşıdır[1]
Saray içindəkilər bir-birinə qarşıdır.
4247 Bu qapıda paxıllıq çox olur,
Paxıllıq olan yerdə dava-döyüş olar.
4248 Səndən böyüklər sənə paxıllıq edərlər,
Sən etibardan düşər, peşman olarsan.
4249 Eyni rütbəlilər də sənə paxıllıq edərlər,
Yaxşılıqların görünməz, günün gecəyə dönər.

[1] Qarşı – qədim türk dilində saray



4250 Səndən kiçiklər də paxıllıq edərlər,
Sənin yaxşılığını istəməzlər.
4251 Buna görə saraydakılar qarşı-qarşıya gəlirlər,
Belə olduqda ikisindən biri ölür.
4252 Ey könlümün günəşi, sən paxıl olma,
Doğru yoldan heç vaxt çıxma.
4253 Paxıllıq xəstəlikdir, müalicəsi uzundur,
Onun yediyi özünü yeyər, öz-özünü əridər.
4254 Yaxşılıq-pislik Tanrının hökmüdür,
Tanrı versə, paxıl ona mane ola bilməz.
4255 Belə isə, paxıllığın nə xeyiri var,
Paxılın sonu xəstəlikdir.
4256 Gücün çatan qədər yaxşılıq et,
Şübhəsiz, əvəzində yaxşılıq görərsən.
4257 Birini sevinci varsa, sən də sevin,
O, kədər və qayğıya düşsə, sən də kədərlən.
4258 Adın yaxşı olar, səni sevərlər,
Hamı səninlə dostluğa can atar.
4259 Bircə düşmən qazanma, ey qardaş,
Nə qədər mümkünsə dost tut, ey adaş.
4260 Əgər biri düşmən olsa,
Sərvaxt ol, sən də ona tələ qur".
4261 Düşmənlə çarpışmış, qalib gəlmiş
Adam nə deyir, eşit:
4262 "Qafil olma, düşmənə yaxın durma, uzaqlaş,
Düşməni qəfil ovla, tora sal.
4263 Düşməni sınama, böyük və güclü bil,
Dəyənəkli yağıya qarşı dəmir, qalxan hazırla.
4264 Dost-yoldaşın yükünü çək, könüllərini qırma,
Sözünü unutma, bunu daim göz önündə tut.
4265 Əgər dostun sənə düşmən olsa,
Ya canına, ya da malına qəsd edər.
4266 Dostun sənin içini-çölünü bilər,
Belə adam səndən çox şey qoparar.
4267 O istəsə, sənin malına əl uzadar,
İstəsə sənin canını iliklə bəslər.
4268 Sən özünü necə gözləyirsənsə,
Dostunu da elə qoru, vəssalam.

4269 Dost olmaq asan, dostluğu qorumaq çətindir
Düşmən olmaq asan, barışmaq çətindir.
4270 Düşmənin varsa, canını, bədənini qoru,
Düşməni olan insanların qurtuluşu çətindir.
4271 Bu iki cür adamla münasibətdə olma,
Münasibətdə olsan ziyana düşərsən.
4272 Biri dedi-qoduçudur,
O biri ikiüzlü, mənfəətpərəstdir.
4273 Bir də içkiyə düşkün adamla dost olma,
O sənə vəfa qılmaz, könlünü qırar.
4274 Öz xeyirini güdən dosta könül vermə,
Xeyir görməsə, düşmən olar, ondan vaz keç.
4275 İstəsən ki, hamı sənə yaxınlıq göstərsin,
Heç kimdən heç nə istəmə.
4276 Ömrünün sevinclə keçməsini istəsən,
İnsanlara həsəd aparmamağa çalış.
4277 Düşmənləri özünə qul etmək istəsən,
Saf qızıl tök, saqqallarından tut.
4278 Yanındakını özündən uzaqlaşdırmaq istəsən,
Ona istədiyini vermə, onunla qaba danış.
4279 Əgər uzun ömür diləsən, comərd ol,
Başqalarından duz-çörək əsirgəmə.
4280 Özünü hamıya sevdirmək istəsən.
Sözünlə fikrin eyni, dilin şirin olsun.
4281 İstəsən sənə hörmət etsinlər,
Başqalarına hörmət et, ey mehriban insan
4282 Hər baxımdan varlı olmaq istəsən, qənaətkar ol,
Öz nəsibini əldə etmiş olarsan.
4283 İstəsən ki, səni həmişə öysünlər,
Hamıya qarşı gülərüz ol.
4284 Əsl insan belə olar,
İnsana qarşı insanlıq şüarın olsun.
4285 Bir adamın əslini bilmək istəson,
Əməlinə bax, dərhal anlarsan.
4286 Bu beyti söyləyən çox gözəl söyləmişdir,
Sözü və onun mənasını bir-birinə şahid göstərmişdir.
4287 İnsanın əslini açıq olaraq bilmək istəsən,
Onun düşüncəsi, sözü, hərəkəti buna şahiddir.



4288 Hərəkəti xoş, sözü, düşüncəsi doğru isə,
Bu onun nəcabətinə dəlalət edər.
4289 Kobud adamlara qoşulma, ey təmiz əsilli,
Onlar səndə abır qoymazlar".
4290 Kobudlardan uzaq olan ağıllı,
Davranış bilən adam nə deyir, eşit:
4291 "Kobudlara qoşulma, təmiz və həlim ol,
Ey oğul, bütün davaların səbəbkarı kobudlardır.
4292 Qəzəbli adama da yaxınlıq etmə,
Qəzəblənsə, dostluq haqqını tapdalayar.
4293 Könül sirrini və sözünü heç kəsə açma,
Açsan, özün zəhmətə düşərsən.
4294 Daim artan bir yaxınlıq görmək istəsən,
Tamahkar olma, ona mane ol,
4295 Üzünün daim gülməsini istəsən,
Doğruçul ol, rahatca yaşa.
4296 Özünün və sözünün nüfuzlu olmasını istəsən,
Heç nəyə qarışma, əlini qısa tut.
4297 Şərəf və etibarını qorumaq istəsən,
Ağızdan yalan çöz çıxarmamağa çalış.
4298 Harada dövlət başını qaldırsa,
Sən oraya get, ey yaxşı insan.
4299 Sən iqballa öcəşmə, onunla anlaş,
Anlaşa bilməsən, acı olar yediyin aş.
4300 Sözünün nüfuzlu olmasını istəsən,
Soruşduqları vaxt danış, sözün doğru olsun.
4301 Boş söz danışma, qeybət etmə,
Dedi-qodu etmə, fitnə yaratma.
4302 Söz bir qasırğadır, qəlbi sızladar,
Qəlbi sızlayan kəs səni məhv edər.
4303 Özündon böyüyün sözünə qarşı çıxma,
Cavab verəndə qaba danışma.
4304 Böyükləri əziz tut, hörmətini gözlə,
Sən də böyük, xoşbəxt olarsan.
4305 Sən dost-tanışla tez-tez görüş,
Onlara qoşul, münasibətini kəsmə.
4306 Sənə doğrudan hörmət göstərsələr, sən də hörmət et,
Səni saymayanı sayma, yaxın durma.

4307 Onlar nə etsələr, sən də onu et,
Şirin sözə şirin dillə cavab ver.
4308 Yaxşılara qarşı yaxşı ol,
Pislərə qarşı pislikləri nisbətində pis ol".
4309 Gözəl, yaxşı demiş qanun bilmiş ər,
Qayda-qanun ilə ölkəyə rəhbərlik etmiş ər:
4310 "Sənə "siz" deyənə, sən də "siz" de,
Qarşındakından da nəzakətli ol.
4311 Qaya əks-sədasından susqun olma,
Sənə "sən" deyənə, sən də "sən" de".

* * *

4312 Əratla münasibət belə olmalıdır,
Qoşulmaq istəsən, çarəsi budur.
4313 Mən söylədim, sən eşitdin,
Yadında saxla, vəssalam.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

4314 Odqurmuş cavab verib dedi:
– Bu sözləri eşitdim, ey qəlbi pak.
4315 Bundan başqa bir sözüm də var,
Onu da mənə söylə, ey gözəlüzlüm.
4316 Bu gün kəndə-şəhərə getsəm,
Gərək xalqa qoşulam, onunla yaşayam.
4317 Onlarla necə münasibət qurmalıyam,
Söz açmışkən, bunu da mənə söylə.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4318 Öydülmüş cavab verib dedi: – Ey təmizqəlbli,
Doğurdan da bu vacib bir sözdür.
4319 Gələcəkdə lazım olan məsələyə toxundun,
Eşit, mən bunu sənə söyləyim.



# XLIX

## ÖYDÜLMÜŞ ODQURMUŞA QARA CAMAATLA NECƏ RƏFTAR ETMƏK GƏRƏK OLDUĞUNU BƏYAN EDİR

4320 Qara camaatın təbiəti bambaşqadır,
Onun biliyi, tövrü də təbiətinə uyğundur.
4321 Qara camaat görgüsüz olur,
Aralarında nə qayda, nə də üsul var.
4322 Fəqət yenə də bunlarsız iş aşmaz;
Onlara qarşı yaxşı münasibət saxla, ancaq yoldaşlıq etmə
4323 Qara camaatın təbiəti də qapqaradır,
Çalış, özünü bu qaraya bulama.
4324 Onun hərəkəti və təbiəti qarışıqdır,
İşi-gücü də təbiəti kimidir.
4325 Qarınlarını doyurmaq üçün yeməyi bilirlər,
Boğazdan başqa bir qayğıları yoxdur.
4326 Görüb-götürmüş, yolundan çaşmayan insan,
Qara xalqın təbiəti haqda nə deyir, eşit:
4327 "Qara xalqın qayğısı ancaq qarnıdır,
Əlləşib-çarpışması boğazı üçündür.
4328 Boğaz uğrunda çoxları can verib,
İndi qara yer altında peşmanlıqla od yeyir.
4329 Qara xalqın qarnı doysa, dili baş qaldırar,
Möhkəm tutmasan, hakim olmağa çalışar.
4330 Ey qardaş, onlarla da münasibət qur,
Yeyib içəcəklərini əskik eləmə.
4331 Şirindil ol, nə istəsələr ver,
Bax, verən alır, qazancdan istifadə edir.
4332 Çox danışma, özünə hakim ol, dilini qoru,
Çox söylənən sözün qiyməti olmaz".
4333 Özünə hakim olan, dilini qoruyan
Bilikli adam nə deyir, eşit:
4334 "Hər sözü söz deyə ağzından çıxarma,
Gərəkli sözü düşünərək, ehtiyatla de.

4335 Bir ağıllı adam gördüm, az danışdı,
Ancaq "çox danışdım" deyə illərcə peşmanlıq çəkdi".

## L

## ƏLƏVİLƏRLƏ[1] MÜNASİBƏTİ BƏYAN EDİR

4336 Xidmətçilərdən və bəyin adamlarından başqa
Münasibətdə olacağın adamlar da var.
4337 Bunlardan biri peyğəmbərin nəslidir.
Onlara hörmət etsən dövlətə və səadətə yetərsən.
4338 Onları çox və könüldən sev,
Onlara yaxşı bax, kömək elə.
4339 Onlar əhli-beytdirlər, Həbibin[2] qohum-qardaşıdırlar,
Ey qardaş, sən də onları Həbibin haqqı üçün sev.
4340 Ağızlarından *səfeh söz* çıxmayana qədər
Onların əslini-nəslini soruşma.

## LI

## ALİMLƏRLƏ MÜNASİBƏTİ BƏYAN EDİR

4341 Digər bir zümrə də alimlərdir,
Onların elmi haqqın yoluna işıq saçır.
4342 Onları çox sev, onlardan hörmətlə bəhs et,
Az-çox onların biliklərini öyrən.
4343 Xeyir-şəri bir-birindən seçən,
Doğru-təmiz yol tutan onlardır.
4344 Mümkünsə, elmlərini öyrən, biliklərini bil,
Onlara yaxşılıq et, köməklik göstər.
4345 Bu dinin dirəyi gerçəkdən onlardır.
Doğru şəriətin təməli onların biliyidir.

[1] Ə l ə v i l ə r – burada Əli övladları
[2] H ə b i b – Həzrət peyğəmbərin ləqəblərindən biri



4346 Dünyada hakim və alimlər olmasaydı,
Əkilsəydi də, yerdən qida çıxmazdı.
4347 Onların elmi xalq üçün bir məşəldir,
Gecə məşəl yansa, insanlar yolda azmazlar.
4348 Onlara mal payla, yedirt-içirt,
Gülər üz və şirin sözlə xidmətlərində dur.
4349 Sərt və kobud danışma, onlardan çəkin,
Onların əti yeyilməz, zəhərdir.
4350 Onlara qarşı qaba və acıdil olma,
Duz-çörək yedirt, hörmət elə.
4351 Onları eşit, biliklərinə görə hörmət elə,
Əməlləri haqqında dedi-qodu eləmə.
4352 Sənə lazım olan şey onların elmdir,
*Onlar insanlara yol göstərənlərdir.*
4353 Onları qoyun sürüsünün qoçu san,
Onlara başa keçib sürünü doğru yola çəkirlər.
4354 Onlarla münasibət qur, xoş dolan ki,
Səadətə qovuşub hər iki dünyada məsud olarsan.

## LII

## TƏBİBLƏRLƏ MÜNASİBƏTİ BƏYAN EDİR

4355 Bunlardan başqa bir neçə zümrə də var,
Bax, bilikləri bir-birindən fərqlidir.
4356 Onlardan biri də təbiblərdir,
Xəstəlik və ağrıları onlar sağaldır.
4357 Onlar da sənin üçün lazımlı adamlardır,
Həyat onlarsız keçinmir.
4358 İnsan həyatda xəstələnirsə, təbibə deyir,
Təbib onu müalicə edir.
4359 İnsan üçün xəstəlik ölümün yoldaşdır,
Hər bir canlı insan üçün ölüm var.
4360 Təbiblərlə xoş dolan, özünə yaxın tut,
Onlar gərəkli adamlardır, haqlarını gözlə.

## LII

## ƏFSUNÇULARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4361 Bunlardan sonra əfsunçular gəlir,
Cin-pəri xəstəliklərini onlar sağaldır.
4362 Bunlarla da görüşmək, bilişmək lazımdır,
Cin-pəri xəstəliklərini oxutmaq gərəkdir.
4363 Təbib əfsunçunun sözünü bəyənməz,
Əfsunçu da təbibə qiymət verməz.
4364 Biri deyir dərman içsən, xəstəlik sağalar,
O biri deyir dua daşısan, cin qaçar.

## LIV

## YUXU YOZANLARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4366 Bax, elmlərdən biri də yuxu elmidir,
Kim onu yozsa, xeyirə yozar.
4367 *İnsan yatanda yuxu* görər,
Yozan yuxunu yaxşı yozsa, çin çıxar.
4368 Yuxu yozan onu xeyirə yozsa,
Yuxu yaxşı çıxar, insan sevinər.
4369 Əgər *yuxu pis və ya fəna olsa,*
Yoxsula sədəqə verib, adamı şərdən qorumaq gərəkdir.
4370 Bu yuxu elminə, bax, rəhmdil Allah,
Qula xeyir arzuladı, yuxuda əlamət göstərdi.
4371 Yuxu yaxşı olsa, görən adam sevinməli,
Pis olsa, rəbbə sığınmalıdır.
4372 Kasıba gümüş, mal paylansa,
Tanrı bəlanı sovuşdurar.
4373 Yuxu yozuma bağlıdır, yuxunu xeyirə yoz,
Ey yuxu yozan, yuxunu diqqətlə araşdır.



4374 Yuxunu belə yaxşı yozan onlardır,
*Bilik və səmimiyyəti ilə insanlara yaxşılıq edirlər.*
4375 Onlarla yaxşı rəftar et, ey qardaş,
İstər dost ol, istər yoldaş.

## LV

## MÜNƏCCİMLƏRLƏ MÜNASİBƏTİ BƏYAN EDİR

4376 Bundan sonra münəccimlər gəlir,
Baxsın görərsən ki, onlar rahatlığa yol açırlar.
4377 İl, ay, gün hesabını onlar tuturlar,
*Ey qüdrətli insan, hesab çox lüzumlu şeydir.*
4378 Bunu oxumaq üçün həndəsə oxumalısan,
Yalnız ondan sonra hesab qapısı üzünə açılar.
4379 Vurma və bölmə oxu, bütün kəsrləri öyrən,
Bu, kamil adam üçün mükəmməl imtahandır.
4380 Sən təzif və təsnifi yaxşıca öyrən,
Bundan sonra ədədlərin kökünü araşdır.
4381 Sonra cəmə, təfriq və məsahaya keç,
Yeddiqat fələyi ovucunda çöp kimi tut.
4382 Sonra da istəsən cəbr ilə müqabilə oxu,
Bir də İqlidisin qapısını yaxşıca döy.
4383 Dünya, yaxud axirət işi olsun,
Alim onları hesabla tutar.
4384 Hesab pozulsa dünya və axirət işi,
Onunla birlikdə pozular, ey gözəl insan.
4385 Hər hansı bir işə başlamaq istəsən,
Əvvəlcə zamanın yaxşı, yaxud pis olmasını öyrən.
4386 Gün və ayların uğurlusu və uğursuzu var,
Soruş, uğurlunu seç, ey pak qəlbli.
4387 Nə gözəl söyləmiş bilikli insan:
"Biliklikdən soruş, işini ona görə qur.
4388 İnsan işini biliklə başlasa,
Şübhəsiz, nə iş görsə, diləyinə qovuşar.

4389 Hər işdə əvvəlcə bilik qazanmaq xeyirdir,
Biliyi sonraya qoysan, əlin işə yetməz.

4390 Sözü onlardan soruş, lakin dərhal inanma,
Tanrıdır bilikli, bundan bərk tut.

4391 Bunlarla da xoş keçin, anlaş,
Onlara qəzəblənmə, qəlblərini qırma".

## LVI

## ŞAİRLƏRLƏ MÜNASİBƏTİ BƏYAN EDİR

4392 Sonra şairlər, söz düzənlər,
İnsanı öyənlər, yaxud söyənlər gəlir.

4393 Qılıncdan itidir şairin dili,
Tükdən çox incədir, qəlbinin yolu.

4394 Dərin, incə sözləri anlamaq istəsən,
Sözü onlardan eşit, anlarsan.

4395 Yaxşı diqqət etsən, onlar dənizə dalaraq
Gövhər, inci, yaqut çıxarana bənzər.

4396 Onlar kimi öysələr, öygü ölkələrə yayılar,
Əgər söyləsələr, insanın adı əbədi pis olar.

4397 Onlarla imkan dərəcəsində yaxşı dolan, ey qardaş,
Bunların dilinə düşmə, ey adaş.

4398 Əgər təriflənmək istəyirsənsə,
Onları sevindir, vəssalam.

4399 Nə istəsələr, hamısını ver,
Onların dilindən özünü satın al.

## LVII

## ƏKİNÇİLƏRLƏ MÜNASİBƏTİ BƏYAN EDİR

4400 Başqa bir zümrə də əkinçilərdir,
Onlar da gərəkli insanlardır.



4401 Onlarla qaynayıb-qarış, təmas qur,
Boğazından sarı rahatca yaşa.

4402 Hər canlı onlardan istifadə edər,
Yemək-içmək zövqünü hamıya onlar verər.

4403 Bütün canlılar acanlar və doyanlardır,
Bütün yaşayanlar əkinçilərə möhtacdır.

4404 Boğazının ehtiyacını ödəmək üçün
Onlar, şübhəsiz, sənə də gərəkdir.

4405 Onlarla münasibətdə ol, ey qadaş,
Boğazın təmiz, aşın halal olsun.

4406 Hər işində tədbirli hərəkət edən,
İman sahibi adam nə deyir, eşit:

4407 "Çox incə olan bu doğru yolda yürümək istəsən,
Yeməyin halal olsun, ey təmizqəlbli.

4408 Gerçəkdən iman sahibi olmaq istəsən,
Yeməyin və geyimin halal olmalıdır.

4409 Kasıb deyil, varlı olmaq istəsən,
Heç vaxt zina etməməyə çalış.

4410 Həmişə etibarlı qalmaq istəsən
Heç vaxt fəsada uyma, ey yumşaq qəlbli.

4411 Hər şeyin təməlini pozan şey fəsaddır,
Hər yaxşı izi silən fəsaddır.

4412 Səadət tapmış adam fəsada yaxınlaşmaz,
Fəsad sönmüş odu alışdırıb-yandırar".

4413 İşə bilik ilə əl uzadan,
Təmizqəlbli insan nə gözəl demişdir:

4414 "Fəsad ətrafında dolaşma, ona yaxınlaşma,
Fəsad olan yerdə ucuzluq hazırdır.

4415 Səadət fəsadla bir yerdə durmaz, qaçar,
Əgər dursa da gündüz yox, gecə durar.

4416 Əkinçilərin əlləri geniş olur,
Allahın verdiyini geniş qəlblə xərcləyirlər".

4417 Hər məxluq öz ruzisin alır:
"Yeriyənlər yeməklərini, uçanlar yemlərini".

4418 Sən də onlarla qayna-qarış, münasibət qur,
Onlara qarşı şirindil, gülərüz ol.

## LVIII

## SATICILARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4419 Bunlardan sonra gələn satıcılardır,
Onlar satmaqdan doymur, qazanc qazanırlar.
4420 Qazanc dalınca dünyanı dolaşırlar,
Ağıl vo könüllərini Tanrıya çevirirlər.
4421 Onlarla qayna-qarış, get-gəl,
Nə istəsələr ver, alış-veriş elə,
4422 Xalqın bəyəndiyi seçmə, gözəl şeylər,
Dünyanın hor cür neməti onlardadır.
4423 Şərqdən qərbə qədər gəzirlər,
İstədiyin şeyi sənə gətirirlər.
4424 Min növ ipək, dünyanın nadir şeyləri,
Onlarda olur, ey bilikli comərd.
4425 Dünyanı dolaşan bu satıcılar olmasaydı,
Qara samur dərisindən kürkü haçan geyərdin?
4426 Xatay karvanı yolu tozu-dumana qatmasaydı,
Min növ ipək haradan gələrdi?
4427 Satıcılar gəzib dolaşmasaydılar,
Bu qatar-qatar inciləri kimin gözü görərdi?
4428 Buna bənzər şeylər çox-çoxdur,
Sözü uzatmamaq üçün burada kəsirəm.
4429 Bütün satıcılar belə olurlar,
Onlarla təmas qur, qapını üzlərinə aç.
4430 Onlarla ən xoş münasibətdə olmağa çalış,
Sənin adın da xeyirxahlıqla uzaqlara yayılar.
4431 Onlar dünyanın hər yerinə sənin adını yetirərlər,
Yaxşı-pis olsun, adını dünyaya onlar yayarlar.
4432 Sənə az-çox hədiyyə versələr,
Əvəzini ver ki, sevinsinlər.
4433 Xeyir və zorər xüsusunda həssas olurlar,
Onlarla iş tutanda buna fikir ver.
4434 Eşit gör dünyanı gəzmiş ər,
Başına çox macəra gəlmiş ər nə deyir:



4435 "Dünyada adım yayılsın desən,
Yolçularla xoş keçinməyə çalış.
4436 Sən gerçəkdən məşhur olmaq istəsən,
Yolçu və karvanlara qarşı daim yaxşı hərəkət et.
4437 Ey oğul, yaxşı ad qazanmaq istəsən,
Yolçu və karvanlara qarşı daim yaxşı hərəkət et.
4438 Satıcılarla xoş münasibət qur,
Ad qazan, sevinc içində yaşa".

## LIX

## HEYVANDARLARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4439 Bundan sonra heyvandarlar gəlir,
Bütün sürülərin başçısı bunlardır.
4440 Bunlar doğru və dürüst adamlardır,
Heç kimə yük olmazlar.
4441 Ordunun yeməyini, geyimini, at və ayqırını,
Yük heyvanlarını bunlar yetişdirirlər.
4442 Qımız, süd, yağ, yoğurt, qurut, pendir,
Dəri və keçəni evin rahatlığını təmin edirlər.
4443 Bunlar çox faydalı adamlardır,
Əzizim, bunlardan bərk yapış.
4444 Qayna-qarış, yedirt-içirt,
Həyatını doğruluq içində keçirt.
4445 Nə istəsələr – ver, nə lazım olsa al,
Doğru gördüm, bu zümrə hiylə bilməz.
4446 Onlardan gözəl davranış və bilik gözləmə,
Tövr və hərəkətləri sərbəst olur.
4447 Onlarla münasibətdə özünə diqqət et,
Onlar görməmiş, kobud adamlardır.
4448 Dilin şirin olsun, ancaq dost kimi hərəkət etmə,
Bunlar biliksiz və cahildirlər.

4449 Qanun verən, xalqa qarışıb onu sınayaraq
Öyrənən adam yaxşı demişdir:
4450 Biliksizi özünə yaxın tutma,
Yaxın tutsan, şübhəsiz, pis hərəkət görərsən.
4451 Bax, bilikli bundan da yaxşı demişdir,
İşə həmişə biliklə əl uzadarlar:
4452 Biliksizlərə yaxınlaşma, özünü saxla,
Özünü saxlaya bilən şad-xürrəm yaşayar.
4453 Biliksiz insanlardan uzaq dur, qaç,
Biliksizin sözü və əməli kobuddur.
4454 Bax, heyvandarlar belə olurlar,
Onlarla rəftarında bu sözüm sənə yol göstərər.
4455 Həyatdan necə pay almağı
İndi sənə açıqca söylədim.

## LX

## SƏNƏTKARLARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4456 Başqa bir zümrə də sənətkarlardır,
Yaşamaq üçün sənətkarlıq edirlər.
4457 Bunlar da sənə gərəkli insanlardır,
Ey igid, onlarla yaxın ol, xeyir görərsən.
4458 Bunlar dəmirçi, çəkməçi, dəriçi,
Cilaçı, boyaqçı, oxçu və yayçılardır.
4459 Dünyanın bəzəyi onlardan gəlir,
Heyrətli məharət onlardan çıxır.
4460 Onların sayı çoxdur, saysam söz uzanar,
Qalanlarını özün təsəvvür et, vəssalam.
4461 Onlarla görüş, tanış ol, onları sevindir,
Onda öz həyatın da sevinc içində keçər.
4462 Sifariş etdiyini işi görsələr,
Yedirt-içirt, haqlarını ödə.
4463 Qoy səni xalq içində pisləməsinlər,



Çalış, adın ləkələnməsin.
4464 Bilikli, xalqa mehriban,
Təmiz, qəlbi düz adam yaxşı demişdir:
4465 "Yalnız həyat dilərnə, həm də yaxşı ad dilə,
Yaxşı ad da gərəkdir insana həyat ilə.
4466 Özün bir gün öləcəksən adın qalacaq,
Adın yaxşı olsa, həyat zövq verər.
4467 Kimin adı ləkələnsə, pis olsa,
Belə dirilikdən ölüm yaxşıdır.
4468 Sərmayədir bu həyatda yaxşı ad,
Boş dayanma yaxşılıqla qazan ad".

## LXI

## YOXSULLARLA MÜNASİBƏTİ BƏYAN EDİR

4469 Bunlardan sonra yoxsullar gəlir,
Onlara mal payla, yedirt və içirt.
4470 Duaçı olarlar sənə, ey qardaş,
Çox gözəl şeydir bu dua, ey adaş,
4471 Onlardan əvəzində mal istəmə,
Əvəzində Tanrı sənə cənnəti qismət edər.

* * *

4472 Onların sənə, yaxud sənin onlara işin düşsə,
Bil ki, ölkədə təmas ediləcək adamlar yoxsullardır.
4473 Onların işini həll edərkən, rəhmdil ol,
Onda bütün yoxsullar sənə yaxın olarlar.
4474 Beləliklə, iki dünya nemətinə qovuşarsan,
Yaxşı ad qazanarsan, sanın dünyaya yayılar.

## LXII

## NECƏ EVLƏNƏCƏYİNİ BƏYAN EDİR

4475 Əgər evlənmək istəsən,
Yaxşı qız axtar, gözünü iti tut.
4476 Kökü, ailəsi, nəsəbi yaxşı olsan,
İffətli, namuslu, təmiz olsun.
4477 Əl dəyilməmiş qız al,
Səndən başqa ər üzü görməmiş olsun.
4478 Beləsi səni sevər, səndən başqasını tanımaz,
Yaramaz hərəkət də eləməz.
4479 Özündən aşağı dərəcə ilə evlən,
Yuxarı dərəcədə evlənsən, əsir olarsan.
4480 Eşit gör nə deyir sınamış kişi,
Sınamış kişilər bişirər işi:
4481 "Arvadın özündən aşağı dərəcədən olsun,
Onda ömrün şad-xürrəm keçər.
4482 Qızda gözəllik yox, gözəl xasiyyət axtar,
Xasiyyəti yaxşı olsa, məmnun olarsan.
4483 Ey imanlı adam, evlənmə,
Evlənsən, öz babınla evlən.
4484 Üz gözəlliyi deyil, gözəl xasiyyət ara,
Xasiyyəti gözəl olan, mükəmməl insandır.
4485 Ey gözəllik arayan, gözəllik arama,
Qızıl bənizini saraltma.
4486 Ey ərlərin başı, evlənmək istəyənlər
Bu dörd növ qadınla evlənirlər:
4487 Biri varlı qadınla evlənmək istər,
Onun nəcabətilə fəxr edər.
4488 Biri əsil-nəcabətli qadın istər,
Onun nəcabətilə fəxr edər.
4489 Biri namuslu olmasını arzular,
Tapınca, özünü ona qapdırar,
4490 Bunların hansı düzdür – sənə deyim,
Evlənmək istəsən mənə qulaq ver.



4491 Varlı qızla evlənməyi arzu edib,
Ona əsir olma, ey bilikli və seçkin insan.
4492 O, malına güvənərək dilini uzadar,
Çox şey istər, sən nə edərsən?
4493 Ey gözəllik arayan gözəl insan,
Gözəllik arama, gülünc hala düşərsən.
4494 Qadının gözəlliyini hamı istər,
Ancaq onu Tanrının fəzli qoruyar.
4493 Ey nəcabət, böyüklük arayan insan,
Bu nəcabət içində kiçik mövqeyə düşmə.
4496 Nəcabətlilər yüksəkdən danışırlar,
Sən qadın əsiri olma.
4497 Ey qadının namuslu olmasını istəyən bəyzadə,
Beləsini tapsan, bu dörd şeyi birlikdə taparsan.
4498 Yaxşı və namuslu bir qadın tapsan,
Dərhal evlən, ey gözələ insan.
4499 Var istəsən, o, qənaət edər,
Səni varlandırar, üzünü güldürər.
4500 Əxlaqı dürüst olan adam gözəl görünür,
Qadının gözəlliyi hərəkətindədir, bunu bilən bilir.
4501 Namuslu, təmiz qadın nəcabətlidir,
Digər üç şey də onda birləşir, ey qüdrətli insan,
4502 Ey hakim, namuslu qadın arzula,
Namuslu qadında o dörd şey birləşir.
4503 Belə bir qadın tapsan,
Fürsəti qaçırma, ey mərd igid".

## LXIII

## UŞAQLARIN NECƏ TƏRBİYƏ EDİLƏCƏYİNİ BƏYAN EDİR

4504 Sənin ayüzlü oğlun-qızın doğulsa,
Evində tərbiyə ver, başqa adama tapşırma.
4505 Yaxşı və təmiz bir südanası tap,
Uşaqlar sağlam böyüyər, uzun ömürlü olarlar.

4506 Oğul-qıza bilik və ədəb öyrət,
Hər iki dünyada onlara xeyiri dəyər.
4507 Oğluna qız al, qızını ərə ver,
Ömrünü dərdsiz keçir, ey xoşbəxt ər.
4508 Oğula bütün ərdəmləri öyrət,
Gələcəkdə bu ərdəmlər sayəsində varlı olsun.
4509 Oğulu avara gəzməyə qoyma,
Avara hər yana gedər, yazıq olar.
4510 Qızı evdə uzun zaman saxlama,
Yoxsa peşmançılıq səni öldürər.
4511 Ey dost-yoldaş, sənə qəti bir söz deyim,
Qız doğulmasa, doğulsa da yaşamasa yaxşıdır.
4512 Əgər doğulsa, ona yerinin torpağın altı,
Evinin qəbirə qonşu olması yaxşıdır.
4513 Qadınları daim evdə saxla,
Qadının içi çölü kimi olmaz.
4514 Yad adamı evə gətirmə, qadını çölə qoyma,
Küçədə onları görən göz qadının könlünü ovlar.
4515 Göz görməsə, könül arzu etməz,
Ey oğlu, gözün görsə, könlün arzular.
4516 Gözünü gözləsən, könlün bir şeyə axmaz,
Arzu etməsə. insan heç nəyə məftun olmaz.
4517 Yeyib-içməklə qadını kişilərə qatma,
Əgər qatsan, ölçünü aşarlar.
4518 Qadını evdən bayıra buraxma,
Əgər çıxsa doğru yoldan azar.
4519 Qadının əsli ətdir, əti qorumalı,
Qorumasan ət qoxar, buna çarə yoxdur.
4520 Qadına hörmət elə, nə istəsə ver,
Qapını kilidlə, yad kişini evə qoyma.
4521 Bunlarda əzəldən vəfa yoxdur,
Gözləri baxan yerə könülləri axar.
4522 Onlar zəhmətlə baş verən ağaca bənzər,
Meyvəsi zəhərdir, onu yemə.
4523 Neçə min qüdrətli ərənlər əri
Qadınlardan ötrü məhv olmuşdur.
4524 Neçə alyanaqlı, üzü gözəl ər,
Qadınların üzündən qara torpaq olmuşdur.



4525 Qadınlar minlərlə adlı-sanlı qəhrəmanı
Diri-diri torpağa gömmüşlər.
4526 Onları necə tutub saxlamaq olar?
Hər şeyi qoruyan Tanrı onlarla başa çıxsın.

## LXIV

## QULLUQÇULARLA NECƏ RƏFTAR OLUNACAĞINI BƏYAN EDİR

4527 Qulluqçularla da xoş rəftar elə,
Yemək-içmək və paltarlarını əskik eləmə.
4528 Onlara gücləri nisbətində iş ver,
Qadir Tanrı bunların hesabını səndən soruşacaq.
4529 Onlara zəhmətli iş tapşırma, əziyyət vermə,
Allah səni buna görə cəzalandırar.
4530 Onlar da Allahın quludur, zülm etmə,
Zülm edərək cəhənnəmi satın alma.
4531 Sən böyüksən, onlar səndən kiçikdir,
Böyük həmişə kiçiyə qarşı şəfqətli olmalıdır.
4532 Nə qədər böyük olsan da, sadə və təvazökar ol,
Böyüyə təvazökarlıq yaraşır.
4533 Eşit gör, ağıllı adam sənə nə deyir,
Ey bilikli insan, bu sözə əməl elə:
4534 – Əgər sən bəy və xalqın böyüyü olsan,
Dilini, könlünü kiçik tut, özünü fəda elə.
4535 Özünü unutma, yolunu yanıltma,
Qulun səadəti salamət yolundan gələr.
4536 Evini-mülkünü təmiz və pak saxla,
Ey mərd və comərd, bu sənə səadət gətirər.
4537 Bir də yemək-içməyi, duz-çörəyi bol elə,
Yaxşı ad qazanarsan, səadət sənə yar olar.
4538 Gəlirinə görə çıxarını hesabla,
Çıxarına görə gəlirini tənzimlə.
3539 Alış-verişdə dürüst hərəkət et,
Belə etsən, yolun həmişə açıq olar.

4540 Ey mərd insan, əlin aşağı olsa,
Başqalarının yanında sızlama.
4541 *Səni sevənlər eşidər, köməyinə gəlməzlər,*
Sevməyənlər eşidər, üstünə gülərlər.
4542 Dost, yoldaş, qardaş yanında etibarın qalmaz,
Bunun acısından könlün yaralanar.
4543 Yaxşı adamlarla otur-dur, təmas qur,
İnsan ol və insanlar arasında yaşa.
4544 Şərikli işə girişmə, belə işə mal sərf etmə,
Peşmançılıqdan al yanağın saralar.
4545 Evin-mülkün böyük və işlək yola yaxın olmasın,
Sənə zərəri dəyər, bunu yaxşı fikirləş.
4546 Bəyə və daşa çaya qarşı çıxma,
Hasara yaxın durma, ey könlü düz.
4547 Bu üç qonşuluqdan sənə xeyir gəlməz,
Onlardan gələn zərərin qarşısı alınmaz.
4548 Ev almaq istəsən, qonşunu xəbər al,
Yer almaq *istəsən suyunu xəbər* al.
4549 Pislə yoldaş olma, salamatla yeri,
Hərəkətin düz olsun, köhlən kimi cövlan et.
4550 Nə varsa ona qane ol, bəy adını al,
Kədərin az olsun, sevinc ara.
4551 Ölümü unutma, qəflətə düşməzsən,
Rəbbini unutma, gözün qapalı qalmaz.
5452 Sözünü düşün de, sənə kədər gəlməz,
Həyatını boşuna keçirmə, peşman olmazsan.
4553 Çox qürrələnmə, hamı səndən üz çevirər,
Çox xəsis də olma, səni söyərlər.
4554 Könlü təmiz kişi nə deyir, eşit,
İnsanlığa qarşı insanlıq göstərən şəxs:
4555 "Sən yaxşı ad qazanmaq istəsən,
Çalış ki, çox comərd olasan.
4556 Azad adamı doğurdan qul etmək istəsən,
Comərd ol, mal payla, əvəzini görərsən.
4557 Bir gün başının göylərə dəyməsini istəsən,
Hər işi diqqətlə, biliklə gör.
4558 Adının dünyaya yayılmasını istəsən,
Yolçu ilə xoş rəftar elə, adın yayılsın.



4559 Rahat yaşamaq istəsən, ey xoşqılıq,
Tamahkarlıqdan tamamilə əl çək.
4560 Tanrıya qulluq etmək istəsən,
Bədəninin arzu qapısını bağla.
4561 Hər cür yaxşılığa çatmaq istəsən,
Bədəninə və nəfsinə hakim ol".
4562 Namuslu adam çox gözəl söyləmişdir,
Ey ürkək insan, bu sözə əməl et:
4563 "Bədənin diləyini-arzusunu yerinə yetirəm,
Diləyinə qovuşsa sahibinin başını yeyər.
4564 Ona yaxşılıq etsən, sənə pislik edər,
Ona pislik etsən, naçar sənə boyun əyər".

* * *

4565 Öydülmüş sözünü bitirib dedi:– Ey qardaş,
Qara camaatın tövrü və hərəkəti belədir.
4566 İndi söylədim, sən də eşitdin,
Bunu anladınsa, sözün olmamalıdır.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

4567 Odqurmuş cavab verdi, dedi: – Bu sözün
Hamısını eşitdim, ey dürüst insan.
4568 Başqa bir sözüm var, sənə söyləyim,
Onu da mənə izah et.
4569 Mən adamlar içinə çıxsam,
Bunu qorxusuz-hürküsüz etməliyəm.
4570 Şübhəsiz, məni yeməyə dəvət edəcəklər,
Mən də dəvət edəndə onlar gələcəklər.
4571 Yeməyə necə gedim, necə yeyim,
Dəvət edərkən necə dəvət edim, ey qardaş,
4572 Bunları da mənə açıqca söylə ki,
Bu işdə də məlumatım olsun.

## LXV

## ÖYDÜLMÜŞ ODQURMUŞA ZİYAFƏTƏ GETMƏK QAYDASINI BƏYAN EDİR

4573 Öydülümüş cavab verib dedi: – Ey qardaş,
Bu da izah edilməsi vacib bir işdir.
4574 Dəvət edənlər müxtəlif təbəqələrə mənsub olur,
Ziyafətlər də müxtəlif cürdür.
4575 Bunlardan biri toy qonaqlığı,
Biri də sünnət və ya ad günü ziyafətidir.
4576 Bir də dost-yoldaş, tanış,
Böyük-kiçik, yaxın-qohum dəvəti var.
4577 Yaxud bir ölü ehsanı ola bilər,
Ya da biri rütbə alsa, ziyafət verə bilər.
4578 Bunların hansına getmək,
Hansına getməmək lazımdır, bilməlisən.
4579 Dost-tanış, yar-yoldaş ziyafətidirsə,
Oraya getmək, dost-yoldaşı görmək lazımdır.
4580 Ziyafətdə yad adamlara xüsusi diqqət göstərmək,
Yeyib-içməyin az, yaxud çox verilməsinə
diqqət etməmək gərəkdir.
4581 Yaxın qonşu sənə qonaqlıq versə,
Yaxud axirət qardaşın ziyafətə çağırsa,
4582 Onlara get, könüllərini qırma,
Onları sevindir, özün də sevin.
4583 Əgər sənə ziyafət verirlərsə, ziyafətə get,
Yeməklərini ye, onları sevindir.
4584 Bunlardan başqa digər qonaqlığa çağırılsan
Getmə, çünki könlün yaralanar.
4585 Oturmağa, durmağa yer çatışmaz,
Ey əsil-nəsəbli, qəlbini qırırlar.
4586 Yaxud ziyafətdəkilər sərxoş olub dalaşarlar,
Yediyin içinə sinməz, canın sıxılar.
4587 Bir qarın yeyib-içmək üçün
Özünü etibardan salma.



4588 – Boğazına hakim olan şəxs
Eşit gör nə gözəl söyləmişdir:
4589 "Boğazını gözlə, aşağı insan olma,
Bir boğaz üçün qul vəziyyətinə düşmə.
4590 İndiyədək çox etibarlı adamlar gördüm ki,
Boğazına hakim ola bilməyib, torpağa qarışdılar.
4591 Ölkədə yüksəlmiş çox adamlar gördüm ki,
Boğazına qul olub yerə düşdülər.
4592 Çox varlılar gördüm ki,
Boğazına əsir olub, iflas etdilər.
4593 Boğazına əsir olma, ey boğazına düşgün,
Boğazına əsir olsan, əsarətdən qurtulmazsan.
4594 Hansı ziyafətdə olursan-ol,
Ədəb dairəsində yemək ye.
4595 Qayda, üsul, ədəb bilməyən adamlar,
Ədəb-ərkanlı adamları görəndə çaşıb qalırlar.
4596 Səndən böyüklər yeməyə başladıqdan sonra
Sən də əlini uzat, adət belədir.
4597 Bismillah deyib yeməyə sağ əlinlə başla,
Onda yeməyin bərəkəti artar, sən də varlı olarsan.
4598 Başqasının qabağındakı yeməyə toxunma,
Öz qabağında nə varsa, onu ye.
4599 Süfrədə bıçaq çıxarma, sümük sıyırma,
Acgöz olma, sıxılmış vəziyyətdə oturma.
4600 Nə qədər tox olsan da, verilən yeməyi ye,
Adam adama görə yemək verər.
4601 Yeməyi götür, dişlə, xırda-xırda çeynə,
İsti yeməyi ağzınla üfləmə.
4602 Yemək vaxtı süfrə üstündə sürünmə,
Başqasını narahat etmə, diqqətli ol.
4603 Bunlar davranış bilməməkdən doğur, qayda-qanuna uy,
Davranış bilməyənlər başqasına ziyan vurarlar".
4604 Üsulu bilən adam nə gözəl demişdir:
"İnsan üsul bilsə, yuxarı başa keçər.
4605 Hər şeyin üsulu, ədəb-ərkanı var,
Üsulu tam tətbiq edənin üzü gülər.
4606 Üsul, ədəb-ərkan bilməyən adam
Cəmiyyətdə müvəffəq ola bilməz.

4607 Yeməyə əl at, həzz və arzu ilə ye.
Ev xanımı səni görsün, razı qalsın.
4608 – İnsan zəhmət çəkib sənə qonaqlıq versə,
Onun zəhmətini yerə vurma, xatirini qırma”.
4609 Qəlbi oyaq adam çox doğru söyləmişdir,
Onun sözü çox mənalı və rənglidir:
4610 “İnsan könlü incədir, şüşəyə bənzər,
Diqqətli ol, onu sındırma.
4611 Könül sınsa, işin dadı qaçar,
Yaxınlıq pozular, xeyir kəsilər.
4612 Yaxınlıq diləsən, könlünü qoru,
Könül sınsa, yaxınlıq gedər”.
4613 Yeməyi ölçülü ye, çox yemə,
Ağıllı və əziz insan bu haqda nə deyib:
4614 “Çox yeyənin yeməyi həzm olunmaz,
Yaxşı həzm etməyənlər daim xəstə olarlar.
4615 Xəstəlik boğazdan girər, boğazı qoru, az ye,
İnsan həmişə az yeyib, az içməlidir.
4616 Xəstəlik insanı gücdən salar,
Müalicə olunmasa, ölüm yaxın gələr”.
4617 Təbib, hakim də çox gözəl söyləyib,
Onun sözünə kim pis deyə bilər:
4618 “Xəstəlik ölümün müjdəçisidir,
İnsan xəstələnsə, ölüm qonşuluğundandır.
4619 Xəstəlik bəla, möhnətdir, ölümün xəbərçisidir,
Ölümün dadlısı, yaxşısı yoxdur.
4620 Özünə “mən insanam” deyən Adəm oğlu
İsti-soyuğu bir-birindən fərqləndirməlidir.
4621 Uyğun olanı yemək üçün öz məcazını bilməli,
Ona görə yaramayan yeməkdən uzaq durmalı.
4622 Çox isti olsa, üstündən soyuq bir şey içmək,
Çox soyuq olsa, isti əlavə etmək gərəkdir.
4623 Yaşın gənc, ömrün bahar dövründədirsə,
Soyuq şeylərdən istifadə et, qanın onları qızdırar.
4624 Yaşın qırxdan çox, mövsüm sən bahar isə,
Məcazını isti şeylərlə bəslə.
4625 Yaşın altmış, ömrün qış isə,
İsti şey ye, soyuqla dostluq etmə.



4626 Quruluq və soyuqluq çoxalsa, isti və yaş şeyləri hazırla,
Bu ikisi onlara cavab verər.
4627 Yaş və soyuq artsa, sənə zərər versə,
İsti və quru şeylərlə onları qarşıla…
4628 Məcazın soyuqdursa, onu isti ilə gücləndir,
İsti isə, soyuq şey ye, soyuq şey iç.
4629 Əgər məcazın ılıqdırsa,
Onu sıra ilə isti-soyuq şeylərlə bəslə.
4630 Məcazını bu şəkildə tənzim et,
Onda şən və sağlam olarsan”.
4631 Təbib nə demişdir, dinlə,
Onun mənasını anlayaraq yaşa, quzum:
4632 “Mən sənin məcazını izah edərəm,
O, qırmızı, sarı, ağ və ya qaradır.
4633 Onların hamısı bir-birinə düşməndir,
Düşmən-düşmənə yaxınlaşanda bu rənglərlə.
4634 Məcazı ılıq, mötədil tutmaq üçün ağıllı olmalı,
Nə olarsa, anacaq onu yeməli.
4635 İnsanla heyvan arasındakı fərq
Məcaza uyğun olanı yeməklə bilinir, ey oğul”.
4636 İndi ağsaqqal nə deyir eşit,
Bunu anla qocalanda çaşma:
4637 “İnsan qırx yaşına çatsa məcazını bilməsə,
Dili olsa da, o bir heyvandır.
4638 Sınaqdan, təcrübədən bilik öyrənməyəni
Sən insan sayma, ey təmiz qəlbli.
4639 Başına gələndən nəticə çıxarmayana
Heyvan demək daha doğru olar.
4640 Vaxtı keçdiyi halda hikmət sahibi olmamışsa,
Ona insan deyil, heyvan demək lazımdır.
4641 Bax, təbiblər nə gözəl söyləmişlər:
İnsan nə qədər az yesə o qədər sağlam və şən olar.
4642 Daima sağlam olmaq, xəstə olmamaq üçün
“Az” adlı bir dərman iç, eləcə yaşa, ey bəyzadə.
4643 Uzun zaman dinc və rahat yaşamaq istəsən,
“Dil” adlı əti ye, eləcə yaşa, ey təmiz qəlbli”.

## LXVI

## ÖYDÜLMÜŞ ODQURMUŞA ZİYAFƏTƏ DƏVƏT ÜSULUNU BƏYAN EDİR

4644 Əgər sən başqalarını dəvət etmək istəsən,
Dəvət et, lakin əvvəlcə hazırlaş.
4645 Ev-eşik, *süfrə, qab-qaşıq təmiz olsun,*
Evin döşəməli, yemək-içməyin abırlı olsun.
4646 Qonaqların ləzzətlə yeyə bilməsi üçün
Xörəklərin də, içkin də ləziz olmalıdır.
4647 Ziyafətə dəvət etməsən bir eybin olar,
Dəvət etsən, gələnlər bir yerinə min eyib taparlar.
4648 Qonaqların süfrədən doyaraq qalxması üçün
Yeyib-içməyi təmiz və dadlı hazırla.
4649 Dost-yoldaş, uzaq-yaxın –
Hamının haqqını gözlə, qonaq çağır.
4650 Gələn gələr, gəlməyənlər olsa,
Onların da xətri qırılmaz.
4651 Boğaz sarıdan doğan qəzəb çox pisdir,
İnsan ölənədək kin, intiqam bəslər.
4652 Çalış yeyib-içmək hamıya çatsın,
Gecikən varsa, yeməksiz qalmasın.
4653 Qonaqların içkisini bol elə,
Biri qurtaran kimi, o biri gəlsin.
4654 Yemək olan yerdə içki də olmalıdır,
Yeməklə içki bir-birinə uyğun olmalıdır.
4655 Yeməyin yanında içki olmasa,
Yemək qonaqlar üçün zəhərə dönər.
4656 Fuqa şərbəti ilə *mizab* şərbəti,
Güləngbinlə gülab şərbəti ver.
4657 Bundan başqa nə verəcəyini məndən soruşma,
Onu başqalarından soruş.
4658 Böyüklər süfrədən qalxandan sonra
Kiçiklərə yemək verilməlidir.



4659 Hamıya yemək çatsın, heç kimi gözdən qaçırma,
Onları ac qoyma, sən söyə-söyə qayıtmasınlar.
4660 Yeyib-içmək bitəndə çərəz və meyvə ver,
Quru və yaş meyvə yanında bir az da simiş olsun.
4661 Hədiyyə ver gücün çatsa, ipək-qumaş ver,
Daş kirəsi ver ki, gələnlərin ağzı bağlansın.
4662 Qonaqlıq belə başa çatar, qapıları aç,
Gedənlər varsa, mane olma.
4663 Qonaqlığa çağıranlar dörd zümrədir,
Çağırılanlar da dörd zümrə olur, bunu unutma, ey quzum.
4664 Bunlardan biri çağırıldığı hər qonaqlığa gedər,
Qonaqlıqda nə versələr, yeyər, içər.
4665 Ancaq özü evinə başqasını çağırmaz,
Evinə qapanıb yeməyini təkcə yeyər.
4666 Biri də ziyafətə gedər, yeməyini yeyər,
Özü də onu yeməyə dəvət edər.
4667 Biri nə ziyafətə gedər,
Nə də başqasını çağırar.
4668 Belə adam ölüdür, onu diri sayma,
Onunla oturub-durma, birlikdə olma.
4669 Biri isə dəvətə gəlməz,
Heyvan kəsər, başqalarını çağırar.
4670 Bunlardan ən yaxşı bu sonuncudur,
Hakim və alimlərin bəyəndiyi hərəkət budur.
4671 Ziyafətə getsən də, getməsən də,
Boğazına hakimi ol, az ye, sağlam yaşa.
4672 Çox yeyən həmişə xəstə olar,
Üzü sarı, özü cılız, etibarsız olar.
4673 Məcazı bilən, kasıb, biliyi geniş təbib
Bunu təsdiq edən bir söz demişdir:
4674 "İnsana xəstəlik boğazla, yeməkdən gəlir,
Xəstəlik insanı qocaldır, o, ömrünü tamamlaya bilmir".
4675 Boğazı daim qoru, xəstələnməməyə çalış,
*Xəstəlik insanın üzünü* çökük edər.
4670 Bu ziyafət işi belə olur,
Dəvət etməyin, dəvətə getməyin üsulu budur.

* * *

4677 Mən söylədim, sən də eşitdin,
Bunu kafi say, sözü uzatma.
4678 Əgər insanlar arasına qarışmaq istəsən,
Dünyanın halı, tövrü və yolu budur.
4679 Ey könlümün işığı, əziz adamım,
Sözümün mənasını anla, yaxşıca düşün.

## LXVII

## ODQURMUŞ ÖYDÜLMÜŞƏ DÜNYADAN ÜZ ÇEVİRİB OLANA QANE OLDUĞUNU BƏYAN EDİR

4680 Odqurmuş dedi: – Mən sənin sözlərini eşitdim,
Sən də bunların bəyənmədiyim tərəflərini eşit.
4681 Sənin dediklərini insanlar öyrənsələr,
Dünyada dilək və arzularına yetərlər.
4682 Ancaq dünya yeyib-içməkdənmi ibarətdir?
Ey hakim alim, insan əvvəlcə bunu bilməlidir.
4683 İnsan dünyanı tutub-durmayacağı halda
Bu qədər zəhmətlə bu malı niyə yığır?
4684 İnsan bu dünyanın ardınca qaçsa,
İbadət və itaət bir tərəfdə qalar.
4685 Bu gün sən gələndən bəri, bax,
İbadət edə bilməmişəm.
4686 Tək bir adamla görüşməyin zərəri bu qədərsə,
Məndən incimə, mənə zor eləmə.
4687 Mən durub şəhərə-kəndə getsəm,
Bütün işim-gücüm insanlarla olacaq.
4688 Bu qapı mənim üçün qapanmış olacaq,
Bəs mən necə ibadət edəcəyəm?
4689 Gənclikdən ayrılmışam, bu gün qocayam,
Ömrüm Tanrıya həmdü-səna ilə, ibadətlə keçdi.



4690 Hədər olacaq bir həyata təkrar dönmək
Mənə yaraşarmı, ey mərhəmətli?
4691 Biliyi çay kimi axan alim nə demiş,
Ey təmizqəlbli insan, sən bunu dinlə:
4692 “Qocalıqda görəcəyin işləri gənc ikən gör,
Qocanın gücü olmaz, bunları görə bilməz.
4693 Gənclikdə çalış, Tanrıya ibadət et,
Qocalanda bunu bacarmazsan, bil.
4694 Gənc ikən yaxşı hərəkət etməyə çalış,
Qocalıq gələndə bu atəş sönər.
4695 İgidlik çağında hər yaxşılıqdan pay almaq
Nə qədər gözəl bir şeydir.
4696 Qocanın igidlərin işini görməsi,
Çox münasibətsiz bir hərəkətdir.
4697 Dünya malı həyat üçün yaranıb,
Həyat bitəndə mal dərdi də ortadan qalxar.
4698 Mal yığa-yığa ömrü başa vurdu,
Öləndə onların kimə qalacağı bilinmir.
4699 Tutaq ki, Elikin xidmətinə girdim,
Dost-tanışın, xalqın hərəkətini tam öyrəndim.
4700 Axırda onsuz da öləcəyəm, bunun nə xeyiri,
Bütün bunlardan əlimdə iki arşın bez qalacaq.
4701 İstidə tərləyəcək, soyuqda üşüyəcəksən,
İkicə arzuna yetəcəksən, ey müsəlman cavan.
4702 Biri dünya malı ilə özünü yüksəldəcək,
İkincisi, ölkədə sözü keçən bir adam olacaqsan.
4703 Yaxşı olardı ki, bu iki şeyə nail olasan,
Ölümün əlinə düşməyəsən, ölümsüz olasan.
4704 Bu iki şeyi dünya məndən alacaqsa,
Dünyaya nə ehtiyacım var, ey bilikli insan.
4705 Xoşbəxt adamın bir əlaməti olar,
Onun yaxşılığı gündən-günə artar.
4706 Əgər adam talesizsə, hamını özündə soyudar,
Qoca çağında əxlaqı pozular”.
4707 Hakim və bilikli adam çox gözəl söyləmişdir,
Ey alyanaqlı, sən bunu eşit:

4708 “Xoşbəxt taleli adam yüksəldikcə, yaxşılaşar,
Pislikdən tamam əl çəkir.
4709 Qoca vaxtı nəfsinin dalınca düşən
Adam bədbəxtdir, bunu açıq bil.
4710 Hanı bu dünyanı tutub duran,
Özünə dəmir şəhər, qala tikən?
4711 Hanı o axmaq köpək ki, dünyanı tutdu,
Qaraquşa minib mavi göyə çıxdı?
4712 Hanı o, “mən Allaham” deyən axmaq ki,
Axırda Tanrı onu dənizin dibinə atdı?
4713 Hanı o adam ki, dünya malını yığdı,
Sonra malla birlikdə yerin dibinə keçdi.
4714 Hanı o, şərqdən-qərbə qədər
Səfər edib ölkələr tutan dünya bəyi?
4715 Hanı o, əsası ilanı olan,
Dəniz yarılıb vurub-keçən insan?
4716 Hanı o, pəriyə, quşa, insana
Böyüklük hökm edən adil adam?
4717 Hanı o, ölüləri dirildən adam,
O da axırda ölümün əsiri olmuşdur?
4718 Hanı insanlar içində seçilmiş insan
Dünya onsuz boş qaldı, bir tərəfi əskildi?
4719 Bu saydıqlarımı ölüm tutdu – apardı,
Ey pakqəlbli, sənimi burada qoyacaq?
4720 Bu dünyanın qanunu belədir,
İstər tabe ol, istərsə olma.
4721 Bax, bu qara yerin ağuşuna
Nə ərlər gedib, yenə çuxuru boşdur.
4722 İndi qara yerin qatını azca açsan,
Görərsən orada nə seçkinlər yatır.
4723 Necə bəylər qara torpaq olub yatır,
Neçə alim və hökmdarlar ölüb torpağa qarışıb.
4724 Mən orada bəyi quldan seçmirəm,
Gözüm varlını yoxsuldan ayırmır.
4725 Neçə sağlam, xəstəlik tanımayan adam
Qara yerə girdi, tərpənə bilmir.
4726 Bu adamlar torpağa döşəndilər,
Guya sənlə mənmi qalacağıq?



4727 Bir anlıq dincəlmək üçün dayanan yorğun yolçu
Bu ulu yolda ev-mülk tikməz.
4728 Mən içimdəki bütün arzuları boğdum
Məndən əl çək Tanrının yardımı mənə bəsdir.
4729 İnsanı qul edən bu hərislikdir,
Mən hərisliyi buraxdım, gözüm toxdur.
4730 Dünyadan əl çəkmiş insan,
Bu dönük dünyadan bezmiş insan nə deyir, eşit:
4731 Mən bu dünyada diləyimə yetdim,
Hər cür hərislik gözümdə silindi.
4732 Dünyanın dilək və arzu yükünü üstümdən atdım.
Diləyim tükəndi, sözüm qurtardı.
4733 Bu dünya bir tarladır,
Bu gün nə əksən, sabah onu biçərsən.
4734 Pislik toxumu əksən, pislik göyərər,
Pislik sabah insanın boynuna yük olar.
4736 Bu gün bu nəfsi və arzuları atmasam,
Sabah yaxşılıq tapmağım mümkün olmaz.
4737 Bu dünya səni tərk etmədən sən onu tərk et,
O səndən bezməmiş, sən onu gözündən sal.
4738 Sən onu tərk etməsən, o səni buraxacaq,
Sən ondan bezməsən, o səndən bezəcək.
4739 Belədirsə, dünyanın nə lüzumu var,
O səni tərk edincə, sən onu tərk et.
4740 Bundan əl çək, o biri dünyanı istə,
Orada rahat, əbədi həyat sür.
4741 Bundan daha yaxşısı da var,
Əgər bacarsan, heç birini istəmə.
4742 Yeri, bu iki dünyanın sahibini dilə,
Dünya və axirət nəyə lazım?
4743 Yaradanı tapsan, yaranan sənindir,
Törədəni tapsan, törəyən sənindir.
4744 Törəyəndən qorxma, ondan heç nə diləmə,
Törədəndən qorx, hər şeyi ondan istə.
4745 Törədən rəbbə ibadətdən əl çəkib
Törəyənə uymağa, ona xidmət etməyə dəyərmi?
4746 Xidmətçinin bu iki şeydən başqa qazancı yoxdur,
Ya xidməti qəbul olunar, başı yüksələr.

4747 Ya da xidməti və zəhməti boşa keçər,
Vaxtı və ömrü boşuna sərf edilmiş olar.
4748 Xidməti yarasa, bəy onu yüksəlsə,
Aradığını tapan gün özünə hakim ola bilməz.
4749 Bunun üçün bəzən ac, bəzən tox olmaq lazımdır,
Bəy rahat olsa, onun zəhmətini xidmətçi çəkməlidir.
4750 Əgər onun xidməti qiymətləndirilməsə,
Bütün həyatı boşuna keçmiş olar.
4751 Söylə, xidmətçinin əldə etdiyi nədir?
Onun xidmətində necə bir dad var?"
4752 Xidmətin ədəb və ərkanı haqda
İla böyüyü nə deyir, eşit:
4753 "Bax, bu bəylərin işi tərs bir işdir,
Çox çalışmaqla insan özünü bəyəndirə bilməz.
4754 Xidməti bəyənilsə, o özünə hakim ola bilməz,
Xidməti bəyənilməsə, tezliklə etibardan düşər.
4755 Ey xidməti çox olan, xidmətinə güvənmə,
Bu xidmət axırda başını yeyər.
4756 "Razı qaldı" desən, dağıdar, söyər,
"Üzü güldü" desən, qaşlarını çatar.
4757 Onları tamam-kamal öyrənmək olmaz,
Edəcəkləri pisliklərin qabağını almaq olmaz.
4758 Ey oğul, bu dünya bir qasırğa kimidir,
O bir yerdə dura bilməyən kölgədir.
4759 Bax, o sanki gözə görünən bir ilğımdır,
Tutmaq istəsən, ələ gəlmir, yox olur.
4760 Bu səadət növbəsi sıra ilə gəlir,
O dönükdür, qaçmaq istər, bir də erkən qocalır.
4761 Bu dünya indi mənə gərək deyil,
Qızdırmaya bənzər səadəti də istəmirəm, ey igid.
4762 Rəbbimi yad etmək mənə bəsdir, sevincdir,
Onun əmrlərini yerinə yetirmək məni ovundurur.
4763 Rəbbimin sevdiyi işlər kafi olmasa,
Çarpışmağa şeytan kimi yağı var.
4764 Diləyim onda, ümidim onadır,
Ona güvənirəm, ona sığınıram.
4765 Geyməyə qoyun yunu, yeməyə arpa aşı mənə bəsdir,
Ey qardaş, dünyadan başqa heç nə istəmirəm".



4766 Eşit gör nə deyir rəhmdil adam,
Mağarada yaşayan iman əhli:
4767 "Dünyadan öz nəsibimi aldım,
Kəpəkdən yemək, qoyun yunundan paltar bəsimdir.
4768 Kəpək yeməyi mənə qənddən də şirindir,
Bu ağ paltar baftalı ipəklərə əvəzdir.
4669 Yemək-içməkdən qarnın doyan qədər ye,
İstər arpa, istər darı olsun, qarnım doyar.
4770 Ey qardaş, ölməmək üçün bir azca ye,
Öküz kimi çox yemə, yoxsa məcazın pozular.
4771 Zövq-səfa sürmə, zövqün cəzası ağırdır,
Zövqün bədəli bərbad bir bataqlıqdır.
4772 Turş və dadlı yeməklər boğaz zövqüdür,
Boğazına düşkün adamlar heyvandan fərqlənməz.
4773 İnsanlar ipək, zərbaftalı paltar geyirlər,
Sən bədəni örtməyə bir şey tap, ey ərənlər əri.
4774 Boğaz bir dəfə doysa, iki gün bəsdir,
Əyinə geyilən paltar iki il gedər.
4775 Bu iki şey üçün xidmətə girməyə,
Bilə-bilə özünü qul etməyə dəyərmi?
4776 Yuxarıda ərşdən, aşağıda torpağa qədər,
Bütün varlıq ehtiyac içindədir.
4777 Hər şeydən azad olan ancaq Tanrıdır,
O, ehtiyacları bilir, rəhmdil və həlimdir.
4778 Könülümü ixlas ilə Tanrıya yetirdim,
Diləkçi olub ancaq onu istərəm.
4779 Onun varlığına könüldən inanıram,
Könlüm inandı, dilim onu zikr edir.
4780 Varlığını iqrar edirəm, onu istəyirəm,
Onu harada axtaracağımı özüm də bilmirəm.
4781 Gecələr gözlərimi qırpıram, rəbbimi istəyirəm,
Nişanəsini tapıram, ancaq onu görən yoxdur.
4782 Axtaran yatarmı, durmadan ara,
Tapmadım deyə geriyə dönmə.
4783 Durmadan axtar, axtarmaqla kimsə onu tapmamış,
Ancaq tapmadım deyə ruhdan düşmə.
4784 Axtaran adam dincəlmədən yürüməlidir,
Dincələrək yatanlar heç nə tapmamışlar.

4785 Durmadan axtaranlar nə tapmışlar?
Kim dincəlib-yatmaqla arzusuna qovuşar?
4786 Əvvəlcə sevərək o məni dilədi,
Mən də indi çırpınaraq onu axtarıram.
4787 Öncə o məni, əzəldən istəmişdi,
Mən də indi çırpınaraq onu axtarıram.
4788 Belə rəbbi necə sevməyim,
Onu tapmaq üçün necə çarpışmayım?
4789 Möhtackən, dərdliykən mənə o, kömək edir,
Bəla, qayğı gəlsə, məni o qurtarır.
4790 İlk öncə o məni istəyərək seçdi,
Buna görə onu könüldən arzulayıram.
4791 Bu sözüm doğrudur, məni o törətdi,
Məni o yetirdi, beləcə böyüdüm.
4792 Mən xalqdan vaz keçdim, Tanrıya sığındım,
O məni hər şeydən qoruyar.
4793 Yalnız qalsam, rəbbimi zikr etmək bəsdir,
Zikr etməyə rəbbimin adı kifayətdir.
4794 Ovunacağım, sığınacağım, köməyim arxamdır,
Toxluqda-aclıqda məni qoruyan odur.
4795 Qəlbi təmizlənmiş, Tanrıya qovuşmuş
Adam, eşit gör nə deyir:
4796 Könüldəki sirrimi mən sənə açaram,
Diləklə, arzu ilə mən sənə uçaram.
4797 Güvənəcək, ovunacaq, sığınacaq rəbbim sənsən,
Hər şeydən üzüldüm, sənə sığındım.
4798 O dünyadakı yerin bu dünyaya bağlıdır,
Bundan əl çəkməyən ona nail olmaz.
4799 Bu dünyadan əl üzüb vaz keçmək lazımdır,
O biri dünyanı bu yolla əldə etmək olar.
4800 Dönük dünyadan möhkəm yapışmaqla,
Əbədi dünyanı necə əldə edə bilərsən?
4801 Bu dünya təhlükəli şərbəti də zəhərdir,
Sən bütün yemək və içməyində təmizlik ara.
4802 Bu dünyanın arzusunda vaz keç,
Axirətdə yaxşı bir yer qazansan.
4803 Ey Öydülmüşüm, bunu həqiqət bil,
Sənə öz bildiklərimi söyləyirəm.



4804 İnsan bu dörd işdən vaz keçməsə,
Digər dörd işi görə bilməz.
4805 Bu dünya işindən tam əl çəkməsə,
İnsan axirət işini görə bilməz.
4806 Ey qardaş, insanlardan uzaqlaşmadıqca,
Tanrıya ibadətlə məşğul olmaq mümkün deyil.
4807 Öz nəfs və hərisliyini boğmadıqca,
Bədən doğruluq yoluna girməz.
4808 Əsl Tanrı sevgisi girsin deyə
Qəlbdən dünya arzuları çıxmalıdır.
4809 Dünya müsəlmanlar üçün bir zindandır,
Zindanda rahatlıq arama, könlünü doğrult.
4810 Bədənə üz vermə, istəklərini boğ,
O zaman doğru yola girə bilərsən.
4811 Vaxtını, gününü boş keçirmə,
Ötən gecə geri dönməz.
4812 Günün boşuna keçsə, peşman olarsan,
Həyat boşuna keçsə, onu təkrar əldə edə bilməzsən".
4813 Ey biliyi dəniz, eşit gör nə deyir
Təvazökar, fəqət özü yüksək olan ər:
4814 "Diyardan-diyara köç edən insan
Əşyaları əvvəlcə göndərsə, düz iş görər.
4815 Köçməzdən əvvəl köçünü göndərsə,
Oraya çatanda ona xeyiri dəyər.
4816 Köçünü göndərsən də, göndərməsən də,
Özün axırda gedəcəksən, qafil olma.
4817 İstər bəy ol, istərsə də qul,
Çox qalmazsan, ölüm yola çıxıb.
4818 İstər min yaşa, istər on səkkiz,
Özün ölsən, yaxşı adın qalsın.
4819 İstər varlı ol, istərsə yoxsul,
Hər keçən il, ay, gün həyatını gəmirir.
4820 Başın göyə dəysə, adın böyüsə,
Son mənzilin qara torpaqdır.
4821 Nemət tapıb ər vaxtını boş keçirsə,
Özünü oda atmış olar, o, heyvandan fərqsizdir.
4822 İnsan sağlam olub ömrünü boşa keçirsə,
Ey qardaş, bu çox çirkin həyat olar.

4823 Ey qardaş, sən mənim qayğımı çəkmə,
Sən gözündən yaş töküb öz qeydinə qal.
4824 Bu dünya işi möhkəm bir tələdir,
Tələyə düşmə, səni bərk-bərk tutar.
4825 Bu gün səadət gəlsə, diləyincə hərəkət edər,
İnanma ona, səni yenə tərk edəcək.
4826 Qafil olma, ölümü uzaq sanma,
Qəflətən pusqudan çıxar.
4827 Minlərcə qafilə ölüm basqın edib,
Çox cəmiyyətləri ölüm dağıtmışdır.
4828 İndi könlü oyaq adam nə deyir, dinlə,
Ölümə qəfil ovlanma, zərər görərsən.
4829 Bir çox cəmiyyətləri ölüm dağıtdı,
Onu andıqca gözüm çeşmə olur.
4830 "Mən" deyib göyə yüksəltmək istəyinin mənliyi qalmadı,
Silahlı ordular ona dov gələ bilmədi.
4831 Qafil olma, həyat özünü bildirmədən gedər,
Bu zaman, bu gün bir də geri dönməz.
4832 Özünü ovundurma, günün boş keçər,
Səadətə inanma, o, dönük və kobuddur.
4833 "Mən böyüyəm" deyəni ölüm yaxaladı,
"Mən uluyam" deyəni ölüm məğlub etdi.
4834 Şəhər və ölkələri viranə qoydu,
Saray, köşk və evləri yıxdı.
4835 Neçə min diri adam öldü, yerin altına batdı.
Orada bizim gəlişimizi gözləyirlər.
4836 Gözünü aç, onlara yaxşı bax,
Bəyi quldan ayıra bilirsənmi?
4837 Böyüklük ölümə qarşı fayda vermədi,
Ölümdən qaçan qaçmağa yer tapmadı.
4838 Neçə ulu peyğəmbəri ölüm aldı,
Ona qarşı kim silah və ya dərman işlədə bilər?
4839 Bu cəfakeş dünyaya inanma, o, dönükdür,
Onun məcazı vəfasız və kobuddur.
4840 Dünyanın günü tez ötüşər,
Yaxşısı-pisi, əyrisi-düzü də fənadır.
4841 Ac da keçər, tox da keçər,
Nə bəyə üz verər, nə bəy-qul seçər.



4842 Nə rahatlığı, nə də narahatlığı uzun çəkir,
Ey oğul, bu qalmaqala nə lüzum var".
4843 Nə yaxşı demiş hakim, biliyi geniş,
Düşüncə hərəkəti bir-birinə uyğun şəxs:
4844 "Kiçik bir səadətə çatanda insan özünü unudur,
Səsini mavi göydən də yuxarı qaldırır.
4845 Neçə-neçə təkəbbürlü, məğrur insanını
Ölüm köksünü əzmiş, gözünü çıxarmışdır.
4846 Bunu söylədim mən sənə, ey comərdim,
Bu sənə həqiqi bağlılığımın nişanəsidir.
4847 Bu həqiqəti bilən insan
Heç vaxt bu dünyaya qiymət verməz.
4848 Gənclik ötdü, yaşım keçdi,
Müşk yerinə başıma kafur töküldü.
4849 Ey insanların yaxşısı, artıq bundan sonra,
Ölümə hazırlanmaq zamanı çatmışdır.
4850 Ölüm qayğısı sardı, sevinc bizdən getdi,
Ölümdən sonra bəs halımız necə olacaq?
4851 Ey təmizqəlbli, bu qayğı, əndişə içində
Mən necə Elikin yanına gedim?
4852 Elikə məndən heç bir xeyir dəyməz,
Fayda istəsə, faydam olmaz.
4853 Əgər o biri dünya üçün məni istəyirsə,
Məni yanında sansın, doğru yolla getsin.
4854 Qadir Tanrı insanı, iki şey üçün yaratmış,
Bundan dolayı ona bu adı vermişdir.
4855 Cəhənnəmdə və ya cənnətdə bəy olmaq üçün,
Əziz tutmaq üçün və ya ucuz qılmaq üçün,
4856 Əziz olmağın yolunu göstərmişdir,
Ucuzluq yolunu da çəkmişdir.
4857 Tanrının şəfqətinə nail olmaq üçün
Qul öz qulluğunu göstərməlidir.
4858 Əgər Tanrı şəfqətinə nail olsa,
Ona bütün yaxşılıqların yolu açılar.
4859 Bütün ibadətləri yerinə yetirməyə çalışsa,
Min bir yaxşılığa açılar qapı.
4860 Mənim bildiklərim bunlar idi,
Sənə söylədim, ey yaxşı dost.

4861 Sizə mənim faydalı sözlərim gərəkdir,
Sözlərim özümdən daha yaxşıdır.
4862 Əgər axirət istəsən, yolu budur,
Dünya istəsən, onu məndən yaxşı bilirsən.
4863 Fələk rast gətirdi, səadətə qovuşdun,
Başqa arzularına da yetəcəksən, inan.
4864 Məndə başqa nə işlər var ki,
Sizə xeyirli olsun, ey gözəl yoldaş.
4865 Elik məni Tanrıya bağışlasın,
Yaxşılığı üçün ona duaçı olum.
4866 Elik istəyirsə, bildiklərim budur,
Sən eşitdin, ona da çatdır.
4867 Sözümə qulaq asın, əgər asmasanız,
Başınıza gözləmədiyiniz işlər gələcək".
4868 Biliyi dəniz olan bu sözləri nə xoş deyib,
İnsan bu sözə əməl etsə, bəxtiyar olar:
4869 "Bu sözüm bu gün sənə yar olsun,
Sabah orada bunun əcrini taparsan.
4870 Qafil olma, sözümə əməl et,
Eləməsən, dediklərim başına gələr.
4871 Elikdən mənim yerimə üzr istə,
Nə lazımsa elə, işi həll elə.
4872 Gəlib-getmək sənə zəhmət olur,
Tanrı əvəzini versin, gün kimi parla.
4873 Ey qardaş, mənim üçün özünü üzmə,
Mənə olan sevgini azaltma".

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4874 Öydülmüş cavab verdi, dedi:
– İndi mən həqiqət yolunu anladım.
4875 Dediklərini eşitdim, sözünü ölçüb-biçdim,
Deməyə sözüm qalmadı.
4876 Düz deyirsən, həqiqət budur,
Bundan başqası əyri yoldur.
4877 Həqiqət səndədir, mənimki isə oyundur,
Həqiqətə baş əyir, oyundan əl çəkirəm.



4878 Mən gedim, sən sağ-salamat qal,
Ey hər iki dünyada səadətə qovuşan insan.
4879 Ey qardaşım, Tanrı sənə güc-qüvvə versin,
Dualarında məni də unutma, yada sal.
4880 Mənim üçün də Tanrıya dua et,
Məni oyatsın, könlümü, gözümü açsın.

* * *

4881 Sözünü kəsdi, qalxdı, vidalaşdı,
Evinə doğru yola düşdü.
4882 Atına minib yenə evinə gəldi,
İçəri girib bir az dincəldi.
4883 Yedi-içdi, bir müddət düşüncəyə daldı,
Eşitdiyi sözlər barədə fikirləşdi.
4884 Günəş öz üzünə qara pərdə örtdü,
Hər yan toz-duman rənginə büründü.
4885 Rum qızı zülfünü açıb üzünü örtdü,
Hər yan qara saç rənginə boyandı.
4886 Göyün hər tərəfi zənci üzünə döndü,
Uçan quşlar dondu, gəzən məxluqlar durdu.
4887 Qalxıb dəstamaz aldı, gecə namazı qıldı,
Yer saldırdı, işlərini qurtarıb yatdı.
4888 Bir az yuxuya daldı, təkrar oyandı,
Mərrix ulduzu təpədən yana sürüşmüşdü.
4889 Tərar baxdı, Ülkərin başı üfüqə tərəf əyilmişdi,
Qarşısında şərqdən Əqrəb qalxıb yüksəlmişdi.
4890 Təkrarən uzandı, ancaq yata bilmədi,
Keşikçi adam tək gözünü yummadı.
4891 Uymadan xeyli uzandı, düşündü,
Göyün dərisi kafura boyandı.
4892 Əbr səpilmiş kimi göy alacalandı,
Üfüqdən ətrafa sancılan mizraqlar yüksəldi.
4893 Günəş yüksəldi, yerdən toz qalxdı,
Doqquz at tuğu yaxınlaşmağa başladı.
4894 Öydülmüş qalxıb dəstəmaz aldı,
Namazını qıldı və dua etdi.

4895 Qızarmış mizraqlar və qalxan üfüqdən görünəndə,
Qalxıb saraya getdi və düz içəri keçdi.

* * *

4896 Gəldiyini eşidən Elik onu içəri çığırdı,
Öydülmüş hüzura girib əlini ovuşdurdu.
4897 Elik işarə etdi, oturmağa yer göstərdi,
O, ədəblə, vüqarla göstərilən yerə keçdi.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

4898 Bir az durduqdan sonra Elik sordu:
Ey təmiz təbiətli, söylə nə xəbər var?
4899 Qohumun nə deyir, işin necə oldu?
Xahişin nə oldu, dostun gəlirmi?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

4900 Öydülmüş cavab verdi, onun sözlərini,
Bütün söhbəti olduğu kimi nəql etdi.
4901 İkisinin arasındakı danışığı
Elikə eynən ərz etdi.

* * *

4902 Elik bir az durdu, öz-özünə düşündü,
Könlü yaralandı, gözündən yaş tökdü.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

4903 Elik dedi: – Qohumun düz deyir,
Söz onun söylədiyi sözdür.
4904 Bu gün özümüzə zülm etdiyimiz kimi
Ona da zülm edir, əziyyət veririk.



4905 Bu dünya müvəqqətidir, qalmaz,
Qalan ömrün müddəti də bilinməz.
4906 Şübhəsiz, dünya bizə doğru yaxınlaşır,
Rahatlığı, əziyyəti uzun sürməz.
4907 Harada rahatlıq varsa, orada sükunət var,
Orada insanın yeri və yolu bir olar.
4908 Qohumun qəflətən xilas olub,
Onu nə qədər çağırsaq da buraya gəlməz.
4909 Bizim varlığımız hərisliyin, həvəsin əsiridir,
Zamanımız, ömrümüz boşuna keçir.
4910 Dinlə, indi könlü diri olan adam nə deyir,
Bax, sənə yaxşı sözlərlə öyüd-nəsihət verir:
4911 "Hərislik və nəfs sənə düşməndir, güclənsə,
Şübhəsiz, səndən əski qisasını alacaq.
4912 Hərislik və nəfs canlansa, könül ölər,
Könül ölsə, ibadət qalar, ey oğul.
4913 Hərislik və nəfsin yoğun boynuna baxsan,
Gərək bizim könlümüz bu gün ölmüş olaydı.
4914 Ululuq, böyüklük, səadət günü
Uzun sürməyəcək, ey təmiz qəlbli.
4915 Bax, dünyanın rahatlığı az, əziyyət çoxdur,
Baş ağrısı, qarğış-söyüşü də var".
4916 Nə gözəl söyləmiş bilikli kişi,
Dünyanı sınamış, qocalmış kişi:
4917 "Ululuğa artıq güvənmə, bel bağlama,
İnsan böyüdükcə zəhməti də artır...
4918 Sevinc olan yerdə axır bəla var,
Rahatlıq haradasa, min bir əziyyət də oradadır".

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

4919 Elik yenə dedi: – Ey Öydülmüşüm,
Qohumunu çağırmaqdan məqsədin.
4920 Məni yaxşılığa sövq etməsəydi,
Ey pəhləvan, könlüm təkrar canlanarmı?
4921 Bəri gəlməyə dirəndi,
Dost-yoldaş, qohum üzü görmək istəmədi.

4922 Bax, söylədiklərimin hamısı doğrudur,
İndi onu zorla çağırmaq da yaxşı deyil.
4923 Sənə də gedib-gəlmək zəhmət oldu,
Çox qaçdın, çox danışdın, çox yoruldun.
4924 Yenə gözləyək, görək, ey comərd,
Axırı nə olacaq, fələk nə göstərəcək.
4925 Gələcək zil qara gecə içindədir,
Onu parlaq günəş işıqlandırar, ey gözəl yoldaşım.
4926 Zəmanənin yayı qurulıdur,
Bəzən xeyiri dəyir, bəzən ziyanı.
4927 Hər şeyi Tanrının hökmünə burax,
Vaxtı gəlsə, özü açılar, ey könlü diri.
4928 İnsan bir işdən zövq almasa,
Onu bir müddət tərk etməlidir, ey bilikli.
4929 Bu dünyanın xasiyyəti budur, qovsan, qaçar,
Əl çəksən, sənə doğru gəlməyə başlar.
4930 Bir az gözləyək, onu sınayaq,
Görək gələcək bizə nə göstərəcək.
4931 Ola bilər ki, bir gün bizi istəsin,
Düşünər, özünə əl vereni cdər.

* * *

4932 Buraya çatanda Elik susdu,
Öydülmüş yavaşca qalxıb bayıra çıxdı.

* * *

4933 Bu söhbətdən bir neçə gün keçdi,
Elik bu işin önünü-sonunu düşündü.



## LXVIII

## ELİK GÜNDOĞDUNUN ODQURMUŞU ÜÇÜNCÜ DƏFƏ DƏVƏT ETDİYİNİ BƏYAN EDİR

4934 Elik Öydülmüşü bir gün yenə çağırdı:
"Sənə bir zəhmət də verəcəyəm" dedi.
4935 Çağırdım qardaşın bura gəlmədi,
Mən də öz arzuma qovuşmadım.
4936 Mən bu arzumdan vaz keçdim,
Arzuya çatmaq üçün başqa bir yol seçdim.
4937 Bugünkü diləyim budur ki,
Bircə dəfə onun üzünü görüm.
4938 Ziyarət etmək üçün, ey bəxtiyar insan,
Ya mən ora gedim, ya o bura gəlsin.
4939 Mənə öyüd versin bu ağıl əri,
Sonra yenə getsin görsün işləri.
4940 Mənə xeyiri dəysin, ona zərər dəyməz,
Könlüm saf və əmin olsun.

### ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

4941 Öydülmüş cavab verib dedi: – Bu söz
Gerçəkdən çox yerində sözdür, ey xoşbəxt insan.
4942 Elik arzu etsə, bu işi görərəm,
Əmr etsə, onu təkrar dəvət edərəm.
4943 Gedib bu sözü ona söylərəm,
Elik getməsin, mən onu gətirərəm.
4944 Elik yenə bir məktub yazsın,
O təmiz insan, oxuyub, inanıb, gəlsin.

### ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

4945 Elik dedi: – Nəyə lazım bu məktub,
Sən məktubdan da əfzəlsən, ey müdrik insan.

4946 Məktub etibarsız adama verilir,
Səndən də etibarlı adam varmı?
4947 Yaxşı yəğma bəyi nə deyir, eşit,
Hər işdə ağlı bişmiş bəydir:
4948 "Elçi etibarlıdırsa, məktub nə gorək,
Etibar varsa, hazırlıq nə gorək?
4949 Öz sözünü söylə, cavabı eşit,
Ey müdrik, məktuba nə ehtiyac?
4950 Bu o qədər ağır iş deyil,
Ürkəcok-qaçacaq bir iş deyil.
4951 Bu kiçicik işə məktub nə lazım,
Ey ağıllı şəxs, məktub sənsən, onu niyə yazım?
4952 Buraya gəlsin, görüşək, yenə getsin,
Zorla ona mane olmayacağam, qərarında sərbəstdir.
4953 Bu iş üçün səni göndərirəm,
Onu xoşluqla buraya dəvət et.
4954 O gəlməsə, mən gedərəm,
Üzünü görüb geri qayıdaram".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

4955 Öydülmüş cavab verib dedi: – Dilək
Yerinə yetər, əgər Tanrı kömək etsə.
4956 Özüm də çox çalışacağam ki,
Bu arzu yerinə yetsin.
4957 Hökmdar sağ olsun, xürrəm yaşasın,
Tanrı onu bütün diləklərinə qovuşdursun.

* * *

4058 Ordan çıxdı, atına minib evə gəldi,
Çatıb atdan endi, içəri girdi, paltarını soyundu,
4959 Göy üzünün al rəngi soldu, saraldı,
Dünyanın hər tərəfi qızıl rəngini aldı.
4960 Günəş üzünə sarı zəfəran sürtdü,
Cahan isə mina rənginə büründü.



4961 Göyü tamam tutdu sevənlər qaşı,
Dünya oldu zənci–həbəş qarışığı.
4962 Yeyib-içdi, yuyundu, namaz qıldı,
Yeri saldırdı, bir az yatdı.
4963 Sarı bülbül gözəl səsilə cəh-cəh vurdu,
Öydülmüş doğrulub oyandı, yuxusu qaçdı.
4964 Bülbülü dinləyərək bir az uzandı,
Bu səsə ovundu, ona heyran oldu.
4965 Yuxusu qaçdı, gecə ona uzun göründü,
Günün ağarmasını səbirsizliklə gözlədi.
4966 Səma qara köynəyini cırdı,
Çarşabını götürdü, parlaq üzü açıldı.
4967 Yüksəkdən gözəl qız üzü gülərək baxdı,
Dünyanın hər tərəfi işığa büründü.
4968 Günəş doğdu, yüksələrək üzünü göstərdi,
Bütün vadi və çayları parlatdı.
4969 Öydülmüş qalxdı, yuyundu və geyindi,
Namaz qıldı, işin xeyirinə dua etdi.

* * *

4970 Atını tutdu, mindi, bir nökər ilə
Qohumunun yanına gəldi, sevinə-gülə.
4971 Onun olduğu yerə yaxınlaşanda
Atdan düşdü, piyada qapıya gəldi,
4972 Əli ilə qapını astaca çaldı,
Qohumu eşitdi, durub qapıya çıxdı.

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

4973 Önündə görüncə o, Öydülmüşü,
Dedi: – Ey qardaşım, uzatdın işi.
4974 Niyə özünə əziyyət verirsən,
Niyə bu qədər israr edirsən?
4975 Yürü, gəl içəri, de, nədir sözün,
Təkrar nəyə gəldin buraya özün?

* * *

4976 Qoşa evo keçdi bu iki qardaş,
Zahid qohumuna düydü alın, qaş.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

4977 Gələn qohum dedi: – Ey qəlbi düzüm,
Qaşını çatma bir, gəl eşit sözüm.
4978 Sənin dediyin bütün sözləri
Elikə dedim, özüm də xahiş etdim.
4979 Elik hamısını dinlədi, eşitdi,
Uzun müddət düşünüb-daşındı.
4980 Ey qardaş, Elik səndən əl çəkdi,
İndi tamam başqa bir arzusu var.
4981 Bu iş üçün məni elçi göndərdi,
Ey qəhrəman, məni artıq utandırma.
4982 Hər şeyin bir həddi və ölçüsü var,
Ölçünü aşma, ey şöhrətli insan.
4983 Ağıllı insan nə deyir eşit,
Hər şeyə uyğun və təməl olan söz budur:
4984 "Ölçüdən gəl çıxma heç bir işdə sən,
Ölçünü aşan iş çıxar cızıqdan.
4985 Hər işin özünün qaydası vardır,
Hər şey ölçü ilə yoluna qoyulur".
4986 Elik əvvəlki arzusundan vaz keçdi,
Səni ancaq ziyarət üçün çağırır, kömək et.
4987 Ya sən get, ya da ki, o gəlsin bura,
Ey genişürəkli, sənin üzünü görsün.
4988 Bunun nə ziyanı sənə, ey qardaş,
Sözümə qulaq as, ey ürəyi daş.
4989 Vallah, bizim Elik yaxşı sultandır,
Kasıba, suçluya sevimli candır.



## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

4990 Odqurmuş söylədi, dedi ki, bu söz,
Əqlə çox yaxındır, ey ürəyi düz,
4991 Müsəlman müsəlmana qardaşdır,
Ziyarət etməlidir, ey könlümə uyğun insan.
4992 Bu söz qarşısında boyun əyərəm,
Mən bu gün onu ziyarət edərəm.
4993 O məndən bir xeyir gözlədiyi üçün,
Mən onu yanına getmədim.
4994 İndi o bundan vaz keçdi, doğru yola girdi,
Mən də bu yola girirəm, əmin ol.
4995 Elik ölkənin bəyi, xalqın böyüyüdür,
Ona hər cür hörmət etmək lazımdır.
4996 Elik ölkənin bəyi, xalqın böyüyüdür,
Ona hər cür hörmət etmək lazımdır.
4997 Əməli düz olsa, düz olar sözü,
Yox olar əlindən pislərin izi.
4998 Eşit gör biliyi dəniz olan,
Ağıllı, sakit, könlü düz adam nə deyir:
4999 "Rəiyyətə bəyin yarlığı vacibidir,
Kiçik-böyük, hamı onu yerinə yetirməlidir.
5000 Bəyin özünə-sözünə hörmət et,
Hətta o hindu, yaxud gümüşlə satın alınmış olsa da".
5001 Elikin fərmanına hörmət edər,
Onu ziyarət üçün yanına gedərəm.
5002 İndi get, Elikə söylə,
Çatdır ki, mən özüm gələcəyəm.
5003 Parlaq dünya üzünə örtük örtəndə,
Mən oraya gələrəm, ey əski dost.
5004 Adamlar gündüz məni görsələr,
Haqqımda dedi-qodu etmək üçün özlərini oda atarlar.
5005 İndi sən get, məni evdə gözlə,
Mən gələrəm, bir az gec yat.
5006 Mən əvvəlcə sənin yanına gəlim,
Nə etmək lazımsa, birlikdə düşünək.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

5007 Bax, Öydülmüş sevindi, dedi: – Bu cavab,
Çox doğrudur və çox savabdır.
5008 İndi mən qalxıb Elikin yanına gedim,
Bu sözləri ona deyim, eşidib sevinsin.
5009 Mən getdikdən sonra sən də sözündən qaçma,
Şərtləşdiyimiz vaxt özünü ora yetir.

* * *

5010 İkisi də bu söz üzərində qərarlı qaldı,
Öydülmüş sevinə-gülə oradan çıxdı.

* * *

5011 Bir də əlavə etdi, ey qardaş,
Sözündən qaçma, gəl, ey könüldaş.
5012 Günəş yerə batıb üzünü gizlədikdən,
Dünya öz üzünə kömür kimi qara dəri bağladıqdan sonra
5013 Səni evdə gözləyəcəyəm, gəl,
Sənin üçün gərəkli hazırlıq görəcəyəm.

* * *

5014 Atına mindi, düz Elikin yanına gəldi,
Atdan düşdü, izin alıb hüzura girdi.
5015 Danışılmış sözü Elikə ərz etdi,
Elik sevindi, qaşı-gözü güldü.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

5016 Elik dedi: – Bu iş çox yaxşı oldu,
Barı o, sözünün üstündə duraydı,
5017 Elik yenə dedi: – Nə zaman gəlir?
Onunla harada görüşəcəyik?



## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5018 Odqurmuş cavab verdi: – Gecə
Parlaq dünya üzünü gizləyincə,
5019 Mənim evimə gələcək, nə zaman
Əmr etsəniz yanınıza gələr.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5020 Elik dedi: – Çox yürüdün, çox zəhmət çəkdin,
Zəhmətinin əvəzini Tanrı özü ödəsin.
5021 Mənim xəstəliyimin dərmanı bu idi,
İndi mənim könlümü sevindirdi.
5022 Sən evdə gözlə, gəlsə, mənə eşitdir,
Mən də dəvət üçün adam göndərim.
5023 Sən qohumunla birlikdə yanıma gəl,
Mən də üzünü görüb onu ziyarət edim.
5024 Bir alimin buna bənzər sözü var,
İndi onu eşit, sözə fikir ver:
5026 "Bu zaman ki, arzu-diləyinə çatdı,
Onu könlündən çıxarar, dilinə gətirməz".

* * *

5027 Öydülmüş "baş üstə" deyib durub çıxdı,
Atına minib evinə gəldi.
5028 Günəş yerə endi, üzünü gizlədi,
Dünyanı qara bir toz-duman bürüdü.
5029 Dünya dul donunu geydi, qaşını çatdı,
Səma şeytan üzü kimi solub qaraldı.
5030 Bütün məxluqat sükut etdi, gözünü yumdu,
Səs-küy kəsildi, canlıdan səs çıxmadı.

## LXIX

## ODQURMUŞUN ÖYDÜLMÜŞÜN YANINA GƏLDİYİNİ BƏYAN EDİR

5031 Odqurmuş evindən durub astaca gəldi,
Öydülmüş gözləyərək onu qarşıladı.
5032 Salamlaşdılar, əl sıxdılar,
Bu iki pak adam evə girdilər.
5033 Öydülmüş yemək-içmək gətizdirdi,
Elikə xəbər üçün adam göndərdi.
5034 Elik eşitdi, dərhal cavab verdi,
Yaxınlıq göstərərək onları saraya çağırdı.

## LXX

## GÜNDOĞDU ELİKİN ODQURMUŞLA GÖRÜŞDÜYÜNÜ BƏYAN EDİR

5035 Hər ikisi durub Elikin yanına getdi,
Elik onları görüb ayağa durdu, qarşıladı.
5036 Qarşılaşınca, əvvəlcə Elik salam verdi,
Zahid isə əleyk aldı, salama durdu.
5037 Elik zahidlə əl sıxdı,
Sevinə-gülə hal-əhval tutdu.
5038 Özünün yanında yer göstərdi,
Onu səmimiyyətlə hədsiz əzizlədi.
5039 Dedi Odqurmuşa: – Çox zəhmət çəkdin,
Payi-piyada bura qədər gəldin.

### ODQURMUŞUN ELİKƏ CAVABI

5040 Odqurmuş cavab verdi, dedi:
– Gözüm səni gördü, zəhməti unutdum.



5041 Özüm öz arzumla gəlmişəm sənə,
Ey Elik, bunun yox zəhməti mənə.
5042 İnsan öz arzusu ilə yola çıxsa,
Yolda yorulmaz, diləyinə çatar.
5043 Eşit gör Bökə yavqusu nə deyir,
Ağlı ilə dünyaya ün salmış adam:
5044 "Könül arzulasa iraq yer yaxın olar,
İnsan öz diləyinə tez qovuşar.
5045 İnsan arzulayaraq yola çıxsa,
Bu sevgi ilə diləyinə yaxın olar.
5046 Bir yerə könülsüz yola düşsə,
Yol nə qədər yaxın olsa da, uzaq görünər.
5047 Piyada yeriyən adam zəhmət çəkər,
Könül arzusu ilə getsə, zəhmət yüngülləşər.
5048 Ey elim, mən könlümün arzusu ilə gəldim,
Bunun mənə heç bir zəhməti yoxdur.
5049 Könül kimi sevsə, diləsə, baxın,
Ona uzaq yer də olacaq yaxın".

### ELİKİN ODQURMUŞA SUALI

5050 Elik dedi: – Söhbətdən əvvəl
Sənə bir sualım var, ona cavab ver.
5051 Sən indi könüllü buraya gəldin,
Lakin bu iş necə oldu, ey qüdrətli,
5052 Bilirsən ki, salamın fəzli uludur,
Kim əvvəl salam versə, yolu o açar,
5053 Məni gördün, ancaq salam vermədin,
Bu fəzli, savabı niyə istəmədin?

### ODQURMUŞUN ELİKƏ CAVABI

5054 Odqurmuş dedi: – Mən bilə-bilə
Birinci salam vermədim.
5055 Salamdır kişiyə salamat yolu,
Kim salam verirsə, təminat verir.

5056 Salam insan üçün əminlik və amandır,
Salam versən, demək, can əminlikdə olur.
5057 İndi buna bənzər bir söz var,
Bunu eşit, ey könlü düz.
5058 Salam verən adam insana aman verir,
Əleyk alan isə salamat olur.
5059 Salam insanı şərdən qoruyar,
Cavab verən salamatlıq alar.
5060 Ulular kiçiyə salam verməlidir,
Beləliklə, işlər tamam olar.
5061 Kiçiklər uluların sözünü eşitsə,
Salamat yaşayar, xoşbəxt olarlar.
5062 Kiçiklər böyüklərin şərindən əmin olmalı,
Onlardan xeyir umub, salamat yaşamalıdırlar.
5063 Məndən hökmdara nə şər toxuna bilər?
Mən kiçiyəm, kiçiyin nə zərəri var?
5064 Elikin əli bütün xalqa yetişər,
Qəzəblənsə, istədiyini edər.
5065 Bax, buna görə qara camaat
Bəyə salam verməz, ey biliyi tamam.
5066 Ən əvvəl sən məni xidmətə çağırdın,
Çox arzu edərək yanına dəvət etdin.
5067 Mən qəbul etmədim, sözünə baxmadım,
Çünki bu yalançı dünyaya inanmıram.
5068 Ondan əl çəkdin ziyarət üçün
Çağırdın, mən də bu gecə gəldim.
5069 Yenə də səndən eymənirəm,
Ancaq salamında mənə aman verdin.
5070 Yenə əvvəlki sözünə dönəcək deyə,
Səndən çəkinir və qorxurdum.
5071 İndi sənə tam, həqiqətən inandım,
Mənə səndən ancaq yaxşılıq keçər.

## ELİKİN ODQURMUŞA CAVABI

5072 Elik dedi: – Bir bəy üçün
Ən pis şey sözündən dönməkdir.



5073 Verdiyi sözdən qaçan bəy
Heç zaman böyüklüyə çatmasın.
5074 Yalançı və qəzəbli insan
Heç bir zaman dünyaya hakim olmasın.
5075 Dili yalan və əli quru
Xalq üstündə necə bəy rola bilər?
5076 Bilik bundan daha yaxşı söyləmişdir
Kim sözündən dönsə, səadət ondan dönər.
5077 Yalançı insanların pisidir,
Pislərin pisi isə sözündən qaçandır.
5078 Doğru sözlü insan gözəl demişdir,
Doğru sözlü adama Tanrı əcr versin:
5079 "Bəy sözündə dürüst olmalı, sözdən qaçmamalıdır,
Sözündən dönənə kişi demək olmaz.
5080 Ərən verdiyi sözdən qaçmaz,
Sözündən qaçanı arvad say".

## ODQURMUŞUN ELİKƏ CAVABI

5081 Odqurmuş cavab verdi, dedi: – Elik
Bu xoş əməllərə vasitə oldu.
5082 Ey Elik, bu xoş əməl və əxlaqını
Allah daimi eləsin və artırsın.
5083 Xalq içində yüksək olan bəylərin özü,
Özü kimi də sözləri yüksək olmalıdır.
5084 Bilikli insan bilik verir və belə deyir:
"Bəy yaxşı və doğru olsa xalq varlanar".
5085 Eşit gör nə deyir ağ başlı ər,
Dünya görmüş, uzun yaşlı ər:
5086 "Ey dünyaya hakim olan, yaxşı hərəkət et,
Səadət gəldiyi kimi gedə də bilər.
5087 Çalış, yaxşı ad qazan – səadət bivəfadır,
Səadət sənə təkrar yad ola bilər.
5088 Pislik etmə, ey qüdrət sahibi,
İşin, sözün həmişə yaxşı olsun.
5089 Böyüklük, bəylik səndən üz çevirə bilər,
Ancaq yaxşılıq üz çevirməz, ey mərd qəhrəman.

5090 Bu gün yaxşılıq qazan, xalqın yükünü çək,
Sabah vaxtı ötər, sənə yaxşılıq qalar.
5091 Bu ömür dediyin qasırğa kimidir, keçər,
Səadət vəfasızdır, bir gün səni də tərk edər".

## ELİKİN ODQURMUŞA CAVABI

5092 Elik dedi: – Dinlə, ey biliyi ulu,
Səndən diləyim budur: mənə yaxşılıq yolunu aç.
5093 Səni israrla çağırmaqdan
Diləyim bu idi, ey könlümü doyuran.
5094 Mənə indi, nəsihət ver ki,
Yalnız yaxşılığa yetişsin əlim.
5095 Ətrafımda boğaz ortağı çoxlu adam var,
Ey comərd, içində doğru-dürüst, sadiq adam yoxdur.
5096 Bəylər bütün dilək və arzularını taparlar,
Ancaq qolbə yatan köməkçi tapa bilməzlər.
5097 Qapıda böyük bir kütlə adam var,
Mənə xeyirli biri də yoxdur, ey bilən.
5098 Ey comərd, indi bu beyt ona bənzəyir,
Anlamaq istəsən, onu oxu:
5099 "İnsanam deyə gəzən çox adam var,
Bunların içində xeyirlisi hanı?
5100 Bir adam bəzən mininin işini görər,
Mini yığışar birinin işini görə bilməz".

* * *

5101 Elik yenə dedi Odqurmuşa:
– Sən Tanrının bütün fəzilətlərini özündə toplamısan
5102 Bütün hərəkətlərin adına yaraşır,
Allah səni bütün arzuna yetirsin, xoşbəxt etsin.
5103 Allah sənə verəndən mənə pay versin,
Könlüm dirilsin, nəfsim ölsün.



## ODQURMUŞUN ELİKƏ CAVABI

5104 Odqurmuş cavab verdi, dedi: – Ey bəy,
Hamı kimi sən də mənim zahirimi öyürsən.
5105 Ey qüdrətli, əgər mənim içimi bilsəydin,
Məni min dəfə söyüb burdan qovardın.
5106 Mənə zahid adı veriləndən bəri
Bu ad mənim üçün fəlakət oldu.
5107 Məni məhv edən bu adımdır,
Bu adımdan dolayı nəfs mənə bəy olub.
5108 İnsanların görəcəyi dükanımı çox bəzədim,
Ancaq burada iş və satışdan əsər yoxdur.
5109 İnsanın zahirinə baxma, ey Elik,
İnsanın içini gör, gizli əməllərinə bax.
5110 Qovunun xarici, üzü necə olsa da,
Rəngi, qoxusu nə qədər ürəkaçan olsa da.
5111 İçində dad yoxsa, o qovun
Qaldırıb atmaq gərək, ey çevik.
5112 Könlü oyaq adam nə deyir, eşit:
"İçini bəzə, zahirini boyayıb cilalama.
5113 Hər şeyi onun içi yüksəldir,
İçi yoxsa, çölü bir şeyə yaramaz".

## ELİKİN ODQURMUŞA CAVABI

5114 Elik cavab verdi – Ey saf insan,
İçin də çölün kimi mükəmməldir.
5115 Dünyadan əl çəkməklə yükün yüngülləşdi,
Mən isə ona əsir oldum, indi yüküm ağırdır.
5116 Məni bu dünya işi məşğul etdi,
Tanrı ibadətinə vaxtım qalmadı.
5117 Mənə öyüd ver, ona uyğun hərəkət edim,
Sözün səadət gətirsin və mən ruhumu sevindirim.

## ODQURMUŞUN ELİKƏ CAVABI

5118 Odqurmuş cavab verib bəyə dedi:
– Bütün yaxşılıqlara yaxşılıqla yet.
5119 Ey biliyi çay kimi axan, bil ki,
Tanrının qulları içində məndən pisi yoxdur.
5120 Allahımın qulları arasında,
Məndən də pisi mən özüməm.
5121 Mənim sözlərimin nə xeyiri var ki,
Sənə öyüd də verəm?
5122 Mən yenə də rəbbimdən naümid deyiləm,
Bütün günahları bağışlayan o bir rəbbimdir.
5123 Günahlarını etiraf edən qul nə deyir,
Tanrıdan əfv və bağışlanma diləyir:
5124 Mən sənin cəfakeş, günahkar qulunam,
Baxsan, görərsən ki, bütün günaham.
5125 Səndən başqa sığınacaq rəbbim yox,
Günahımı bağışla, məni səadətə tuş et.

## ELİKİN ODQURMUŞA CAVABI

5126 Elik cavabında dedi: – Ey oyaq,
Bu gözəl bədəni Tanrı gözəl əxlaqla bəzəyib,
5127 Özünü pis hesab etdiyin üçün
Xalq içində ən yaxşı adam sənsən.
5128 Könlünü, dilini, özünü təmizlədin,
Öyüd ver, sözündən istifadə edim.
5129 Ey xoşməcaz, sadiq, işi doğru adam,
Mənə yazığın gəlsin, öyüd ver.
5130 Tanrı sənə hər cür yaxşılıq verdi,
Ey şöhrətli, bu yaxşılıq yolunu mənə aç.
5131 Ey gözəl insan, indi mənə öyüd ver,
Sabah Tanrı sənə əvəz verər.



# LXXI

## ODQURMUŞUN ELİKƏ ÖYÜD VERDİYİNİ BƏYAN EDİR

5132 Odqurmuş cavab verdi, dedi: – Ey Elik,
Tanrı hər işdə sənə əl tutsun.
5133 Bu boş dünya çox əski aləmdir,
O neçə bəyi qarıtdı, özü qarımadı.
5134 Sənin kimi bəyləri sevdi, sonra üz çevirdi,
İndi hazırlaşır, səndən də üz çevirəcək.
5135 Sən ona həqiqi könül bağlama,
O, vəfa göstərməz, ondan vaz keç.
5136 Mənim öyüd-nəsihətimə nə lüzum var,
Ey diri, sənə fələyin ibrəti bəsdir.
5137 Səndən əvvəl dünyaya hakim olanlar hanı?
Haraya getdilər, hanı o ehtişamları?
5138 Onlar hara getdilər, bax, düşün,
Sənin də oraya gedəcəyin gün yaxındır.
5139 Bu bəylik növbəsi indi səndədir,
Uzun davam etməz, işini ona görə tut.
5140 Onlara nəyin xeyiri dəydisə, sən də onu et,
Sabah bunun zövqünü dadasan.
5141 Onlar öləndə nəyə peşman oldularsa,
Sən ondan uzaq dur, ancaq yaxşılıq et.
5142 Bilikli hakim çox gözəl söyləmiş
Biliklinin sözü inci və yaqut kimidir:
5143 "Ölünü görən heç kim diri qalmaz,
Ölümə hazırlaş, qafil olma.
5144 Ey ölümü bilərək qafil davranan,
Həyat keçir, ondan nəsibini al.
5145 Ey qəflətdə yeriyən arzuların əsiri,
Ölüm basqın edib səni almağa gələcək.
5146 Keçmiş günlərə bu gün diqqətlə bax,
Hamısı bir yuxu oldu, ağılla fikirləş.
5147 Əgər özün yaxşılıq etdinsə,
Özünə əbədi səadət qazandın.

5148 Əgər ömrünü boşuna keçirdinsə,
Onda gecə-gündüz peşmanlıqla inlə.

5149 Arzu etməklə uzun həyat qazanmısan,
Gənclik gücü isə bir də geri dönməz.

5150 Barı bu əlinə düşən zamanı boş keçirmə,
Ölümə hazırlaş, ibadətə qoş.

5152 Xəzinəsi, məiyyəti, qoşunu vardı,
Onların köməyi ilə yaşadı, diləyinə yetdi,

5153 Axırda ölüm onu yaxaladı apardı,
Onun böyük şöhrəti köməyinə çatmadı.

5154 – Atan öldü, bu ölümlə sənə öyüd verdi,
Ata öyüdünə əməl etsən, sənə bal-şəkər olar".

5155 İndi buna bənzər bir sözü dinlə,
Əməl etsən, xeyir verər, görən gözün olar:

5156 "Atan ölərkən sənə belə demiş olur;
Ey oğul, bax və oyan.

5157 Ölüm məni yaxaladı gedirəm, növbə sənindir,
Çalış özündən sonra yaxşı ad qoy.

5158 Valideynlərin ölümü uşaqlar üçün öyüddür,
Bunu anlayaraq mənimsə.

5159 Atanı-ananı ölüm qoymadı,
Vaxtı çatanda səni qoyarmı?

5160 Onlara acımayın, cəfa edən dünya
Təbiətini dəyişib sənəmi vəfa göstərəcək?

5161 Həyatı əziz bil, xeyirli işə sərf et,
İnsanlara ehsan et, savab qazan.

5162 Keçən gün içindən gərəklisini al,
Zaman səni də keçirəcək, hazırlaş.

5163 Sən bu qədər xalqın yükünü çəkirsən,
Ayıq ol, qafil olma, düşünüb hərəkət et.

5164 Bir sürü ac qurd ətrafına yığılıb,
Ey qəhrəman Elik, qoyunları yaxşı qoru.

5165 Ölkədə bir adam bir gecə ac qalsa,
Tanrı onu səndən soruşacaq, gözünü aç.

5166 Ey Elik, sən bu gün məşəl kimi yanırsan,
Bunun işığı başqaları üçündür, ey pak qəlbli.



5167 Yaşın ötüb sona yetəndə
Bu adamların sənə xeyiri dəyəcək?

5168 İnsanlar üçün özünü oda atma,
Göz görə-görə zorla özünü yandırma".

5169 Ölüm gəlib qapını döyəndə hər şey qalacaq –
Bəylik də böyüklük də – hər şey.

5170 Doğru ol, doğruluqla hakimlik et,
Bəylik, ancaq bu cür baqi olur.

5171 Böyük alim nə gözəl bilik verdi,
Ona görə hərəkət et, o yolla yeri.

5172 Bəyliyin təməlini möhkəmlətmək istəsən,
Hökm edərkən həmişə doğruluq yolunu tut.

5173 O biri dünyanı əldə etmək istəsən,
Şübhəsiz, yenə doğruluq yolu ilə getməlisən.

5174 Ey "mən bəyəm" deyən, qürrələnmə,
Dünya və səadət vəfasızdır, ona bel bağlama.

5175 Bu dünyanın səadətinə çox güvənmə,
O, dönük təbiətlidir, ona inanma,

5176 Ey Elik, bu saray, bu köşk, bu taxt,
Diqqət etsən sənin üçün bir dayanacaqdır.

5177 Səndən əvvəlkilər ordan gəlib keçdilər,
Mənzildə qalmadılar, köçdülər.

5178 Bu saray, bu taxt indi sənə qaldı,
Köçünü özündən əvvəl göndər.

5179 Bu gün bu köşkü, sarayı burda qurma,
Ötüşən il, ay, gün səni sürükləyəcək.

5180 Sənin yatacağın yer məzardır,
Onu yaxşılıqla bəzə, ey ad-san sahibi.

5181 Bu gün bu saray mənimdir deyə bilərsən,
Ciddi düşünsən, əslində belə deyil.

5182 Eşit gör bu saray sənə nə deyir,
Diqqət etsən, doğrunu deyir, ey qəhrəman:

5183 "Bunu sən "mənimdir, mənim" deyirsən,
Niyə belə deyirsən, bu necə sənin ola bilər?

5184 Səndən sonrakılar sənə "çıx" deyir,
Onlar getməyə hazırlaşıb "mənimdir" deyə gözləyirlər".

5185 Ey dünya bəyi, bu dünya bir zindandır,
Zindanda qayğıdan başqa heç nə olmaz.

5186 Zindanda sən sevinc gözləmə,
Sevinc və ovunc yeri ancaq cənnətdir.

5187 Keçici rahatlığı rahatlıq sayma,
Keçəcək sevincə də sevinc demə.

5188 Səadət belədir, durmaz, qaçar,
Sən topladığın malları o saçar.

5189 Axirəti obodi həyat yeri hesab et,
Dünya malını burax, üzünü ora çevir.

5190 Rahatlığı, arzu, diləkləri qoy, əbədiyyəti ara,
Əbədi rahatlıq istəyən zəhmətə qatlanmalıdır.

5191 Tanrı və fəzli ilə bax, gör, düşün,
Sənə no qədər yaxşılıqlar etmişdir.

5192 Qələbəlik xalq üzərində səni hakim etdi,
Dilək-arzularını verdi, fərmanını yeritdi.

5193 Sənin kimi Tanrı qullarını
Sənə möhtac etdi hamısını görürsən.

5194 Ey Elik bu gün buna şükür et,
Tanrının yaratdıqlarına qarşı xoşrəftar ol.

5195 Tanrı səni doğruluq üçün bu vəzifəyə gətirdi,
Doğru ol və doğruluqla yaşa.

5196 Hər işi ağılla gör,
Nəfsini boğ, könlünü diri tut.

5197 Xalqa qarşı rəhmdil ol,
Böyüyə-kiçiyə doğruluqla hökm et.

5198 Xalqın xasiyyəti dəyişib pozulsa,
Gözdən qoyma, fəsada düşməyə qoyma.

5199 Ey Elik, dinlə gör biliyi dəniz nə deyir,
Biliklə hərəkət et üzün gülsün.

5200 Bu gün hamının yaxşı olmasını istəsən,
Birinci özün yaxşı ol, ey ölkə hakimi.

5201 Bütün bulanıqları durultmaq istəsən,
Öz ruhunu təmizlə, onda xalq da durular.

5202 Bəylər başdır, baş hara getsə,
Ona tabe olanlar bəylərin arxasınca gedərlər.

5203 Xalq pozulsa, onu bəylər nizama salar,
Bəylər bulansa, onları kim süzər?

5104 Sən öz hərəkətini, əməlini düzəlt,
Xalqın hərəkəti öz-özünə düzələr.

5105 Əgər özünə yaraşan şeylər etmək istəsən,
Səno yaraşmayan şeylərə yaxınlaşma.

5106 Kobudluqdan və fəsaddan uzaq ol,
Bu iki şey insanı qaraya boyayar.

5107 Pis və namünasib şeylərə qarışmaq istəmirsənsə,
Yaraşmayan hərəkət etmə, sənə qəti deyirəm.

5208 Eyş-işrətə qurşanma, içki içmə,
Bu iki şey insanı qaraya boyayar.

5209 Əməlin və hərəkətin təmiz olsun,
Yoldaşın ağıl, müşavirin bilik olsun.

5210 Könlünü, dilini doğru, ərdəmi yüksək tut,
Qəflətə uyma, yolundan azma.

5211 Özünü dartma, qürrələnmə,
Əsgərim, qoşunum çoxdur deyə köksünü gərmə.

5212 Neçə-neçə cəsur, kökslü, məğrur əri
Ölüm yerə gömdü, torpaqla örtdü.

5213 Bilikli, böyük insan yaxşı demişdir,
Onun sözünə əməl edən yaxşılığa tuş olar.

5214 "Xəzinəm çoxdur!" deyə mala güvənmə,
"Xidmətçim əsgərim çoxdur" deyə qürrələnmə.

5215 Gücünə güvənib köksünü gərən adam
Bir milçəyə çarə tapa bilmədi,

5216 İş zamanı qəzəblənmə, öfkələnmə,
Qəzəbə uğrasan lal kimi hərəkət et.

5217 Din işindən başqa işlərdə tələsmə,
İnsan tələsik işin faydasını görməz.

5118 Ehsan edərkən tələs, tez elə,
Cəza verən zaman bir az asta ol.

5119 Hərəkətdə tələskən, sözdə zəvzək olma,
Səbirli ol, səbirliyə həlim deyərlər.

5220 Comərd ol xalqa mal dağıt, payla,
Bəylər xəsis olsa, adları pisə çıxar.

5221 Qaba söz demə, özünü saxla,
Qaba söz insanların könlünü tez soyudar.
5222 Dilin hər kəsə şirin söz desin
Üzünü açıq, alnını pak tut.
5223 Sən xalq içində seçkinsən, hərəkətin də seçkin olsun,
Düşüncən, sözün doğru-dürüst olsun.
5224 Qara camaat yaxşı olsa, onun yaxşılığı
Ancaq özünə çatar, ey xalqın ümidi.
5225 Əgər bəylər yaxşı hərəkət etsələr,
Bütün el min sevinclə dolar.
5226 Əgər bəylər pis iş görsələr,
Pislər güclənər, yaxşı adəti pozarlar.
5227 Pis olma, adını pisliyə çıxarma,
Pisləri əz, onlara aman vermə.
5228 Pislik zəhərdir, o zəhəri içmə,
Zəhər içənin həyatı məhv olar.
5229 Kim ağıllıdırsa, onunla yaxın ol,
Biliklinin sözünü tut, haqqını gözlə.
5230 Bütün doğru, dürüst, adlı-sanlıları
Özünə yaxın tut, işi onlara tapşır.
5231 Bu yalançı dünyanın hərəkəti vəfasız və dönükdür.
Qəflətə uyma, diqqətli ol, yolu çox sürüşkəndir.
5232 O bəzənib-düzənərək könlünü alar,
Könül verincə üz çevirib gedər.
5233 Unutma ölümü, uzun xəyallar bəsləmə,
Ölümün basqınına uğrama, ey dövlətli hakim.
5234 Ey Elik, qəflət yuxusuna dalma,
Bəylikdən məst olma, ey təmizqəlbli.
5235 Bugünkü rahatlığa allanma, saqın,
Sabahkı rahatlığı ara, yaxşıca düşün.
5236 Onun sevinci çox, rahatlığı uzun olar,
Rahatlıq deyilən şey belə olmalıdır.
5237 Rahatlıq, yaxşılıq diləsən, yürü, yaxşı ol,
Bol nemət içində əbədi ömür sür.
5238 Eşit gör nə deyir, bilikli ər,
Biliklə eldə hörmət qazanmış ər:



5239 Tanrının verdiyi izzət sonsuzdur,
Bol rəhmət içində rahat yaşarsan.
5240 Əgər ondan qaçsan zillət səni yaxalar,
Kimin zillət əzabına taqəti var?
5241 Ey Elik, sən bu gün bir həkimsən,
Xalq isə sənə möhtac xəstədir.
5242 Bəzisi dara düşmüşdür, bədbəxtdir,
Bəzisi isə qayğı içində qıvrılır.
5243 Bəzisi ac, bəzisi də çılpaqdır,
Bir qismi də yoxsulluqdan əzab içindədir.
5244 Bütün bunların dərmanı səndədir,
Sən onların həkimi ol, dərmanı ver, sağalt.
5245 Əgər dərman görməsən, sağaltmasan,
Xalq üçün fəlakət olarsan.
5246 Tanrı sabah bunu səndən soruşar,
Onda özünü xilas etməyə cavab hazırla.
5247 Həyat tez keçər, bu bəylik qalar,
Sənə lazım olan şey yaxşı addır.
5248 Bu dünya bir tarladır, ey Elik,
Bu əl nəyi əksə, onu da biçər.
5249 Yaxşılığa çalış, yaxşılıq et,
Bundan yana əbədi yaxşılıq taparsan.
5250 Eli idarə edən hakim bəy,
Bəylik işində yol göstərən bəy nə deyir, eşit:
5251 "Ey xalqın böyüyü olan Elik,
Könlünü, dilini kiçik tutmaq sənə vərdiş olsun.
5252 Ey elin başı, ey hökm sahibi,
Sən hər işində əvvəlcə biliyi tətbiq et.
5253 Hər bir işi biliklə işlə,
Hər gözəl iş biliklə meydana gələr.
5254 Bu aləm qalan deyil gedəndir,
Sən daima qalacaq bir yaxşılıq et.
5255 Doğulan hər şey ölür, dünya yerində qalır,
İnsandan qalan isə yaxud pis addır.
5256 Pislə oturub-durma, pis səni yandırar,
Adın yaxşı olsa, yaxşı izin qalar".

5257 Ey Elik, ehtiyatlı dur, sayıq ol, sayıq,
Qafil adamlara zərər toxunur.
5258 Bəyliyin təməli ehtiyat və sayıqlıqdır,
Daha bir dünya istəsən, bunlardan taparsan.
5259 Qafil olma, qafil olsan, bəylik gedər,
Qafil adam hər iki dünyada binəsib olar.
5260 Özünə düşmən qazanma, qan tökmə,
Bu iki günaha görə çıxan can inildəyir.
5261 Harama əl uzatma, özünü bərk tut,
Haram yeyənin dibi cəhənnəmin dibidir.
5262 Bütün insanlara qarşı rəhmdil ol,
Başqalarının zərərini istəmə, yolunu azma.
5263 Şərab içmə, fəsada uyma, uzaq ol,
Bu ikisi saray, qəsr, qalalar yıxar.
5264 Hər doğulan ölmək üçün doğular,
Ölən adamdan ad və iz qalar.
5265 Bu bir tutam həyat bitər sona çatar,
İnsanın ancaq yaxşı-pis adı qalar.
5266 Bu dünya səni ovundurar, aldadar,
Qafil olma, qəflət səni uyutmasın.
5267 İnsanı uyudan bu qəflətdir,
Uyuyan adam iş-güc görməz.
5268 İnsan bu qəflətə heç düşməsəydi,
O, mələk olar, yalnız ibadət edərdi.
5269 Bilikli adam bu sözü çox gözəl söyləyib,
Ey könlüaçıq, indi bunu anlamağa çalış:
5270 "Sevinc ilə şadlıq qəflətin əseridir,
Qəflətlə insan özünü məhv edər.
5271 Qafil olma, qəflət yuxusuna dalma
Ey rəbbim məni bu qəflət yuxusundan qoru!
5272 Eldə gözün və qulağın iti olsun,
Mərhəmətin hamıya çatdır.
5273 Axırda Tanrı bunu səndən soruşacaq,
Hər bir günahkar adam Tanrının sual toruna düşər.
5274 Diqqət et, gör namuslu adam nə deyir,
Onun sözünə əməl edənin işi rast gətirər:



5275 – Ey üsyan vadilərində sərsəri gəzən,
Tanrının sualına cavab hazırla.
5276 Ey öz arzusuna görə hərəkət edən eyibli,
Bir gün Tanrı səndən haqq-hesab soruşacaq.
5277 Ey yeyib-içməklə həyatını boşuna keçirən,
Hesaba hazırlaş, çıxış yolu axtar.
5278 Tanrı bütün haqq-hesabı soruşanda,
Qurtulmağa, qaçmağa yerin varmı, hanı?"
5279 Ay Elik, qılınc və qırmanc səndədir,
Bu qamçılar, bu cəzalar pislər üçündür.
5280 Pislər pisliklərindən əl çəkmədikcə,
Sən cəzanı azaltma qırmancı hazır tut.
5281 Pislər qamçı yeyəndə də yola gəlməsələr,
İmkan daxilində özünü onlardan qorumağa çalış.
5282 Hökmdar pis olsa, dünyanı pozar,
Ona mane olmasalar, yolunu azar.
5283 Sən yaxşıya qiymət ver, ona yaxşılıq et,
Bu namdar, beləliklə bütün el yaxşı olar.
5284 Oyunla ovunma, özünü qoru,
Arxayınlaşma, günün az qalıb.
5285 Sən hər zaman doğruluqla hökm et,
Bəylik qanun ilə qüdrətli olar.
5286 İnsan gücü yetdikcə çalışmalıdır ki,
Bəd əməlləri üçün Tanrıdan əfv diləsin.
5287 Eşit gör nə deyir elin başçısı,
Qayda-qanun ilə eldə şöhrətini yayan insan:
5288 "Ey bəy, gücün yetən qədər qanunu tətbiq et,
Xalqın haqqını verməyə çalış.
5289 Əgər günah işləsən, Tanrıdan əfv dilə,
Hər gün dönə-dönə tövbə et.
5290 Çox altun-gümüş yığıb xəzinə yaratma,
Nə tapsan, camaata ver, payla.
5291 Ölüm yaxalasa, malın qalacaq,
Övladların onu pis işlərə sərf edəcəklər.
5292 Malını sağ ikən göndərməyə çalış,
O bəladan qurtar, savab qazan".

5293 Xalqın bəyi nə yaxşı demişdir,
Xalqın böyüyü, insanların yaxşısı:
5294 "Ey xəzinə yığan dünya bəyləri,
Yeri, özündən sonra xəzinə qoyma.
5295 Kefi başqası sürüb,
Dərdi sənə verməsin, ey nəcabətli qoca.
5296 Ey varlı, ey xalqın seçkini,
Bu sərvəti payla, çoxlu savab qazan.
5297 Vəfasız dünyaya könül bağlama,
Axırda o sənə cəfa edəcəkdir.
5298 Ey bəy, ey xalqın irəli çıxanı,
Bu bəylikdən əl çək, özünə bir yer hazırla.
5299 Ey acgöz tamahkar insan,
Ölüm səni yaxalamamış, hər şeyini payla.
5300 Ölüm yaxalayanda bu malın faydası olmayacaq,
Malın qalacaq, onun zövqünüsə dadmayacaqsan".
5301 Ey Elik, az ye, çox ibadət et,
Ərdəmliyi öyrən, ancaq az danış.
5302 Yoxsullara, dullara, yetimlərə görüm-baxım elə,
Onları qorumaq ədalətin tətbiqi deməkdir.
5303 Dedi-qoduçuları özünə yaxın qoyma,
Aravurandan uzaq dur, ondan saqın.
5304 Belələri insanların zərərlisidir,
Zərərli adamları həmişə özünə düşmən bil.
5305 Acgöz adama ölkədə vəzifə vermə,
İnan ki, onlar elin nizamını pozacaqlar.
5306 Özünü cəhənnəmdən uzaqlaşdırmağa çalış,
Həmişə yaxşılıq elə, Tanrı səni qoruyar.
5307 Sabahkı günün və gecən
Bugünkü günündən daha yaxşı olsun.
5308 Bilikli, xoşqılıq adam yaxşı söyləmiş,
Görəcəyin işi yazıya almışdır:
5309 "Sabah, bu gün üçün cavab verəcəksən,
Sabahı fikirləşərək doğru yeri.
5310 Qafil olma, sayıq ol, yatma, ayıq ol,
Yatan gözünü aç, yuxudan əl çək.



5311 Din və dünya işi bir-birinə qarışdır,
Onlar uzlaşmasalar, yolları ayrıdır.
5312 Dinlə dünyanın birləşməsi çətindir,
Onlar qovuşmazlar, bunu bilmək kafidir.
5313 Biri yaxınlaşsa, o biri qaçar,
Onları birlikdə tutmaq istəyən, çaşar.
5314 Dünyanı fırtına və yağmur san,
Gələr, gurlayar tez də sovuşar.
5315 Səadət gələndə qapıda izdiham yığışır,
Sən könlünü ona versən, o hər şeyi başqasına verir.
5316 Varlıyam desən, yoxsul olarsan,
Hörmətləyəm desən, zəlil olarsan.
5317 Dünyanın toxluğu aclıqdan ibarətdir,
Onun rahatlığı, sevinci isə – zəhmətdən".
5318 Ey Elik, nəfsini möhkəm tut,
Onun istədiyini vermə, zövq almasın.
5319 Hamıdan pis düşmənin budur,
Nə qədər yaxşılıq etsən, yenə pislik edər.
5320 Vəfa qılsan cəfa ilə cavab verər,
Cəfa etsən sənə vəfa göstərər.
5321 Nəfsi ucuz tutsan canın əziz olar,
O zaman bilik bəy olar, ağıl xan olar.
5322 Bu dünya da yağıdır, nəfs də yağıdır,
Bu iki düşmənin toru hazırdır.
5323 Bu səadətdə güvənmə, açıq könül ol,
Həyata inanma, ondan əlini üz.
5324 Böyüklük də ululuq da müvəqqətidir,
Səadət odu bir gün sönər.
5325 Nəcabəti böyük olan nə deyir, eşit,
Səmimi sözə əməl etsən, çox xeyir görərsən:
5326 "Bu bəyliklə çox da qürrələnmə,
Köksünü qabartma, özünü qoru.
5327 Bu həqir dünyanı süpür at,
Tanrı orada sənə hər cür nemət verər".
5328 Ey Elik, seçkin adamlar axtar,
Bu üç işi onlara tapşır:

5329 Bunlardan biri qazıdır, pak olsun,
İman sahibi olsun, xalqa xeyiri dəysin.
5330 İkincisi, naibdir, o, bütöv olmalıdır ki,
Xalq rahat və xoşbəxt yaşasın.
5331 Üçüncüsü, seçkin bir vəzir lazımdır,
Xalqa nə gəlsə, ondan gələr.
5332 Bu üç işə baxan adamlar doğru olsalar,
Xalq rahat olar, günü aydın olar.
5333 Ölkə nizama düşər, xalq varlanar,
Nəticədə, sənə xeyir-dua edərlər.
5334 Bu üç vəzifədə yaramaz adamlar olsa,
Bütün xalqın işi pis olar.
5335 İndi ağlıma buna bənzər bir söz gəldi,
Sən bunu eşit, ey gözəlüzlüm:
5336 Bəyə yolu vəzir göstərir,
Xalqa, xidmətçi və mühafizələrə o, nizam verir.
5337 Vəzir cilovu əks tərəfə çəksə,
Zənnimcə, hər şey tərs olar.
5338 Dünyanı qurulu bir süfrə hesab et,
İnsanlar burada nə qədər nemət yeyərlər?
5339 Bizdən əvvəlkilər və indi ölüb gedənlər
Yedilər, doydular, getdilər.
5340 Çoxlu adam məhşəri gözləyərək yatır,
Bizi çağırırlar, biz də gedəcəyik.
5341 Digər bir nəsil də ana bətnindədir,
Bizdən sonra bu süfrədən onlar yeyəcəklər.
5342 Bu nəsil bizim getməyimizi,
O biri gəlməyimizi gözləyir.
5343 Bu gün biz də həmin süfrədən yemə yedik,
Bizə daha nə qədər yemək-içmək verəcək?
5344 Ölüb yatanlar bizi oraya çağırırlar,
Qarındakılar isə get deyirlər.
5345 Biri qovur, biri çağırır,
Bu ikisinin arasında kim rahat ola bilər?
5346 Ey Elik, qafil olma, uzun əməllərə qapılma,
Burda çox qalmaq olmaz, ey pak təbiətli.
5347 Harama əl uzatma, özünü gözlə,
Bil ki, haram tikə könül qaraldır.



5348 Ey şöhrətli, iman sahibi olmaq istəsən,
Halal ye, nəsibini halaldan al.
5349 Gerçəkdən halal axtaran, halal yeyən,
İman sahibi insan nə deyir, eşit:
5350 "Halal yeyən Allah qarşısında günahsızdır,
Halal ye, sabah üçün azuqən də halal olsun.
5351 Kimin boğazı, əyni-başı təmiz olsun,
Bütün günahlar ondan təmizlənər.
5352 Təmizlik istəsən, boğazın təmiz olsun,
Onda sənə tərəf nemətlər çay kimi axar.
5353 Öz mənfəətinin deyil, xalqın mənfəətini düşün,
Sənin mənfəətin də onun içindədir".
5354 Hər cür işə ağlı yetən,
Uluq-Kənt bəyi nə deyir, eşit:
5355 "Bəy xalq üçün səadətdir, onu xoşbəxt etməlidir,
Xoşbəxt olmaq üçün də qarın doymalıdır.
5356 Bəylər dibi inci ilə dolu bir dənizdir,
Dənizə yaxın olan varlanmalıdır.
5357 Bəylər altun-gümüş mədəni olan dağdır,
Gümüş mədəninə qazma vuran çox varlanar.
5358 Bəy insanlara faydalı və comərd olmalıdır,
Dünya xalqına ondan toxluq gəlməlidir.
5359 Ey hakim Elik, günəş kimi parla,
Xalq sayəndə yeyib-içmək tapsın.
5360 Tanrı sənin boynuna əmanət qoymuşdur,
Əmanəti qoru, sonra səndən soruşacaq.
5361 Ey Elik sən özünə bir göz yetir,
Sən özündə nə qədər şey toplamışsan.
5362 Sənin üçün dənizdəki, gövhər tükənməz,
Dibindəki inci qurtarmaz.
5363 Qara yer altındakı qızıl-gümüş toplar,
Çoxlu xəzinələr yığarsan.
5364 Bu dağlar altında çıxan gövhəri, incini
Qazıb sənə çatdıra bilməzlər, ey pak təbiətli.
5365 Quru yer üstündəki taxılı
Sən yığaraq anbarlara doldurarsan.
5366 Uçanlar, qaçanlar, suda üzənlər
Sənin əlindən qurtulmazlar, ey bədqılıq.

5367 Karvanların el-el dünyanı dolaşar,
İpək, qumaş, sincab, samur dərisi yığarsan.
5368 Qəsəb, tuzi, rumi kimi dünya varı,
Sənə gələr, yenə xəzinən dolmaz.
5369 Hər cür atlarla axurların dolub,
Ancaq bu acgözlük yenə də doymaz.
5370 Çöldə çoxlu ilxı, axurda qatır,
Minlərcə seçmə maya yığılıb.
5371 Ovda və dağda çoxlu qoyun sürüləri,
Qul, cariyə, xidmətçin çoxdur, ey xoşqılıq.
5372 Yaxud quzeydəki vəhşi sığır sürüləri,
Yaxud obada dolaşan inək və öküz sürüləri,
5373 Qayalara dırmaşan dağ keçiləri, keyiklər
Ey igid pəhləvan heç biri sənin əlindən qurtulmaz.
5374 Erkək-dişi dağ keçiləri, keyiklər
Sənin üçün tükənməz qidadır, ey xoşqılıq.
5375 İstər qulan və ya tağı, istər boz keyik olsun,
Tutub sənə gətirilər, ey pəhləvan.
5376 Qurd, tülkü, aslan, ayı və ya donuz
Səndən qurtulmaz, ovlayarsan.
5377 Qu, qorday, durna, yuğaq,
Yaxud toy quşu, yügdik, todlıç və qaz,
5378 Havada uçan qara quş sürüləri,
Səndən yan keçə bilməz, ey bozqurd.
5379 Sənin ov quşların uçanı uçurmaz,
Sənin aslanın, itin qaçanı qaçırmaz.
5380 Atalı, atasız qalıb yetim olar,
Analı, anasız qalıb öksüz olar.
5381 Bunlar sənin üçün bitib-tükənməz,
Ancaq sən özün tükənərsən, ey güclü igid.
5382 Boğaz və əyin üçün bu dünyanı yığdın,
Ancaq bir gün öləcəksən, bunlar qalacaq.
5383 Dünya malını toplamağın nə xeyiri var,
Bax, əcəl can yığıb sənin kökünü qazır.
5384 Diqqət et, bütün bunlar acgözlükdür,
Tamahkarlıqla acan adamlar nə vaxt doyarlar?



5385 Gözü tox adam nə deyir, eşit:
Varlılığın başı toxgözlü olmaqdır.
5386 Acgöz adam bütün dünyanı əldə etsə də,
Ona heç vaxt varlı demək olmaz.
5387 Yoxsul deyirlər, yoxsul kimdir,
Acgöz nə qədər varlansa da yoxsuldur.
5388 Acgöz adama sərvətin xeyiri yoxdur,
Ey könlü tox olan insan, acgözə acı.
5389 Acgözə bütün dünyanın malı az görünər,
Aza qail olan xoşbəxt yaşayar.
5390 Qara torpağın tozu gözünə dolmadıqca,
Acgöz adam maldan doymaz".

* * *

5391 Ey Elik, mənim bildiklərim bu qədərdir,
Bildiklərimi və inandıqlarımı sənə söylədim.
5392 Mən söylədim, sən də dinlədin,
Yaxşı baxsan, gözün-könlün açılar.
5393 Sözümə əməl etsən, sabah xeyiri dəyər,
Əməl etməsən, vəbal sənin qalar boynunda.
5394 Ağıllı insan nə deyir, eşit,
Eşitsən, bu sənə bir nəsihətdir:
5395 "Nəsihət insana fayda gətirər,
Nəsihəti loxma-loxma ver, istəyən yesin.
5396 Əgər bu loxmaları yeyə bilməsə,
İşin yoxdur, qarışma, od yeyər".

## ELİKİN ODQURMUŞA CAVABI

5397 Elik bu sözləri eşidib ağladı,
Dedi: – Ey insanların seçkini Odqurmuş,
5398 Ey könlü daima oyaq insan,
İndi bu bəylik mənim üçün fəlakətə çevrildi.
5399 Mən hər şeyi anladım, gözüm açıldı,
Mən öz-özümü oda atmışammış.

5400 Ey ulu, mən doğruluqdan ayrılmışam,
İndi sən o yolu mənə göstərdin.
5401 Ey Odqurmuş, indi mənə dua et,
Allah yaxşılıq yolunda mənə güc versin.

## ODQURMUŞUN ELİKƏ CAVABI

5402 Odqurmuş cavab verdi, dedi: – Ey bəy,
Tanrı sənə dilədiyin qədər güc versin.
5403 Çalış ki, ağılla nəfsinə hakim olasan,
Nəfsini ram edə bilməyən adam yava olur.
5404 Səni məhv edən bu nəfsani zövqlərdir,
Sənə eyş-işrətdən vaxt keçmək ağırdır.
5405 Bu dünya çox qoca dünyadır,
O çox bəylərin axırına çıxmışdır.
5406 Sənin kimi çox bəyi qocaltmışdır,
Səni də çox yaşamağa qoymaz.
5407 Onlar getdi, taxt sənə qaldı,
Sən vaxtını boşuna keçirmə, hazırlaş.
5408 Ey Elik, ölümü unutma, oyan,
Şübhə etmə ki, tezliklə səninlə növbən çatar.
5409 Ey Elik, saqın, özünü unutma,
Əgər özünü unutsan, əslini xatırla.
5410 Kim bu iki şeyi unutsa,
O, doğruluq yolundan azar.
5411 Eşit gör nə deyir bilmiş kişi,
Nəfsini ağlına əsir etmiş kişi:
4512 "Ölümü unutma, əsl yerin məzardır,
"Özünü unutma" sözünü həmişə xatırla.
5413 Sən mənidən[1] törəmişsən, "mən!" demə,
"Mən!" desən, bax, dəyərin budur
5414 Gözə görünməz ölüm pusquda durur.
Qarşına çıxmaq istəsə, yolumu yaxşı bilir.

[1] Məni – kişilik, erkəklik toxumu



5415 İnsan üçün başqa heç bir əzab olmasa belə,
Bu acı ölümə baxmaq kafidir.
5416 Kifayətdir bu ölümdən sonra,
Qara torpaq altında ölüb-çürümək.
5417 Bundan başqa ölüm sənə yol açanda,
Görüləcək çoxlu işlər var.
5418 Ağıllı adam bunları gördükdən sonra,
Necə rahat yata bilər, yeyib-içə bilər?"
5419 Eşit gör nə deyir bilik verən,
Biliklə ulu hörmət qazanan adam:
5420 "Himməti böyük, könlünü yüksək tut,
Bu dünyadan əl çək, ondan vaz keç.
5421 Dünya ox ilanı ilə dolu bir zindandır,
Onu burax, parlaq, əsl dünyadan yapış.
5422 Qara torpaq duru canın qəlibidir,
Qara torpaq bunlarla dolar, ey xoşəməl.
5423 Bu dünya bir zindan, qaranlıq bir quyudur,
Daim bəla, möhnət, fəlakətlə doludur.
5424 Zindanda rahatlıq arzulamaq olarmı?
Ağlına, könlünə düşən nəyi arzu etmək olar?
5425 Bu bir ovuc qara torpaqdan vaz keç,
Böyük və əbədi diyarı istə, gözünü aç.
5426 Bu tozun, dumanın fövqünə yüksəl,
Duru və əbədi diyarı istə, ilğıma aldanma.
5427 Neçə min yaşasan da, axırda ölüm
Bir gün səni yaxalar, ey günüm.
5428 Dünya malı nə qədər artsa da.
Onun baş ağrıları daha çoxalar, ey igid.
5429 – İnsan min yaşayıb diləyinə qovuşsa da,
Yenə diləyi, arzusu bitməz".
5430 Fələyin oxu ilə qəlbi yaralanmış,
Təmizqəlbli insan nə deyir, eşit:
5431 "İnsan min yaşasa belə,
Diləyini, ehtiyacını ödəyə bilməz.
5432 Diləyən adam hər şey arzulayar,
Diləyi tükənsə, arzuları sona yetər.

5433 Sözün faydası onun çoxluğunda
Və ya sözü heyrətlə çox dinləməklə deyil.
5434 Sözün faydası eşitdiyinə əməl etməkdə,
Özünü doğru yola istiqamətləndirməkdədir".

* * *

5435 Çox söz dedim, hamısını eşitdin,
Sözümə əməl et, xeyirini gör.
5436 Dilim dinc dırmadı, çox danışdı,
Sözümün özü yox, etibarı azaldı.
5437 Allah sənə qüvvət versin, ey Elik,
Bütün yaxşılıqları əl yetirəsən.
5438 Tanrı diləyini versin, səni gözləsin,
Ey Elik, duada məni unutma.

* * *

5439 Sözünü kəsdi, ayağa qalxdı,
Bir az da otur deyib Elik onu buraxmadı.
5440 Növbənöv yemək-içmək gətirtdi,
Dedi: – Ey yaxşı insan, bunlardan dad.
5441 Odqurmuş əl uzadıb bir loxma aldı,
Azacıq yeyib-içdi.
5442 Əlini yeməkdən çəkdi, çox yemədi,
Rəbbə şükür qıldı, adını çəkdi.

* * *

5443 Odqurmuş ayağa qalxdı, salam verdi,
Elik də eyni şəkildə cavab verdi.
5444 Odqurmuş durub hüzurdan çıxdı,
Elik də onu yola salmaq üçün çıxdı.
5445 O, Elik ilə xudahafizləşdi,
Onlar əl sıxışdılar, Elik qəmli qaldı.

* * *

5446 Odqurmuş birbaş dağlara üz tutdu,
Qohumu əlini öpərək onunla getdi.



5447 Bax, Odqurmuş Öydülmüşü geri qaytardı,
Xudahafizləşib ayrıldılar.
5448 Öydülmüş evinə gəldi, qəlbində bir boşluq yarandı,
Kədər və qayğıdan gözünə yuxu getmədi.

* * *

5449 Şərqdən günəş başını qaldırdı,
Dünya qu rənginə büründü.
5450 Günəş doğdu, köksünü qabartı,
Dünya kafur ilə doldu.
5451 Dünya mələkləri üzü kimi parladı,
Göy üzü kafur saçılmış kimi oldu.

* * *

5452 Öydülmüş yuxudan durdu, abdəst aldı,
İxlas ilə namazını qıldı.
5453 Geyindi, evdən çıxdı, atlandı,
Sonra birbaşa saraya yollandı.
5454 Atından endi, saraya girdi, içəri yeridi,
Elik onu çağırdı, hüzura girdi.

## ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

5455 Elik əvvəlcə Odqurmuşun
Nə qədər qaldığını, haçan getdiyini soruşdu.
5456 Elik sonra dedi: – Ey Öydülmüşüm,
Yemək artıq mənə zəhər oldu.
5457 Bundan sonra necə yaşayım,
Belim büküldü, daha dikəlməz.
5458 Bəyliyə, elin yükünü çəkməyə nə lüzum var,
Bu əndişə və qayğı qəlbimi parçaladı.
5459 Bəyliyin bütün işlərini görən,
Xalqı idarə edən bəy xidmətçisiz keçinməz.
5460 Xidmətçi tutsa, şübhəsiz, mal-sərvət lazımdır,
Mal olmasa, kim başqasının xidmətinə girər?

5461 Nə deyir eşit bir ordu başında duran
Can verib bəyin işini görən ər:
5462 "Bəyin gücü xəzinə və ordular,
İnsan öz öcünü bunlarla alar.
5463 Bəy bu iki şeylə böyüklük tapır,
Bu ikisi uzlaşsa, bəyin tacı əzəmət kəsb edər.
5464 Əsgər toplamaq üçün çoxlu mal lazımdır,
Mal almaq üçün bilə-bilə zorakılıq göstərməlisən.
5465 Mənim ancaq bir əynim, bir boğazım var,
Niyə bu qədər adamın günahını üstümə götürüm?
5466 Nə qədər yoxsul olsa da, adam ac qalmaz,
Bu ölüm hər bir canlıdan öcünü alar".

## LXXII

## ÖYDÜLMÜŞ ELİKƏ ÖLKƏNİ İDARƏ ETMƏYİN QAYDASINI BƏYAN EDİR

5467 Öydülmüş cavab verdi, dedi: – Elik,
Hər işə əvvəlcədən əl qoymalıdır.
5468 Ağzından ona yaraşmayan yava söz çıxmasın,
Tanrıya xoş gəlməz, ey biliyi çay kimi olan.
5469 Bu bəyliyi sən zor gücünə almadın,
Onu Tanrı öz fəzli ilə sənə bağışlayıb.
5470 O, lütf edərək bu bəyliyi sənə verdi,
Ey geniş bilikli, buna şükür et.
5471 Düz qəlblə, paklıqla Tanrıya tapın,
Xalqa mərhəmət və şəfqət göstər.
5472 Həvəsini, nəfsini bas, ağlınla ona hakim ol,
Bilik ilə nəfsə qalib gəl.
5473 Həvəsinə, nəfsinə hakim olan kişi,
Bilik verən kişi nə deyir, eşit:
5474 "Bədənini düz istəsən nəfsinin boynunu qır,
Nəfs ölsə, bədənin əyriliyi düzələr.
5475 Çalış həvəsinin əsiri olma,
Nəfs və həvəs din oğrusudur".



5476 Ey Elik niyə belə aciz oldun,
Hər cür yaxşılığa qadirsən, gücün var.
5477 Niyə bu qədər çox kədərlənirsən,
Həyatı özünə zəhər edirsən.
5478 Xəzinən varlı, adamın, əsgərin çoxdur,
Hər cür işə yol göstərən biliyin, ağlın var.
5479 Xəzinəni aç, payla, adamları sevindir,
Onlar səni hər arzuna qovuşdurarlar.
5480 Düşmənə qarşı çıxan cəsur ər nə deyir, eşit:
"Qızıl-gümüş verəu düşməni məğlub edər:
5481 Əgər hər vaxt üstün olmaq istəyirsənsə,
Adamlarını məmnun et, sevindir, şövqə gətir.
5482 Adamlarını sevindir, sonra arzunu bildir,
Arzun çin olur, yağı boyun əyər.
5483 Sənin tərəfin saxlayanları sevindir ki,
Bir gün əziz canlarını sənə fəda etsinlər
5484 Qoşunla kafir yağını məğlub elə,
Könül təmizliyi ilə Allahdan güc istə.
5485 Əsgər, ordu və silahını kafirə vermə,
Kafirlə döyüşdə ölmək ölüm deyildir.
5486 Ev-eşiyini yandır, məbədini yıx,
Yerində məscid tik, camaat ətrafına toplansın.
5487 Oğlunu, qızını əsir al, qul, cariyə elə,
Oradan aldığın malla xəzinə yarat.
5488 Müsəlmanlığı, şəriəti yay,
Adın-sanın yaxşılığa çıxsın.
5490 Müsəlmanlara zidd olma, onlara əl vurma,
Ey Elik, onların arxasında Allah durur.
5491 Xalqa dinclik gətirən nizam qur,
Sənə həmişə xeyir-dua etsin.
5492 Allah sənə bunun əvəzini verər,
Hər iki dünya sənin olar, ey qəhrəman".

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5493 Elik dedi: – Bu sözlərin gözəldir:
Mən də elə bu cür etmək istəyirəm.

5494 Ey igid bununla məşğul olacaq insan hanı?
Bu işləri görmək üçün mənə kömək et.
5495 Əvvəlcə fitnə-fəsadın kökünü kəsmək,
Daxili və xarici işləri nizamlamaq lazımdır.
5496 Dostlara bəxşiş verərək sevindir,
Səni sevməyənləri sürgün elə.
5497 Buna görə ölkədə qayda yaratmaq,
Bütün meyxanaları dağıtmaq lazımdır.
5498 Ölkədə belə pis yerləri məhv etmək,
Xalqı qanun ilə nizamlamaq gərəkdir.
5499 Eldə nizam yoxdur, mən də məşğul ola bilmirəm,
İş üstünə iş gəlib, gözümü yummağa vaxtım yoxdur.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5500 Öydülmüş söylədi: Ey bəy,
İşi uzatma, hər işə baş qoş.
5501 Görəcəyin işi niyə uzadırsan,
İşi uzatma yaş ötür.
5502 Bugünkü işi görməsən, sabahkı da gələr,
İki günün işi üst-üstə yığılar.
5503 Bu günün işini sabaha qoyma,
Sabah işin olsa, bugünkünü görə bilməzsən.
5504 Ölkənin işini fasiləsiz gör,
Xalqınla özün də rahat olasan.
5506 Zalım olma, pislərə zülm elə,
Zalımların hamısını ölkədən qov.
5507 Doğru ol, doğru iş tut, doğru yolla get,
Onda pislər də doğru yolu taparlar.
5507 Bu bədməcazların, bu pislərin
Əl-qolunu bağlamasan, iş getməz.
5508 Pisi özünə yaxın qoyma, zərəri dəyər,
Ayıq ol, yaxşılarla ömür sür.
5509 Doğru və dürüst könlü olan,
Sözü, işi, hərəkəti düz olan nə deyir, eşit:



5510 "Pislə yoldaş olma, düzlükdən uzaqlaşma,
Pislər arasında doğrunun günəşi qaralar.
5511 Pislik edənlər qəzəbə düçar olarlar,
Qiyamət günü Tanrı qarşısında doğru ol".
5512 Çarə yoxdur, ey Elik, sənə adamlar lazımdır,
Bəylər fəsadı onların əlilə ortadan qaldırırlar.
5513 Döyüşçülər topla, onlara xələt ver,
Kasıbı varlı et, acı doyur.
5514 Xidmətçi nəyəsə ümid bağlayır,
Ümidi qırılsa, durmaz, gedər.
5515 Ey Elik, xidmətçi dürlü-dürlüdür,
Seç, ayır tut ki, yollarını yanılmasınlar.
5516 Bəziləri şərəf üçün işləyir,
Onları şərəfləndir, qoy razı qalsınlar.
5517 Bəzisi mal və mülk istəyir,
Ona mal ver, özünü sənə fəda etsin.
5518 Bəzisi həm şərəf, həm də mal istəyir,
Həm ad, həm xələt, həm də nüfuz istəyir.
5519 İgid və cəsurdursa ona gümüş ver,
Qılıncla sənə kənd, ölkə tutsun.
5520 Bilikli ağıllı və təmiz adamdırsa,
Ona hörmət elə, mal ver, əl uzat.
5521 Pisi və zalımı yüksəltmə,
El içində nüfuz vermə, səni hörmətdən salar.
5522 Zalımı, pisi yüksəltmə, varlandırma,
Şəksiz sənə dərmanı ağı edər.
5523 Eşit gör Bökə yavqusu nə deyir:
"Ən yazıq adam da varlansa, fərmana baş əyməz".
5524 Ey qüdrətli Elik, pisləri varlı etmə,
Onlar varlandıqca, hərəkətləri dəyişir.
5525 Yaxşı adam dar günə düşəndə,
Onun da tövrü, hərəkəti pozulur.
5526 Xoşbəxt insan pis vəziyyətə düşəndə,
Yaxşılığı qədər də pisləşə bilir.
5527 Pisi ucuz tutsan, yerişini düzəldir,
Yaxşını əziz tutsan, halı-tövrü lap yaxşı olar.

5528 Səmimi adamı özünə yaxın tut,
Saqın, uğursuzu özündən uzaq tut.
5529 Kimi faydalı, kimi də faydasızdır,
Ey bilikli hakim, onları bir-birindən seç, ayır.
5530 Səni sevəni və sevməyəni də ayır,
Sevənə sevimli, yağıya alov kimi ol.
5531 Sənin sevincini diləməyən kişini özündən uzaq tut,
Onu sevindirmə, özünə də iş tapşırma.
5532 Əmniyyətlə xəyanəti qarışdırma,
Yararlı ilə yararsızı qatışdırma.
5533 Bir işi iki adama birdən tapşırma,
Onlar bir-birinə arxayın olarlar, iş qalar.
5534 İşi iş bilən adamlara ver,
Bacarıqsıza versən, işi sındırar, özü də qayğı çəkər.
5535 Xidmətkar deyə hər yetənə iş tapşırma,
İşi xeyir verən adama ver.
5536 Elin faydasını öz mənfəətinlə uzlaşdır,
Başqasının mənfəətini düşünüb ona bağlanma.
5537 Başqasının könlünə baxma, hamı öz xeyirini istər,
Elin xeyirini istə, özünə güc eləmə.
5538 Sənə kim faydalı isə ona faydalı ol,
Xeyirsizi özündən uzaq tut.
5539 Xeyirliyə daim etibar göstər,
Ey Elik, vacib işləri ona gördür.
5540 Ey Elik, sənin görəcəyin işlər bunlardır,
Bunları eləsən, eldə nizam yaranar.
5541 Adın yaxşılığa çıxar, rahat olarsan,
Adını və sözlərini daim yad edərlər.
5542 Xalq varlanar, el nizama düşər,
İstədiyin qədər xəzinə yığarsan.
5543 Qəlbən sadiq adam nə deyir, eşit,
Onun dili ilə könlü birdir.
5544 Hansı elin bəyi yaxşı və doğru olsa,
El varlanar, xalqın başına gün doğar.
5545 Xalqın varlığı bəyin varlığıdır,
İstər onu istə, istər də bunu.



5546 Şəhər və qəsəbədə oğruları yox elə,
Karvan və yolçu qorxusuz hərəkət etsin.
5547 Daxili eldə zülm edənləri məhv elə,
Xaricdəki vilayətlərdə də yolkəsən qat.
5548 Pisi cəzalandır, doğru yola çək,
Pisə pis rəftar lazımdır, sən elə et,
5549 Yaxşı sərbəst dolaşsın deyə, ey mətin ürəkli,
Pis zəncirdə və ya zindanda olmalıdır.
5550 Məmləkətin əhalisi bir neçə təbəqəyə bölünür,
Onları bir-birindən fərqləndirmək lazımdır.
5551 Onlardan biri alimlərdir ki,
İnsanı səadətə və elmə yetirirlər.
5552 Onları əziz tut, nə istəsələr ver,
Şəriət yolunu tut, onlara baş əy.
5553 Ey hakim, onların haqqını qoru,
Yemək-içməklərini təmin et.
5554 Könül dincliyi ilə öyrətsinlər,
Biliksizlər onlardan öyrənsinlər.
5555 Bunlardan sonra möhtəsiblər gəlir,
Ey qüdrətli, onlar qüdrətli olmalıdır.
5556 Günahkarlara, sərsəri və avaralara
Nəzarət etsin, camaatı məscidə yığsın.
5557 Digər zümrə sənin xidmətçilərindir,
Manc olmasan, sənə qarşı çıxarlar.
5558 Onlar yük altına girməzlər,
Onların yüklərini sən özün yükləməlisən.
5559 Bunlardan sonra qara camaat gəlir,
Onlara qanunu tətbiq et, yaxşı bax.
5560 Bunlar da üç fərqli zümrədir,
Onlara zülm etmə, etsən, fəlakət olar.
5561 Bunlardan biri varlılardır, ey qüdrətli,
Onlar xalq içində gücü olanlardır.
5562 Sonra orta hallılar gəlir,
Orta hallılar varlılarla yarışa bilməzlər.
5563 Sonra isə yoxsullar gəlir,
Bunları hamıdan çox qorumaq lazımdır.

5564 Varlıların yükünü ortabablara yükləmə,
Yoxsa onlar kasıb düşərlər.
5565 Ortabablarm yükünü də kasıblara yükləmə,
Yoxsa yoxsullar acından ölərlər.
5566 Kasıbı qorusan, o, ortabab olar,
Ortabab özünü toplasa, varlı olar.
5567 Kasıb ortabab olsa, ortabab varlanar,
Ortabab varlansa, ölkə varlanar.
5568 Ölkə nizama düşər, xalq varlanar,
O zaman sən çox xeyir-dua alarsan.
5569 Uc-Ordu xanı nə deyir, eşit,
Yaxşı ad qazan, ey fani insan:
5570 "Ölən adam yaxşılıqla yad edilsə,
Ölmüş olsa da, adı əbədi yaşar.
5571 Ölərək xeyir-dua ilə xatırlanan
Yenidən dirilib yaşamış olar.
5572 Yaxşı adla şöhrət qazandıqdan sonra,
İstər yerin altında ol, istər üstündə.
5573 Yaxşı ad lazımdır, bədən bir gün öləcək,
Adı qalan insan heç vaxt ölməz.
5574 Təbəələrinin sənin üstündə üç haqqı var,
Bu haqları ödə, onları çətinə salma.
5575 Birinci, ölkədə gümüş təmiz qalsın,
Onun əyarını qoru, ey təmiz insan.
5576 İkincisi, xalqı adil qanunlarla idarə et,
Heç kəs heç kəsə zülm etməsin, hamını qoru.
5577 Üçüncüsü, bütün yolları təhlükəsiz et,
Quldur və yolkəsənləri ortadan qaldır.
5578 Təbəələrinin haqqını ödədikdən sonra
Onlardan öz haqqını istə, ey comərd hakim.
5579 Təbəələrinin üstündə sənin üç haqqın var,
Bunu onlardan istəməlisən, yaxşı dinlə:
5580 Birinci, xalq sənin əmrlərinə hörmət etməli,
Onları dərhal yerinə yetirməlidir.
5581 İkincisi, xəzinənin haqqını gözləməli,
Vergiləri vaxtında ödəməlidir, ey səxavətli.



5582 Üçüncüsü, sənin dostuna dost,
Düşməninə qarşı düşmən olmalıdır.
5583 Beləliklə, sən onların, onlar da sənin
Haqqını ödəmiş olarlar.
5584 Bu yolun yolçuluğunda bəy belə,
Təbəə də elə olmalıdır, ey ulu.
5585 Beləcə, xalq bəyinin yaxşılığını görər,
Bəy rahat olar, şöhrəti dünyaya yayılar".
5586 Hər iki dünyada qazanacağın qismət, səadət
Şübhəsiz ki, budur, ey Elik.
5587 Bundan sonra alimlər hərəkətə gəlib,
İxlas ilə xalqa bilik versinlər.
5588 Möhtəsibin əlində səlahiyyət olmalıdır,
O, camaat içində gəzib pisliklərə mane olsun.
5589 Satıcılar əmanətləri qorusunlar,
Sənətkarlar şagird yetişdirsinlər.
5590 Əkinçilər əkin-biçində səy etsinlər,
Heyvandarlar heyvanları çoxaltsınlar.
5591 İndi sənin xidmətindəkilər qaldı,
Yağıya və qurda qarşı onlar çıxırlar.
5592 Onları mal-mülk ilə sevindir,
Onlara başqa işlər tapşırma.
5593 Faydalı qədər onları əzizlə, xələt ver,
Mallarını artır, rütbələrini yüksəlt.
5594 Yağıya və qurda qarşı silahı hazır tutsunlar,
Dosta yar, düşmənə ölüm olsun.
5595 Beləcə, bütün yaxın olanlar seçilər,
Bütün işlərin durular, yoluna düşər.
5596 Sən hər iki dünyada yaxşılıq taparsan,
Tanrının rəhmini qazanarsan.
5597 Bax, doğruluq budur, doğru ol,
Doğruluq səni diləyinə qovuşdurar.
5598 Tanrı doğruluq üçün səni sevər,
Xalqa hirslənib doğruluqdan uzaqlaşma.
5599 Könlü parlaq insan nə deyir eşit,
Bunun mənasını bu söz təsdiq edər:

5600 "Göy doğruluq üzündən ayaqda durur,
Yerdə sabitliyi üzündən ot-ələf bitir.
5601 Sağa-sola meyl etmə, könlünü doğru tut,
Doğru olan şəxs hər iki dünyada doğruluq tapar".
5602 Ey Elik, bu şeyləri ki, mən bilirəm,
Gizli-açıq hamısını sənə söylədim.
5603 Hər iki dünyada sənə faydalı olanlar,
İndi mənim sənə söylədiklərimdir.
5604 Bu dünya sənə rahatlıq və yaxşı ad,
Bu dünyanı və axirəti bəxş edəcək.
5605 Bu dünya malı dünyada qalacaq,
Bir gün öləcəksən, yaxşı ad qazan.
5606 Bilikli adam buna bənzər yaxşı deyib,
Sözün mənasını onunla müqayisə et:
5607 "Qoy özüm ölüm, adım yaxşı olsun,
Dirilər axır öləcək, qoy adım qalsın.
5608 İmkan dairəsində yaxşılıq et, yaxşı ad dilə,
Bu əbədi ad ilə yaşamağa davam et".

* * *

5609 Elik bu sözü eşidib şad oldu,
Könlü, gözü şövqlə işıqlandı.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5610 Öydülümüşü çox öyüd, alqışladı, dedi:
– Sən öz bildiyini söylədin.
5611 Bu gündən Tanrı mənə, qabiliyyət versin,
Sənin sözlərinə əməl edə bilim.
5612 Allah mənə sənin kimi köməkçi verdi,
İstəsə, başqa diləklərimə də qovuşdurar.
5613 Sən mənim arzularımı yerinə yetirdin,
Ey xoş tale, Tanrı səni hər arzuna yetirsin.
5614 Bu gündən sonra sən sədaqətlə
Mənə kömək et, ey qəlbimə yaxın.



5615 Mən sənə inanıram, etibar edirəm,
Fikirlərini mənə açıqca söylə, ey gözəlüzlüm,
5616 Sən mənim parlaq günəşimsən,
Mən öz qüsurlarımı sənin sayəndə görürəm.
5617 Könlü-dili bir olan adam,
Könül sahibi adam nə yaxşı söyləmişdir:
5618 "Könlün kimə inansa, onu güzgü bil,
Özünü görmək üçün onu qarşında tut.
5619 Mehriban adam insana ayna olur,
İnsan ona baxıb hal-hərkətini düzəldir.
5620 Kimin könlü kimi gerçəkdən bağlı olsa,
Onu özünə gerçəkdən yaxın hesab edə bilər.
5621 Sözü etibarlı adamdan soruşarlar,
Belə adamın sözünə qulaq asarlar".

* * *

5622 Öydülmüş Elikin sözlərini eşitdi,
Üzü güldü, sevinclə "baş üstə" dedi.
5623 Elik şad-xürrəm sözünü bitirdi,
Öydülmüş qalxıb hüzurdan çıxdı.

* * *

5624 Bax, Elik bundan sonra rahatlıqdan əl çəkdi,
Çox zəhmət çəkib eli tənzim etdi, qaydaya saldı.
5625 Pislərin hamısını özündən uzaqlaşdırdı,
Yaxşıları ətrafına yığdı,
5626 Ölkə duruldu xalqın həyat zövqü artdı,
Xalqın şikayəti kəsildi, rahat oldu.
5627 Elin rifahı ilə həyatın zövqü artdı,
Xalq sevinə-gülə rahatlığa qovuşdu.
5628 Elik Öydülmüşə çox hörmət göstərdi,
Etimad edərək hər şeyi ona tapşırdı.

* * *

5629 Öydülmüş bir müddət belə davam etdi,
Ancaq həmişə qayğılı, əndişəli idi.

5630 Özünə diqqət etdi, halına-tövrünə baxdı,
Həyatını, gəncliyini boşuna keçirdiyini anladı.
5631 Könlü, köksü, gözü parlayaraq açıldı,
Könlünün tamamilə təmizlənməsini arzuladı.

## LXXIII

## ÖYDÜLMÜŞ ÖZ KEÇƏN HƏYATINA ACIYARAQ TÖVBƏ ETDİYİNİ BƏYAN EDİR

5632 Öydülmüş dedi: – Mən qəflət içində yaşadım,
Bu qəflət içində özümü xoşbəxt sandım.
5633 Həyat gücü məni tərk etdi, uzaqlaşdı,
Əlim sərvəti atıb əsa tutdu.
5634 Peşman oldu: – Təəssüf ki, günlərim keçdi,
Ömrüm tükəndi, gecəm qaralır, – dedi.
5635 Mən öküz kimi həvəs və nemət yedim,
Bilərək-bilməyərək öküz kimi yaşadım.
5636 Dedi: – Mən qəflətdə yürüdüm,
Bu qəflət içində özümü bəxtiyar bildim.
5637 Gənclik gücü məndən uzaqlaşdı,
Gəncliyə görə yanıb-yaxılaram.
5638 Həyat sona çatdı, ölüm yaxınlaşdı,
Ölümə çarə, ondan qurtarmağa yol yoxdur.
5639 Saçım sunqur tükü kimi ağardı,
Saqqalım yazdan qalmış quru ota döndü.
5640 Otuz iki inci ağ dişimin
İpi qaraldı, birər-birər töküldü.
5641 Gözlərim günəşli yeri görürdü,
İndi qaraldı, qarşımdakı adamı da görmür.
5642 Qulaq assam, uzaqları da eşidərdim,
Bu gün işarə ilə danışıram.
5643 Quzğun tükü kimi başım qara idi,
Başıma qu qondu, yaşım artdı.



5644 Bu gün Allaha qovuşmaq vaxtı çatdı,
Günahlarım üçün fəryadla ağlamalıyam.
5645 Artıq qalxıb Tanrıya qayıtmalıyam,
Günahlarım üçün tövbə etməliyəm.
5646 Özüm faydasız şeylərdən əl çəkməli,
Könlümü bulanıq şeylərdən təmizləməliyəm.

* * *

5647 Öydülmüş, beləcə, tövbə edərək
Günahları üzündən Tanrıya sığınmaq istədi.

* * *

5648 Birdən düşündü: – Tələsməliyəm,
Tələsmək zərərlidir, bunu etməliyəm, – dedi.
5649 Bu işə bir məsləhət lazımdır,
Zərərli şeylərdən vaz keçmək gərəkdir.
5650 Hər işi bilərək, gənəşərək görməli,
Gənəşməyən adam sonra peşman olar.
5651 Eşit gör nə deyir xəbər gətirən peyğəmbər:
"Məsləhət hər işin dərmanıdır".
5652 Yaxın adamla məsləhət etməli,
Hər işi gənəşməklə həll etməli.
5653 Adam işini gənəşib görər,
Gənəşməyən adam peşman olar.
5654 Mən indi qohumumun yanına gedim,
Bu işi onunla məsləhətləşim.
5655 O, lazım bilsə, bu işi görərəm,
Bilməsə, ondan vaz keçərəm.
5656 İnsan özü öz işini yaxşı bilməz,
Başqası ilə gənəşmək xeyirli olar.
5667 Gənəşən insanın biliyi artar,
Gənəşməyə bilik də qatılsa, o iş düzələr.
5658 Gənəşən insan nə deyir, eşit,
İşi məsləhət ilə yoluna qoyarlar:

5659 “Hər bir işi başqasına gənəş,
Gənəşməyən adamdan uzaq dur.
5660 Girişmək istədiyin işi gənəş.
Diləyinə məsləhət ilə yetiş.

* * *

5661 Gecə yatdı, erkən durub yuyundu,
Atına minib Elikin yanına getdi.
5662 İcazə alıb Elikin hüzuruna çıxdı,
Elik ona iltifatla yer göstərdi.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5663 Elikə ərz edib dedi: – Mən bu gün
Qohumuma dəyib gəlmək istəyirəm.
5664 İcazə versən, oraya gedib,
Ziyarət edib, tez geri dönərəm.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5665 Elik dedi: – Get, məndən salam yetir,
Ey biliyi kamil insan.
5666 O, sirrini birbaşa Tanrıya açarkən,
Duada məni də qoy unutmasın.
5667 Günahlarımı bağışlamaq üçün Tanrıya yalvarsın,
Bəlkə Allah məni bu dualara bağışlaya.

* * *

5668 Öydülmüş “iləl” deyib durub çıxdı,
Sevinc-nəşə içində evinə gəldi.
5669 Dünyanın üzü qızıl rənginə boyandı,
Günəş yaqut rəngini zəfərana çevirdi.



5670 Göy qaşını çatdı, üzünü qaraltdı,
Bütün adamların gözünü bağladı.
5671 Öydülmüş namaz qılıb yatağına girdi,
Bir az oyaq qaldı, bir az uyudu.
5672 Bir az yatdı, sonra yenə oyandı,
Fikir ondan əl çəkmədi, təkrar qalxdı.
5673 Yenidən uzandı, bir müddət uyudu,
Öz-özünə diskinərək birdən oyandı.
5674 Fikirdən iki gözü yumulmadı,
Yata bilmədi, özünü yalqız hiss etdi.
5675 Gördü ki, əvvəlcə Müştəri alov kimi qalxaraq
Yerdən yüksəlməyə başladı.
5676 Sonra Ayğır və Yıldırıq ulduzları parladı,
Ərəntir də onlara qoşuldu, bunları özünə işarə bil.
5677 Səhər quşu qalxıb göyə doğru yüksəldi,
Məzamir oxuyurmuş kimi cəh-cəh vurdu.
5678 Başını qaldırıb şərqə baxdı,
Gördü ki günəş yuxarı yüksəlir.
5679 Yerdən yuxarı mizraqlar budaqlandı,
Göy üzü atəş və alov rəngin aldı.
5680 Öydülmüş qalxdı, yuyundu, namaz qıldı,
Atına minib dağa tərəf çapdı.
5682 Çatıb atdan endi, astaca qapını döydü,
Qohumu ibadəti saxlayıb qapını açdı.

* * *

5683 Öydülmüş ona salam verdi,
Odqurmuş da ona cavab verdi.
5684 Hal-əhval tutaraq, evə keçdilər,
Odqurmuş söz açıb dedi:

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ SUALI

5685 Dedi: – Nə üçün gəldin, ey qardaş,
Səninlə görüşümüzdən heç bir yay keçməyib.

5686 Könlünü bir az sınıq görürəm,
Pənbə bənizin də xeyli saralıb.
5687 Niyə qayğılısan, niyə halın pisdir?
Mənə söylə, izah et.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

5688 Öydülmüş cavab verdi, dedi: – Ey qardaş,
Fələk məni oxladı, könlüm yaralandı.
5689 Əgər zəmanə öyüd-nəsihətlə könülü işıqlandırsa,
Ölmüş könül də dipdiri olar.
5690 Qəflət üzündən könlüm uyumuşdu,
Zəmanənin nəsihəti məni oyatdı.
5691 Könlümün gözü ilə baxaraq sınadım,
Doğru yoldan ayrıldığımı gördüm.
5692 Həyat sona yetdi, yüküm ağırlaşdı,
Günaha tövbə etmək zamanım çatdı.
5693 Ömrüm boyu insanlara xidmət etdim,
Qəflətə uydum, Tanrıya ibadəti unutdum.
5694 Sərvət gəlir, dirilik isə gedir,
Həyat tükənsə də, dünya qılır.
5695 Mən dünyanı həyat üçün arzulamışdım,
Həyat qurtardı, artıq dünyanın da mənası var.
5696 Bax, bugünkü günümdə ötüşür,
Bu gələn gecəni bir də tapacağammı?
5697 Saçım yaydakı kələf oxu tək qurulaşdı,
Saqqalım sunqur tükü kimi çallaşdı.
5698 Sabahkı işim düzəlsin deyə,
Bu gün hazırlaşmalıyam, ey aqil.
5699 Buna bənzər bir söz var,
Ey təmizqəlbli, bu sözə görə hərəkət et:
5700 "Mən keçmiş həyatım üçün peşmanam,
Ey gözəlüzlüm, bundan sonra günüm necə keçəcək?
5701 Gənclik günlərim də boşuna keçdi,
Barı gələcək gecələrim hədər olmasın.



5702 Sabah üçün bu gündən hazırlıq gör,
Bilikli və müdrik insan mənə belə dedi.
5703 Qafil olma, ibadət işini bu gün gör,
Bu gün görsən, sabaha hazır olarsan.
5704 Öküz kimi yeyib-içdim, ömrüm boşa keçdi,
Artıq bədənimi riyazətə[1] çəkməliyəm.
5705 O çox arzuya, nemətə çatdı, kökəldi,
Artıq vaxtdır, onu zəiflətməliyəm.
5706 Kef çəkdi, rahatca yatdı,
Qoy bu gündən ayaq üstə dursun.
5707 O, çox adamı özünə düşmən etdi,
Mən yaxşılıqla onları razı salmalıyam.
5708 İnsanlara çox əl və dil uzatdım,
Dilim bu gün onlardın üzr istəməlidir.
5709 İnsanları tapdayaraq çox gəzdim, ey əziz insan,
Bu gün özümü ayaq altına atmalıyam.
5710 Qaçağam, Allahından qaçmış bir asiyəm,
Bütün bədənim günaha batmışdır.
5711 Bu gün tövbə ilə ona üz tutmalı,
Rəbbimə bağışlanmaq üçün yalvarmalıyam.
5712 Ölüm yaxalamamış ibadət etməliyəm,
Ölüm yaxalasa, ibadətə imkan qalmayacaq".
5713 Dərin biliyi olan insan nə deyir, eşit,
Ey qatı ürəkli, sənə nəsihət edir:
5714 "Ölüm gəlməmiş, özünə gəl,
Ölüm gəlsə, peşmançılıq fayda verməz.
5715 Ölümü unutma, tövbəyə hazırlaş,
Qafil olma, ölüm gəlib səni tutacaq.
5716 Cavan ikən ibadətlə məşğul ol,
Qoca vaxtı insanda güc qalmaz.
5717 Həyatı əziz bil, ibadətə tələs,
Ölüm səni tutmamış oyaq ol.
5718 Ölüm səni yaxalamamış ayıq ol, diqqət et,
Ölüm yaxalasa, heç nə köməyə çatmayacaq.

[1] Riyazət – nəfsini boğmaq, aclığa və susuzluğa dözmək, saflaşmaq

5719 Mən oradan qalxıb buraya gəldim ki,
Yaxşı düşünüb mənə məsləhət verəsən.
5720 Sən mənim mehriban qardaşımsan,
Ey qəhrəman, de görüm, neyləyim?"

## LXXIV

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ MƏSLƏHƏT VERDİYİNİ BƏYAN EDİR

5721 Odqurmuş cavab verib dedi: – Ey qardaş,
Sözümü dinlə, ey könlü könlümə uyan.
5722 Sən çox gözəl niyyətə düşmüsən,
Tanrı sənə yar olsun, xoşbəxt etsin.
5723 Bu iş üçün təkcə bilik kifayət deyil,
Bunun üçün dünyada görüləcək çox işlər var.
5724 Onlardan biri budur, eşit, sənə deyim,
Uyğun bilən, düşün, ona riayət elə:
5725 Bu gün orada olmaq sənin üçün,
Burada qalmaq mənim üçün daha yaxşıdır.
5726 Ölkə bu gün səndən çox xeyir görür,
Xeyir pozulsa, yerini qarğış-söyüş alar.
5727 Elik sənə böyük səlahiyyət verdi,
Sən yaxşılıq edən, həlim-səlim adamsan.
5728 Xalq rahatlığa, el nizama qovuşdu,
Rəiyyətin dili sənə dua edir.
5730 Adamlar arasında adam odur ki,
Ondan adamlar xeyir tapır.
5731 Xeyirsiz adamlar adamların mənfurudur.
Xeyirlidən bütün ölkə istifadə edir.
5732 İnsan könlündə xoş niyyət tutsa,
O, dünyada dilədiyi hər işə nail olar.
5733 Xoş niyyətli daim yaxşılıq görər,
Niyyətə yetməsə də, əvəzini tapar.
5734 Əmniyyət və qanun elə rahatlıq gətirir,
Elik və el səndən razıdır.



5735 Hansı tərəfdə qanun hakim oldu,
Pislik, hiylə, al eldən qeyb oldu.
5736 Onları buraxıb buraya gəlsən,
İşlər pozular, ondan əsər-əlamət qalmaz
5737 Bu nizam, qanun yenidən dəyişər,
El pozular, sən də peşman olarsan.
5738 Sənin yerinə bir pisi keçər,
Elə göz verib, işıq verməz.
5739 Pis adam Eliki də pisliyə çəkər,
Pislərə xidmət edər, pis iz qoyar.
5740 Bir olan Allah bunu səndən soruşacaq,
Sual öz yerində, yaxşı ad da var.
5741 Pislik etmək, pis qayda-qanun qoymaq,
Pislərə uymaq olmaz.
5742 Təbiəti və könlü doğru olan insan nə deyir, eşit,
Bu sənə öyüddür, bax, bunu unutma:
5743 "Pisə bulaşma, pis nizam qurma,
Pislik edənə rəhm göstərmə.
5744 Sən yaxşılıq et, yaxşı qanun qoy,
Hər iki dünyada pisliksiz yaşa.
5745 Allah sənə bacarıq vermişdir ki,
Yaxşılıq edəsən, yaxşılığa yetəsən.
5746 Bu yaxşılıqları niyə pozursan,
Sənə ziyanı dəyər, ey könlü diri.
5747 Elin xeyirini pozub, öz xeyirini qoyub,
Buraya gəlməkdən nə fayda umursan?
5748 Mənim üçün buranın daha yaxşı olduğunu
Sənə başa salım, ey gözəlüzlüm.
5749 Mən dünya və dövlət görmədim,
Dilək-arzulara könül vermədim.
5750 Xalqla qarışıb-qaynamadım,
Bəylərlə də necə yaşamağı bilmədim.
5751 Bu dünya malını görmədim,
İnsanların pis-yaxşı halını bilmirəm.
5752 Bu vəziyyətdə mən oraya getsəm,
İbadətdən əl çəksəm, çox pis olar.

5753 Qızıl-gümüş görməmiş insan
Onları tapsa, xasiyyəti dəyişər, söyüş qazanar".
5754 Dünyanı dolaşın Xitay karvanının
Tacirlər başçısı nə deyir, eşit:
5755 "Yoxsul və möhtac adam varlansa,
Bütün yaxşı əməllərini yadırğayar.
5756 Yoxsul adam bəy olsa, varlansa,
Doğruluq yolunu azar.
5757 Dövlət görməmiş adam dövlətə yetsə,
Təbiəti pozular, elə fəlakət gətirər.
5758 Hakim olmamış adam hakim olsa,
Əli və dili ilə elə zülm edər.
5759 Sən dünya və dövlətin hər növünü qazandın,
Könlünə, nəfs və həvəsə hakim oldun.
5760 Gözün doydu və könlün toxdur,
Eliklə birlikdə düz yola gedirsən.
5761 Bunlar hamısı sənə Allahın fəzlidir,
O sənə bütün yaxşılıqları bağışlamış, səni sevindirmişdir".

## LXXV

## DOĞRULUĞA QARŞI DOĞRULUQ, İNSANLIĞA QARŞI İNSANLIQ GÖSTƏRMƏYİ BƏYAN EDİR

5762 Bu bir cürdür, birini də eşit,
Mən onu da sənə izah edim.
5763 Bir şeyi unutdun, yoxsa gizli qaldı,
Bu işi hansı xeyirə görə edirsən?
5764 Bilirsən ki, dünyada vəfalı adamın
İzzəti çoxdur, o alqışlanır, ey əziz insan.
5765 Dünya yaranandan bəri bir qayda var:
Onun nişanəsi insanlığa qarşı insanlıq etməkdir.
5766 İnsan yaxşılıq əvəzində yaxşılıq etməlidir,
Hətta bir yaxşılığa görə on yaxşılıq etməlidir.
5767 Kimin əsli atadan təmiz olsa,
Ondan da elə xeyir gələr.



5768 Əgər ana oğurluq suyunu gizlincə götürsə,
Oğul doğsa, o, el üçün fəlakət olar.
5769 İndi sən Elikin xeyiri üçün çalış,
Ondan yemək, paltar kimi nemətlər gördün.
5770 Bütün bu ərdəmə, baliyə və ağıla
Elik səbəb oldu, sənə qapılar açdı.
5771 O sənə ad-san verdi, yüksəltdi,
Sənə yaxşılıq qapılarını açdı.
5772 Yoxsa unutdun bu yaxşılıqları,
Bunların əvəzini çıxmaq lazımdır, ey könül diri.
5773 Ey qardaş, mən bir az sərt danışdım,
İncimə, hirslənmə, könlün sınmasın.
5774 Doğru söz sərt olur, könülə acı gəlir,
Mənasına varsan, əslində, şirindir.
5775 Sənə sərt söz desələr, incimə,
Doğru söz sərtdir, sən də sərt olma.
5776 İndi buna bənzər bir sözüm var,
Ey gözəlüzlüm, onu dinlə:
5777 Doğru söz acıdır, onu həzm et,
Sabah xeyirini görərsən, sənə zövq verər.
5778 Bax, doğru söz könülə sərt və acı gələr,
Sərt söz doğrudur, hanı o doğru söz?
5779 Sən kiçik uşaq ikən atan öldü,
Sən onda bilik və ərdəm qazanmamışdı.
5780 Səni Elik yanına aldı, tərbiyə verdi,
Sən də adam içinə çıxdın.
5781 Bu qul-qaravaş, at-ayğır, yer-su,
Elikdən gəldi, dövlət qapısı üzünə açıldı.
5782 Sən hər cür nemət və yaxşılıq gördün,
Adın elə yayıldı, məşhur oldun.
5783 İndi sənə yaraşarmı ayağı qalxıb,
Düşmən kimi ondan üz çevirərsən?
5784 Xeyir verən vaxt ondan qaçsan,
Onun könlünü qəmə qərq edərsən.
5785 Elik sənə hər cür yaxşılıq etdi,
Əvəzini verməlisən, ey şöhrətli insan.
5786 Səni görən hamı tərifləsin,
Vəfalı adam kimi adın elə yayılsın.

5787 Eşit gör insanların yaxşısı nə demiş;
Əsl insanın nişanəsi insanlıqdır.
5788 Ey mərd insan, insanlıq vəsfilə yüksəl,
İnsan insanlıq yolunu belə tərif etdi:
5789 "İnsan ol, insanlara insanlıq et,
İnsanlıq vəsfini ən yüksək rütbə kimi daşı".
5790 Elik sənə min yaxşılıq etdi,
Sən də ona yaxşılıqla cavab ver.
5791 Yaxşılığı əvəzsiz qoymayan adam
İnsanların yaxşısı, xalqın seçkinidir.
5792 Sən biliksiz, qiymətsiz bir uşaq idin,
O sənə kömək oldu, səni səadətlə yüksəltdi.
5793 İndi canını, bədənini ona fəda et,
Yatma, gecə-gündüz ona xidmət et.
5794 O yaxşılıq əvəzində, bu yaxşılıq hazır olsun,
Tanrı sənə bunun əvəzini verər.
5795 Qəlbi yaxın və səmimi insan,
İnsanlıq yolunda yeriyən nə demiş, eşit:
5796 Kimin çörəyini yesən, onun işini gör,
Getdikcə vəfalı ol, çörək halalın olsun.
5797 İnsan duz-çörək haqqını gözləməlidir,
Duz-çörək verənə can verməlidir.
5798 Bütün diləyinə çatdın, doğru yolu tutdun,
Bu gün sən də yaxşılıqla ona xeyir ver.
5799 Sən atlas geydin, ipəklər büründün,
Həsəd edənlərin gözləri qamaşdı.
5800 İndi Elikə yaxşı ad qazandır ki,
Yağılar qəhr olsun, yadlar boyun əysin.
5801 Sən min arzuya, nemətə çatdın,
Buğa kimi boynunu, ənsəni qalınlaşdırın.
5802 Bu gücü Elikin xidmətinə sərf elə,
Uzun ömürlü olması üçün xalq ona dua etsin.
5803 Sən dünya malını yığdın, varlandın,
Ərəb atlarına, cins atlara, daylara sahib oldun.
5804 Bu malı-dövləti Elikə sərf elə,
Diləyinə yetsin, üzü gülsün.



5805 Bu gün Elik məğrur halda taxta çıxsın,
Yağıları uzaqdan baş əyib, yer öpsünlər.
5806 O sənə qüdrət, sözünə kəsər verdi,
Dost-düşmən hamı sənə baxır.
5807 Ey dost, sən indi duanı artır,
Səadət içində uzun ömür sür.
5808 Əsl insan belə yaxşılıq edər,
Onun adı dünyada əbədi qalar.
5809 Ərəb dilində söylənmiş bir məsəl
Adamın əslini bilməyə yol açmışdır:
5810 "Hər kəsin hərəkəti onun əslinə şahiddir,
Hərəkəti nədirsə, əsli də odur".
5811 Əsli yaxşı olanın hərəkəti də yaxşıdır,
Pisin əslinə hərəkəti dəlildir.
5812 Ey təmizqəlbli, Elik hərəkətini dəyişsə,
Onu yenə doğru yola çək, biliklə onu işıqlandır.
5813 Bütün yaxşılıqlar Elikin yanındadır,
Bu yaxşılıqdan kənarda qalma.
5814 Mənə inanıb mənimlə gənəşdin,
Bildiklərimi sənə söylədim.
5815 Söylədiklərimlə bildiklərini tutuşdur,
O zaman düyünün asan açılar.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

5816 Öydülmüş sevindi, dedi: – Ey qardaş,
İnsanların xası belə də olmalıdır.
5817 Bu gün bu sözləri yaxşı söylədin,
Bu düyün mənim üçün açılmış oldu.
5818 Bu sözlər hamısı mənim üçün məchul idi,
İzahınla üstündən pərdəni götürdün.
5819 İndi mən bu dilədiyimdən vaz keçdim,
Tanrı mənə kömək etsin.
5820 Rəbbim məni qorusun, könlümü təmiz etsin,
Hərəkətlərimdə məni doğru yoldan ayırmasın.
5821 Üzüağ olmam üçün dualarınla kömək et,
Məni unutma, özümü sənə tapşırıram.

* * *

5822 Sözünü bitirdi, ayağa qalxdı, vidalaşdı,
Atına mindi, geri qayıtdı.
5823 Evə çatdı, atdan enib içəri keçdi,
Yemək yedi, bir az dincəldi.
5824 Göylər dul paltarını geydi, belini bağladı,
Saçını dağıdıb parlaq üzünü qapadı.
5825 Günəş hörülmüş saçını açdı,
Dünya sincab və samur rənginə büründü.
5826 Yerini saldırdı, yatdı, dincəldi,
Bir müddət şirin və sakit yuxuya daldı.
5827 Oyandı, dikəlib yuxarı baxdı,
Göy üzü qızların təbəssümü kimi dişlərini göstərdi.
5828 Günəş başını qaldırdı, üzünü açdı,
Dünya ağ quş rənginə boyandı.
5829 Öydülmüş tez yerindən qalxdı,
Yuyundu, sübh namazı qıldı, yemək yedi.
5830 Atına minib təkrar saraya getdi,
Birbaşa Elikin yanına girdi.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5831 Elik ondan Odqurmuşu xəbər aldı:
O kamil insan necədir? – Dedi.
5832 Məni öz dualarında zikr edirmi?
Tanrıya dua ilə insan bəladan qurtarır.
5833 İnsan dua ilə yaxşılıq tapır,
Dua ilə əbədi cənnətə qovuşur.
5834 Əgər dünyada xeyir-dua olmasaydı,
Bu pis dünya oxdan fəlakət girdabına düşərdi.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5835 Öydülmüş cavab verib dedi: – Bu söz
Doğrudur, elmə və ağla uyğundur.



5836 Qardaşım bu gün orda yalnızdır,
Bizə dua etməklə məşğuldur.
5837 Bizdən qafil olan varmı?
Biz işləyirik, o isə dua qılır.
5838 Bu gün o, Elikə məhəbbət bəslər,
Dilindən dua düşmür.
5839 Kim ondan daha mərhəmətli ola bilər?
Öz dərdini qoyub bizim üçün dua edir.
5840 Ey Elik bizdən qafil adam yoxdur,
Ömrümüz boş keçdi, əlimiz ibadətə yetmədi.
5841 Bədənimiz arzu, nemətlə kökəldi,
Yatıb rahatlıq içində ovunduq.
5842 Bədən axır öləcək, qurda, ilana yem olacaq,
Can gedəndən sonra bizə peşmançılıq qalacaq.
5843 Nə deyir, eşit ağıllının sözünü,
Bu sözə əməl et, ey quzum.
5844 Bədən kökəlsə, ilanla qurdu hazırdır,
Sevinmə, özün də köçəri qonaqsan.
5845 Bu ömür yuxu tək gəlib-keçər,
Hər ötən gün həyatın müvəqqətiliyinə dəlildir.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5846 Elik cavab verib dedi: – Ey hakim,
İnsan özünü necə tutsun, necə qorusun?
5847 Mənə səndən mehriban heç kim yoxdur,
Mən sənə inanıram, etimad bəsləyirəm.
5848 Mən indi ev içində yatıram,
Ey kamil insan, işlərim isə qıraqdadır,
5849 Sən gözüm və qulağımsan, gör, eşit,
Uyğunsuz nə görsən, dərhal düzəlt.
5850 Mənim sənə köməyim lazım olsa,
Mənə de, sənə kömək edim.
5851 Xidmətçilərin bir-birinə rəftarını tənzimlə,
Mən onlarla avara olmayım, rahat olum.
5852 Zalımın əli xalqdan uzaq olsun,
Biliksizlər ölsün, biliklilər qalsın.

5853 Xalqım varlansın, elim nizama düşsün,
Dilim Tanrıya rəhmət oxusun.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5854 Öydülmüş cavab verib dedi: – Ey bəy,
Tanrı özü sənə eyləsin kömək.
5855 Diləyim və gərəyim də elə budur,
Tanrı doğruluq və yaxşılıq yolunu açsın.
5856 Elik rahat olsun, səadətlə yaşasın,
Bütün dərdi, başağrısı mənə gəlsin.
5857 Artıq özümü sənə fəda etdim,
Ey şanlı hakim, rahatlıq içində yaşa.
5858 Bu gün səndən yalnız bir diləyim var,
Düşün və bu diləyimi qəlbən qəbul et.
5859 Bilirsən ki, bəylər kimi özünə yaxın tutsa,
Adamlar onun var-yoxunu müzakirə edərlər.
5860 Mən sənə nə qədər yaxşı baxsam da,
Qanmazlar səni məndən soyuda bilərlər.
5861 Nə demiş, eşit, igid ər,
Bu öyüd-nəsihəti o bilərək demişdir:
5862 "İnsanın ürəyi ətdəndir, xarab olar, qorxar,
Ey iradəli insan, onu yaxşı qoru.
5863 İnsan nə qədər kamil olsa, qeybət sevməsə də,
Araya pis adam girsə, özünü saxlaya bilməz.
5864 Bəy nə qədər ağıllı və sayıq olsa da,
Ona yaxınlaşan nadanın zərərindən qurtarmaz.
5865 Ürək bəydir, bədən isə qul və əsirdir,
O, bəzən sözlərdən soyuyur, bəzilərindən qızınır.
5866 İnsan təbiəti dörd düşmən ünsürdən yaranır,
Biri güldürür, o biri gurultu qoparar.
5867 Biri tələssə, o biri ətalət istər,
Biri gülsə, o biri ağlamağa başlar".
5868 Sevincli dedikdə, qayğılı olur,
Kədərli dedikdə, sevinclə gülür.



5869 Ey xoşbəxt Elik, mənim qorxum budur:
İnsanların iti olan bu xain şər atsa,
5870 Cana doyar, məndən üz çevirərsən,
Onda mənim xidmətim zay olar.
5871 Səndən arzum və xahişim budur,
Biri məni pisləsə, bunu özümə de.
5872 Axıra qədər soruş, öyrən,
Nə nəticə çıxsa, ona görə qərar ver,
5873 Sənə söz daşıyanın sözünü eşit,
Ancaq bunun yalan-doğru olduğunu araşdır.
5874 İnsanların irəlidə gedəni yaxşı deyib:
"Sözü dinlə, ancaq hər sözə könül vermə".
5875 Bundan da gözəl bir söz vardır,
Ona əməl elə, ey yaxşı insan:
5876 "Hər sözü eşit, lazımlısını götür,
Gərəksizini qoy orada qalsın.
5877 Sözünü eşit doğru-yalanı araşdır,
Doğrunu qəbul et, yalanı cəzalandır.
5878 Dünyanı yalançılar fəsad yuvası edər,
Doğru-dürüst insanı tut, ey hakim".

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5879 Elik cavab verdi: – Ey həqiqi insan,
Arzunu və diləyini qəbul edirəm.
5880 Qadir Tanrı sənə insanlıq verdi,
Könlün, dilin, əxlaqın və adın doğru oldu.
5881 Səndən heç vaxt pislik gələ bilməz,
Sən xoş əxlaqı ananın ağ südüylə qazanıbsan.
5882 Səni pisləyən insanları mən
Özümə düşmən biləcəyəm, ey bilikli.
5883 İstər az, istər çox söz desinlər,
Mən onların sözünə qulaq asmayacağam.
5884 Yaxşı ilə pisi ayırd edə bilməyən şəxs
Xalqa başçı ola bilərmi?

5885 Doğrunu yalandan ayıra bilməyən
Necə bəy və hakim ola bilər?
5886 O günü qaralmış necə ölkə hakimi olar ki,
Sınanmış adamı təkrar sınasın?
5887 Doğrunu yalandan seçə bilməyən hakim
Öz işində necə müvəffəq ola bilər?
5888 Sən bu gün mənə Tanrının hədiyyəsisən,
Bütün çətin düyünləri sən açmısan.
5889 Sən mənə sədaqətlə xidmət etdin,
Yediyin duz-çörək haqqını ödədin.
5890 Sənin güzaranın və xidmətin üçün
Mən yaxşılıqla cavab verməliyəm.
5891 Eşit gör nə deyir yaxşı kişi,
El içində doğruluqla ad qazanmış kişi:
5892 "Başqalarına qarşı insanlıq göstərən şəxs
İnsanların yaxşısı və xasıdır.
5893 İnsana insanlığı nisbətində cavab ver,
Buna görə də insana insan deyilir".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

5894 Öydülmüş cavab verdi: – Qoy Elik
Rahat yaşasın, ölkəni biliklə idarə etsin.
5895 Tanrı ona hər iki dünyanı versin,
Arzu-diləyi, istəyi yerinə yetsin,
5896 Dövran onun olsun, muradınca dönsün,
Zəmanə onun arzusuna uyğun olsun.
5897 Ey könlü düz, əməli bütöv, təvazökar insan,
Sağ-salim ol, səadət içində yaşa.
5898 Mənə hər cür yaxşılığın dəydi,
Səndən yemək, geyim, sərvət, hörmət gördüm.
5899 Mənim niyyətim sənə xidmətdir,
Ey bilikli, Tanrı mənə güc versin.
5900 Öydülmüş yenə dedi: – Ey xoşbəxt Elik,
Tanrı sənin yaxşı adını dünyaya yaydı.



5901 Sən yaxşı ad dilə, Allah sənə səadət verdi,
Səadət yetişincə könlünü xoş tut.
5902 Məşhur bir bəy kimi qalmaq üçün
İnsana bu dörd şey lazımdır:
5903 Biri doğruçul, bütöv sözlü olmaq,
İkincisi, ölkəni qanunla idarə etmək.
5904 Üçüncüsü, əliaçıq və səxavətli olmaq,
Xalqa qarşı mehriban olmaq,
5905 Dördüncüsü, yağıya boyun əydirmək,
İşdə əzmkar və cəsur olmaqdır.
5906 Hansı bəy bu dörd şərtə əməl etməsə,
Onun ölkəsinə fəlakət girər.
5907 Bəyliyin kökü və təməli, bax, budur,
Əsl bəyin gedəcəyi yol elə budur.
5908 Sən bu gedişi pozma, bu yolla get,
Səndən əvvəlkiləri bu yol yüksəltdi.
5909 Bu yoldan çıxıb başqa yol tutan bəy,
Bəyliyini pozar, binəsib olar.
5910 Ey Elik, bu üç şeyi qiymətləndir,
Onları sənə deyirəm, yaxşı dinlə:
5911 Biri igid, cəsur, tunc ürəkli ərəndir,
Qılıncı ilə elə min xeyir verər.
5912 İkincisi, hakim və alim dövlət adamıdır,
O, məsləhətlər verər, elin işini görər,
5913 Üçüncüsü, ağıllı və mahir katibdir,
Gəlir-çıxarı bilsə, xəzinə dolar.
5914 Sən onları yaxşı seç, qiymətləndir,
Verdikləri xeyirə görə mükafatlandır.
5915 Onda bütün işlərin nizama düşər,
Ölkən gündən-günə genişlənər, torpağın artar.
5916 Adın yaxşı olar, şöhrət taparsan,
Dünya xalqı sənin üzünü görmək dilər.
5917 İnsanların alimi çox gözəl söyləmiş:
"İnsan ölsə belə, yaxşı ad ölməz".
5918 Bax, nə gözəldir, xoş ad sahibinin
Özü ölsə də, adı ortadan qalxmır.

5919 Gözəl ad sahibi qara torpaqda yatsa da,
Sən həmişə onu diri besab elə.
5920 Sən dirilik yox, yaxşı ad istə,
Adın yaxşı olduqca sən dirisən.
5921 Dirilik nədir, yaxşılıq nədir?
Ey alim hakim, bunu mənə izah et.
5922 Bax, yaxşılıq əslində doğruluqdur,
Diqqət etsən, bu diriliyin özüdür.
5923 Kimin əməli gözəlsə, o, diridir,
Bədəməl isə diriykən ölüdür.
5924 Dünya keçər, xoş əməl keçməz,
Gözəl əməlin açdığı yol qalar.
5925 Dönük dünya səndən üz çevirsə,
Təkcə yaxşılıq sənə qalar, ey quzu.
5926 Ey Elik, bu dünyaya heç güvənmə,
O, vəfalı deyil, xəbərin olsun.
5927 Oyuna bənzət sən dünya işini,
İstə ayağını, versin başını.
5928 Ey qüdrətli insan, onun oyununa gəlmə,
Bu tələyə düşənin boynu bağlanır.
5929 Bax, kitabda nə gözəl yazılmış,
Ey oyaq qəlbli, bunu unutma:
5930 "Bu dünya işi, bax oyundur, oyun,
Oyuna qatılma, nə gərək oyun.
5931 Tanrını əmrinə özünü qul et,
Etməsən, hazır tut, gedəcək boyun".

* * *

5932 Ay Elik, o şeyləri ki bilirdim,
Gizli-aşkar, hamısını dedim.
5933 Sözümü tutursan tut, əgər tutmasan,
Şəksiz, nəticəsini bir gün görəcəksən.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5934 Elik dedi: – Könlümü Allah tutaraq
Ondan bu iş üçün kömək istəyirəm.
5935 Tanrı istəsə kömək edər, mənə göstərər,
Mənim görmədiyimi isə sən göstər.
5936 Çalış hər bir işi idarə elə,
Sayıq, gözü və qulağı açıq ol.
5937 Gücün yetən işi özün gör, mənə ümid olma,
Gücün yetməyəndə mən kömək edərəm.

* * *

5938 Elik öz sözünü kəsdi və susdu,
Öydülmüş qalxıb yavaş və səssiz çıxdı.
5939 Atına minib düz evinə gəldi,
Atdan enib evə girdi, soyundu.
5940 Gecə yatdı, səhər yenə atlanıb
Saraya gəldi, atdan enib içəri girdi.
5041 Qeyrətlə işə girişdi,
Hər işi yerinə yetirdi.
5942 El rahatlığa, dünya nizama qovuşdu,
Elik də rahatlandı, razı qaldı.
5943 Ölkə xoş sözlə, dua ilə doldu,
Adı ölümsüz və unudulmaz oldu.
5944 Bax, yaxşı qanun nə gözəl şeydir,
Bəylik qanun sayəsində ayaqda durar.
5945 Əgər belə bir bəy xalqa başçılıq etsə,
El də, xalq da rahatlıq tapar,
5946 Budun da müti və doğrucul olsa,
Onda bəylərin günəşi parlar.
5947 Bəylər bəyliklərini Allahdan alır,
Xalq yaxşı olsa, bəy də yaxşı olur.
5948 Xalq pislik etsə, bəy də edər,
Pisliyin qarşısı pisliklə alınar.
5949 Xalq düzəlsə, bəy də düzələr,
Təmiz adamlar ölkəni də təmizlər.

* * *

5950 Beləcə ötüşdü zaman, gün və ay,
Dünya gözəlləşdi, xalq oldu bay.

5951 Toz-duman sovuşdu, oldu aydınlıq,
Düzüldü, süzüldü bütün bulanıq.
5952 Şükür qıldı Elik Allaha yenə,
Çox öydü, çox qıldı dua və səna.

## LXXVI

## ODQURMUŞUN XƏSTƏLƏNƏRƏK ÖYDÜLMÜŞÜ ÇAĞIRDIĞINI BƏYAN EDİR

5953 Günlərin bir günü Öydülmüş
Başını balışa yenicə qoymuşdu.
5954 Bir nəfər qapıda möhkəm səs saldığını eşitdi,
Tez adam göndərdi, gedib bax dedi.

### XİDMƏTÇİNİN ÖYDÜLMÜŞƏ CAVABI

5955 Xidmətçi baxıb dedi: – Bir adam gəlib
Sözüm var deyib, içəri gəlmək istəyir.

### ÖYDÜLMÜŞÜN XİDMƏTÇİYƏ CAVABI

5956 Yenə dedi: – Get, sən söylə bu sözü,
Soruş: – Sözü nədir və kimdir özü?

### XİDMƏTÇİNİN QASİDƏ SUALI

5957 Xidmətçi yenə çıxdı və soruşdu ki,
Gələn kimdir, haradan gəlir, nə istəyir?

### QASİDİN XİDMƏTÇİYƏ CAVABI

5958 O dedi ki, məni Odqurmuş göndərdi,
Onun qardaşını görməliyəm.



### XİDMƏTÇİNİN ÖYDÜLMÜŞƏ CAVABI

5959 Xidmətçi içəri girib qasidin sözünü çatdırdı,
Odqurmuşun ona xəbər göndərdiyini bildirdi.

### ÖYDÜLMÜŞÜN QASİDƏ SUALI

5960 Dərhal ayağa qalxdı, qasidi çağırtdırdı,
Qasid içəri girdi, salam verdi.
5961 Dedi: – Sən haradan gəlirsən?
Diləyin, sözün nədir, ey hakim?

### QASİDİN ÖYDÜLMÜŞƏ CAVABI

5962 O dedi: – Məni Odqurmuş göndərdi,
Səni görmək istəyir, deyir gəlsin.
5963 Ağır vəziyyətdə xəstə yatır,
Ey könlü yaxın, gedib ona dəyin.

### ÖYDÜLMÜŞÜN QASİDƏ CAVABI

5964 Öydülmüş cavab verdi, dedi:
Bir az yemək ye, birlikdə gedək.

### QASİDİN ÖYDÜLMÜŞƏ CAVABI

5965 Qasid razı olmadı, dedi:
Qohumunun halı pisdir, yol üstədir.
5966 Mən tez qabaqda gedirəm, ey təmizqəlbli,
Sən də yavaş-yavaş arxadan gəl.

* * *

5967 Təkrarən qapıdan qaça-qaça çıxdı,
Öydülmüş əlini ova-ova qaldı.

5968 Qayğılı halda evə girdi,
Sevinci getdi, böyük yasa batdı.
5969 Bir az uzandı, ancaq yuxusu gəlmədi,
Gecəsi qədər uzandı, bitmək bilmədi.
5970 Yatmaq üçün gözlərini yummaq istədi,
Ancaq yuxusu gözündən uçub getdi.
5971 Təkrar qalxıb bir az oturdu,
Sarı dan yeri söküldü, yayını qurdu.
5972 Çiçəklikdə bülbül ötməyə başladı,
Bunu eşidən sevgilinin könlü tutuşdu.

* * *

5973 Atına mindi, qardaşıgilə yola düşdü,
Çatıb əlini-üzünü öpdü, onunla görüşdü.
5974 Gördü ki qardaşı uzanıb yatır,
Əbasını altına salıb, qoluna dirsəklənib.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA SUALI

5975 Dedi: – Ey qardaş, sənə nə olmuşdur?
*Səni belə gördüm, könlüm yaralandı.*

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

5976 Dedi: – Ey qardaşım, yol üstəyəm,
Ölüm tələsi tutdu, etmək üzrəyəm.
5977 Sənin üzünü bir də görüm deyə,
Səni çağırtdırdım, zəhmət verdim.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

5978 Öydülmüş dedi: – Ey canım,
İnsan həyatda həmişə xəstələnə bilər.



5979 Ürəyinə və dilinə pis şey gətirmə,
Ağrı və xəstəlik günaha kəfarətdir.
5980 Biliklinin sözü nədir, dinlə,
Bilik könülün tozunu təmizləyər.
5981 Sənin üçün bu xəstəlik günahın kəfarətidir,
Mənə de görüm, günahsız adam varmı?
5982 Xəstələnən insanın günahları azalar,
Ey qəhrəman, günah azalsa insan qurtular.
5983 Az-çox hər insan günah sahibidir,
Dünyada günahsız insan çox azdır.
5984 Xəstəliyin keçər, sağalarsan,
Günahın təmizlənər, savab qazanarsan.
5985 Niyə dilinə pis söz gəlir,
Ey pakqəlbli, öləcəyini hardan bilirsən?

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

5986 Odqurmuş cavab verdi; səbəb budur,
Rəbbim yuxuda mənə ölümü göstərdi.
5987 Öləcəyimi bildim, ey qəhrəman,
Yatdım, yuxuda mənə əyan oldu.

5988 Allah özünün yaxşı və pis qəzasını
Yatarkən insana yuxuda bildirir.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

5989 Öydülmüş dedi: – Ey təmizqəlbli insan,
Bu söz də yaxşı söz deyildir.
5990 Hər bir xəstəlikdən ölsəydi əgər,
Dünyada qalmazdı tək bircə nəfər.
5991 İnsan həyatda həmişə xəstələnə bilər,
Ancaq hər xəstəlik kökü ölümlə kəsməz.
5992 İnsan yatsa, yuxu görər,
Ancaq yuxu yozanlar onu düz yoza bilərlər.

## LXXVII

## ÖYDÜLMÜŞ ODQURMUŞA YUXU TƏBİRİNİ BƏYAN EDİR

5993 Röyanı doğru yoza bilmək üçün
Bu yuxu elmini öyrənmək gərəkdir.
5994 Bu yuxu təbiri çox müxtəlifdir,
Onları bilmək lazımdır, ey sakit təbiətli.
5995 Biliksizə yuxu açma, danışma,
Onu bilənə de, özü də gecikmə.
5996 Gecə gördüyün yuxu ilə
Gündüzkü yuxunun yozumu başqadır.
5997 Bax, röya təbiri çox şərtlərə bağlıdır,
Bunu anlamaq üçün bunları bilməlisən:
5998 Yuxunu öz könlünə görə yozmamalı,
*Hər kəsə yuxunu danışmamalı.*
5999 "Hər yuxunu yuxu deyə yozmamalı,
Ey hakim, yuxunun yozumu çoxdur.
6000 Yuxunu yozma, yozsan da biliklə yoz,
Mənasını diqqətlə təhlil et.
6001 Yuxu yozumuna görə çin olar,
Yoza bilməsən, yuxunun faydası yoxdur.
6002 Dəniz kamallı insan nə demiş, eşit,
Bu sözə əməl et ki, üzün gülsün:
6003 Yuxu öz yozumundan asılıdır,
Yuxunu diqqətlə, biliklə yoz.
6004 Yuxunu necə yozsan, nəticəsi elə olar,
Yuxunu pisə yozma, zərəri dəyər.
6005 Yuxuların çoxu yeməklə bağlıdır,
Pis yeməyin yuxusu da pis olar.
6006 Bəzisi bağlıdır ilin fəslinə,
Bəzisi güclənib çəkər əslinə.
6007 Əgər fəsli-yaz isə, yuxu görən kiçik isə,
O hər şeyi qızıl, yeri qara görsə,
6008 Deməli, onun qanı coşur,
Bir az qan aldırmalıdır.



6009 Əgər yaydırsa, yuxu görən gəncdirsə,
Sarı, al, zəfəran, yaxud üyüdülmüş şey görsə,
6010 Ey hakim onun öd kisəsi qüvvətlənib,
Qarnını boşaltmalı, qüvvət halvası yeməlidir.
6011 Əgər payızdırsa, insan yaşlıdırsa,
Qara, dağ, quyu və ya çökək görsə,
6012 Deməli, onun sevdası güclənmişdir,
Dərman içib beynini təmizləməlidir.
6013 Qış olsa, yuxu görən qoca olsa,
Axar su, buz, qar, dolu görsə,
6014 Onun bəlğəmi qüvvətlənmişdir,
İsti şey yeməli və içməlidir.
6015 Bundan başqa, qarışıq yuxular da var,
Onlar yozulmur, ey qüdrətli insan.
6016 Biri axşam nə isə düşünüb yatsa,
Onu yuxuda görsə, bu da yozulmaz.
6017 Bir röya da var ki, şeytanla bağlıdır,
Onu görən qüsl etməlidir.
6018 Yuxuda öz sənətini görənin
Yuxusunun təbiri yoxdur, ey gözəl insan.
6019 Bunları bilib, seçib, ayırıb,
Sonra yozmaq lazımdır.
6020 Yuxu yozan hakim nə demiş, dinlə,
Yuxunu kim görsə o, yozdurmalıdır.
6021 Yuxu görən onu, bildi-bilmədi yozmamalıdır,
Çünki necə yozsan, yuxu elə də çıxar.
6022 Qəmli yuxu görülmüşsə, tərs çıxar,
Şadlıq görülsə, qayğı gələr, insan ağlayar.
6023 Hər yuxu eyni cür yozulmaz,
Bunu yaxşıca düşünmək lazımdır.
6024 Qara camaatın yuxusu başqadır,
Bəylərin yuxusu tamam başqadır.
6025 Kim yuxuda nəşə, oyun, rəqs görsə,
Demək, kədəri və qayğıları başlayacaq.
6026 Biri yuxuda ağlasa, kədər görsə,
O, rahatlıq və min bir sevinc tapar.

6027 Elə yuxular da var ki, sənə xeyiri yoxdur,
Onların yozumu başqalarına maraqlıdır.
6028 Hər bir yuxu adamına görə yozular,
Yozarkən ağıl ona uyğun olanı yaraşdırar.
6029 Röya var ki, onu görən sağalar,
Həmin röya başqa birini xəstələndirər.
6030 Ey qardaşım bunun hamısını bilmək lazımdır,
Yuxunu da ondan sonra yozmaq gərəkdir.
6031 İndi sən gördüyün yuxunu mənə danış,
Mən də düşünərək onu yozum.

## LXXVIII

## ODQURMUŞ GÖRDÜYÜ YUXUNU ÖYDÜLMÜŞƏ BƏYAN EDİR

6032 Odqurmuş cavab verdi, dedi:
– Yaxşı, mən deyim, sən dinlə.
6033 Yuxumda əlli pilləli nərdivan gördüm,
Yüksək və enliydi, qarşımda dururdu.
6034 Pillə-pillə qalxıb yuxarı çıxdım,
Sona çatıb neçə pillə olduğunu saydım.
6035 Son pillədə bir atlı mənə su verdi,
Mən suyu axıradək içdim, doydum.
6036 Sonra havaya yüksəlib göyə uçdum,
O qədər yüksəldim ki, gözdən itdim.

## LXXIX

## ÖYDÜLMÜŞ ODQURMUŞUN YUXUSUNU YOZUR

6037 Öydülmüş cavab verdi, dedi: – Bu yuxu
Çox yaxşı və xeyirli yuxudur.



6038 Niyə sən onu xeyirə yozmursan,
Ey könlü tox, yuxu təbirə görə çıxar.
6039 Yuxuda yüksəlmə etibara dəlalətdir,
İnsan yüksəldiyi qədər də şərəfli olar.
6040 İnsan röyada nə qədər yüksələrsə,
Onun boxti və halı da o qədər yüksələr.
6041 Nərdivanla çıxdığı miqdarda səadəti yüksələr,
Adı isə böyüyər və məşhurlaşar.
6042 Başqa bir söz də buna şahiddir,
Yuxunu yozan bunu belə demişdir:
6043 "Röyada nərdivan izzətdir, kim yüksəlsə,
Hər pillə üçün ayrı etibar görər.
6044 Nə qədər çox yüksəlsə, o qədər etibar görər,
Dünya malından, səadətdən və taledən kam alar.
6045 Qabdakı suyu alıb içməyin
Nəslinin uzun ömürlülüyünə işarədir.
6046 Göyə uçub yüksəklərə çıxmağın isə
Allah hər diləyini verəcək deməkdir".

## LXXX

## ODQURMUŞ BU YUXUNU BAŞQA CÜR YOZUR

6047 Odqurmuş cavab verdi, dedi: – Ey dostum,
Bu yuxunun yozumu belə deyil axı.
6048 Əgər bu yuxunu sən görmüş olsaydın,
Onun yozumu da sən deyən kimi olardı.
6049 Çünki sən bu dünya üçün çalışırsan,
Bu dünyanı istəsən onu da qazanar.
6050 Mən isə dünyanı qoyub qaçmışam,
Burada zəhmətə qatlaşaraq yaşayıram.
6051 Sən mənim yuxumu bütöv yozmadın,
Dinlə, mən o yuxunu özüm yozum.
6052 Gördüyüm o yüksək pilləli nərdivanı,
Qardaşım, mən ömür kimi yozuram.

6053 Nərdivanın başınadək çıxmağım isə,
Yaşımın tükənməsi, ömrümün bitməsidir.
6054 Nərdivanın başınadək çıxdım,
O atlının gəlib mənə verdiyi suyu içdim.
6055 Övladları atasız qoyan da
Elə bu atlıdır, ey təmizqəlbli.
6056 Həyatdakı canlıları hərəkətsiz qoyan,
Tənzim edilmişi pozan bu atlıdır.
6057 Qabdakı suyu alıb içməyimi sən həyat sandın,
Mənim ömrümü uzatmış oldun.
5058 Mən yarısını içib, yarısını saxlasaydım,
Ömrümün yarısı qalmış olardı.
5059 Salam insanı şərdən qoruyar,
Cavab verən salamatlıq alar.
6060 Suyun hamısını içdim, ömrümü tamamladım,
Sən sağ-salamat qal.
6061 Ağıllı hakim nə deyir, eşit,
Hakim sözü sözlərin əsası və təməlidir:
6062 "Yuxuda suyun yarısının içilməsi o deməkdir ki,
Ömrün yarısı keçdi, yarısı borc qaldı.
6063 Əgər suyun hamısı sonadək içilsə,
Demək, ömür başa çatdı, qəbir qazıldı".
6064 Mənim yuxarı uçub yox olmağım,
Göyə çıxıb boşluğa qarışmağım isə,
6065 Təmiz canın öz qəlibindən çıxması və
Geri dönməmək üzrə uçması deməkdir.
6066 Tanrı bunu mənə yuxuda bildirdi,
Ey qəhrəman, artıq ölümə hazırlaşmalıyam.
6067 Bu yuxunun yozumu belədir, ey qüdrətli,
Ancaq sən onu mənə başqa cür yozursan.
6068 Sən mənə təsəlli vermək istəyirsən,
Ancaq önümə ölüm çıxdı, daha çarə yoxdur.
6069 Ey könlü diri olan insan, diqqət et,
Ölüm qara torpaqları təpəciyə çevirdi.
6070 Neçə-neçə qəsri, bəzəkli sarayı
Ölüm dağıtdı, sahibsiz qoydu.
6071 Neçə-neçə cəsur, özünə güvənən bəyi
Ölüm torpağa gömdü, ey diri insan, bax.



6072 Neçə-neçə qüvvətli biliklərin topladığını
Ölüm alıb saçdı, dağıtdı.
6073 Heyrət etmə, ölüm doğulanda insan ölür,
Bütün nəfəs alanlar ölümə məhkumdur.
6074 Heyrət et ki, fani bədən ölümü unudur,
Onu heç yadına da salmır.
6075 İnsan qafildir, öləcəyini bildiyi halda,
Qəflət yuxusundan oyanmır.
6076 Ölüm haqdır, ondan qaçmaq olmaz,
Əcəba, ölümündən sonra halın necə olacaq.
6077 Ey könül sirdaşım, qorxum budur,
Tanrı ölümdən sonra işlərimi düzəltsin.
6078 Nə varsa ona qane olub günümü keçirtdim,
Yaxşı-pis hər şey ötdü, gecəm sonsuz qalmadı.
6079 Əlimi qısa tutdum, sərvət yığmadım,
Həvəsə, diləyə könül vermədim.
6080 Bu günümü düşündüm, üstümdəki
Yük və günahları yüngülləşdirmək istədim.
6081 Bilik öyrədən, nəsihət və öyüd verən
Mərhəmətli insan nə demiş, eşit:
6082 Qafil olma, çalış yükünü azalt,
Yolun qıldan incədir, düz yeri.
6083 Bu gün yatma, zəhmət çək, işini nizamla,
Köçərkən müvəqqəti zəhmətləri unut.
6085 Yenə dedi: – Ey mənə doğrudan bağlı insan,
Gedirəm, arxamdan sən də gələcəksən.
6086 Sən həyatda ikən sənə bir yaxşılığın dəysin,
Məndən sonra bu söz yadigar qalsın.

## LXXXI

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ NƏSİHƏT VERDİYİNİ BƏYAN EDİR

6087 Sözüm budur, ey qardaş, qafil olma,
Həyatını, ömrünü boşuna keçirmə,

6088 Dürüst ol, düzlük yolundan əsla sapma,
Bil ki, insanı arzu-diləyə bu yol aparır.
6089 Hər məxluqa qarşı rəhmdil ol,
Könlünü qəlbinlə bir edib Tanrıya ibadət qıl.
6090 Dünya haqda düşüncən qısa, ibadətin uzun olsun,
Tələsərkən sakit, hiddətlənərkən həlim ol.
6091 Ölümü unutma, ona hazırlaş,
Özünü unutma, əslini, mənşəyini bil.
6092 Dünyaya tamah edib ruhunu qaraltma,
Dünya qalar, sən isə peşmanlıqla gedərsən.
6093 Tanı hökmünə razı ol, nə gəlsə, döz,
Vaxtı çatanda xalq üçün faydalı ol!
6094 Düz danış, sözün doğru və bütöv olsun,
Yalançılar hiyləgər olarlar.
6095 Güləriz, şirindil, xoşəməl ol,
Zamanə beləcə dönər, sənə səadət gətirər.
6096 Comərd və təvazökar ol, duz-çörək yedirt,
Başqalarının eybini görmə, ört, onu yox bil.
6097 Arzularına hakim ol, hirslənsən, özünü tut,
Nəfsin əyri yola sapsa, ona mane ol.
6098 Öz xeyirini yox, xalqın xeyirini düşün,
Xalqa yük yükləmə, yükü özün daşı.
6099 Malını, mülkünü, var-yoxunu payla,
Günahlarının kəfarəti olsun, ey dərin bilikli.
6100 İnsanların xası insanları qurtarar,
Onların sevinci üçün öz canını fəda edər.
6101 Yetkin, yaxşı, bilikli, ağıllı, düşüncəli insan,
Eşit gör nə gözəl söyləmişdir:
6102 "İnsanların yaxşısı xeyirli olanıdır,
Mərhəmətli insan xalq nəzərində etibarlıdır.
6103 İnsan adını daşımaq üçün iki şey gərəkdir,
Biri mərhəmətli, biri səxavətli olmaq".
6104 Bax, ağıl bundan da gözəl demişdir:
"Ağılın yolu ilə getmək çox faydalıdır".
6105 Comərd deyirlər, comərd kimdir?
O, canını fəda edərək insanını haqqını verəndir.



6106 Gümüş paylamaq comərdlik deyil,
Comərd xalq üçün canını fəda edər.
6107 Comərd insan xalqa mal paylasa,
Xalq da qaçıb onun ətrafına toplanar.
6108 Dünyada şan-şöhrət iki şeylə əbədidir,
Biri mal-mülk sahibi, biri şərəfli olmaq.
6109 Bu iki şeyi tapan insan tam min il yaşasa da,
Ölüm gələndə vəziyyəti dəyişər.
6110 Xalq vəzifəsini yerinə yetirsə, bəy yüksələr,
Üzəngi olsa, insan cilovu daha möhkəm tutar.
6111 Dünyanın, dövlətin və xalqın əhvalı budur,
Bunlar tapılmaz, tapılanda isə bəy qocalar.
6112 Sən köçəcəksən, adın da köçəcək,
Son gün səni köçürən ölüm gələcək.
6113 Köçəcək adam saray, qəsr tikməz,
Gəzən adam yolda aylarla, illərlə qalmaz.
6114 Ey qardaş, hesab et ki, bu yolu keçmisən,
Bu dünyada çox sevinib gülmə.
6115 Bu dünya əbədi deyil, müvəqqətidir,
İnsan öləcək, ancaq öləcəyi günü bilmir.
6116 Ölümün pəncəsi hazırdır, onun caynağı
Qəflət içində yeriyən adama saplanacaq.
6117 Bu dünya bir xörəkdir, adını sən söylə,
Mən söyləməyə cəsarət etmirəm.
6118 – Həvəs-arzu dalınca qaçma, nəfsinə hakim ol,
Başqalarının qiybətini etmə, dilini saxla.
6119 Könlü oyaq insan nə demişdir, eşit,
Onun sözünə əməl etsən, xeyir taparsan:
6120 Həvəs-arzu dalınca qaçmaq ləzzətli olsa da,
Sabah onun üçün ciddi hesab soracaqlar.
6121 "Dadlıya qarşı dadsız, şirinə qarşı acı,
Yoxuşa qarşı eniş, hündürlüyə qarşı dərinlik var.
6122 Bu dünya gözəl bir qıza bənzəyir,
Ey həlim insan, çalış ki, o səni aldatmasın.
6123 O sənin kimi çoxlarını yelə verdi,
Hökmdar kimi çox bəyləri gördü, keçdi.

6124 Bu gün də sizə baxdı, əl uzatdı,
Qafil olma, ey təmizürəkli insan.
6125 Sənə nə vermişsə, geri alacaq,
Səndə nə yığmışsa, onları dağıdacaq.
6126 Nə qədər gülsə də, bir gün ağladacaq,
Nə qədər düzəltsə də, bir gün dağıdacaq.
6127 Onun təbiəti cəfaçı və hiyləgərdir,
Aydınlığı az, toz-dumanı çoxdur.
6128 Bəzənər, özünü insana göstərər,
Elə ki, könül verdin əl-qolunu bağlar.
6129 Şəkərlə bəslər, axırda zəhər verər,
Ey hakim, dönük səadət belədir".
6130 İbadət sahibi nə deyir, eşit,
Ey səadətə yetmiş insan, bunu yaxşı düşün:
6131 "Arxada qoyacağın bu dünyaya könül vermə,
Saqın, ey sakit təbiətli, o, cəfakeşdir.
6132 Bax gör xas, bilikli, ağıllı insan,
Nə gözəl bir söz söyləmişdir:
6133 Dönük səadətə qapılma, yolunu azma,
Səadətə inanma, bir də gördün dəyişdi.
6134 Dünya və səadət günləri bir kölgədir,
Kölgə həmişə eyni yerdə, eyni şəkildə durmaz.
6135 Dinino qiymət ver, dünyaya qiymət vermə,
Ey dərya kamallı, dinin sənə qiymət qazandırır.
6136 Rahatlığa çatdım deyə sevinmə, ovunma, özünü saxla,
Tanrını zikr et, ibadətlə məşğul ol.
6137 Ey qardaş, səadət səni sərxoş etməsin,
Ayılanda, şübhəsiz, gözün yaşla dolacaq".
6138 Eşit gör ağıllı, bilikli,
Təcrübəli bəy nə demişdir:
6139 "Səadət kimi xoşbəxt etsə, onun
Qara torpaq altda inləməkdən qəlbi parçalanacaq.
6140 Kim qürurundan sərxoş olub özünü itirsə,
Qara torpaq altda bunun cəzasını çəkəcək.
6141 Gənclik, səadət və sərvət sərxoşluğu
Şərab sərxoşluğundan betərdir, ey qüdrətli.



6142 İçki içən şərabdan sərxoş olar,
Yatsa sərxoşluğu ötər, qalxsa ayrılar.
6143 Səadətdən sərxoş olan heç ayrılmaz,
Ölüm gələnədək yatıb qalar.
6144 Adın quldur, sən bəylərin işi ilə uğraşma,
Ey yaxşı insan, sən öz qulluğunla məşğul ol.
6145 Həyat çox da uzun sürməyəcək,
Böyüklük şöhrəti çox da uzaqlara yayılmayacaq.
6146 Min il yaşasa da, insan bir gün öləcək,
Bəndəndə birləşən əzalar bir-birindən ayrılacaq.
6147 Buna bənzər bir söz var, onu eşit,
Mənimsə, əhəmiyyətsiz sayma,
6148 Hər arzuna yetsən, dünya nemətlərinə nail olsan,
Abi-həyatı tapıb içsən də.
6149 Əl atıb göydəki ulduzları tutsan da,
Başın göyə dəysə də bir gün öləcəksən".
6150 Ey qardaş, qoy sənə düzünü deyim,
Ey könüldaş, səndən nə gizlədim.
6151 Bu dünya malını, dünya nemətlərini,
Gözəllərin işvələrini necə sevməmək olar?
6152 Bu nemətlərin hamısını tərk edərkən
Dönük dünya bu qapını mənim üzümə bağladı.
6154 Arif adam bundan qorxub dünyadan əl çəkir,
Min zəhmətlə dünyanı gəzib-dolaşır.
6155 Biri dağda qalır, evi mağaradır,
Yeməyi ot kökü, içməyi yağış suyudur.
6156 Biri Allaha qarşı qorxu və əndişə ilə
Taqətsiz halda çöllərdə qaçır.
6157 Biri çullara bürünmüş halda,
Biri gözü yaşlı diyar-diyar gəzir.
6158 Biri yemək yemir, özünü arıqladır,
Biri gecə yatmır, ayaq üstdə durur.
6159 Oyaq insanlar, bax, belə yaşayırlar,
Qafillərin qafili olan bizlərsə yatırıq.
6160 Ey qardaş, indi sən özünü qoru,
Dünya sənin oldu, sən baş oldun.

6161 Həvəsini-arzunu qıs, ağlınla nəfsin boynunu
İnsanlığın və ağıllılığının əlaməti budur.
6162 İnsan bu iki şeylə özünü məhv edər,
Kim bunların əsiri olsa, iztirab çəkər.
6163 Bu gün mən gedirəm, bu sənin də yolundur,
Mənim yolumu başqalarına yaxşılıqla davam elətdir.
6164 Pislərə qoşulma, daima əməlisaleh ol,
Pislər üçün hər iki dünyada fəlakət var.
6165 Ölməzdən əvvəl axirət işini yoluna qoymuş
Könlü kamil olan adam gör nə demişdir:
6166 "Ey erkək dəvə kimi pisliyə doğru qoşan,
Pislik etmə, pisliyin yemi zəhərdir.
6167 Ey insanlara hökm edən kimsə,
Ölüm yetişmək üzrədir, bir çarə tap.
6168 Ey "mən-mən" deyən, mənəmlikdən əl çək,
Ölümə hazırlaş, o da "sən-sən" deyir.
6169 Ey bu dünyanın qulu, acgöz, tamahkar,
Ölüm səni tutmağa tamah edir".
6170 Odqurmuş davam etdi: – Hüzünlü gedirəm,
Bu gün iki şeyə çox yanıram:
6171 Biri odur ki, daha Tanrıya ibadət edə bilməyəcəyəm,
İkincisi, dilim onu zikr edə bilməyəcək.
6172 Bu gün-sabah gözüm qapananda
Mən də sizin duanıza möhtac olacağam.
6173 Ey qardaş, duanda məni unutma,
Məndən sonra də sən gələcəksən.
6174 Mənim halımı gör, sənə ibrət olsun,
Özünə çarə qıl, tədbir tök.
6175 Ölüm gəlib aparır, niskilli gedirəm,
O məndən sonra sənin üçün gələcək, hazırlaş.
6176 Bu gün mən səndən ayrılıb niskilli gedirəm,
Kim bilir bir də nə vaxt qovuşacağıq.
6177 Ölən, ölərkən inləyən, başını yerə döyən
İnsan nə demişdir, eşit:
6178 "Ölürəm, peşmanlıqdan iki gözüm iki çeşmədir,
Bu ölüm şirini acı edir.
6179 Ölümdən sonra insanı iki yol gözləyir,
Görəsən, mənim yolum hansı olacaq?"



6180 Odqurmuş davam etdi: – Ey rəhmdil qardaşım,
Mənim qayğımla könlünü yaralama.
6181 Dalımca fəryad etmə, könlünü üzmə,
Özünü ələ al, mənə dua et.
6182 Çox ağlama, toxdaq olmağa çalış,
Bu Tanrının əmridir, sözüm bitdi.
6183 İndi dön, təkrar evinə get,
Bu kədər və qayğı ilə canını sıxma.
6184 Gərəkli hər şeyi sənə söylədim,
Ey pakqəlbli, öyüdümü unutma.
6185 Məndən Elikə salım söylə,
Ey pürkamal, bu son salamımdır.

## ÖYDÜLMÜŞÜN ODQURMUŞA CAVABI

6186 Öydülmüş xeyli düşünüb cavab verdi:
Mən səni bu halda necə qoyub gedim? – Dedi.
6187 Ağır xəstəsən, həm də yalqızsan,
Təkbaşına nə edərsən, ey əsil insan?

## ODQURMUŞUN ÖYDÜLMÜŞƏ CAVABI

6188 Odqurmuş təkrar dedi: – Oğlum, get,
Sən mənim üçün heç üzülmə.
6189 Rəbbimi zikr etmək mənə təsəllidir,
O məni tək qoymaz, işimi sahmanlar.
6190 – Tanrı kimə qarşı lütfkardırsa,
Kimi əziz tutursa, onun işi yolunda gedər.
6191 Doğru sözlü hər işi əvvəlcədən görən,
İti baxışlı adam çox gözəl demişdir:
6192 "Tanrı kimə inayət və yardım etsə,
Dünya onun olar, o, səadətə çatar.
6193 Kim Tanrı fəzlinə layiq olsa,
O, iki dünyanın səadətinə nail olar.
6194 Ey cəsur, Tanrı adamı tərk etsə,
O istər köpək, istər bozqurd olsun, fərq etməz.

6195 Odqurmuş: – Qardaşım, sağ ol, daha get,
Gözündən yaş tökmə, – dedi, sözünü bitirdi".

* * *

6196 Öydülmüş qalxıb Odqurmuşu qucaqladı,
Öpüb ağlayaraq göz yaşı tökdü.
6197 Qalxıb kədərlə oradan çıxdı,
Atına minib evinə yola düşdü.
6198 Gəlib evinə girdi, üzü kədərli,
Özü nəşəsizdi, könlü hüznlə dolmuşdu.
6199 Bax, insan oğlu çox zərif varlıqdır,
Sevinci azdır, hər şey onun üçün qayğı mənbəyidir.
6200 Arzusuna çatanda sevinc onu nəşələndirir,
Qayğı gələndə kədər onu ağladır.
6201 Sevdiklərini tapanda gülərək baxır,
Ayrılanda kədərlə ağladır.
6202 Bozən vüsal onu sevindirir,
Ayrılıq isə kədərlə ağladır.
6203 Dünyada ayrılıqdan çətin nə var,
Ayrılığın qayğısı dənizdən də dərindir.
6204 Sağ ikən ayrılanlar yenə qovuşurlar,
Axtararaq bir-birini təkrar tapırlar.
6205 Ən çətin ayrılıq bu ölümdür, çarəsi yoxdur,
Ona qarşı silahla da çıxmaq olmaz.
6206 Hər şeyin fəraqı yaxın və ya uzaq olur,
Ölümün fəraqı uzaq fəraqdır.
6207 İndi buna bənzər bu beyti oxu,
Oxusan, mənasını yaxşı anlarsan.
6208 Hər şeydən ağır fəraq ölümdür,
Bu görən göz fəraq üçün göz yaşı tökər.
6209 Sağ ikən fəraqa qarşı bir vüsal ümidi var,
Ölən isə, şübhəsiz, vüsaldan uzaqdır.

* * *

6210 Öydülmüş bir az təsəlli tapdı,
Yedi, içdi, qalxıb namaz qıldı.



6211 Günəş yerə endi, üzünü gizlədi,
Açıq səma da onun yolunu izlədi.
6212 Döşək istədi, uzandı, yuxusu gəlmədi,
Kədər, qayğı içində gözünü yummadı.
6213 Qalxıb eşiyə çıxdı, göz yaşı tökdü,
Dünyanın rəngi həbəş dərisinə dönmüşdü.
6214 Təkrar otağına qayıdıb yerinə girdi,
Kədərə hakim olub, bir az toxdadı.
6215 Rumi qızı üzünü yerə gömdü,
Dünyanın rəngi zənci üzünə döndü.
6216 Yuxusu gəlmədi, qalxıb yenə baxdı,
Ülkər aşağı enmiş, gecə sona yaxınlaşmışdı.
6217 Göyə göz dikib xeyli seyrə daldı,
Gecə davam edir, hava işıqlanmırdı.
6218 Bir az yatdı, təkrar ayağa qalxdı,
Başını qaldırıb mavi göyə baxdı.
6219 Gündoğardan Qaraquş ulduzu doğdu, yüksəldi,
Atəş parladı, sanki yağı öz məşəllərini yaxdı.
6220 Yeddi qardaş başını yuxarı qaldırdı,
Yıldıraq ulduzu Ayqır bürcünə tərəf üz tutdu.
6221 Ərəntirin başı Yerə yaxın bir nöqtəyə endi,
Günəş başını qaldırdı, parlaq üzünü açdı.

* * *

6222 Öydülmüş qalxdı, abdəst aldı, yuyundu, darandı,
Namaz qıldı, virdini oxudu.
6223 Dünya altun rənginə boyandı,
Göy üzü alov kimi qızardı.
6224 Paltarını geyinib atına mindi,
Evdən çıxıb saraya gəldi.
6225 Enib yeriyərək düz saraya girdi,
Elik çağıranda özünü toplayıb hüzura çıxdı.
6226 Elik Öydülmüşə diqqətlə baxdı,
Bu gözəl insanın könlünü kədərli gördü.

ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

6227 Elik sordu: – Bu nə haldı, ey həlimxasiyyətli,
Mən səni düşüncəli görürəm.
6228 Qəlbinə bu gün hansı dərd yükləyib?
Alnındakı düyündə bunun əlaməti var.
6229 Qırmızı yanağın niyə solub?
Dünya sənə hansı kədəri verib?
6230 Səadət ki hələ səndən üz çevirməyib,
Dönük dünya və səadət sənə gülümsəyir.
6231 Fələk hələ muradınca dövr edir, ey igid,
Ay, günəş, zaman diləyincə dolanır.
6232 Mən hələ sənə qaşımı çatmamışam,
Səndən razıyam, sənə qarşı iltifatlıyam.
6233 Kim səni bu qayğıya, kədərə bürüyüb?
Bu nə haldır? Mənə cavab ver.
6234 Ey oğlu, belə bir zamanda bu nə dərddir?
Söylə, ey həlim insan, mən də bilim.
6235 Sən qayğılı, kədərli olanda
Mən necə sevinc duya bilərəm?

ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6236 Öydülmüş cavab verdi, sözə başladı,
Qardaşının xəstə olduğunu, vəziyyətini,
6237 Özünün oraya getdiyini, onu gördüyünü,
Odqurmuşun nəsihətlərini nəql etdi.

ELİKİN ÖYDÜLMÜŞƏ SUALI

6238 Elik kədərləndi, ağlamağa başladı,
Dedi: – Heyif o gözəl insandan!
6239 Tanrı onun canını bağışlasın,
Ətinə, qanına xələl gəlməsin.



6240 Sonra dedi: – Onun halı necədir?
Onu qoyub gəlməyə necə razı oldun?
6241 Ona kim xidmət edir, kim baxır?
O, xəstə halda necə tək qalır?
6242 Niyə orda bir az qalmadın?
Onu kimə tapşırıb gəldin?

ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6243 Öydülmüş dedi: – Ey kamalı dərya kimi dərin,
Eyni sözləri mən ona dedim.
6244 Mənə etiraz etdi, qulaq asmadı,
Sözünə qarşı çıxmaq istədim, gücüm çatmadı.

ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

6245 Elik dedi: – Onu Tanrı qorusun,
Tanrı istəsə, şəfa verib onu sağaldar.
6246 O könlünü, fikrini Tanrıya bağlayıb,
Ey oğlu, bir olan Tanrı onu tək buraxmaz.
6247 Əgər bir qul hamıdan üz çevirsə,
Yalnız yaradan rəbbə sığınsa.
6248 Bir olan Tanrı onu qoruyar,
Onu diləyinə yetirər, o da şöhrət qazanar.
6249 İndi buna bənzəyən bir sözü dinlə,
Yadında qalsın, onu hər işində xatırla:
6250 Hər şeyi tərk et, Tanrıya sığın,
Könlünü, dilini təmiz tut, əməlini düzəlt.
6251 Bütün diləyini Tanrı verəcək,
Şeytanla vuruş, Tanrıya sadiq qal.
6252 Elik davam edib dedi:
– Çox əzab çəkib özünü üzmə.
6253 O, yaxşıların seçilməsi, yaxşı insan idi,
Öləndə də Tanrı onun işini asanlaşdıracaq.

6254 Ey hakim, bu iş sabah bizim üçün də var,
Görəsən, ömrümüz necə keçəcək, nə qazanacağıq?
6255 Heyif, biz gəncliyimizi boşuna keçirdik,
Bədənimiz, qəlbimiz, fikrimiz pisdən pisdir.
6256 Həyat bu gün röya kimi oldu,
O necə keçdisə, mükafatı da elə olacaq.
6257 Ömrün qalanını hədər etmək,
Həvəsə, arzuya könül vermək olmaz.
6258 Necə olsa da bədən axırda öləcək,
Ölümdən sonra min peşmançılıq var.
6259 Bu gündən camaata şəfqət göstər,
Xalqın dərdi ilə yolu göstərsin.
6260 Məni də, özünü də xilas etməyə çalış,
Tanrı bizə doğru yolu göstərsin.
6261 Tanrı qullarına mərhəmət göstərən
Xoşxasiyyət adam nə demiş, eşit:
6262 "Yaxşılıq edənə Tanrı da yaxşılıq edər,
Ey yaxşı insan, sən sevin.
6263 Kim pislik eləsə, özünə edər,
Pisliyin əvəzi pislikdir.
6264 Pislik istəyirsənsə, get pislik elə,
Amma əvəzində bir gün piləyəcəksən".

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6265 Öydülmüş cavab verib dedi: – Elik
Öz öyüdləri ilə məni ruhlandırdıqca.
6266 Tətbiq edilən qanunlar daim yaxşı olacaq,
Tanrı da bu bəyliyi həmişə qoruyacaq.
6267 Elik uzunömürlü, xoşbəxt, qüdrətli olsun,
Canım, bədənim, varlığım ona fəda olsun.
6268 Öləri insan üçün ancaq yaxşı ad dəyərlidir,
Qadir Tanrım yaxşı adla ömür versin.
6269 Ölüm səni yaxalamaq üçün fürsət gəzir,
Özünü qəflət yuxusundan oyat.



6270 Bilikli insan çox gözəl söyləmiş,
İbadət sahibi o yolla gedər.
6271 Gözəgörünməz əcəl pusquda gözləyir,
Ümid dalınca qaçan qafilləri qəfil ovlayır.
6272 Əzəldən yazılmış əcəl gələndə
Yaxşı-pis hamı qara torpaq olur.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

6273 Elik dedi: – Qoy Tanrı mənə güc versin,
Bu yolda öz hökmümü yeridim.

* * *

6274 Elik durdu, sözünü bitirdi,
Öydülmüş qalxıb hüzurdan çıxdı.
6275 Öydülmüş bir neçə gün səbir elədi,
Kədər və qayğısını içinə saldı.
6276 Qardaşı üçün çox əzab çəkdi,
Getdikcə saraldı, kədərdən əridi.
6277 Ancaq çox dözə bilmədi,
Gedib onu görmək istədi.
6278 Qalxıb birbaşa saraya getdi,
Elikin dəvəti üzrə birbaşa hüzura çıxdı.
6279 Elikə ərz etdi, dedi: – Mən bu gün
Gedib qardaşımı yoluxmaq istəyirəm.
6280 Görüm vəziyyəti necədir?
Sağdırmı? Bir xəbər bilim.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

6281 Elik dedi: – Getsən çox yaxşı olar
Qardaşlıq, qohumluq gediş-gəlişlə olar.
6282 Get mənim adımdan da xətir soruş,
Bax gör xəstəliyi necədir, təsəlli ver.

6283 Öydülmüş "baş üstə" deyib, oradan çıxdı,
Evinə gəlib bir az dincəldi.
6284 Bir az yedi-içdi, atına mindi,
Qəmgin-qəmgin qohumugilə yola düşdü.
6285 Çatıb atdan endi, piyada yürüdü,
*Qapıya çatıb səsləndi, girməyə izin istədi.*

## LXXXII

## KUMARU ÖYDÜLMÜŞƏ ODQURMUŞUN ÖLDÜYÜNÜ BƏYAN EDİR

6286 Qardaşının müridi Kumaru qapıya çıxdı,
Onu göz yaşları ilə salamladı.
6287 Yaxına gəldi, dedi: – Ey qardaş,
Tanrı əcr versin, könlün yaralanmasın,
6288 Qardaşın köçüb getdi, bu dünyanı tərk etdi,
Tanrı sənə uzun ömür versin.
6289 Ağlayıb-inləmə, səbir et, özünü ələ al,
Dirilər üçün ölümdən başqa çıxış yolu yoxdur.
6290 Hər doğulan ölür, şirin can gedir,
Dünyada nə bəy, nə qul, nə də peyğəmbər qalır.
6291 Bu ölüm bizim üçün də hazırlanıb,
Ölümə qarşı çarə və silah yoxdur.

* * *

6292 Bunu eşidən Öydülmüş fəryadla
Özünü döydü, göz yaşları tökdü.



## LXXXIII

## KUMARUNUN ÖYDÜLMÜŞƏ BAŞSAĞLIĞI DİLƏDİYİNİ BƏYAN EDİR

6293 *Kumaru onun fəryadına mane olmaq istədi:*
– Səbirli ol, Tanrı hökmünə qəlbin, ağlın, dilində razı ol.
6294 Bu ölüm hamı üçün bir gün gələcək,
O öldü, indi sən ölümə hazırlaş.
6295 Ey oğlu, niyə ağlayırsan, de, görüm,
Kim səni söydü, vurdu, zərər verdi?
6296 Bu fani canı ona Tanrı vermişdi,
Onu da geri aldı, can da çıxıb getdi.
6297 O bir daha geri dönməyəcək,
Tezliklə sən də, mən də gedəcəyik.
6298 Dedi: – Dayan qardaşının qəbrini gör,
Ziyarət et, sonra geri qayıt.

## LXXXIV

## ÖYDÜLMÜŞÜN ODQURMUŞ ÜÇÜN MATƏM TUTULDUĞUNU BƏYAN EDİR

6299 Qalxıb getdi, qardaşının qəbrini gördü,
Onu qucaqlayıb ağladı, göz yaşı tökdü.
6300 Ey qardaşım, bir başını qaldır, bax,
Səni görüm, həsrətim bitsin, – dedi,
6301 Buraya səni görmək üçün gəlmişdim,
Niyə məndən üzünü gizlətdin?
6302 Ey könülümün tacı, əziz canın canı,
Sənsiz bu fani can necə yaşasın?
6303 Səni mən yuxudamı gördüm?
Gördüm və itirdim, qeyb olub uzaqlaşdım.

## LXXXV

## ELİKİN ÖYDÜLMÜŞƏ BAŞSAĞLIĞI DİLƏDİYİNİ BƏYAN EDİR

6304 Elik bunu eşidib Öydülmüşün evinə gəldi,
Ona səmimi başsağlığı dilədi.
6305 Elik dedi: – Ey Öydülmüş, səbirli ol,
Dua ilə ona yardım etməyə çalış.
6306 Allah Odqurmuşa rəhmət eləsin,
Onun bütün günahlarını bağışlasın.
6307 Tanrı sənə bu fəlakətin əcrini versin,
Tanrı səndən razı olsun, cəhənnəmdən qorusun.
6308 Sən yolunu unutmuş, qapını bağlamış,
Üzünü gizləmiş, ağzını qıfıllamışsan.
6309 Bu hərəkət sənə yaraşmaz,
Ağıllı adam bu yola seçməz.
6310 Mənə de, kim səni bu sıxıntıya saldı,
Kim sənə hirsləndi, kim sənə kin bəslədi?
6311 Qardaşının ölümü Tanrının hökmüdür,
Allah qəzasıdır, sən öz hərəkətlərinə diqqət et.
6312 Ağlayıb fəryad etmə,
Elə iş görmə, verən alır.
6313 Doğulan ölür, yüksələn enir,
Yüyürən durur, verən alır.
6314 Qardaşının ölümü sənə ibrət olsun,
Səbir et ki, şəkərin qənd olsun.
6315 Ölünü görən dirilər bundan
İbrət almalıdır. Alan hanı?
6316 Ölənin nəsihətini eşit, nə deyir:
"Ölüm yaxaladı, gedirəm, səni də yaxalayacaq".
6317 İndi buna bənzəyən beyti oxu,
Oxuyub könlünə yaxşıca yaz:
6318 "Səndən əvvəl ölən min-min adam
Öyüd verib dedi: – Mənə bax, mənə,



6319 Qafil yaşadım, usandım, yoruldum,
Ölüm məni yaxaladı, növbə sənindir".

* * *

6320 Sonra Odqurmuşun necə öldüyünü,
Bu haqda nə bildiyini soruşdu.

### ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6321 Elikə nə gördüyünü danışdı,
Odqurmuşun vəsiyyətindən və misrasından bəhs etdi.
6322 Qardaşından yadigar qalan
Çanağı və əsanı Elikin önünə qoydu.
6323 Dedi: – Qardaşımdan mənə
*Miras qalan bunlardır.*
6324 Elik bunun birini özünə yadigar alsın,
O həm bu dünyada, həm axirətdə uğur gətirər.

### ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

6325 Hökmdar asanı əlinə aldı
Bu yadigar mənə uğur gətirsin, – dedi.
6326 Sən isə bu çanağı özünə götür,
Ona baxıb qardaşını xatırlayarsan.

* * *

6327 Öydülmüş çanağı aldı,
Qəlbi sızladı, gözündən yaş axdı.
6328 Elik dedi: – Ağıllı, düşüncəli insan üçün
*Bu gün bu ibrət kifayətdir.*
6329 O elə də yaşadı, həyatı bitdi,
Ondan dünya, bir də bunlar qaldı, ey saf insan.

6330 Hər işə ağılla əl uzadan
Əməli təmiz adam nə deyir eşit:
6331 "Dünya malı nə qədər olsa da, çox sayılmaz,
Nə qədər az olsa da, yerinə görə kafi olar.
6332 Bu dünyanın qüsuru min, məziyyəti birdir,
İnsan onu keçirsə, elə də keçər.
6333 Ölümdən sonra bolluğun faydası nədir?
Səndən sonra ancaq onu yeyən sevinər.
6334 Qardaşın dünya malını qoyub getdi,
Öz səviyyəsinə görə cındır geydi, arpa yedi.
6336 Ömrünü keçirdi, vəziyyətinin pisliyindən ölmədi,
Hazır yeyicilərə də mal qoymadı.
6337 O, işini nizamladı, bu gün xilas oldu,
Bizim halımız nə olacaq. Bu düyün hələ açılmayıb".

* * *

6338 Elik gözəl öyüd-nəsihətlər verdi,
Öyüd verib ürəyini boşaltdı, rahatlandı.
6339 Elik qalxıb yenə saraya qayıtdı,
Atdan enib fikirli halda otağa girdi.

* * *

6340 Öydülmüş bir neçə gün yas tutdu,
Matəmdən sonra bir az özünə gəldi.
6341 Qayğı və kədəri unutdu,
Yenə yedi-içdi, sevindi, güldü.
6342 Xalqı biliklə idarə edən
Xalq başçısı nə gözəl demişdir:
6343 "Kədər səni nə qədər əsir etsə də,
Bir gün üzün təkrar güləcəkdir.
6344 Bu dünyanın köhnə qanunudur, –
Pislik də, yaxşılıq da bir gün keçər".
6345 Öydülmüş də təziyə tutdu,
Sonra vəzifəsinə başladı, işinə davam etdi.
6346 İşə möhkəmcə girişdi,
Gecə-gündüz yorulmadan çalışdı.



## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

5347 Elik bir gün Öydülmüşü çağırdı,
Xalqın, ölkənin vəziyyətini soruşdu.
6348 Dedi: – Elin halı, xalqın halı necədir?
Günlər və zaman necə keçir?
6349 Sən mənim həm gözüm, həm qulağımsan,
Hər işə özün bax, özün həll elə.
5350 Neçə gündür kədərli-yaslı olduğun üçün
İşə baxa bilmədin. İşlər necədir?

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6351 Öydülmüş cavab verdi: – Ey bəy,
Xalqın vəziyyəti yaxşıdır, dua edir.
(*Mətn əskikdir*)
6352 Söz, boğaz, göz və bu şəhvət atəşdir,
Onlar ibadətə mane olur, fəlakətdir.
6353 İnsan boğazına hakim olsa, az danışsa,
Yaraşmaz şeylərdən özünü uzaq tutsa,
6354 Həvəs və arzusunu cilovlaya bilsə,
Qəzəbini boğa bilsə,
6355 Ağıllı və bilikli insan odur,
Ağıllı və həlim insan buna müvəffəq olar.
6356 Ağıllı adamların sözü tərifəlayiqdir,
O, doğru-dürüst olur, özünü göstərir.
6357 Onlar özlərinə yaraşmayan şeyə yanaşmaz,
Lüzumsuz şeylərə baxmaz, göz yumarlar.

## ELİKİN ÖYDÜLMÜŞƏ CAVABI

6358 Elik dedi: – Çox gözəl söyləyirsən.
Çox səmimi və xeyirli sözlərdir.
(*Mətn əskikdir*)

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI
(*Mətn əskikdir*)

6359 Bu bədən cəfakeş və hiyləgərdir,
Cəfakeşə cəfa ver özünə hakim ol.
6360 İnsan öz bədənini nə qədər sevsə, ona qulluq etsə,
Bədən də ona bir o qədər pislik edər.
6361 İnsanların yaxşısı nə gözəl söyləmişdir,
Onun sözü cəfakar bədənə qarşı çarı tədbirdir:
6362 "Kimə vəfa göstərsən, ondan cəfa gözlə,
Cəfakar nəfs səni bir gün cəfaya salacaq.
6363 Kimə xoşrəftar göstərsin, ondan qorx,
Onun pisliyi bir gün səni inlədəcək".
6364 Ey Elik, bu üç şeyin kökü, şişmanı pisdir,
Biri köpək, biri ov quşu, biri də bədəndir.
6365 Ram etmək üçün onları ac qoymalı,
Onları ancaq bu cür yola gətirmək olar.
6366 Ov quşu ətli olsa, ovunu tuta bilməz,
Köpək kök və tox olsa, ov dalınca qaçmaz.
6367 Bədən doysa, erkək dəvə kimi olar,
Etdiyi bütün yaxşılıqları silib süpürər.
6368 Quşun ovu ovlamasa, zərərin bir ördək olar,
Köpəyin ovu qaçırsa, zərərin bir heyvan olar.
6369 Bədənin erkək dəvəyə dönsə, boynunu yoğunlatsa,
Səni oda salar, aca-acı fəryad edərsən.
6370 Yeməyi olmayan kasıb da rahatdır,
Aza qail olar, könül varı ilə yaşayar.
6371 Əyninə bir şey keçirsə, qarnını doyursa,
Tanrıya ibadət edər, axirət işinə baxar.
6372 Böyüklük, var-dövlət və səadət insanı
Əsas işindən ayırar, təkəbbürlü edər.
6373 Qürur insanı Tanrıdan uzaqlaşdırar
Ağıllı adam o yolu seçməz.
6374 Kasıb da, varlı da öləcək, qara torpağa dönəcək,
Hər ikisi bu dünyadan ancaq kəfən aparacaq.
6375 Kasıb öləndə əziyyətdən xilas olur,
Varlı öləndə malını qoyur, günah aparır.



6376 Gerçəkdən buna bənzər bir söz var,
O sözdən özünə pay al:
6377 "Ey nemət sahibi, ölüm sənin möhnətindir,
Ey möhnət yiyəsi, ölüm sənin nemətindir.
6378 Kasıb ölsə, əziyyətdən qurtular,
Ey varlı, ölüm gələndə səndən haqq-hesab istəyəcək".

## ELİKİN ÖYDÜLMÜŞƏ SÖZÜ

6379 Elik davam edərək dedi:
– Dünya zəhərli ilan-çayanla doludur.
6380 Yeməli neməti az, zəhəri çoxdur,
Bəyəniləcək şeyi az, nifrət ediləcək şeyi çoxdur.
6381 Ağıllının əl uzadıb alacağı şey az,
Biliklinin yeyəcəyi nemət də azdır.
6382 Biliksiz üçün bu dünya cənnətdir,
O, bolluq içində firavan yaşayır.
6383 Ağıllı adam üçün dünya tikanla doldurur,
Yeriyəndə ayağın da batır.
6384 Bilikli üçün dünya zəhərlə doludur,
Buna görə o yemək yemir, gücdən düşür.
6385 Buna görə zahid arvad-uşağını qoyub qaçdı,
Buna görə abid dünyanı buraxıb ibadətə başladı.
6386 Biz bu gün özümüzü buna əsir etmişik,
Tanrı bizi bu bəladan qorusun.

## ÖYDÜLMÜŞÜN ELİKƏ CAVABI

6387 Öydülmüş cavab verib dedi:
– Bunlar doğru və ağıllı sözlərdir.
6388 Diqqət et, dünyanın təbiəti dəyişdi,
Hərəkəti də acgöz əjdahaya bənzəyir.
6389 Bil ki, insanı özü bəsləyər, özü kökəldər,
Sonra özü öz ətini yeyər, arıqladar.

6390 İnsan dünyanın mahiyyətini anlasa,
Heyrət və təəccüb içində qalar.
6391 Adəmlə Həvva yer üzünə endilər,
Dünyada insan nəslini çoxaltdılar.
6392 O vaxtdan bu günə qədər dünyaya
Nə qədər insan, nə qədər bəylər bəyi gəldi.
6393 Kimi alim, kimi cəsur, qəhrəman doğuldu,
Kimi də yalçın qaya kimi məğrur və kobud.
6394 Kimi ağıllı, hakim, kimi dəli,
Kimi axmaq, kimi tənbəl oldu.
6395 Neçə peyğəmbər, kamal sahibi, neçə elçi gəldi,
Tanrı hökmü ilə bizə yol göstərdi.
6396 Kimi az yaşadı, kimi çox,
Kimi hakiminə sözlərlə yüksək mərtəbəyə çatdı.
6397 Kimi də düşmən kimi
Yayını qurub Tanrıya ox atdı.
6398 Bu beyti oxu, dinlə, gör nə deyir,
Öz təbiətini bu beytə uyğunlaşdır: –
6399 "İstər alim ol, min yaşa, dünyanı tut,
Bütün nemətlərə sahib ol,
6400 Axırda sən də ölüb qara torpaq olacaqsan,
Ölüm səni tutanda peşman olacaqsan.
6401 Dünyaya neçə yaxşı insan, alim, həkim gəldi,
Ancaq heç biri əbədi həyat tapa bilmədi.
6402 Bax, sanki onlar heç doğulmamışlar,
Hamısı qara torpaq altında yatır.
6403 Dünyaya nə çox insanlar gəldi,
Bax, qara torpaq hamısını uddu, yedi.
6404 Möhtəşəm saray, qəsr və evlərini qoyub
Qara torpağa döşənib yatırlar.
6405 Yatırlar, səsləri yoxdur, nəfəs almırlar,
Vəziyyətləri necədir? Kim bilir?
6406 Onların hamısı yaxşılığa möhtacdır,
Əlləri yeməyə-içməyə çatmır.
6407 Bax, peşmanlıq içində inləyib yatırlar,
Min xahişlə yaxşılıq istəyirlər.



6408 Bu gün Tanrı bizə bu günü verdi,
Bu fürsəti əldən qaçırmamalıyıq.
6409 Allah bizə yaxşılıq üçün güc versin,
Ey mülkün yaxşı nizamı".

* * *

6410 Öydülmüş Eliki öydü və dedi:
– Ey hakim hökmdar, ömrün uzun olsun.
6411 Dünya sənsiz qalmasın, sənsiz boş olar,
Tanrı sənin nəslini kəsməsin.
6412 Necə arzu və diləklərin varsa,
Tanrı onların qapılarını sənin üzünə açsın.
6413 Ey comərd, daha nə arzu-diləyin olsa,
Tanrı hamısını sənə ehsan etsin.
6414 Sevinərək, ovunaraq uzun ömür sür,
Rahat yaşa, ey həlim və salim insan.
6415 Sənin kimi insanlar ölsə,
Sümükləri torpaq altda qalıb dağılsa – heyf!
6416 Nə etmək olar, ey böyük hökmdar,
Tanrı dünyanı belə yaratmışdır.
6417 Sənin kimi yaxşılıqlar edən Elik.
Ölsə də, ölü sayılmaz.
6418 Ölsən də, düşmənin pərişan olsun
Adın yaxşılıqdan dolayı dünyaya yayılıb.
6419 Dostun çox, düşmənin pərişan olsun
Ölkən daim genişlənsin.

* * *

6420 Öydülmüş susdu, yeri öpüb, qalxıb çıxdı,
Atına minib evinə doğru getdi.
6421 Çatıb atından endi, evinə girdi,
Yedi-içdi, yatıb bir müddət dincəldi.
6422 Səhər yenə qalxdı, işinə başladı,
Əmrlər verdi, hər şeyə göz qoydu, özü də işlədi.

6423 Hərəkətlərini sodaqətlə tənzim elədi,
Əyrilər ona baxıb xasiyyətlərini dəyişdilər.
6424 Dünya nizama girdi, xeyir-dua çoxaldı,
Bunun sayəsində ölkədə səadət artdı.

* * *

6425 Onlar getdilər, gözəl adları qaldı,
Adları daim hörmətlə yad ediləcək.
6426 Bax, indi belə insanlar hanı?
Onların işləri ölkəyə yaraşıq idi.
6427 O vaxtkı insanlar əsl insanlar idi,
De görək, bugünkü insanlar nədir?
6428 Ey hakim, əgər biz insanıqsa,
Onlara, şübhəsiz, mələk demək lazımdır.
6429 Onların işi, əməli, qoyduqları iz haqda
Danışılanları eşitmək də səadətdir.
6430 Ağıllı anlayır, bilikli bilir,
Şübhə yox ki, insan ölür, dünya qalır.
6431 Vaxtı boş keçirmək yox, ibadət etmək lazımdır,
İnsanın bu dünyada yeganə mənfəəti odur.
6432 Səndən əvvəlkilər ölür, sən də görürsən,
Daha bundan böyük nə nəsihət olar, bilər?
6433 Saray, qəsr və imarətlər qalır,
Ey böyük, insan onları daim işlədə bilməz.
6434 Saray, qəsr və qalaları ölüm pozdu,
Bax, hamısını qara torpağa çevirdi.
6435 Ey diri, ölüm neçə şəhəri, neçə ölkəni
Bağları, bağçaları kimsəsiz qoydu.
6436 Saray, qəsr, imarətlər boşalır, sənə qalır,
Bunları ələ keçirdim deyə işlədirsən.
6437 Böyük bir ordusu olan o cahan bəyi hanı?
Ordusunu buraxdı özü qara torpaq oldu.
6438 Hanı "ölkən azdır" deyən həris hökmdar?
Çox ölkələr aldı, ancaq əlində tuta bilmədi.
6439 Hanı başqa ölkələr, göz dikən adam?
İndi bir qulac yerdə yatır, iztirab çəkir.



6440 Hanı müsəlmanların qanını tökən insan,
Niyə torpağa girdi? Gücü nə oldu?
6441 Hanı başqalarına iftira edən şəxs?
O alçaq torpağa necə qərq oldu?
6442 Hanı dünya üçün çarpışan insan?
Dünya yerindədir, o isə ölümə qarşı çıxa bilmədi.
6443 Hanı o malı-mülkü, hər şeyi istəyən?
Özü ilə iki parça bez apardı.
6444 Hanı o çox yer istəyən adam?
Qara torpağa döşəndi, dava bitdi.
6445 Bütün dünyanın vəziyyəti belədir,
Ağılla baxsan, idrak qapıları açılar.
6446 Onun rahatlığı zəhmət, sevinci kədər,
İzzəti zillət, dincliyi möhnətdir.
6447 Nə gəlsə, şikayət etmə, çiyninə yüklə,
Dinclik də, zəhmət də ikisi də keçər.
6448 Ey fəlakətlər önündə səbir edən insan,
Bilik verən insan nə demiş, eşit:
6449 "Ey nemət sahibi, nemətə şükür et, ye,
Ey möhnət sahibi, qədərinə boyun əy, döz.
6450 Səbir etsən, möhnət nemət olar,
Nemətə şükür etsən, artar, bunu bil".

* * *

6451 Ey alim, indiki zəmanəyə diqqət et,
İşlər tamamilə dəyişmişdir.
6452 Bilikli həqir olub, bir yanda düşüb qalıb,
Ağıllı lal olub, susub durur.
6453 Ölkədə pis adamlar çoxalıb,
Həlimlər ayaq altda qalıb.
6454 Şərabla üzünü yuyan, ibadət etməyənlər,
İndi igid sayılır, istədiklərini edirlər.
6455 Fəsad və hiylə işlədənlər mərd sayıldı,
Şərab içməyənlər xəsis hesab edildi.
6456 Namaz qılana, oruc tutana münafiq deyildi,
Ey məmləkətin başında duran insan.

6457 Halal büsbütün ortadan qalxdı, haram çoxaldı,
Haram yeyənin könlü qara kirlə qapandı.
6458 Halalın ancaq adı qaldı, özü yoxdur,
Haramı qarışdırdılar, hələ də doymurlar.
6459 Hanı bu harama hara deyən?
Haramı buraxıb halal yeyən insan?
6460 Dürüst adam, ibadət sahibi qalıbmı?
Ancaq günəşi parlayan bir qiyamət günü vardır.
6461 Qəlblər haram üçün çox qaraldı,
Ey oğul, halalı harada axtarmalı?
6462 Buna bənzər belə bir söz var,
Yaxşıca dinlə, ey təmizqəlbli insan:
6463 "Könlüm haram illə-qaraldı, çirkləndi,
Mən bilikdən yüzdə bir istifadə edirəm.
6464 Həvəs və istək bədəni əsir etdi,
İbadətlə məşğul olmuram, sirrimi açdım.
6465 Dünyanın təbiəti tamam dəyişdi,
İnsanların könlü ilə dili başqa-başqadır.
6466 Xalqdan vəfa getdi, cəfa çoxaldı,
İnanılacaq adam tapa bilməzsən.
6467 Xalqdan vəfa getdi, yerini cəfa aldı,
İnanılacaq tək-tük adam var.
6468 Qohumlardan yaxınlıq, qardaşlıq uzaqlaşdı,
Artıq səmimi dostluq qalmadı.
6469 Kiçiklərdə tərbiyə, böyüklərdə bilik yox,
Qabalar çoxaldı, zəriflər ortadan qalxdı.
6470 Adamlar pul üçün bir-birinə yaxınlaşdılar,
Doğruluq və həqiqət uğrunda iş görən yoxdur.
6471 Əmanətin adı var, ona sədaqət yoxdur,
Nəsihətin sözü qalıb, özünü eşidən kimdir?
6472 Mərufu əmr edən hanı?
Münkəri nəhy edən hanı?
6473 Satıcılar əmanət vəsfini itirdilər,
Ustalar nəsihətdən vaz keçdilər.
6474 Bilikli öz sözünü doğru-dürüst demir,
Qadınlardan həya getdi üzlərini örtmürlər.



6475 Doğruluq getdi, yerinə əyrilik gəldi,
Allah xətrinə iş görən kimsə qalmadı.
6476 İnsanların hamısı pula qul oldu,
Gümüş kimdədirsə, ona boyun əyirlər.
6477 Camaat çox, məscidlər az idi.
İndi məscid çox, camaat azdır".
6478 Dinlə, ibadət sahibi insan gör nə deyir,
Ey yaxşı adam, bunu qəlbinə yerləşdir:
6479 "Hanı, doğruluqla hərəkət edən varmı?
Hanı, Allah naminə iş görən varmı?
6480 Dünya başdan-başa pozuldu,
Bunu görüb heyrət edən bircə adam varmı?
6481 Müsəlmanlar qarışdı, bir-birinin ətini yeyir,
Kafirlər isə rahatlıq içində yaşayırlar.
6482 Müsəlmanların malı talandı, oğurlandı,
Halalı-haramı seçən, buna riayət edən edən hanı?
5483 Hiylənin uca səsindən gecə yatmaq olmur,
Elmin, Quranın səsi heç eşidilmir.
6484 Ürəklər daşlaşdı, dillər yumşaldı,
Doğruluq qeyb oldu, ancaq qoxusu qaldı.
6485 Oğul ataya atalıq edir,
Oğul bəy, ata isə qul oldu.
6486 Həyat çətinləşdi, qayğı çoxaldı,
Hərislik, tamah artdı, dinclik azaldı.
6487 Fəqirə, yetimə, dula şəfqət göstərən yox,
Dünya başqa qəlibə salındı, heyrət edən yox".
6488 Bilikli, təcrübəli səxavətli,
Hakim insan nə gözəl demişdir:
6489 "Dünyanın sonu gəldi, nizam pozuldu,
Yaxşılar pislərə baxıb dəyişdilər.
6490 Ağıllı anlayır, bilikli bilir,
Gün, ay, il keçdikcə dünya pozuldu.
6491 Oğul-qız ataya hörmətdən əl çəkdi,
"Qoca" sözü insana həqarət oldu.
6492 Nizam və qanunlar bütün dəyişdi,
Ağla qara bir-birindən fərqsiz oldu.

6493 Bunlar qiyamət gününün əlamətidir,
Əlaməti göründəndə gələcək olan gələr.
6494 Qadir Tanrı aqibətinizi xeyir etsin,
Bu fitnə-fəsadı, şər-bəlanı ortadan qaldırsın".

* * *

6495 Dörd yüz altmış ikinci il idi,
Bu əsəri yazıb bitirdim.
6496 Ağlıma batan sözlərin hamısını yazdım,
Ey oxuyan-yazan insan, bundan pay al.
6497 Hansı yollarla necə gedəcəyini
Bir az izah etdim, ona əməl et.
6498 Bunlardan biri dünya, biri din yoludur,
Bu yollarla get yolunu azma.
6499 Dünyanı istəsən onun yolu budur,
Axirəti istəsən onun yolu odur.
6500 Sən qulluğunu et, Tanrı sənə güc verər,
İki yoldan birini seç, üçüncüsü yoxdur.
6501 Mən bu sözə başlayanda
Diləyimin nə olduğunu bilirsən, rəbbim.
6502 Özümə şan-şöhrət, yaxşı ad diləmədim,
Yaxın-uzaq hamının yaxşılığını istədim.
6503 Bunu oxuyan oxuduqca məni xatırlayar,
Bəlkə mənə dua edər deyə, düşündüm.
6504 Diləyim bu idi, ümidim də budur,
Oxuyan hər halda mənə dua qılacaq.
6505 Dilim söylədi, əlim bunu yazdı,
Dilim də, əlim də fanidir, ey təmiz qəlbli.
6506 Ey müdrik, dildən və əldən qalan nişanə,
Bax, sənin üçün yazdığım bir kitabdır.
6507 Mən dünyadan köçüb torpağa düşəndə
Ey bunu oxuyan diri, məni unutma.

* * *

6508 Ey əbədi, ölümsüz rəbbim, sən böyüksən,
Bu möhtac qulunun günahlarını bağışla.



6509 Yolunu azmış qul idim, günahım çoxdur,
Günahlarımdan keç, sən mənim rəbbimsən.
6510 Mən qulunam, sən rəbbimsən, qulun adı quldur,
Sən rəbbimsən, şəfqətlisən, rəhm elə.
6511 Mən qulunam, sən rəbbimsən, ey qafur,
Məni əfv et, günahlarımı bağışla.
6512 Bir də şərqdən qərbə qədər,
Bütün möminlərin günahlarını bağışla.
6513 Mən bir avamam, avamdan avamlıq gələr,
Sən mərhəmətlisən, günahlarımdan keç.
6514 Müşkdən ancaq müşk iyi gələr,
Pis qoxu murdar şeydən çıxar.
6515 Ey ümidim, mənim pənaham sənsən,
Ey ümidim, səndən ümidimi üzməyəcəyəm.
6516 Mən sənin günahkar qulunam, işim cəfadır,
Sən vəfalı rəbbimsən, mənə vəfa göstər.
6517 Ey rəbbim, cəfadan yenə cəfa gələr,
Vəfada isə vəfadan başqa heç nə görmədim.
6518 Bütün möminləri əfv elə,
Onların hörmətinə günahlarımı bağışla.
6519 Yaxşı bələdçi, doğru yol göstərən
Peyğəmbərə min-min salamımı yetir.
6520 Onun dörd yoldaşına məndən daima
Ehtiram yetir, ey Tanrım.

D

I

# GƏNCLİYİNƏ ACIYARAQ QOCALDIĞINI BƏYAN EDİR

6521 Uçan bulud kimi gəncliyimi keçirdim
Ömrümü qasırğa kimi tez tükətdim.
6522 Heyif gəncliyimə, gəncliyimə heyif,
Tuta bilmədim, səni tez əldən qaçırdım.
6523 Ey gənclik, yenə gəl, mən səni
Əl üstdə tutaram, sənin üçün ipək-xara döşətdim.
6524 Heyif gəncliyə, hanı, hara getdi,
Çox axtardım, axtardım, tapa bilmədim.
6525 Soruşdum, gənclik qədər zövqlü.
Şirin canı xoşbəxt edən şey yox imiş.
6526 Uşaqlığın zövqünü, gəncliyin rahatlığını
İtirdim, əlimdə tutarkən qaçırdım.
6527 Doğru yaşasaydım, qocalığın eybi yoxdu,
Təəssüf ki, onu boşuna sərf etmişəm.
6528 Ey gənclik, təəssüflə sənə acıyıram,
Bütün gözəlliyimi sən uzaqlaşdırdın, mən uzaqlaşdım.
6529 Bənizim ərğüvan kimi qəzəl idi,
Bu gün üzümə zəfəran toxumu səpdim.
6530 Müşk kimi qara başıma kafur örtdüm,
Ay kimi dolğun üzü harda itirdim?
6531 Rəngbərəng çiçəkli parlaq yaz idim,
Xəzana uğratdım, hamısını qurutdum.
6532 Qayın kimi olan qamətim ox kimi düz idi,
İndi yay kimi əyri oldu, əydim, əyildim.
6533 Heyif, ömrü boşuna sərf etdim,
Peşmanlıqla gözümdən qan-yaş axıtdım.
6534 Uşaqlığı keçirdim, gəncliyi itirdim,
Günümü qaraltdım, özümü çökürdüm.
6535 Yeyib-içərkən öküz kimi yedim-içdim,
Dilək dalınca qaçıb tozu dumana qatdım.



6536 Neçə növ quş və keyik ovladım, sevindim,
Cins atları uçan quş kimi torumdan qaçırdım.
6537 Qohumlar, dostlar üçün əziz can kimi idim,
Düşmənimi isə dəlisov dayça kimi sıçratdım.
6538 Mən neçə-neçə adama hirsləndim, söydüm,
Günahsızlara, yoxsullara əl qaldırdım, dil uzatdım.
6539 Neçə yağı öldürmüş ər kimi köksümü qabartdım,
Kobud olub qaya kimi qabaqlarına dikəldim.
6540 İçib yatmış adam kimi oyandım,
Gördüm yolumu azmışam, Tanrıdan utandım.
6541 İnsanlara xidmət etdim Tanrı ibadəti qaldı,
Dünyanı dörd dolanaraq yolumu azdım.
6542 Neçə-neçə arzu-dilək dalınca qoşdum,
Qudurmuş qurd kimi dünyanı inlətdim.
6543 İnsanları tutub zorla pullarını aldım,
Kimisini qorxutdum, kimisini döydüm, kimisini əzdim.
6544 Rəbbim soruşsa ki, niyə elə elədin?
Nə deyim? Çox xəcil hala düşdüm.
6545 Hansı dəli bundan pis hərəkət edə bilər?
Fani günlərdə aldanaraq həyatı xərclədim.
6546 Rahatlıq ötdü, zəhmət də ötəcəkdi,
Gün və aylar hədər oldu, peşmançılığa düşdüm.
6547 Tutaq ki, ya Kəsrə, ya Qeysər oldum,
Şəddad və Ad kimi bir cəhənnəm qurdum,
6548 İsgəndər kimi bütün dünyanı tutdum,
Nuhun yaşını yaşadım və yaşatdım,
6549 Şimşək qılınclı Heydər oldum,
Yaxud Rüstəm kimi dünyaya ün saldım,
6550 İsa kimi göylərə yüksəldim,
Nuşiravan kimi adil oldum.
6552 Bunların nə xeyiri, sonu torpağa çevrilməkdir,
Dünya qaldı, özümlə iki arşın bez apardım.
6553 Çılpaq gəlmişdim, çılpaq da gedirəm,
Bəs niyə özümü dünyaya bunca bağladım.
6554 Fani dünya qasırğa kimi ötüb keçdi,
Fani dünyanın təzyiqi altda qaldım.
6555 Yaşayarkən necə yaxşılıqlar elədim,
Həyatda ikən əkdiyim tarla hanı?

6556 Nə əkdimsə, axırda onu da biçdim,
Nə biçdimsə, ondan zövq aldım.
6557 Gəncliyi əldən verdim, qocalığa gəldim,
Məqsədə gələk, sözü niyə dağıtdım?
6558 Uzun gecəni yatmaqla yox, Tanrıya ibadətlə keçir,
Oyaq ol, durmadan ağla, günaha batdım.
6559 İlan, qurd-quş yemi olan bədənimi
Mən niyə nemət içində bəslədim?
6560 Ey mürgüləyən bədən, oyan, durmadan ağla,
Tanrıya ibadət et, yoxsa mən məhv oldum.
6561 Qocalıq yetişdi, *gənclik uzaqlaşdı*,
Zövq getdi, mən də doğru yolu tapdım.
6562 Qoca dünya çox xalqları aldatdı,
Mən hansı xalqdanam? Niyə onu özümə sevdirdim?
6563 Ya rəbb, məni oyat, axı sən mənim rəbbimsən,
Məni qovma, mən könlümü arıtdım.
6564 Sən günahlarımı bağışlayan tək rəbbimsən,
Məni bağışla, mən günahlarımın sayını də itirmişəm.

## II

## ZƏMANƏNİN POZUQLUĞUNU VƏ DOSTLARIN VƏFASIZLIĞINI BƏYAN EDİR

6565 Duraq gedək, dünyanı gəzək,
Dünyada vəfalı kimdir deyək.
6566 İnsan adam tapılmaz, onu harda axtaraq?
Axtarmaqla tapılsa, tapaq, onu görək.
6567 Bütün arzularımı tapdım, insan tapmadım,
Bu arzum yerinə yetsə, onun üzünə baxaram.
6568 Vəfa qəhət oldu, dünya cəfa ilə dolu,
Kimdə vəfa varsa, bir azca istəyirəm.
6569 Əgər *bir vəfalı comərd adam tapsam*,
Onu dalıma alıb, gözümə sürtərəm.
6570 Əgər bir vəfalı tapa bilməsəm,
Vəhşi heyvanlarla ömr sürərəm.
6571 Yediyim ot kökü, içdiyim yağış olsun,
Qumdan döşək düzəldib dünyadan qeyb olaram.



6573 Bu da olmasa, bütün aləmdən əl çəkib,
Çay kimi axaram, qasırğa kimi göyə yüksələrəm.
6574 Ey rəbbim, bunca vəfasızlığa tuş oldum,
Kim vəfalısa, ona canımı fəda edərəm.
6575 İnsanını adı qaldı, insanlıq yox oldu,
İnsanlıq hara getdi? Mən də ora gedim.
6576 Axtardım, dünyada səmimi insan yoxdur,
Vəfasızlara *necə könül verim*?
6577 Kimi gözüm kimi özümə yaxın tutdumsa,
Yağı çıxdı, şeytan kimi yağını nə edim?
6578 Kimi sevdimsə, onu əziz can bildim,
Ancaq ondan da cəfa gördüm, indi kimi sevim?
6579 İnsan könlünə dili və sözü şahidi idi,
İndi könül və dil yalançı oldu, kimə güvənim?
6580 Bu gün özümə kimi eş edim,
Kimi dost bilim, kimə inanım?
6581 Kimə könül verim, kimə dərd açım,
İndi qəmliyəm, ürəyimi kimə boşaldım?
6582 Yar-yoldaşımda sədaqət görmədim,
Qardaşım sanki yaddır, ona necə könül açım?
6583 Əminlik, bütünlük anladırsa,
Anda sadiq kimdir, ona mərd deyim?
6584 Duz-çörək haqqını gözləyən varmı?
Onu qızıla, gümüşə, gövhərə tutum.
6585 Qonum-qonşu, sevinc-kədər yoldaşı hanı?
Hər şeyimi ona verib evdən də çıxım.
6586 Yar-yoldaş kimi inanılacaq adam varsa,
Onu bəy edim, özüm ona qul olum.
6587 Bir insan tapmadım, dərdli və yalqızam,
Kədərdən əriyirəm, mən də sevinim, gülüm.
6588 Xalq niyə pozuldu, niyə qanundan əl çəkdi,
Hansı zamana tuş oldum, mən hara gedim?
6589 *Yoxsa dəlimi oldum*, ağlımı *itirdim*,
Niyə belə dedim, söylə, bilim.
6590 Yoxsa sevda çoxalıb beynimə vurdu?
Yoxsa gözümə elə göründü? Qoy mən dərman içim.
6591 Yoxsa bu cür insanlar mənə tuş oldular?
Əgər mən tərs adamamsa xasiyyətimi dəyişim.

6592 Mən pisəm, mən pisəm hanı o insanlar ki,
Dünyada vəfalı ad qoydu, onları mədh edim?
6593 Onların qoyduqları adətləri, qanun-qaydanı
Mən də görüb sevinc tapım.
6594 Belə deyilsə, yaxşı adət, nizam qoysunlar,
Xalislər başa keçsin, axmaqları qovum.
6595 Bütün yaxşılar getdi, qanun-qaydanı apardı,
Burada insan artıqları qaldı, yaxşıları necə tapım?
6596 Bu insan cildində gəzənlər adam isə,
Əvvəlkilər mələk imiş, nə bilim?
6597 Onlar getdi, mən bunlarla qaldım,
Neyləyim, bunlarla necə uzlaşım?
6598 Nə qədər danışsam da, söz bitməz,
Hələlik bəsdir. Sözün varmı? Mən gedim.
6599 Özüm üçün burada yaxşı bir şey tapmadım,
Kənddən-şəhərdən çıxıb, insanlardan qaçım.
6600 Adımı bilməsinlər, məni görməsinlər,
Axtarıb tapmasınlar, sözümü kəsim.
6601 Çayan kimi vurarlar, çibin kimi sancarlar,
Köpək kimi hürərlər, hansına cavab verim?
6602 Usandım artıq, axmaqlara tuş oldum,
Gecə-gündüz peşmanlıqla bu yükü necə daşıyım?
6603 Dünyanın cövrü-cəfası mənə dəyməsin,
Axmaq və qaba adamlardan uzaq olum.
6604 İlahi, sevimli peyğəmbərin üzünü mənə göstər,
Bir də dörd əshabının üzünü görüm.

## III

## KİTAB SAHİBİ YUSİF ULU HACİB ÖZÜNƏ NƏSİHƏT VERİR

6605 Bilik bil, yerin yuxarı başda olsun,
Bilik insan üçün möhkəm qalxandır.
6606 Biliksiz ürək, dil nəyə yarar,
Bilməklə su kimi hamının işinə yara.
6607 Nə qədər bilsən də, bilik axtar,
Bax, bilikli diləyinə soruşaraq çatmışdır.



6608 Bilirəm desən, bilikdən iraqsan,
Biliklilər içində biliksiz sayılarsan.
6609 Bilik bir dənizdir, nə ucu var, nə dibi,
Sərçə ordan nə qədər su götürə bilər?
6610 Bu biliklə öz başın hərlənər,
Özünü bilməyən öz-özündən uzaqlaşar.
6611 Bilik bil, insan ol, özünü böyüt,
Ya da heyvan adlan, insandan uzaqlaş.
6612 Biliklinin üzü gülməz, qaraqabaq olar,
Biliksiz sevinclə, qəh-qəhlə gülər.
6613 Bilikli bu qayğı içində necə gülsün?
Ey biliksiz, sən dağ keçisi kimi ağna, yort.
6614 Bilikli cidarlıdır, durub yüyürəmməz,
Biliksiz isə diləyinin ardınca qaçar.
6615 Ey alim, sən cidarlısan, biliksiz qaçır,
Biliksiz cidarlansa, iplərini tarım çək.
6616 Bilik istəyərək ona əl uzatdım,
Sözü sözə düzdüm, sıraladım.
6617 Bu türkcə sözü keyik kimi gördüm,
Onu yavaşca tutdum, özümə yaxınlaşdırdım.
6618 Oxşadım, isitdim, tez könül verdi,
Ancaq yenə də ara-sıra hürkür, qorxur.
6619 Sözü tutduğun şəkildə izlədim,
Onun müşkü gözəl ətir saçmağa başladı.
6620 Sözü doğru dedim, o, sərt və acı oldu,
Doğru sözə ağıllı adam dözər.
6621 Oxuyana çox ağır gəlməsin,
Şərhlə, təfsirlə üzrümü bildirdim.
6622 Doğru sözdən başqa sözə söz demə,
Doğru-əyri fərqi ağla qara fərqi kimidir.
6623 Həyatımda bu sözləri söylədiyim vaxt
Tarix dörd yüz altmış iki idi.
6624 Bu sözləri tam on səkkiz ayda söylədim,
Sözləri toplayıb yığdım, ayırıb seçdim.
6625 Əlvan çiçək kimi ətri müşkə bənzər,
Mən onları düzdüm, tamamladım.
6626 Nə qədər söyləsə də, sözü kim tükəndirə bilər,
Bulaqlar arasından durmadan axar gedər.

6627 Ey Yusif, gərəkli və doğru sözü söylə,
Gərəksiz sözü gizlət, zərəri dəyər.
6628 Sözü çox söylədin,diqqət et, təzə olsun,
Çox sözdən adam usanar, bezər.
6629 İmansız dünya vəfasızdır, dönükdür,
Ey ağıllı, ondan iraq ol, uzaqlaş.
6630 Sən indi bu dünyadan bərk yapışdın,
Çalış ki, könlünü ondan üzəsən.
6631 Bu dünyaya əsla güvənmə,
Tanrıya sığın, ona yalvar.
6632 Bu vəfasız dünya çoxundan üz çevirdi,
Gör doğru yoldan nə qədər adam azdı.
6633 İndi sənə göz qoyub, bəzənib gülür,
Ona könül vermə bağlanma, əsir olma.
6634 Dünyanın sahibi neçə cahangir bəyləri
Ölüm tutdu, onlar dua diləyərək getdilər.
6635 Gənclik boşuna keçdi ömrüm hədər oldu,
Bu həyat bitəcək, peşman ol, iztirab çək.
6636 Neçə min il yaşasan da, axır öləcəksən,
Dünyanı nə qədər yığsan da, axır qoyub gedəcək.
6637 Ey Allah, sənə sığındım, sən qoru,
Bu qəflət yuxusundan özün məni oyat.
6638 Utanmaz qulunam, günahım çoxdur,
Sən rahimsən, şəfqət səndən gəlir.
6639 Önündə günahkaram, səndən uzaq qaçdım,
Bu gün yalvararaq təkrar sənə sığınıram.
6640 Nəyə inandın, ey yazıq bədən,
Göz görə-görə kimə arxalandın?
6641 İndi yolunu düzəlt, doğru yola get,
İki dünyada da özünə bir mövqe qazan.
6642 Bu dünya bütün sevincdən ibarətdir,
Bunu burax, axirət dünyasına bax.
6643 Dilini tut, boğazını yığ, çox uyuma,
Gözünü yum, qulağını tıxa, rahat yaşa.
6644 Ya rəbb, bütün möminləri bağışla,
Bol rəhmətini onlardan əsirgəmə.
6645 Yetir peyğəmbərimizə minlərcə salam,
Dörd əshabəsinə də salamlar yetir.



## KİTABIN İÇİNDƏKİLƏR

| | |
|---|---|
| Buraxılışa məsul: | *Umud Rəhimoğlu* |
| Texniki redaktor: | *Zahid Sarıtorpaq* |
| Operator: | *Şəbnəm Siyabqızı* |
| Kompyuter səhifələyicisi: | *İslam Rzayev* |
| Korrektor: | *Tofiq Qaraqaya* |

Yığılmağa verilmişdir 05.06.2006. Çapa imzalanmışdır 28.08.2006.
Formatı 60x90 $^1/_{16}$. Fiziki çap vərəqi 27,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 177.

DÜST 5773-90, DÜST 4.482-87




Kitab "CBS-PP" MMC mətbəəsində çap olunmuşdur.
Bakı, Şərifzadə küçəsi, 3.

Azərbaycan Respublikasının Prezidenti
**İlham Əliyevin**
"Azərbaycan dilində latın qrafikası ilə
kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"
12 yanvar 2004-cü il
tarixli sərəncamı ilə nəşr olunur.

